*Bu kitab "**Medi Hüseyn.** Əsərləri. On cilddə. IV cild"*
(*Bakı, Azərnəşr, 1969*) *nəşri əsasında təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Zivər Hüseynova**

**894.3613 - dc 21**
**AZE**
**Mehdi Hüseyn.**
**Seçilmiş əsərləri.** Üç cilddə. II cild. Bakı, "AVRASİYA PRESS", 2005, 312 səh.

Ötən əsrin 60-cı illərinə qədər qaynar bir yazıçı ömrü yaşayan nasir, dramaturq, tənqidçi Mehdi Hüseynin seçilmiş əsərlərinin II cildinə ədibin "Abşeron" romanı daxil edilib. Bakı neftçilərindən bəhs edən bu roman bir sıra insan obrazları ilə yadda qalmış, kollektiv əməyin romantikasını əks etdirən bir əsər olaraq populyar olmuşdur. "Abşeron" romanı on illər boyunca Azərbaycan nəsrinin xarakterik nümunəsi olaraq orta və ali məktəblərdə tədris edilmiş, müxtəlif xalqların dillərinə çevrilmişdir.

**ISBN 9952-421-14-X**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



*Belədir əzəldən insan xilqəti:*
*Hər vaxt axtarışdır onun sənəti.*
*Kimisi axtarır sonsuz dənizlər,*
*Kimisi dənizin dibində gövhər.*

***Nizami***

# BİRİNCİ FƏSİL

## 1

Sərnişin qatarı sürətlə Bakıya yaxınlaşanda, göz işlədikcə uzanan şəhərin işıqları salxım-salxım yanır, göy üzündə sayrışan ulduzlar isə, elə bil, mavi səmanın dərinliklərindən şəhərə qibtə və həsrətlə göz qırpırdı.

Vaqonun pəncərəsinə söykənmiş Cəmil, yanında duran Tahirə sarı dönərək, əli ilə qabağı göstərirdi:

– Bax, mən bu ulduzları deyirdim... Görürsənmi?

Tahir Bakını ilk dəfə görürdü. O, bəlkə də sərnişinlərin hamısından əvvəl pəncərəyə yanaşıb, ta uzaqlardan şəhərə baxırdı. Onun qəribə bir sevinclə çırpınan ürəyi, elə bil, sinəsini yarıb çıxmaq istəyirdi. İndiyəcən, uca dağ başında laçın yuvası kimi yerləşən doğma kəndlərindən, evləri cərgə ilə düzülmüş, balaca, yaraşıqlı və göyçək qəsəbələrindən başqa heç bir yeri görməmiş Tahir, işıqlar içində üzən bu nəhəng şəhərə baxdıqca heyrətdən gözləri böyüyürdü. Ancaq o, hələ də Bakının evlərini, binalarını aydın görmədiyindən, səbri tükənmiş halda Cəmildən soruşdu:

– Bəs Qaraşəhər hanı? Bayıl hansıdır?

Cəmil bir əlilə qara, qıvrım saçlarını yanakı daraya-daraya, o biri əlilə uzaqları göstərdi:

– Bax, o yanda Qaraşəhər, bu yanda da Bayıl... Amma heyf ki, buradan aydın görünmür.

Tahir, maraqlandığı yerləri elə-belə, xala xətrin qalmasın deyə göstərən Cəmildən inciyən kimi olub, qeyri-ixtiyari onun qoluna toxunanda, Cəmilin əlindəki yaşıl rəngli, uzun kauçuk daraq yerə düşərək nəyə isə dəyib iki parça oldu. Tahir öz hərəkətinin nəzakətsizliyini hiss edib qızardı:

– Ay bağışla, – deyərək, tez aşağı əyilib darağın parçalarını götürdü.

Cəmil isə ona acıqlanmaq əvəzinə qayğısız bir təbəssümlə gülümsəyərək, darağın yalnız bir parçasını aldı:

– Canın sağ olsun, – dedi, – elə yaxşı oldu ki, iki bölündü. Biri sənin, biri də mənim...

Enişə gələndə sürətini azaldan qatar, deyəsən, yavaş-yavaş gücdən düşüb, çalxalandı və aramla irəliləməyə başladı. İndi bəzi evlər də, dəmiryolundan bir qədər aralı şığıyıb keçən elektrik qatarı da aydın görünürdü.

Cəmil pəncərədən çəkildi, stansiyaya çatdıqlarını Tahirə də söylədi. Vaqondakı adamlar əl-ayağa düşüb şeylərini yığışdırır, bəzi sərnişinlər isə artıq qapıya doğru yönəlirdilər. Tahir, xalı kimi rəngbərəng iplərdən toxunmuş balaca, dolu heybəsini çiyninə aldı. Cəmil isə qırmızı, taxta çamadanını götürdü.

– Biz hazır! Dərziyə köç dedilər, iynəsini sancdı yaxasına. Amma heyf daraqdan. Günah məndə oldu, Cəmil...

– Əşi, bəri gəl, bir daraq nədir ki, ondan ötrü bu qədər heyfsilənirsən?

Onlar qapıda sıxlaşmış adamların dalınca addım-addım yeriyərək düşməyə hazırlaşanda, qatar birdən yenə çalxalanıb dayandı və indi Tahirin gözləri qarşısında, bayaq uzaqdan gördüyü nəhəng şəhərin kiçik bir parçası aydın bir mənzərə kimi canlandı: morojna arabasını sürüyüb aparan ağ önlüklü, sarısaç, cavan bir qadın, yekə palma dibçəkləri, dəmiryolçuların cərgə ilə divardan asılmış iri, canlı şəkilləri və yeməkxanadan gələn şad musiqi səsləri – Tahirin ilk dəfə gördüyü və eşitdiyi səslər idi.

Tahirlə Cəmil yerə düşəndə, eşikdə xəfif və sərin bir meh əsirdi. Perronda gəzinən oğlanların, qızların qəhqəhəsi, ucadan yoldaşını səsləyən kəndlilərin və yükdaşıyan çağıran sərnişinlərin bağırtısı eşidilirdi. Bu zaman Tahir aydın hiss edirdi ki, Bakının özü də belə səsli-küylü, izdihamlı bir şəhərdir və ehtiyatsızlıq edib Cəmildən ayrı düşsə, adamlar içərisində itib aza bilər. Bu qorxu hələ Tahirin canından çıxmamış, şəhər üzərində göz qamaşdıran, qüvvətli bir işıq parıldadı. Tahir, səmada rəng verib-rəng alan bu fişənglərə gözünü zillərkən, harada isə toplar guruldayıb onu səksəndirdi. Hər tərəfi lərzəyə gətirən bu yaylım atəşi elə bil, Tahiri bərk silkələdi. O, geniş

açılmış gözlərini səmadan çəkməyib yerində dondu, döyükmüş halda udqundu, ulduz kimi axıb haradasa sönən axırıncı fişəngə baxdı və göy üzü zil bir qaranlığa batanda tələsik:

– Haradasan, Cəmil? – dedi.

Yenidən atılan fişənglər yenə qaranlığı parçaladı. Tahir Cəmilin qolundan yapışdı:

– Bu nədir belə?

Cəmil özü də heyrət və təəccüb içində baxırdı. Şəhər üzərində süzən belə saysız-hesabsız işıqları vağzal tərəfdən o da birinci dəfə görürdü.

Dalında yekə bir kisə aparan yükdaşıyan Tahirin böyrünə toxunub, ağır addımlarla gedə-gedə öz sevincini gizlədə bilməyib deyirdi:

– Bu gün də yapon gorbagor olub...

Bir-birini təbrik edib ucadan gülüşən insanların sifəti, geyimi və hərəkəti yalnız Tahirə deyil, Bakını yaxşı tanıyan Cəmilə də yeni və qəşəng görünürdü. Sanki hamı bir-birini daha çox sevməyə, öz ürək sözünü daha səmimi deməyə hazırdı.

Stansiyanın işıqları altında fərəhlə parıldayan üzlər, qüvvətli yaylım atəşinin xəbər verdiyi böyük səadətlər hamıya pay düşdüyünü, elə bil, bir daha təsdiqləyirdi.

O qüvvətli və zəhmli sevinc atəşi bir də gurladı. Tahir yenə başını yuxarı qaldıraraq, gözlərini fişənglərə zillədi. Yalnız kino şəkillərində və qəzetlərin birinci səhifəsində gördüyü salam atəşi büsatını o yalnız indi həqiqi mənada təsəvvürünə gətirirdi. Səmada uçuşan fişənglərin əfsanəvi rənginə baxanda, Cəmilin bütün yol uzunu Bakıya dair söylədiyi nağıllarla əsil həqiqət arasında böyük bir fərq görüb gülümsünürdü. Bu dəqiqə ürəyində köpüklü süd kimi qaynayıb daşan isti və coşqun sevincini o da gizlədə bilmədi:

– Gözəl Bakı! – dedi. – Anam məni şad gündə doğubmuş, Cəmil...

Ancaq Tahirin son kəlmələri yenidən atılan salam atəşinin uğultusuna qarışdı. İndi, deyəsən, gizlin və əsrarəngiz bir əl onun ayaqlarından möhkəm-möhkəm tutub tərpənməyə qoymurdu. Günəşdə yanıb mis rənginə çalan sir-sifəti və sevincdən daha da böyümüş iri, qara gözləri, şəhərin dibsiz mavi göylərində dairəvi zolaqlar cızan fişənglərin qırmızı, yaşıl, ağ və çəhrayı işıqlarını əks edə-edə alışıb yanırdı.

O, "Gözəl Bakı!" sözlərini təkrar edərək, yerindəcə fırlanır, səmadan gözlərini bir an belə çəkə bilmirdi.

Bir neçə an əvvəl bütün varlığını anlaşılmaz bir həyəcanla dolduran top gurultularını indi artıq qəribə bir ürək döyüntüsü və intizar içində gözləyirdi. Salam atəşləri isə o qədər də çox ara vermir, bir də, bir də uğuldayaraq yeri-göyü titrədirdi.

İndi bütün şəhər Tahirə şirin bir röya kimi görünürdü.

Cəmil onun qolundan tutub arxasınca çəkdi:

– Bəri gəl! Vağzaldan çıxıb bir az gedəndən sonra şəhər lap ovcumuzun içində olacaq.

Bu mənzərənin seyrindən doymayan yalnız Tahir deyildi. Qatardan düşmüş adamlar da xurcunlarını, kisələrini, bağlama və çamadanlarını yerə qoyub göyə baxırdılar.

Cəmilin sözlərindən, nə isə, daha qeyri-adi bir şey görəcəyini yəqin edən Tahir, onun dalınca yeriyib, sürüşkən pilləkənlə tələsik aşağı endi.

Bu zaman Tahirin qarşısında doğrudan da başqa bir mənzərə açıldı. Vağzaldan çıxarkən, o, ilk dəfə geniş və asfaltlı meydanın sağ tərəfində, dalları bağ hasarına söykənmiş müxtəlif biçimli və rəngbərəng minik maşınlarını gördü. Yarımdairə halında düzülmüş bu maşınları hündür vağzal binasından düşən güclü fənər işıqları par-par parıldadırdı. Tahir qeyri-ixtiyari ayaq saxlayıb, heyrət içində, bir xeyli onlara baxdı: "Yəqin hər adama biri düşür" – deyə fikrindən keçirdi. Bu anda qabaq tərəfdən bir-birinin arıdınca dabanbasaraq gələn iki maşın Tahirin gözlərinə işıq saldı və dövrə vurub o biri maşınlara yan aldı. Tahir son pillədən yeddi-səkkiz addım belə aralanmamışdı ki, yenə həmin yolla gələn bir "QAZ" tez-tez siqnal verərək, düz onun çənəsinin dibində dayandı. Maşının təkərlərindən gurultuya bənzər bir səs çıxdı.

Üstüörtülü "QAZ"ın taxta qapısını açıb, zənci kimi, qara sifətini və qıvırcıq saçını göstərən şofer, yoğun səsilə qışqırdı:

– Eyy, qulağına pambıq tıxamısan?

Tahir bu sözləri eşitsə də, özünə götürmədi və döyükmüş halda yan-yövrəsinə boylandı.

– Əşi, çəkil də! – deyə şofer daha da ucadan qışqırdı, kəndçi ki kəndçi!

Bu anda kənardan Tahirə sarı yönələn Cəmil, dostunun qolundan tutub özünə tərəf çəkdi.

– Sənə deyir eyy!..

Tahirin alnını tər basdı:

– Bu işıq zəhrimar gözümü lap qamaşdırıb, – deyə əlini alnına çəkdi. – Pah atonnan, bütün dünyanın maşınlarını yığıb bura gətiriblər ki...

Cəmil kəsik-kəsik gülərək, yanakı tərzdə dostunun üzünə baxdı:

– Davadan qabaq, – dedi, bundan on qat çox imiş. Hələ bunlar nədir ki?

Onlar səkiyə çıxdılar və tramvay dayanan yerə tərəf yeriməyə başladılar. Küçədə iynə salmağa yer yox idi. Maşınlar şütüyür, adamlar sağa-sola axışırdılar. Tahirlə Cəmil onlara toxuna-toxuna gəlib tramvayın duracağına çatdılar.

Cəmil, vağzaldan əlli-altmış addım aralı görünən bağın dövrəsinə kəmər kimi dolanmış yollar gələn və relslərdən keçən adamları basmamaq üçün, aramsız cingildəyən tramvayı göstərib dedi:

– Buna da minə bilərik, amma bu yandan gedəndə yolumuz xeyli uzanır. Bir də, şəhərin ən yaxşı küçələrini görmək olmur. Bu saat o biri tramvay gələcək. Gözləyək.

Tahirin nəzərləri, müxtəlif dillərdə danışa-danışa böyründən tez-tez ötüb-gedən və harasa tələsən qızların, oğlanların üzünə dikilirdi.

– Bura bax, Cəmil, görəsən Bakıda nə qədər adam olar, hə? – deyə, Tahir xəbər aldı.

Bu gözlənilməyən suala Cəmilin gülməyi tutdu. “Aşnam yamanca qarıxıb!” – deyə düşündü və dodaqlarındakı təbəssümlə dostunu pərt eləməmək üçün, qəsdən fikirli görünməyə çalışdı.

– Nə qədər? Davadan qabaq...

Tahir onun sözünü kəsdi:

– Hə, yadıma düşdü, dərsdə oxumuşuq. Bir milyona yaxındır, hə?

Onlar tramvayın dayanacağına çatanda, növbə gözləyən adamların sayı birdən-birə artdı. Cəmilin göstərdiyi üç vaqonlu tramvay uzaqlaşdı və o, bağın böyründə gözdən itən kimi, bir başqası onun qabağından bəriyə doğru şığıyıb gəldi. Tahir onun qabağındakı şüşədə “3” rəqəmini aydın görüb soruşdu:

– Buradan gedəndir? Nə tez qayıtdı, ə?

– Yox, həmin nömrədir. İki tərəfə işləyir, – deyə Cəmil, dostunun nabələdliyini yenə üzə vurmamaq üçün, yavaşcadan, az qala pıçıltı ilə cavab verdi.

Tahir Cəmilin ardınca vaqona mindi. Heybəsini çiynindən düşürüb, vaqonun dal tərəfindəki balaca meydançada Cəmilin çamadanı ilə yanaşı, dibə söykədi.

Tramvay hərəkətə gələndə, içəridə adamların çoxluğundan nəfəs almaq olmurdu.

Cəmil əlilə adamları göstərib, Tahiri başa saldı:

– Kinoya, teatra tələsirlər. Bu saat Bakının yaxşı vaxtıdır. Yay teatrları ağzına kimi dolu olur.

Tahir yaylığını çıxarıb, alnının tərini silə-silə dedi.

– Yəqin istidəndir, hə?

– Sentyabrda Bakının havası sərinləşir. Amma yarım ay bundan qabaq asfalt elə qızırdı ki, adamın ayağını yandırırdı.

– Yəni elə isti olur?

– Əlbəttə ki. Sənin ağlın bizim kəndə getməsin. Dağın kəlləsində, hər tərəfi də açıq. Buranın dənizi olmasa, yayda istidən adamın bağrı çatlar.

Təəccübdən Tahirin qaşları çatıldı. Bunun mənasını özünə görə yozan Cəmil, "Tahir yəqin elə fikir eləyəcək ki, niyə bunu əvvəldən mənə demirdi? Axı mən Bakını niyə pisləyirəm?" – deyə düşünüb əlavə etdi:

– Sən ona nə baxırsan? Bir də görürsən yayın lap cır-cıramasında xəzri elə başlayır ki, axşamlar pencəksiz gəzmək olmur.

Tramvay, bir yarpağı belə tərpənməyən bağın yanından keçdikcə sürətini artırırdı. Uzun, enli və düz küçədə qızıl bayraqlar görünürdü. Dörd-beş mərtəbəli evlərin qabağından Vətən müharibəsi qəhrəmanlarının şəkilləri asılmışdı. Hələ Tahirin uzaqdan gördüyü işıq salxımları titrəşdikcə, küçə rəng verib, rəng alırdı. Bu küçə ilə gedib-gələn adamların sayı-hesabı yox idi. Tahir Cəmili dinləyə-dinləyə gah hündür evlərə, gah da müharibə cəbhələrində ad-san qazanmış qəhrəmanların şəkillərinə baxırdı. Hər şey tez və sürətlə gəlib onun gözləri önündən keçirdi. Tramvayın sola buruldugu döngənin sağ tərəfində yüksəlmiş qəhvəyi binanı və onun qarşısında böyük bir əzəmətlə dalğalanan insan dənizini görərkən, Tahirin gözləri yenə böyüdü:

– Nizami kinosudur, – deyə Cəmil əlilə qəhvəyi binanı göstərdi, – yəqin qəzetlərdə şəklini görmüsən.

Tahir baxışlarını insan dənizindən ayırmayaraq:

– Görmüşəm, – dedi, – amma qəzet hara, bu hara?

– Yəqin təzə film göstərirlər. İndi ora bilet tapmaq hər oğulun hünəri deyil. İki salonu var. Biri yay binasıdır, o biri də qış. Bu saat ikisi də doludur, amma bu kino-teatr bütün şəhərin yaraşığıdır.

Bakı hər dəqiqə Tahirin nəzərində böyüyür, binaların əzəməti daha da artır, tez-tez dolub-boşalan tramvay irəlilədikcə, elə bil, Tahir də dənizin dayaz sahilindən üzüb get-gedə lap dərinlərinə düşür, onun təəccübü yavaş-yavaş vahiməyə bənzəyən bir hisslə əvəz olunurdu.

Tahir bu aləmin gözəlliyini başqasına da sevdirmək üçün sadə, tez-tez işlənən, adi sözlərin kafi olmadığını yalnız indi başa düşdü və ürəyində yenə Cəmilə haqq verdi: "Bakını özün görməsən, deyilənlər həmişə azlıq eləyəcək".

**2**

Cəmil kəndə məzuniyyətə gedəndə, ata-anası ilə görüşəndən sonra, hamıdan əvvəl Tahiri xatırladı: bir yerdə oxuyub, bir yerdə boya-başa çatmışdılar.

Tahirin anası Gülsənəm arvad onu birmərtəbəli daş evin eyvanında qarşıladı.

– Xoş gəlmisən, ağrın alım, həmişə sən gələsən!

Gülsənəm arvad Cəmilin boyuna-buxununa tamaşa edəndə, onun bir ildə azı bir daban uzandığını görüb sevindi. – Deyəsən Bakı sənə düşüb, qadan ürəyimə... – dedi.

Əlini çənəsinə dayamış Gülsənəm arvad, başını azacıq yana sarı əyib heyran-heyran baxırdı. Cəmil gülümsəyən gözlərini Tahirin anasından çəkmir, bir illik ayrılıqdan sonra yenə həmin tanış evin qabağında dostunun anasilə görüşdüyünə sevinirdi.

Bu sevinc Gülsənəm arvadın da üzündən aydın oxunurdu. O da kirpiklərini qırpmadan Cəmilə baxırdı. Elə bil onun doğma balası uzaq səfərdən qayıtmışdı. Cəmilin döşündəki bəzəkli qalstuk, alma kimi yumru yanaqlarına və qabarıq kimi görünən enli sinəsinə çox yaraşırdı. Qara cızıqlı ağ köynəyinin ətəyini təzəcə ütülənmiş açıq balaqlı tünd mavi şalvarına salıb, üstündən ensiz, sarı kəmər bağlamışdı. Hələ keçən iləcən üzünə ülgüc dəyməmiş Cəmil, indi saqqalını tərtəmiz qırxdırıb, qara, nazik bığının üstünü azacıq aldırmışdı. Xırdaca qara gözləri yenə gülümsər kimi baxırdı.

– Tahir haradadır, xala? – deyə o, Gülsənəmin əlini sıxdı. Arvadın irəli yönəldiyini görüb, üzündən öpmək istədiyini hiss edəndə, yanağını onun dodaqlarına yaxınlaşdırdı. Gülsənəm arvad onun boynunu qolları arasına alıb, sol yanağından öpdü və qıvrım saçlarını sığalladı:

– Boyuna xala qurban, oğul, – dedi. – Tahir alatorandan gedəndir. Bilmirəm bu vaxtacan harada qalıb? Təzə həvəsə düşüb, ovçuluq eləyir.

– Nə ovu, xala?

– Nə bilim, vallah, gah ördək vurur, gah da turacdan, qırqovuldan gətirir.

Cəmil Gülsənəmin qolları arasından çıxandan sonra belə gözlərini ondan çəkmədi, yanağına dəyən istinin süd iyinə bənzəyən rayihəsini duya-duya, Bakıdan kəndə gəlincəyədək könlündən keçən fikri açıb söylədi.

– Gəlmişəm onu da özümlə bərabər aparam, xala.

Müsbət cavab ala biləcəyinə o qədər də ümid etməyən Cəmil, bu sözləri sual tərzində dediyi kimi, Tahirin anası da ona qeyri-müəyyən cavab verdi:

– Nə olar ki? – deyib, kirpiklərini aşağı saldı. – Görünür zəmanə belədir. Cavanlar indi Bakıya yol eləyiblər. Dünən Tahir özü də başlamışdı ki, yoldaşlarım gedib mədənlərdə işləyir, qəhrəman olurlar. Elə hey qəzeti oxuyub dumuxa gedirdi.

– Özü gec gələr? – Cəmil dağın döşündən dərəyə enən əyrim-üyrüm araba yoluna baxdı.

Uzaqlarda ağ tüstü buraxa-buraxa sürünən dəmiryolu qatarı görünür, arabir də onun zəif eşidilən fit səsi gəlirdi. Dəmiryolundan o yana, bozumtul və ucsuz-bucaqsız düzənlikdə ləkə kimi görünən qamışlıqlar arasında balaca gölməçələr ağarışırdı. Cəmil əlilə onları nişan verib dedi:

– Yəqin oradadır, hə? Axı bu zaman qaz-ördək olmaz ki... Piyada gedib, atlı?

– Atlı gedib... Uzun ip də apardı. Heç bilmirəm onu neyləyirdi? Ha soruşdum, demədi. Bilmirsən necə tərsdir? – Gülsənəm arvad əlilə evi göstərdi. – Gəl, oturgunan ağrın alım, niyə burada durmusan? Hara getsə, axırda gəlib bura çıxacaq.

Cəmil, Tahirin uzun ipi nə üçün apardığı ilə maraqlanıb, yenə düzəngaha baxdı.

– Bəlkə ceyran ovlayır, xala? – dedi.

Bu anda dərədən qalxan bir atlını görüb, sağ əlini açıq havada alnına dayadı və balaca gözlərini büzüşdürüb, bir neçə an hərəkətsiz dayanaraq, ona səbirsiz bir nəzər saldı: – Deyəsən qucağında nə isə gətirir.

Cəmil Tahiri tanıdı və onun məharətinə qibtə ilə baxıb, xəfifcə bir tərzdə gülümsədi:

– Odur, xala. Ceyran vurub, – dedi.

Gülsənəm arvadın sifəti tünd bir qızartı ilə örtüldü.

– Ondan nə desən çıxar. Axırda bizi cərimələdəcək.

– Bilmir ki, ceyran ovu qadağandır? – deyə Cəmil də həyəcanlandı. – Qoy gəlsin, bəlkə vurduğu ceyran deyil? – Atlı yaxınlaşdıqca, onun qucağındakı heyvan da aydın görünməyə başladı. – Yox, ceyrandır, xala!

– Oğul mənimdir, mən bilirəm, Allahına bəndəlik eləmir.

Kəhər at yoxuşu dırmanıb, kəndin ortasından keçən düz yola çıxanda, aşağı məhəllənin itləri hürüşüb Tahirin üstünə tökülüşdülər.

– O, qucağındakı ceyranı tez çiyninə alıb, ayaqlarını yəhərin üstünə qaldırdı və dümdüz dayanıb, atını yortma yerişlə sürməyə başladı.

– Bir bax, bir bax, gör neyləyir? – deyə Gülsənəm arvad qorxudan qızdırmalı kimi uçundu. – Ayağı sürüşüb yıxılsa, itlər gövdəsində sağ yer qoymaz.

Kəhər at dörd nala çaparaq, itləri geridə qoyub gözdən itdi.

– Tahirdən əsil süvari çıxar, xala... – deyə Cəmil dostunun bu hərəkətini iftixarla təriflədi. – Görünür vurduğu bala ceyrandır, yoxsa atın üstündə elə dayana bilməzdi.

– Eh, sən bilmirsən o nə oyunlardan çıxır. Vallah, onu da özünnən aparsan, bir yolluq bilərəm ki, canı-başı salamatdır.

Kəhər at səkərək, qonşu evin həyətində göründü və bir göz qırpımında uçub Cəmilin qarşısında dayandı. – Yallah. Cəmil, yallah. Yenikəndin igid oğlu Tahirdən Bakının neft qəhrəmanı Cəmilə salamlar! – deyə Tahir diri ceyran balası ilə bərabər atdan yerə sıçradı və ceyranın boynuna bağlanmış uzun ipin bir ucunu kəmərinə bənd eləyib Cəmillə qucaqlaşdı. – Xoş gəlmisən, buyur, ceyran kababına qonaq ol!..

**3**

Cəmil ceyranın kəsilməyinə razı olmadı. Tahir onu gətirib balkonun küncünə bağladı. Ceyran adamların hər bir hərəkətindən və qulağına dəyən ən xəfif bir şıqqıltıdan belə səksənir, qumral və iri gözlərini daha da geniş açıb tez-tez dartınırdı.

– Kəsəcəyəm! – deyə Tahir zorba bıçağını cibindən çıxaranda anası da narazılığını bildirdi:

– Lap körpədir ki, ay oğul, – dedi, – ətinin heç dadı-duzu olmaz.

Cəmilin, Gülsənəm xalanın sözləri Tahirə zərrə qədər də təsir etmədi. O, haradansa bülöv daşı tapıb gətirdi və bıçağın tiyəsini itiləməyə başladı.

– Ana, – dedi, – Cəmil kimi dostum mənə qonaq gəlib, nə olur-olsun kəsəcəyəm.

Cəmil:

– Aşna, – dedi, – yaman tərssən ha! Əgər qonaq mənəmsə istəmirəm, sağ ol. Bir bax, lap yazığım gəlir.

Doğrudan da ceyran balası elə yazıq-yazıq boylanırdı ki, Tahirin gözü ona sataşanda, əlləri boşalıb yanına düşdü.

– Yaxşı, qoyun siz deyən olsun, – deyə bir qədər sükut edərək başını buladı və bıçağını qatlayıb cibinə qoydu. Sonra gəlib balkonda qoyulmuş balaca yemək stolunun dalında Cəmillə yanaşı oturdu. – Hə, indi danış görüm, Bakıda nə var, nə yox? Nə vaxt sənə qəhrəman adı verirlər?

– O məndən asılı deyil ki?

Tahir, sərt bir hərəkətlə əlini qaldırıb-saldı:

– Hər şey adamın özündən asılıdır. Doğrusu, mən də yaman həvəsə düşmüşəm, Cəmil. Mən də neft qəhrəmanı olmaq istəyirəm. Dəniz buruqları barədə çox oxumuşam. Sən də orada işləyirsən, eləmi? Yaxşıdır, hə? Mən də bacararam?

– Mən əvvəllər o qədər həvəsnən işləmirdim, amma indi Bakıdan ayrılmaq istəmirəm. Dəniz buruğu başqa aləmdir.

– Mən getsəm, işə götürərlərmi? – Tahir nəfəsini çəkmədən səbirsizliklə dostundan cavab gözlədi.

– Niyə götürmürlər? Könüllü gedən cavanlara daha çox hörmət eləyirlər.

– Elə isə mən də getdim! – deyə Tahir yenə əlilə havanı yardı.

Balkonun o başında yemək hazırlamaq üçün ocaq qalayan Gülsənəm arvad çiyni üzərindən, qaşları çatılmış halda oğluna baxdı. Onun narazılığını büruzə verən bu hərəkəti Tahirin də, Cəmilin də nəzərindən yayınmadı. Hər ikisinin xəyalından eyni fikir keçdi: “Buraxmayacaq”.

Cəmil soruşdu:

– Xala, niyə belə tərs-tərs baxdın?

Gülsənəm arvad cavabında dedi:

– Qəhrəman olmaq istəyən elə burada da olar. O xasiyyət ki, mənim oğlumda var, hara getsə korlayacaq.

Tahir, dostunun yanında pərtliyini gizlədə bilməyib, anasının üstünə bozardı:

– Axı mən neyləmişəm?

– Daha bundan artıq neyləyəcəksən? Onu tənqid, bunu tənqid, hamını eləmisən özünə düşmən. Sədr narazı, briqadir narazı...

– Sədr narazı olsaydı, atını mənə verərdi?

– O da atayın xatirinə... – Gülsənəm arvad yönünü oğluna tərəf çevirmədən cavab verdi və aşağı əyilib ocağı üfürməyə başladı.

Tahir əlini dizinə çırpıb gileyləndi:

– A kişi, sən öləsən, bu arvad mənim canımı boğazıma yığıb. Başlayıb ki, tənqidi yerə qoy, özünə düşmən qazanma. Nə var, nə var, bir dəfə klubda saz çala-çala oxuyub, sədrə, briqadirə həcv demişəm.

– Axı onları nəyin üstündə həcv eləyirsən? – deyə Cəmil maraqlandı.

– Əşi, o günləri komsomol iclası vardı. Mən deyirdim ki, hər kənddən Bakıya işləməyə könüllü gedir, bizdən niyə getməsin? Sədr bundan xəbər tutan kimi bir baş gəlib bizə, başlayıb ki, sən mənim düşmənimsən, istəyirsən ki, mənim kadrlarımı dağıdasan. Mən də deyirəm ki, ay İmran dayı, elə, nöyüt də bizimdir. Dava vaxtı fəhlələrin sayı azalıb. Bakıya kömək eləməliyik, ya yox? Yaxşı, indi sən de görüm, pis iş görmüşəm?

Cəmil dostunun tərəfini saxladı:

– Lap düz demisən, bu saat mədənlərdə fəhlə qüvvəsinə çox ehtiyac var.

Gülsənəm arvad təslim olmaq istəmədi, ocağı üfürməyə ara verib, yenə çiyni üzərindən gah Cəmilə, gah da oğluna baxa-baxa dilləndi:

– O ehtiyacdan elə burada da var. Bakı nöyüt verirsə, biz də süd-qatıq, yağ-pendir veririk.

– Ay ana, mənsiz də o süd-qatıq olacaq, – deyə Tahir mübahisəyə yekun vurdu. – Elə, biri sən özün. Təkbaşına iki kolxozun inəklərini sağarsan. Mənim əvəzimə də ot biçən tapılar. Uzun sözün qısası, gedirəm, vəssalam!

Bu söhbətdən sonra düz iki həftə, hər gün Cəmillə görüşən Tahir, Bakı haqqında onun hekayətlərini dinləyib, nəhayət getməyə hazırlaşdı.

Gülsənəm arvad oğlunu nə qədər fikrindən daşındırmaq istədisə də, heç bir nəticə çıxmadı. Tahir Cəmillə bərabər Bakıya yola düşdü.

## 4

Gənc fəhlələrin ümumi yaşayış evindəki balaca otaqda səhər tezdən yuxudan qalxan cavanlar, Cəmillə Tahiri bir çarpayıda baş-ayaq yatmış gördülər. Onlar gecə ikən stansiyadan gəlib, axşamdan yerlərinə uzanmış uşaqları yuxudan oyatmadan, küçədəki dirəkdə yanan iri lampanın içəri düşən işığında paltarlarını soyunmuş və səs-sizcə uzanıb yuxuya getmişdilər.

Cəmilin yanında Tahiri görənlər öz aralarında pıçıltı ilə danışır, bu təzə oğlanın kim və haralı olduğu ilə maraqlanırdılar. Qara, sərt saçları geriyə daranmış, sifəti mis kimi qızaran, azca dolğun yanaqları parıldayan, dodaqları nazik, alnı geniş, bığ yeri yenicə tərləmiş Tahir, uzun barmaqlı əllərini nazik yorğandan kənara çıxarmış, döşünün üstündə bir-birinə çarpazlayıb gözləri yarımaçıq halda rahat nəfəs ala-ala yatırdı.

Cavanlar həm Tahirə, həm də pəncərədəki heybəyə baxırdılar. Görünür heybədə, içindəkilərdə onları sahibindən az maraqlandırmırdı. Hər iki gözü möhkəm bağlanmış bu heybədə ya fəsəli, ya da qoz halvası olmalı idi: çoxdan bəri bu otaqda mehriban yaşayan cavan fəhlələr Cəmilin anasının tez-tez yolladığı yağlı fəsəlini, dadlı qoz halvasını yeməmişdilər.

Cəmildən aşağıdakı çarpayıda yatan qarayanız, gödək və şişman oğlan Tahirdən çox heybəyə baxırdı. Cavan fəhlələrin birinci mərtəbədəki balaca bufetinə hamıdan əvvəl girib, hamıdan sonra çıxan bu oğlanın yaman qarınqulu olduğunu bütün yoldaşları bilirdi. O, bəzən axşam dərslərindən gec qayıdanda, bufeti bağlı görüb pərt olar, sonra gəlib yoldaşlarının tumboçkalarını axtarardı. Burada da yeməli bir şey tapmayanda yerinə uzanar, o yanına-bu yanına çevrilərək eşələnərdi. Əvvəllər onun hərəkətlərinə qaqqıldayıb gülən uşaqlar, sonralar buna vərdiş eləmişdilər.

O, həmişə gülə-gülə deyərdi:

– Balaca vaxtı yeməkdən boyun qaçıranda anam məni o qədər döyüb ki, indi əlimə daşdan yumşaq nə düşsə, dinməz-söyləməz ötürürəm. Bax, mənim tumboçkamda yemək olanda kim istəyir yesin, sizdə olanda mən ağına-bozuna baxmayacağam.

Bu oğlanla Cəmilin də arası kök idi. Onu həmişə “Qarın” deyə çağırardı. Əsil adı isə Səməndər idi.

Günlərin birində Cəmil təzəcə nəşr olunmuş kitablardan bir neçəsini alıb gətirəndə, Səməndərin gözləri kəlləsinə çıxmışdı:

– Canım, bu pulları niyə çölə tökürsən?

– Cəmil bu sözlərə yalnız gülməklə cavab vermiş və kitabları səliqə ilə bir-birinin üstünə yığıb, pəncərənin qabağına qoymuşdu. O gündən sonra Səməndər bu kitab xəstəliyi ilə şiddətli mübarizəyə girişdisə də, Cəmil inadından dönmədi. Texniki əsərlər, romanlar, şer məcmuələri balaca otağı ağzına götürdü.

Cavan fəhlələr səhər tezdən işə gedər, axşam məktəbindən boş qalan vaxtlarını isə mütaliəyə sərf edirdilər. Səməndər isə əlində kitab tutub gözlərini sətirlərdə gəzdirəndə belə yenə yemək barədə düşünərdi. Bəlkə elə bunun üçün də indi, səhər-səhər heybəni görəndə onun gözləri siçan marıtlayan həris bir pişik ehtirası ilə parıldayırdı.

O, ağzı sulana-sulana heybəyə baxandan sonra yoldaşına üz tutub pıçıldadı:

– Açıb baxardım, amma qorxuram ki, heybə Cəmilin olmasın. Bu təzə oğlanı tanımıram. Ayıbdır.

Səməndərin yoldaşı onu fikrindən daşındırdı:

– Yaxşı deyil, bəri gəl. Əl-üzümüzü yuyaq, ona kimi də Cəmil oyanar.

Onlar həmişə çarpayılarının baş tərəfindən asdıqları sarı haşiyəli kətan dəsmallarını götürüb eşiyə çıxdılar.

Otağın göy şüşəli pəncərəsindən aydın görünən yay günəşi dənizdən yeni-yeni tülu edirdi. O, indi körükdə qızardılmış dairəvi bir dəmir parçasına bənzəyirdi. Aylardan bəri fit səsinə eyni saatda yuxudan oyanmağa adət etmiş Cəmil, pəncərədən axıb üzünə düşən nazik bir işıq sütunundan gözlərini açdı. Yuxulu-yuxulu otaqdakı çarpayılara baxdı və o dəqiqə Səməndər yadına düşdü: “Qarın yuxudan durub” deyə fikirləşəndə dodağı qaçdı. O cəld qalxıb geyinmək istərkən, istirahət günü olduğunu xatırlayıb pəncərəyə baxdı. İki həftə bundan əvvəl kəndə məzuniyyətə yola düşəndən sonra bir-birinin üstünə qalaqlanmış qəzetlərini gördü, əlini uzadıb onları götürdü və bir-bir gözdən keçirməyə başladı. Bakıya ilk dəfə gəldiyi gündən dəniz buruqlarında işlədiyi üçün, adəti üzrə əvvəlcə öz trestlərinə dair yazılmış qeydləri axtarıb tapar, bunları oxuyanda da həmişə ixtiyarsız olaraq sir-sifətini turşudardı. Dənizdəki qazma işlərinin geriliyi, elə bil hamıdan çox ona dərd olmuşdu. Əslinə baxsan, bu gerilik şəxsən onun qeyrətinə də toxunurdu. Səməndərlə sözü çəp gələndə onu qəzet-kitab oxumamaqda, avamlıqda təqsirləndirən zaman, Səməndər də ona deməyə söz tapırdı: “Sizin

evinizi elə o kitablar yıxıb də. Neçə aydır quyruqda sürünürsünüz” – Səməndər istehzalı bir təbəssümlə gülərək, bununla da mübahisəni kəsər, tumbul əllərini şalvar ciblərinə qoyub, şişman qarnını bir az irəli verər, sonra da otaqda şəstlə var-gəl eləməyə başlardı. Bəzən Cəmildən ağır bir söz eşidəcəyindən və ona daha tutarlı bir cavab verə bilməyəcəyindən qorxduğu üçün, saymazyana bir halda, fışqırıqda “uca barıdan aşaram” havasını çala-çala eşiyə çıxardı. Amma nədənsə bu mübahisələr Cəmilində, Səməndərin də dostluğuna mane olmazdı. Söyüşsələr də, döyüşsələr də nəhayət gecə yatmağa hazırlaşanda bir səmimi baxış və ya bir şirin sözlə bəzən Cəmil onun könlünü alar, bəzən də gödək və tumbul əlini Cəmilin çiyninə vurub gülməklə, Səməndər onu sülhə çağırardı. Beləliklə də, o biri mübahisəyə qədər dostcasına dərsə, teatr tamaşasına, mədəniyyət evindəki yerli həvəskarların müsamirələrinə, fəhlə qəsəbəsində yenicə salınmış parka və ya da dəniz kənarına gedib qayıdardılar. Ancaq təkdənbir mübahisə qəliz olanda, Cəmilin qüruru və xudpəsəndliyi üzündən çox gec barışardılar. Belə hallarda onların qaşqabağı çətin açılardı. Hər ikisi paltarını soyunub yerinə girsə də, bir neçə saat burcuxa-burcuxa qalıb yata bilmirdilər. Ən axırda, gecənin bir aləmində Səməndər buna dözməyib deyərdi:

– Bura bax, ayə, sən nə kinli adamsan? Tutaq ki, mən höcətəm, bəs sənə nə olub?

Bəzən bir-birilərini acı sözlərlə təhqir etsələr də, heç biri ürəkdən küsülü qalmağı bacarmırdı. Mədəndə işə girdikləri ilk həftədən bu balaca otaqda dəruni bir dostluq ittifaqı yaranmışdı. Həm Cəmil, həm də Səməndər öz-özlüyündə bunu etiraf etməsə də, bu səmimi dostluq hissləri gündən-günə artır, qüvvətlənir, ürəklərinin ən gizli guşəsində özünə daimi bir yuva tikir, ətə, qana hopurdu.

Səməndər Cəmilə nisbətən daha sadə və daha mehriban idi. O, yoldaşlarının heç birindən sirrini gizlətməzdi. Lakin Cəmilin, onlara məlum olmayan bir sirri vardı: keçən ilin payızından, dəniz buruqlarında tabelçi vəzifəsində çalışan Lətifəni sevirdi. Haradansa bunu Səməndər duymuşdu və bu xüsusda Cəmilə işarə belə vurmuşdu. Cəmil isə ona sərt cavab verməklə, bir də bu məsələdən danışmamağı ondan tələb etmişdi. O zamandan Cəmilin yanında Lətifənin adını dilinə gətirən olmamışdı.

Cəmil qəzetlərin son nömrələrindən bir neçəsinə göz gəzdirdisə də, trestlərinə dair heç bir şey tapa bilmədi. “Yəqin işlər, pis getmir”

deyə düşünüb sevindi. Səməndərlə sözə gələrkən, həmişə bu nöqtədə məğlub olduğunu xatırladı. Əgər birdən trest kəsirdən çıxmış olsa, bundan sonra Səməndər nədir, heç kim onun qabağında dura bilməyəcəkdi.

Cəmil bunu fikirləşməkdə ikən Səməndərlə yoldaşı Biləndər, sarı haşiyəli kətan dəsmallarla əl-üzlərini silə-silə, yavaşca və səssiz addımlarla, ayaqlarının ucunda yeriyərək içəri girdilər. Cəmil gülə-gülə onları salamladı:

– Ay allah, xoş gördük! Qarın, nə var, nə yox?

Səməndərdən cavab almamış, o biri yoldaşlarının da kefini soruşdu:

– Necəsən, Biləndər? Aşna, kənddə lap ürəyim darıxırdı. Buralarda nə var, nə yox?

– Hələ bir de görüm, heybədəki nədir? – deyə Səməndər dəsmalını qatlayıb çarpayısının başından asdı. – Qorxuram, kənddən də yemək əvəzinə kitab gətirmiş olasan...

Cəmil, Səməndərin heybəni əlləşdirib, içinə diqqətlə baxdığına əmin olduğu üçün, onun üzünə sual dolu, çəpəki bir nəzər saldı:

– Guya açıb baxmamısan?

– Yox, sən öl, yox!

– İnanan daşa dönsün.

– Sənindir?

– Yox, Tahirindir.

Səməndər, ucları bir azacıq qıyıq gözlərini Tahirə zillədi.

– Tahir budur? Onu da mədənə gətirmisən? Bəs sazı hanı? Sən ki deyirdin, o aşıqdır?!

– Gətirmədi, Bakı döşünə yatsa, sifariş eləyib gətirdəcək.

Onlar əvvəlcə yavaşcadan, pıçıltı ilə danışdıqları halda, bir az keçəndən sonra özləri də fərqinə varmadan səslərini ucaltdılar. Otağı səs-küy basdı. Söhbət müxtəlif səmtlərə baş alıb getsə də, Səməndər yenə heybə və əl çamadanındakı yemək şeylərindən təkrar söz açdı, qarnını sığallaya-sığallaya gülümsəyib, mənalı bir tərzdə Biləndərə göz vurdu. Cəld yerindən qalxıb paltarını geyən Cəmil, çamadanından üstü naxışlı yağlı çörəyi və soyutma ət parçalarını bir-bir çıxarıb, ortadakı dördkünc və balaca stolun üstünə sərəndə Səməndərin gözlərinə işıq gəldi. O, ətdən və çörəkdən iştaha ilə yeyə-yeyə otaqda var-gəl eləyir, dabanı nallı zorba çəkməsilə çoxdan rəngi getmiş döşəməni

taqqıldadırdı (deyəsən döşəmədəki kələ-kötürə də səbəb onun nallı çəkmələri idi).

– Əyə, səndən başqa da yeyən olacaq, bir az qənaət elə! – deyə Biləndər dilləndiyi zaman, Səməndər kefi-damağı kökəlmiş halda ucadan güldü.

Onun səsinə yuxudan oyanan Tahir, səksənmiş kimi, bir an donuxub baxdı və tez özünü toplayıb harada olduğunu xatırlayanda qımışdı. Onun sıx, inci dişləri göründü.

– Xalaoğlu, məni bağışla, deyəsən səni yuxudan kal oyatdım. – Səməndər Tahirdən üzr istəyib, sadəlövh bir səmimiyyətlə qıyıq gözlərini ona dikərək baxdı və bir neçə anlıq sükutdan sonra əlavə etdi:

– Bakının hər şeyinə varam, amma, doğrusu, nənəmin yağlı bozartmalarından tapa bilmirəm ki, bilmirəm.

Cəmil, yoldaşının belə şirin-şirin yeməyindən ləzzət alırmış kimi, geniş açılmış gözlərilə ona bir xeyli baxıb soruşdu:

– İndi də doymadın?

Səməndər narazı halda Cəmilə nəzər saldı, başını ağır-ağır yırğalayıb cavab verdi:

– Bax, bu olmadı, balam.

Cəmil onun sifətində elə bil bu sözləri oxudu: De ki, bunların hamısını çamadandan təkcə sənin üçün, məhz sənin üçün çıxarmışam.

Cəmil onun könlünə dəymədi:

– Hamısı sənindir. Ancaq inanmıram yeyib qurtara biləsən, – dedi.

Səməndər özünü unudub birdən-birə uşaq kimi sevindi və sağ əlini açıq halda irəli uzatdı:

– Nədən mərc gələk?

– Əgər bunların hamısını yeyə bilməsən, gərək "Qurbanəli bəyi" oxuyub, məzmununu mənə danışasan. Razısan?

Cəmil də öz şərtindən razı qalaraq şəstlə əlini irəli uzatdı. Səməndərin ətli və yumşaq ovcuna çırpdı.

Səməndərə dair Cəmildən çox söz eşitmiş Tahir isə qollarını boynunun ardında çarpazlayaraq, dodaqları bir-birindən azacıq aralanmış halda, kirpiklərini qırpmadan onlara baxır, öz-özünə deyirdi: "Yeyəcək, o bu kitabı oxuyub özünə zəhmət verər?

İndi hamının gözü Səməndərdə idi. Cəmillə Biləndər hələ qəti bir fikrə gəlməmişdilər, amma Tahir nədənsə onun mərci udacağına inanırdı: "Əlbəttə yeyəcək".

O, bu fikirlə də çarpayıdan ayaqlarını salladı, paltarını geyindi, dünən gecə vaqonda Cəmilin əlindən yerə düşüb qırılan darağın parçası ilə uzun və sərt saçlarını geriyə daradı.

İndi cavanlar maraq və intizarla Səməndərə baxıb dinmirdilər. Bir azdan sonra Cəmil qayğıkeş və ciddi bir ifadə ilə əlini Səməndərin çiyninə qoydu:

– Aşna, mərci udmağın cəhənnəm, qorxuram kəkliyin aza, axırda da günah mənim boynumda qala.

Səməndər də, elə bu sözləri gözləyirmiş kimi, sevinə-sevinə:

– Bura bax, Cəmil, – dedi, – yalnız indicə fikirləşdiyi sülh maddəsinin təsirini artırmaq və Cəmilin ürəyini yumşaltmaq üçün dişlərini ağarda-ağarda səssizcə güldü: – mərc gələndə bu şərti kəsməmişdik, de görüm su içmək olar, ya yox?

Tahir əllərini havada oynadaraq rədd işarəsi verdi və çox yeməyə suyun mane olmadığından ziyadə, Səməndərin mərci uduza biləcəyi ehtimalı ilə razılaşa bilmədi:

– İçmə, içmə! – deyə yerindən qışqırdı:

Cəmil, Tahirin tamam əksinə, bu yolla mərci uduza biləcəyindən qorxuya düşüb etiraz etdi:

– Yox, yox razı deyiləm!

– Aşna, deyəsən daha boğazımdan ötmür... – deyə Səməndər yenə duruxdu, təngnəfəs halda gözlərini Cəmilə zilləyib boynunu azacıq yana sarı əyərək, ondan mərhəmət diləyən bir ifadə ilə baxdı. – Vallah, mənim adım çıxıb. Yaxşı deyiblər ki, çaqqal var gödən dağıdır, qurdun adı bədnamdır. Vallah, mənim köklüyüm çox yeməkdən deyil. Axı, mən hansınızdan çox yeyirəm? Ona görə belə kökəlmişəm ki, ürəyim tərtəmizdir.

Cəmil, artıq qalib gəldiyinə zərrə qədər də şübhə etmədən, cəld bir hərəkətlə çarpayısının başından üz dəsmalını götürüb kəmər kimi belinə bağladı, yaşıl rəngli sabunqabını, sərt tüklü diş şotkasını və dördkünc diş paraşoku qutusunu götürüb otaqdan çıxdı.

O geri qayıdan kimi Səməndərdən tez-tələsik soruşdu:

– Hə, nə oldu?

Səməndər kəsik-kəsik nəfəs ala-ala əllərini yuxarı qaldırdı:

– Qardaş, mən təslim! – dedi.

Hamı gülüşdü. Cəmil əlini Səməndərin çiyninə qoyub dedi:

– Günah səndə deyil. Ət də, çörək də çox yağlı idi.

Otağa sükut çökdü. Lakin üzlərdəki təbəssüm xeyli müddət silinib getmədi. Tahir gözlərini Səməndərdən çəkmir, onun rəhmdil, ürəyi saf bir cavan olduğunu hiss edib, könlündə ona isinişməyə başlayırdı. Tahir elə uşaqlıqdan bu cür oğlanlarla dost olmağı arzulayırdı. Onun fikrincə Səməndər kimi cavanlar həmişə başqasının xoşbəxtliyini istər, qəlbində kin saxlamağı bacarmaz, yeri düşəndə əlindən gələn yaxşılığı da əsirgəməzdi.

Tahir bu barədə fikirləşirdi ki, Cəmil Səməndərdən aralandı, dəsmalını çarpayısının başından asanda bir az əvvəl baxdığı qəzetlərə gözü sataşdı. O, birdən hər şeyi unudub trestlərini xatırladı, Səməndərə üz tutdu:

– Hə, bir danış görək buralarda nə var, nə yox? Usta Ramazanı görməmisən? Trestdə işlər necə gedir? Daha qəzetlərdə – bizi söymürlər?

Səməndər, söhbətin dəyişdiyinə sevinmiş kimi o dəqiqə cavab verdi:

– Trestimizə təzə müdir yollayıblar. Famili, gərək ki İsmayılzadədir. Deyəsən bərk başlayıb. Hamı tərifləyir, balam... Dünən axşam usta Ramazan bura gəlmişdi. Səni xəbər alırdı. Dedim: “Bu gündə-sabahda qayıdar”. Qiyamət kişidir, balam...

Qoca buruq ustası Ramazanın adı çəkiləndə, Cəmil ən çox sevdiyi bir adama dair şad xəbər dinləyən kimi oldu və onun gözlərində sevinc qığılcımı parıldadı.

Usta Ramazan Bakı mədənlərində çoxdan bəri tanınmış bir adam idi. Abşeron yarımadasında onun ayağı dəyməmiş bir yer göstərmək çətin idi. Nisbətən az təcrübəli buruq ustalarının işi çətinə düşəndə, onun yanına məsləhətə gəlirdilər. O, torpağın sirrini öz ürəyinin sirri kimi bilirdi. Heç bir təhsili yox idi, amma uzun illərin təcrübəsi sayəsində Suraxanı neft təbəqəsini Ramanı təbəqəsindən gözüyumulu fərqləndirə bilərdi. Onun barəsində qəribə bir əfsanə uydurmuşdular: guya ağır bir xəstəlikdən ölüm yatağına düşəndə yoldaşlarından xahiş edir ki, harada neft tapılmırsa, onu mütləq orada basdırsınlar. Xəbər alırlar: “Niyə?”, cavab verir ki, “Mənim ayağım dəyən yerə o dəqiqə neft axıb gəlir”. Həmin əfsanəni Ramazanın özünə söylədikləri zaman o gülə-gülə demişdi: “Bunun harası yalandır? Mən hələ su vuran quyu qazmamışam”. Doğrudan da o, buruq ustası olandan bəri qazdığı quyulardan heç birinin boşa çıxdığını görməmişdi. O, yalnız usta kimi deyil, həm də köhnə inqilabçı kimi məşhur idi. O, Stalinlə bir yerdə işləmiş, dəfələrlə həbsə düşüb-çıxmışdı.

Cəmil, dəniz buruğunda daima qaşqabaqlı görünən bu qocanın, əslində mehriban və ürəyi nazik bir adam olduğunu əvvəllər dumanlı bir şəkildə hiss edirdisə də, təxmininin doğru çıxdığına sevindi.

– Hə, nə dedi usta?

– Dedi ki: "Qorxuram Cəmil qayıtmasın". Oturub xeyli söhbət elədi. Yaman xoşuma gəldi, balam. Ötən günlərdən danışırdı. Nə yaman dünya görmüş qocadır! Çıxıb gedəndə məndən xahiş elədi ki: "gəldiyimi ona deməyəsən"

– Niyə ki? – deyə Cəmil qaşlarını təəccüblə qaldırıb soruşdu.

– Yəqin elə fikirləşir ki, qudurarsan, iş vaxtı boynuna minərsən... Bizim ustamız da yaxşı adamdır. Amma buna çatmaz, balam.

Cəmil sükut edib gözlərini yerə dikdi və öz-özünə fikirləşdi: "Hər adamı usta Ramazana bərabər tutduğuna bax!" – Səməndərin təriflədiyi usta ilə Ramazanı yanaşı halda təsəvvürünə gətirdi: "İnsafən o da yaxşı adamdır" – deyə ürəyində etiraf etdi və yenə trestdən söz saldı:

Sən özün onu heç görməmisən?

– Yox, görməmişəm. Əvvəlləri ayrı trestdə imiş. Sən gedəndən bircə həftə sonra yollayıblar.

– Deyirsən bizə təzə müdir yollayıblar, hə? Deyirlər ki, camaatın əlini-ayağını yaman yığışdırıb, balam. Qəzetlər xətrinə dəymir. Yəqin hələ təzədir, ona görə. Görünür vaxt verirlər də... Əgər işləri yoluna salmasa, bir azdan onun da eni ilə uzununu bərabər eləyəcəklər.

Cəmil səbirsizliklə yoldaşının sözünü kəsdi:

– Plan nə təhərdir, plan? Mən gedəndə altmış faiz idi. İndi artıb, əskilib?

– Dum-dum halvasıydı məgər? Sən deyirsən on gündə möcüzə icad eləsin?

Tahir bu sözlərdən darıxıb Cəmilə üz tutdu.

– Əlimi-üzümü harada yuyum?

Cəmil üz dəsmalını və sabunqabını götürüb ona verdi:

– Gedək, göstərim.

Onlar uzun, ensiz dəhlizə çıxdılar, Hər iki tərəfdə mehmanxana nömrələrini xatırladan otaqların bir-birinə bənzəyən qapıları yanından ötüb, o başdakı duş otağına girdilər. Burada qabaq-qabağa üç metr uzunluğunda iki əlüzyuyan qoymuşdu. Hərəsinin beş kranı vardı. Bəzilərindən damcı-damcı, bəzilərindən isə şırıltı ilə su tökülürdü.

Kənddə səhər-səhər özünü şəlalənin altına verib buz kimi bulaq suyunda çimməyə öyrəşmiş Tahir, bir-bir əlüzyuyana yanaşan və ara-

larında nə isə deyib-gülüşən cavan fəhlələrin yanında bu vərdişini təkrar etməkdən utanaraq, köynəyinin qollarını dirsəyinə qədər çırmayıb əl-üzünü yuyandan sonra dəsmalın bir ucunu isladıb boynunu, boğazını və sinəsini bərk-bərk sürtüb qızartdı. Onu ilk dəfə görən cavanların təəccüb ifadəsi ilə parıldayan baxışları altında duş otağından çıxıb Cəmilgilin yanına qayıdanda, Cəmil stolun dalında oturub çörək yeyir, arxası üstə çarpayıda uzanaraq çətinliklə nəfəs alan Səməndərə baxıb gülə-gülə deyirdi:

– Mən ölü, siz qalı, onun başına nə gəlsə, qarından gələcək. Bura bax, Səməndər, mərcləşəndə bir şərti də unutduq. Yaxşı, sən "Qurbanəli bəyi" neçə aya oxuyub qurtaracaqsan?

– Daha, onu özüm bilərəm, balam. Keçi can hayındadır, qəssab piy. Mən ölürəm. Deyəsən zəhərlənmişəm.

– Bunun bircə dərmanı var. Dur bir də ye. Bilirəm, səndən kitab oxuyan olmayacaq.

Səməndər bu kitab söhbətindən lap təngə gəldi.

– Eh, bəsdi, mən ölüm. Oxudum oldum sən, bunun xeyri nədir, axı?

– Xeyri? Çox xeyri var. Əgər kitab oxusaydın, bilərdin ki, çox yeməyin cibə ziyanı var.

Bunu deyib şaqqıltı ilə gülən Cəmil, nəhayət stolun arxasından qalxıb Tahirə yanaşdı:

– Tez ol, çörəyini ye! Bu gün trestə gedək, sənin məsələni danışaq, – dedi və tumboçkanın aşağı gözündən bozumtul çəkmə şotkasını çıxarıb, bayırda çəkməsinin tozunu aldı. O içəri girəndə, Səməndər təzə bir xəbər də söylədi.

– Hə Cəmil, dünən Lətifəni gördüm. Parkda gəzirdi. Lap yaxından baxdım, yaman xoşuma gəldi, balam. Ancaq yanında bir oğlan da vardı. Deyəsən qız böyük yerdən yapışıb. Əşi, sən fəhlə babasan, əlin qabarlı, üst-başın da mazutlu. O yəqin incinardan-zaddan axtarıb tapar.

Cəmil, dostunun bu yersiz zarafatını bəyənmədi. Lətifə barədə heç də düşünmədiyini və ona qarşı könlündə ən cüzi bir meylin də olmadığını bütün otaqdakılara bir də hiss etdirmək istədi:

– Əşi Lətifənin mənə nə dəxli? Allah vara lap gedib özünü dənizə atsın. Amma mənim fəhləliyimə, nahaq sataşırsan ha? Bu il fəhləyəm, canıma cəfa basıb oxuyaram, beş-altı ildən sonra olaram mühəndis. Bunun da bir çətinliyi var? Hələ heç on səkkiz yaşım tamam olmayıb...

– O, duruxdu və Səməndərin sözləri Tahiri həvəsdən salmasın deyə əlavə etdi: – Mədəndə işləməyin bir faydası da budur ki, sən bir yerdə ayaq döymək istəsən də olmur, gərək öyrənəsən, irəli gedəsən. Burada işlər qəribə qurulub; sən istəsən də, istəməsən də oxumağa, öyrənməyə məcbursan.

Süfrədəki ət parçalarından birini götürüb yağlı çörəklə yeyən tahir Cəmilin yavaş səslə, lakin inam və ehtirasla dediyi bu sözləri dinlədikcə, kənddən buraya nahaq gəlmədiyinə sevinir və adamların irəliyə getmələri üçün yaranmış bu müsaid şəraiti özünə daha xoş gələn bir halda təsəvvürünə gətirirdi: "Yaxşı oldu gəldim. Kənddə qalıb maldarlıq eləməkdən nə çıxacaq? Bu saat ala-yarımçıq biliklə nə eləmək olar? Məktəb burada, müəllim burada..."

Ancaq birdən nədənsə, Tahirə elə gəldi ki, Cəmil bu sözü qəsdən onu həvəsləndirmək üçün deyir, əslində isə yəqin mədəndəki işdən-gücdən adamın bir dəqiqə də başı açılmır.

Cəmil də onun ürəyində bu iki zidd fikir arasında gedən mübahisədən xəbər tutmuş kimi, sözünə davam edib dedi:

– Hələ bizim ustanı yaxşı tanımırsınız. Yazığın fikri-zikri hey şagirdlərindədir. Əlindən gələni əsirgəmir. Özü nə bilirsə, bizə də öyrədir. Bəzi ustalar var ki, paxıllıqdan şagirdlərinə bir kəlmə də ağzını açıb deməz. Doğrusu usta Ramazan onların heç birisinə oxşamır.

Tahirin qəlbində yenə birinci fikir üstün gəldi:

"Yaxşı oldu. Peşman deyiləm", – deyə düşünüb ayağa qalxdı.

– Gedək, Cəmil, – dedi, – görəsən bu gün trestdə adam tapa biləcəyikmi?

Cəmil başının hərəkətilə təsdiqləyib cavab verdi: – Taparıq, taparıq. Başqası olmasa da trest müdirləri olar. Dava vaxtı istirahət gününü ləğv eləyiblər, indi də elə həmişə trestdə olurlar.

Bu anda qapı döyüldü:

– Gəlmək olar?

Bir oğlanla bir qız içəri girdi. Hər ikisi otaqdakıları salamladı.

– Oturmaq olar?

Onlar qapını döyəndən sonra izin istəyib cavab almamış içəri girdikləri kimi, ikinci suala cavab almamış da oturdular.

Tahir yerində hərəkətsiz dayanıb onlara baxır, mədənin rəsmi işçisi olduqlarını güman edirdi. On altı-on yeddi yaşlarında, qamətli, xurmayısaç, uzun hörükləri dalından topuğuna qədər sallanmış, əlində

“C.Cabbarlı” kitabını tutmuş qız, utancaq tərzdə gözlərini yerə zilləmişdi. Ancaq o, Tahirin baxışlarını öz üzündə hiss edir və başını yuxarı qaldırmağa elə bil cəsarət eləmirdi. Onunla gələn oğlan isə əlindəki iş qovluğunu stolun üstünə qoyub gah Cəmilə, gah Səməndərə, gah da Tahirə baxırdı. O, saçlarını maşında vurdurmuş, bığ yerində nazik bir xətt qoydurmuş, arıq, uzun və bozumtul üzünü yenicə qırxdırmışdı.

– Hə, uşaqlar, – deyə o hamıya müraciət elədi, – heç yaxşı iş görmürsünüz...

– Nə olub ki?

Heç kəs dillənmədi, amma hamının gözlərindən bu sual oxundu.

Belə getsə, heç kim sizə leksiya deməyə gəlməz.

– Axı nə olub? – deyə Səməndər soruşdu.

– Daha bundan artıq nə olacaq? Beynəlxalq vəziyyətdən məruzəçi yollayırıq, o qədər üstünə düşürsünüz ki, yazıq gəldiyinə peşman olur...

Yan tərəfdə çarpayısına söykənmiş Biləndər tab gətirmədi:

– Bilirsən, yoldaş Dadaşlı, sən gərək razı olmayasan ki, bizə yanlış fikirli adam gəlib leksiya deyə...

– Nə yanlış? – Dadaşlı boynunu yana əyib təəccüblə Biləndərə baxdı.

– Başlayıb ki, Qızıl Ordu müttəfiqlərin ciddi köməyi sayəsində qalib gəldi. Biz də ona dedik ki, əgər müttəfiqlərdə kişilik vardırsa, niyə əvvəldən kömək eləmirdilər? – Biləndərin iri gözləri qəzəblə parıldadı. – Mənim beş qardaşım gedib, özüm də gecə-gündüz mədəndə can qoymuşam. Heç insafdır ki, biznən ingilisə təfavüt qoyulmasın? Mən etiraz elədim, lektor başladı ki, müttəfiqlərin rolunu danmaq olmaz. Axı onlar neyləyiblər ki, danırıq?

Biləndər əsəbi halda Dadaşlıya yanaşdı. Elə bil o, qarşısında leksiya deyən adamı görür, dünən axşamkı mübahisəni yenidən təkrar etmək istəyirdi.

– Heç vaxtı razı olmarıq ki, bizi savadsız bilib ağızlarına gələni desinlər. Çörçildən bizə dost olar? O ki, köhnə qurddur. Görmədin necə İtaliyadan yuxarı gəlirdi? Bunu elə nənəm də bilirdi ki, Balkanları caynağına keçirmək istəyir. Yoxsa niyə ikinci cəbhəni açmırdı?

Dadaşlı onun coşduğunu görüb sözünü kəsdi:

– Bilirəm, bilirəm. Bu barədə raykomda danışaram, bir də elə qələti eləməz. Biz indi ayrı işdən ötrü gəlmişik. Sosyarışın nəticəsini

yoxlayırıq. Axşam saat səkkizdə klubda olarsınız. Hə, Cəmil, kənddə nə var, nə yox?

– Sağlıqdır... Elə orada da bərk başlayıblar. Bizim kənd qonşu kəndin "Marks" kolxozunu yarışa çağırıb. Bu il gərək cins heyvanların sayı birə iki artsın... Bizim Tahirlə tanış deyilsən? Onu mən gətirmişəm.

Dadaşlı yenə Tahirin üzünə baxdı:

– Burada işləmək istəyir? Nə olar ki? – dedi.

Tahir onun sərt baxışlarını heç bəyənmədi. Komsomol təşkilatçısı elə bil nə üçünsə Tahiri hədələyən bir ifadə ilə baxdı:

– Davadan sonra bizə çoxlu kadrlar lazımdır... Hə, yoldaş, komsomolda varsan?– deyə Dadaşlı birdən oturduğu yerdə qurcalandı.

– Bəli, varam.

Tahir də bu sözü komsomol təşkilatçısı kimi sərt və rəsmi dedi.

– Niyə belə tərs cavab...

– Tərs niyə? – deyə Tahir onun sualını yarıda kəsdi.

Lətifə bir anlığa başını yuxarı qaldırıb, tez də aşağı saldı. Tahirin nəzərindən qızın bu ani hərəkəti də yayınmadı. Lətifənin uzun kirpikləri arasından baxan iri gözləri, onun çox xoşuna gəldi. Əgər Tahir köhnə aşıqlar kimi gözəllərə söz qoşsaydı, Lətifənin xurmayı gözlərini bir cüt piyaləyə, uzun, gur hörüklərini isə kəməndə bənzədərdi.

– Komsomol işini gətirmisən?

Dadaşlı Tahirin qıza dikilmiş nəzərindən qısqanmış kimi səsini bir az da sərtləşdirdi.

Lətifə, Tahirdən cavab almamış deyilən bu sözlərə, elə bil, təəccüb edərək, diqqətlə Dadaşlıya nəzər saldı.

– Birdən heç bizim mədəndə qalası olmasa da? – deyə soruşdu.

Qızın ötkün səsində xəfif bir titrəyiş vardı. Lakin Tahir bunu duya bilmədi: fikri yalnız Lətifənin boyasız dodaqlarında idi.

– Niyə qalmır? – deyə Cəmil sözə qarışdı. – Bir azdan trestə gedirik. Bəs demirlər kadr lazımdır?

Tahir də sözə qarışdı:

– Axı, mən komsomol işimi hələ gətirməmişəm.

Lətifə ilə Tahirin gözləri bir-birinə sataşdı:

– Elə isə bu gün yaz, tələb elə!..

Tahir Dadaşlıya baxmadı: "Sən deməsən də bunu mən bilirəm" – deyə düşündü və Lətifənin yenə aşağı dikilən gözlərinə baxmaqda

davam etdi: "Görəsən bu qız həmişə buralara gəlib-geldəcək?" – deyə öz-özündən xəbər aldı.

– Ay uşaqlar, bu axşam mədəniyyət sarayında "Arşın mal alan" filmi göstərilir. Hamınıza bilet almaq istəyirik. Kim gedir, desin yazım... – Lətifənin utancaq baxışları xeyli müddət otaqdakı cavan fəhlələrin üzündə gəzdi və o, Tahirin geniş açılmış gözlərini bir də görəndə kirpiklərini aşağı saldı, öz-özündən soruşdu: "Bu niyə belə baxır?".

– Məni yaz.

– Məni də yaz.

– Məni də...

Yalnız Tahirdən səs çıxmadı. Lətifə ona üz tutdu:

– Bəs siz?

– Mən də. Bir dəfə görmüşəm. yenə görmək istəyirəm.

Lətifə hamını siyahıya yazdı:

– Sizin adınız nədir? – Tahirdən soruşdu.

– Tahir

– Tahir?

Qızın sualındakı təəccüb nidası Tahirin də təəccübünə səbəb oldu:

– Pis addır.?

– Niyə pis olur.? Birisi gün də "Tahir və Zöhrə" filmi olacaq.

– Hə, bax, onu görməmişəm. Amma dastanı əzbərdən bilirəm.

– Elə dastan var? – deyə Lətifə balaca bir uşaq marağı ilə xəbər aldı.

– Var. Özü də lap çoxdanın dastanıdır. Mənim rəhmətlik babam danışardı. Azərbaycanda hansı aşıqdan soruşsan əzbər deyər.

Cəmil bu söhbətə qəribə bir ürək çırpıntısı ilə qulaq asır, Səməndər isə altdan-altdan qımışıb dinmir, gec gəlib tez öyrənən Tahirin qələbəsindən Cəmilin nə hala düşdüyünə diqqət yetirdi: "Aşnam bir yerdə dincələ bilmir, bax, bax, gör nə fısıldayır!.."

Bu anda Dadaşlı ayağa qalxdı:

– Doğrusu, bərk yorulmuşuq. Gecə növbəsindən indicə qayıdırıq.

– Yaman gerisiniz, öz aramızdır... – deyə Səməndər arada komosomol təşkilatçısının işlədiyi mədəni pislədi.

– Mənim briqadam planı dörd yüz faiz doldurur.

– Bir gülnən bahar açılmaz...

– Görək də. Cücəni payızda sayarlar... Gedək Lətifə, o biri yoldaşlara da xəbər verək.

Onlar qapıya yanaşanda Tahir bir də diqqətlə Lətifəyə baxdı: "Yaxşıca qızdır" deyə sürətlə xəyalından keçirtdi.

– Gedək, Tahir, – deyə Cəmil də ayağa qalxıb dostunun qoluna girdi.

"Yaxşıca qızdır" deyə bir də düşünən Tahir, Lətifənin xəyalından ayrılmadan, elə bil, qeyri-ixtiyari Cəmilin dalınca eşiyə çıxdı.

– İndi İsmayılzadə yerində olarmı?

Tahirin sualına dəhlizlə gedən Dadaşlı cavab verdi.

– Bu saat maşınla buruqdan qayıdırdı...

**5**

Cəmillə Tahir trest idarəsinə gələndə, müdirin qəbul otağında, stol arxasında oturub kitab oxuyan rus qızından başqa heç kimi tapa bilmədilər. Sarı saçlarını başının ortasında yumurlamış, mavi iri gözlərilə mehriban bir tərzdə baxan, nazik əndamlı bu qız, trest müdirinin katibəsi idi. O, Cəmilin sualına cavab olaraq bildirdi ki, "Qüdrət yoldaş bir az bundan əvvəl gəlmişdi, ancaq işi olduğu üçün yenə maşına minib hara isə getdi. İstəyirsiniz gözləyin. İndi saat on birdir. Özü dedi ki, harada olsam, iki saatdan sonra mütləq qayıdacağam". – O, Cəmillə Tahirin, nə isə, ciddi bir məsələ üçün gəldiklərini yəqin edib, stol üstündəki bloknotunu götürdü. – Siz telefonunuzu verin, gələn kimi sizə xəbər verərəm.

Lakin Cəmil qızın bu ehtiramına qarşı təşəkkür elədi:

– Çox sağ olun, niyə sizə zəhmət verək? Özümüz bir də gələrik.

Tahir yeddiillik məktəbdə rus dilini o qədər də yaxşı öyrənmədiyindən, bu qızın tez-tez dediyi sözləri aydın başa düşə bilmədi. Amma, doğrusu, katibənin yumru sifəti, danışanda inci kimi parıldayan xırdaca ağ dişləri Tahirin çox xoşuna gəldi. Cəmil dostunun qolundan tutaraq:

– Gedək, – dedi, – trest müdiri qaydanacan da biz şəhəri gəzib dolanarıq.

Onlar ikinci mərtəbədən enib, ortasında gül-çiçək, göy-göyərti əkilmiş və dövrəsi məhəccərlənmiş asfaltlı həyətə düşəndə, isti sentyabr günəşi hələ dəniz üzərindəki saf, mavi səmada üzürdü. Hava sakit və bürkülü idi. Yalnız arabir dənizdən əsən xəfif meh bu bürkünü dağıdır, həmişə sərin dağ havasına öyrənmiş Tahirin tərli alnını sərinlədirdi. O, fikirli-fikirli Cəmilin üzünə baxır, "işdir, birdən qəbul

eləməsələr, kənddə biabır olacağam" demək istəyir, ancaq könlündə dolanan bu şübhəni tez də özündən rədd etməyə çalışır, Cəmilin yanında qürurunu pozmurdu.

Trest idarəsinin yanından uzanıb gedən asfalt yol sola tərəf əyilərək, yoxuşa qalxır və dostlar irəlilədikcə, Bakının sahilə bitişən tərəfi aydın görünməyə başlayırdı.

Tahir gözlərini dolandırıb uzaqdan-uzağa sahilə baxanda, tünd mavi tüstü buraxaraq limandan uzaqlaşan böyük bir gəmi gördü.

– Cəmil, – dedi, heç paroxoda minmisən?

– Yox, minməmişəm. Ancaq keçən il bizim ustanı yola salanda gördüm. Bilirsən, gəmiyə minib nə ləzzətli səyahət eləmək olar? Davadan qabaq hər gün buradan Volqa səyahətinə yüzlərcə adam gedirmiş. O gəmilərdə can dərmanı da desən varmış. Kino, musiqi, tans. Yemək, içmək də öz qaydasında. Dava başlanandan sonra gəmilərin hamısı hərbi sursat daşıyırdı. Qoy bir az işlər öz yoluna düşsün, yenə də səyahət üçün gəmilər işləyəcək. Mənim gəzməyə yaman həvəsim var. Dünyanın yarısını görürsən...

– Yaxşı, bəs ustanı hara yola salırdın ki? – deyə Tahir ayaq saxlayıb soruşdu.

– Onu Aşqabada çağırmışdılar ki, Türkmənistan neftçilərinə təzə qazıma üsulunu öyrətsin. Bakıdan çox adam gedirdi. Axı bizim ustalar o birilərindən çox bilir! Nöyüt Allahı bizik. Usta Ramazandan türkmənlər çox razı qalıblar. Qəzetlərdə hər gün şəklini çap eləyirlərmiş. Qocalığına nə baxırsan? Çoxlarının arxasını yerə qoyub...

Cavan dostlar bir müddət kiriyib, sahil boyunu süzməyə başladılar. Dəniz sakit və ləpəsiz görünürdü. Günəş sularda üzür, cavanların gözünü qamaşdırırdı.

– Bax, dünən axşam Qaraşəhəri, Bayılı soruşurdun, – deyə Cəmil yoxuşun qurtaracağında dayandı və yarımdairə halında dənizin boynuna dolanan şəhərə geniş bir nəzər saldı. O, həmin yarımdairənin o biri başına yaxın, uzun bacalarından qatı tüstü buraxaraq, açıq mavi səmanı dumana qərq edən zavodları göstərdi. – Qaraşəhər odur! – dedi. – Zavodlar istirahət günlərində də işi dayandırmır.

– Tahir maraqlandı:

– Niyə ki?

– Necə niyə? Əgər dayandırsa, onda mədənlərdən çıxan nefti təmizləyib çatdıra bilməz. Bu saat hər dəqiqəyə söz var. Camaat elə fikirləşirdi ki, dava qurtardı, daha başının altına yastıq qoyub yata

bilərsən. Amma, bizim usta demişkən, əsil kişi bu dünyada yox, o dünyada yatar.

Tahir dinməz-söylənməz dinləyir, gün işığında dünənkindən qat-qat əzəmətli görünən şəhər üzərində təəccüb və heyrətdən böyümüş gözlərini dolandırır, udqunurdu.

– Bəs Bayıl hanı? – deyə o, Cəmildən soruşanda, dostunun bu suala gülməyi tutdu:

– İndi biz Bayılın düz ortasındayıq! – dedi. – Buradan bu yana mədənlər başlayır, bu yanda gördüyün hündür evlər də Bayılın üstündədir. Təpənin döşündəki tək ağacı görürsənmi? Bax, o püstə ağacı usta Ramazanın həyətindədir. O ağac, sahibindən ikiqat qocadır, düz yüz iyirmi yaşı var, amma püstəsinə söz ola bilməz. Mən bir dəfə ustanı çağırmağa getmişdim. Gördüm bütün ağac qıpqırmızıdır. Yaxından baxanda elə bil ağacın üstündə mərcan dənələri asılıb... İndi yəqin usta meyvəsini dərib. Abşeron doğrudan da qəribə yerdir. Susuzluqdan yerin bağrı çatlayır, amma elə meyvələr yetirir ki, elə bil möcüzədir. Üzümünə, əncirinə nə deyirsən? ...Gəl, trest müdirimiz qayıdanacan tramvaya minib şəhərə gedək.

Tahirin könülsüz addımladığını görəndə, Cəmil bunun səbəbini xəbər aldı:

– Yoxsa şəhərdən gözün doyub? Nə belə tez?

– Yox canım, yaxşı olardı ki, əvvəlcə biləydik, görək məni qəbul eləyirlər, ya yox.

Cəmil dostunun belə ürəkdən işləmək istədiyinə sevindi:

– O barədə arxayın ol, – dedi, trestdə razı olmasalar, ustanın özünə deyərik, o saat düzəldər. Bilirsən necə nüfuzu var? Bir sözünü iki eləməzlər.

Tahirin ürəyi yenə də rahat olmadı. Tramvaya minib şəhərin mərkəzində, Azərneft binası yanında yerə düşüncəyə qədər bu xüsusda həyəcanla düşünürdü: “Bütün kənd mənim Bakıya gəlməyimdən xəbər tutdu. Düzəlməsə tay-tuşumun üzünə baxa bilməyəcəyəm...” – Tahir Cəmillə bərabər dəniz kənarından köhnə bulvarla aşağıya tərəf yeriyərkən də bu intizarlı fikirlərdən ayrıla bilmirdi: “Bəs anam nə deyər? Hələ kolxoz sədri... Durub-oturub başlayacaq ki, yaxşı oğlan olsaydın, Bakıdan üzüqara qayıtmazdın”.

– Tahir, nə olub belə, yoxsa gəlməyinə peşmansan?

– Mən? – Tahir acı-acı gülümsündü. – Bir saat keçib, yox? Yəqin trestin müdiri qayıtmış olar, hə?

Onlar dənizin lap sahilinə gəlib çıxdılar. Yağlanmış su dalğalandıqca göy qurşağı kimi rəng verib-rəng alırdı. Tahir, divar kimi hörülmüş sahildə dayanıb, şırıltı ilə daşlara dəyərək geriyə qayıdan mazutlu sulara baxdı:

_Bu niyə belədir? – deyə soruşdu: – Bəs hər yerdə yazırlar ki, Xəzər dənizi dünyanın ən mavi dənizidir?

– Gəl, əsil dəniz suyunu sənə göstərim... – Cəmil Tahiri gəzinti qayıqları dayanan körpüyə sarı çəkdi.

Tahir başını buladı və son dərəcə mühüm bir fürsəti əldən vermək qorxusu duyan adamlar kimi, tez-tələsik Cəmili geriyə dartdı:

– Yox, yox, sonra gəlib baxarıq. Gedək!

_Tələsmə, Tahir, mən sənə söz verirəm ki, buruğa sabah axşam, gecə növbəsinə bir yerdə gedəcəyik. Axı niyə bu qədər darıxırsan? Bəri gəl, bəri gəl!

Onlar bir-birini dartışdıranda yanlarından gəlib-keçənlərin baxdıqlarını görən Cəmil əlini Tahirdən çəkdi. Bu zaman körpü yavaş-yavaş dolmağa başlayırdı. Müharibə illərində bir dəfə də olsun dəniz gəzintisinə çıxmamış adamlar indi hər gün qayıqlara minir, burada mahnı dinləyərək, bəzən də qayıq içərisində rəqs edənlərə əl vuraraq, sahildən iki-üç kilometr aralanmayıncaya qədər geri qayıtmağa razı olmurdular.

– Bəri gəl, Tahir, – deyə Cəmil yenə dostunu çağırdı. – Qayıqda çalıb-oxuyanlar da var.

Bu zaman doğrudan da tar-qaval səsi gəldi. Tahir özü də çalıb-oxumağı sevdiyindən, bu səsi eşidən kimi yumşaldı və Cəmillə bərabər körpüyə sarı yönəldi.

Qayıqdakıların hamısı cavanlardı. Qızlar, oğlanlar yanaşı oturmuşdular. Tarzən ilə kamançaçı məharətlə çalır, qaval vuran oğlan isə boğazını arıtlayıb oxumağa hazırlaşırdı.

Qayıqda oturmuş gənclər arasında gedən söhbətdən onların çoxusunun dörd ildən bəri yalnız ilk dəfə dəniz seyrinə çıxdığı hiss olunurdu.

Günəş parça-parça ağarışan buludlar arasından süzüb çıxdıqca, hava daha da istiləşir, hamı qayığın tez yola düşməyini arzulayırdı.

Tahirin fikri-zikri yenə trestdə idisə də, yeni düşdüyü bu aləm, hər dəqiqə, hər an onun könlünə yaxınlaşırdı.

Qayığa minən cavanlardan biri, başına ağ kəlağayı örtmüş qızla yanaşı oturan uzun, arıq oğlanı görəndə qışqırdı:

– Ay ya Allah, Mehman, ya Allah, balam, bütün Bakı bu gün səndən danışır!.. – dedi və cibindən qəzetin son nömrəsini çıxarıb, əlinin arxası ilə qəzetə döyə-döyə sözünə davam etdi: – Şəklini görmürsən? Ustanı da tərifləyirlər, səni də... Daha bundan sonra qabağında durmaq olar?

– Yox əşi... Axı mən... deyən arıq oğlan qızın yanında utana-utana gözlərini yerə dikdi. (Onların hər ikisinin utancaq görkəmindən yenicə evləndikləri hiss olunurdu).

Tahir bu söhbəti lap əvvəlindən dinləyir, qəzetdə gördüyü şəkillə oğlanı müqayisə edərək, ürəyində baş qaldıran qibtə hissindən həyəcanlanırdı. "O da elə mən yaşdadır. Allahın altında məni də işə götürəydilər, gərək elə qiyamət eləyəm ki, bir aydan sonra qəzet mənim şəklimi iki o boyda versin..."

Qəzeti arıq oğlana göstərən gənc, portretin altındakı yazını də ucadan oxudu: "Məşhur buruq ustası Volkovun rəhbərliyi ilə yeni sənətini mükəmməl öyrənmiş cavan fəhlə Mehman Feyzulla oğlu gündəlik normasını yüz səksən faiz ödəyir..."

– Bura bax, əzizim, – deyə tar çalanla yanaşı oturmuş bir oğlan onun sözünü kəsdi, – axı kişi burada tar çalır. O qəzeti biz də oxuyuruq da...

Tahirin könlündəki qibtə hissi get-gedə daha da alovlanırdı. İndi Mehman onun nəzərində dünyanın ən xoşbəxt adamı idi. "Boy-buxununa baxanda deyərsən ki, maymağın biridir, amma görünür kişinin oğlu bacarıqlı imiş..."

– Bura bax, Cəmil, bir ondan soruş görək, neçə aydır mədəndə işləyir?

Cəmil bu xahişin mənasını başa düşmədi.

– Neyləyirsən?

– Heç. Elə-belə.

– Yəqin bir-iki il olar.

Tahir inkisar-xəyala uğrayıb pərt oldu, səbir edə bilməyib Mehmandan özü soruşdu:

– Yoldaş, neçə vaxtdır, mədəndə işləyirsiniz?

– Altı aydır, – deyə Mehman azacıq qızardı və utancaq gözlərini yenə yerə zillədi.

"Bu çox oldu" deyə düşünən Tahir yenə həyəcanını gizlədə bilməyib, Cəmilə tərəf döndü:

– Altı ay?

– Bəs sən nə bilirdin? Yəqin bir-iki il də məktəbdə, ya da kursda oxuyub.

Bu anda qayıq hərəkətə gəldi. Bir dəqiqə belə keçməmiş açıq dənizə çıxdı, sürətlə dalğaları yararaq sahildən uzaqlaşdı. Cəmil dostuna sakit-sakit yırğalanan duru suları göstərdi:

– Bax, buna görə deyirlər ki, Xəzər dünyanın ən mavi dənizidir!

Tahir suda parıldaşa-parıldaşa qaçışan xırdaca balıqları belə aydın görürdü. Dənizdən rütubətli meh əsir, sahilin bürküsündən darıxmış adamlar dərindən nəfəs alırdılar. Tar-kamança səsi get-gedə daha da ucalır, Qarabağ şikəstəsi deyən cavan xanəndənin mahnısı dəniz üzərindən yüksələrək, ta uzaqlara qədər işləyirdi.

– Cəmil, ay Cəmil, usta Ramazan indi buruqda olar, hə?

Cəmil Tahirin sualını eşitmədi. Onun bütün diqqəti xanəndədə idi. Tahir isə onun oxumağını bəyənmədiyi üçün, yalnız öz fikirləri ilə məşğul idi: "Hər şey adamın özündən asılıdır. O, altı ayda ad çıxardıb, mən bir ayda çıxardaram".

Tahir fikirli-fikirli uzaqlara baxanda, qarşıdakı adanı gördü:

– Ora haradır? – deyə Cəmildən xəbər aldı.

– Nargin adasıdır. Gecələr orada mayak yanır. Gəlib-gedən paroxodlara yol göstərir. Təzə binaları görürsən? İndi orada göyçək bir qəsəbə salınır. İnqilabdan əvvəl ora dustaqları göndərərlərmiş.

Qayıq dairə vurub Bayıla tərəf döndü. O yanlarda dəniz buruqları qaralırdı.

– Sizin buruq hansıdır, Cəmil?

Yenə Cəmildən səs çıxmadı. Xanəndə zilə çəkdiyindən, hamısının gözü onda idi. Birdən alqışlar qopdu. Tahir yenə səbir edə bilmədi, bu dəfə Cəmilin böyründən yavaşca dürtmələdi:

– Gecikirik ha...

Qayığı sürən oğlan da, onun tələsdiyini duymuş kimi, əlindəki sükanı tez-tez hərləməyə başladı. Qayıq geriyə döndü.

...Onlar sahilə yetişəndə artıq saat ikiyə işləyirdi.

– Görəsən trest müdiri nə deyəcək, Cəmil?..

## 6

Qüdrət İsmaylzadənin qırx yaşı tamam olmuşdusa da, üzdən cavan görünürdü. Bəziləri buna təəccüb də edirdilər. Xüsusən müharibə dövründə gecəli-gündüzlü mədənlərdən ayrılmayan adamlar, onun həmişə dolğun və gülümsər sifətini görəndə, qara, qıvrım saçlarına,

getdikcə daha da enlənib ətə dolan cüssəsinə, zəhmli, möhkəm addımlarına baxanda, onun özünü işə vermədiyini, vaxtında yeyib-içdiyini, müntəzəm yatıb-durduğunu zənn edir, hər zaman başqalarının hesabına ad qazandığını, yalnız normal həyat tərzi sayəsində hər vaxt belə gümrah və gülərüzlü olduğunu düşünürdülər. Neft sahəsində uzun zamandan bəri çalışan yaşıdlarından və yaxın dostlarından biri, bu gün ondan əlborcu qazıma borusu istəməyə gələndə, Qüdrətdən bunun da səbəbini soruşdu:

– Axı bir de görüm necə edirsən ki, həmişə trestin də qabaqda olur, özün də hamımızdan cavan qalırsan?

İsmayılzadə, dostunun ciddi bir əda ilə, gözlərini düz Qüdrətə zilləyib verdiyi bu suala da, həmişə dolğun yanaqlarını, xüsusən bozumtul dodaqlarını bürüyən xəfif və azca istehzalı kimi görünən bir təbəssümlə cavab verdi:

– Çünki, mənim bəxtim gətirir...

Hər şeydən artıq riyazi haqq-hesab sevən neft istehsalında saç ağartmış dostu, Qüdrətin xürafata inanan bir adam olmadığını gözəl bilirdi, ona görə də bu söhbətin zarafata çevrilməsini istəməyib:

– Mən sənin iş üsullarınla maraqlanıram, bir onlardan danışsana! – deyə daha da ciddi təkid edəndə, Qüdrət yenə zarafata saldı:

– İş üsullarımdan nə danışım? Elə bir üsulum yoxdur. Ancaq gümrah olmağımın səbəbini deyə bilərəm. Mən də siz alan normanı alıram. Maaşım da həmin maaşdır. Canın üçün, sizin hamınızdan da az yatıram. On iki ildir bir dəfə də məzuniyyət alıb kurorta getməmişəm. Ancaq mənə elə gəlir ki, hələ bu cavanlıq uzun müddət məni tərk etməyəcək. – Qüdrət gülümsündü. – Görünür bir qədər də arsızlığım var...

– Yox, yox, sənin haqqında bunu ən qəddar düşmənin də deyə bilməz. Bu, arsızlıq nişanəsi deyil. Görünür bunun çox dərin səbəbi var. Ancaq nədir, bunu hələ də təyin edə bilmirəm.

Qüdrət, fiziki əməklə məşğul olan adamların əli kimi iri və bir azca da qaba əlində tutduğu uzun müştüklü papirosunu damağına qoyub, avtomatik alışqanla yandırdı:

– Bunun sirrini mən özüm yaxşı bilirəm, – dedi. – Mənim anam yaxşı nağıllar söyləyir. O nağıllardan biri çox mənalıdır. Əgər onu bütün qadınlara başa salsaq, kişilərin hamısı bundan fayda görər.

Qüdrətin dostu, onun irəli uzatdığı və sonra açıq halda yazı masasının uc tərəfinə qoyduğu iri qutudan bir dənə papiros götürdü, qaşla-

rını azacıq yuxarı qaldırdı, sadəlövh tərzdə və bir qədər də tələsik soruşdu:

– O necə şeydir? Danışmazsan?

Qüdrət, burula-burula havaya qalxaraq, bir an gözlərinin qabağında dumanlanan göyümtül papiros tüstüsünü üfürüb dağıtdı və əsil mətləbini indi söyləyəcəkmiş kimi, düşüncəli baxışlarını yerə dikdi:

– Mənim işimdəki muvəffəqiyyət ailəmdən başlanır, – dedi. – Həmin nağıl da elə bu fikri təsdiq edir. Mən onu anam kimi şirin danışmağı bacarmaram. O, qızım Şirmayının yaşını nəzərdə tutduğu üçün, sözləri elə bir ifadə ilə danışır ki, üz-gözünə elə bir ifadə verir ki, nağıl qat-qat təsirli çıxır... Xülasə, ağıllı padşahlardan biri... – Qüdrət yenə gülümsədi ("belələri də olub" deyə arada əlavə etdi). – Hə... padşah, rəiyyətinin həyatı ilə tanış olmaq üçün vəzir-vüzərası ilə bərabər, şəhərləri, kəndləri gəzirmiş. Günlərin birində qəribə bir hadisənin şahidi olur. Görür ki, cavan bir xarrat, mahnı oxuya-oxuya dəmir zindanın üstündə taxta yonur. Baltanı taxtaya nə qədər bərk endirirsə, balta bir dəfə də olsun zindana toxunmur. Şah vəzirdən soruşur:

– Bu necə şeydir, vəzir? Nə təhər olur ki, xarratın nacağı zindana dəymir?

Vəzir deyir:

– Şah sağ olsun, yəqin xarrat evdə arvadı ilə mehriban dolanır.

Bu cavab hökmdarı çox düşündürür. O, qaş qaralanda vəzirlə bərabər təğyir-libas edib, xarratın evinə getməyi qərara alır. Şahın xidmətkarları xarratın yerini öyrənirlər. Şahla vəzir cındır kəndli libası geyib oraya yola düşür. Qapını döyəndə, xarrat gülərüzlə onların qabağına çıxır, soruşur:

– Kimi istəyirsiniz, qardaşlar?

Vəzir cavab verir ki:

– Yol adamıyıq, qonaq istəmirsənmi? Sənin evində gecələmək olarmı?

Xarrat deyir:

– Buyurun, gözlərim üstündə yeriniz var.

Onlar içəri girəndə xarrat arvadına üz tutur, sevinə-sevinə deyir:

– Ay arvad, qonaq gətirmişəm.

Arvad da onları gülərüzlə qarşılayır:

– Əziz qonaqlara gözüm üstündə yer var, a kişi. Xoş gəliblər; səfa gətiriblər. Allah verəndən nə varsa onlara qurbandır.

Şah vəzirə baxıb mənalı-mənalı gülümsəyir. Onun ehtimalının düz çıxdığını görüb, dərin fikrə gedir... Onlar mahalları gəzib, paytaxta qayıdandan bir-iki il sonra yenə səyahətə çıxmalı olurlar. Həmin şəhərə gələndə yenə də şahın yadına o xarrart düşür, gəlib onun dükanının qabağından keçəndə görür ki, o, bu iki ildə ən azı iyirmi il qocalıb, beli ikiqat olub, saqqalı ağarıb. İndi qaşqabaqlı oturub, yenə taxta yonur amma nacağı hər dəfə taxtadan ötüb dəmir zindana toxunur...

Şah vəzirin üzünə baxıb soruşur:

– Buna nə olub görəsən?

Vəzir cavabında deyir:

– Şah sağ olsun, yəqin indi arvadı onu pis yola verir.

Onlar yenə təğyir-libas edib axşamüstü xarratın evinə yola düşürlər. Xarrat qonaqları içəri çağıranda, arvadı onun üzünə çımxırır:

Boyuna boz ip ölçüm! Çörəyimi boğazımdan kəsib onlara verməyəcəyəm ki?

Şah yenə də vəzirin üzünə baxıb acı-acı gülümsəyir.

Qüdrət nağılını danışıb qurtaranda onun dostu da başını tərpədə-tərpədə, mənalı bir tərzdə qımışdı:

– Məlum oldu, – dedi. – Belə görünür ki, sənin də yaxşı işləməyinə, cavan qalmağına səbəb arvadın Lalədir, hə?

– Əlbəttə! – deyə Qüdrət təsdiq edəndə, kabinetin qapısı açıldı və bir nəfər kişi içəri girdi. İsmayılzadə ilk dəfə gördüyü bu adama zənlə baxdı. Üzünü bozumtul tük basmış bu arıq və gödək kişinin əyri qılçaları, azacıq donqar beli, sağ gözünün uc tərəfindəki iri xalı Qüdrətin diqqətli nəzərini dərhal cəlb etdi. Nazik sifətinə nisbətən uzun görünən fətir qulaqları ona çox nataraz bir görkəm verirdi. Lakin adamları çirkin sifətinə görə qiymətləndirmək Qüdrətin xasiyyəti deyildi. Kişinin yaxalığı çirkdən ləkə-ləkə idi, hülqumu görünən uzun boğazı qapqara olmuşdu. Belə natəmiz adamlar Qüdrətin heç xoşuna gəlməsə də, yenə onu nəzakətlə qarşıladı. Kişi trest müdirinin xoş sifətini görüb cəsarətləndi, ucadan salam verdi, kef-əhval bilmək istədi. Qüdrət də, nadir hallarda üzündən silinib gedən, sadə, səmimi, yumşaq və bir azca da istehzalı kimi görünən təbəssümü ilə gülə-gülə onun salamını aldı:

– Çox sağ olun! – dedi və öz trestində işləyən xidmətçilərdən olduğunu yəqin edib soruşdu: – Siz nəçisiniz, adınız nədir?

Kişinin dodağı qaçdı, seyrək, düz və sarımtıl dişləri göründü:

– Adım Qonaq, familyam Qonaqovdur, – dedi, – trestin nəqliyyat işlərinə baxıram. İzin verin, sizi təbrik edim.

Qonaqovun bir balaca irəliyə doğru əyilmiş bədəninə və üzündəki itaətkar ifadəyə diqqət yetirəndə, Qüdrətin gözlərindəki yumşaq təbəssüm silinib yox oldu, sir-sifəti ciddiləşdi. O, Qonaqovun üzündən nüfuzedici nəzərlərini çəkməyib, təəccübünü gizlətmədən soruşdu:

– Yaxşı, məni nə münasibətlə təbrik edirsiniz?

Qonaqov, Qüdrətin sualındakı nazik kinayəni hiss etməyərək, yenə də eyni müti görkəmlə bir az da qabağa əyildi:

– Bizim trestin rəhbəri göndərilməniz münasibətilə sizi təbrik etmək istəyirəm. Ancaq, doğrusu, mən çoxdan xəstə idim. Vaxtında yanınıza gələ bilmədim.

İsmayılzadə onun sözünü kəsdi:

– Ayrı sözünüz?

– Bizim trest quyruqda sürünür. Köhnə rəhbərlik, düzü, hamının gözündən düşmüşdü. Ümid edirəm ki, sizin kimi bir rəhbər...

İsmayılzadə yan-yövrəsinə baxdı, kirpiklərini qırpmadan, gözlərini bir müddət Qonaqovun yanağında və gülümsərkən qırışıqla örtülmüş alnında gəzdirdi.

– Ayrı sözünüz yoxdur ki, yoldaş Qonaqov?

Qonaqov tutuldu. Qırışıq alnını iri tər damcıları basdı.

– Xeyr, ayrı nə sözüm? – dedi.

– Elə isə gedin, qayıq hazırlayın. Bu gün bütün dəniz buruqlarına baş çəkmək istəyirəm. Aydın oldu, yoxsa bir də izah edim?

Qonaqovun sarımtıl dişləri örtüldü. O, deməyə söz tapmayıb, bir neçə an yerində hərəkətsiz qaldıqda Qüdrət onu çətin vəziyyətdən qurtarmaq istədi:

– Nə üçün karıxırsınız? Başqa bir sözünüz varsa buyurun, onu da deyin!

Qonaqov cibindən çıxardığı ləkəli yaylıqla alnının tərini silə-silə bir neçə addım dalı-dalı çəkildi:

– Xeyr, elə bir sözüm yoxdur. Sizi təbrik etmək... – O, şərab içməkdən məst olmuş bir adam kimi, müvazinətini itirərək, səldirləyə-səldirləyə qapıya yanaşdı və dırnağının ucunda, səssizcə addımlarla bayıra çıxdı.

Qüdrətin dostu Qonaqovun gözdən itdiyini görüb əlini-əlinə vurdu, az qala pəncərələrin şüşəsini cingildədən bir şaqqıltı ilə güldü:

– Neyləsin, karıxmasın? – dedi. – Təzə rəhbərlik insafsızlıq eləyib, yazığın sözünü ağzında qoydu. Yəqin yol uzunu yekə bir monoloq əzbərləyibmiş.

Dostlar bir neçə an gülüşdülər və tez-tez qapıya tərəf baxaraq, elə bil Qonaqovu bir də görmək istədilər. Bu anda kabinetin qapısı ağzında Tahirlə Cəmil göründü. Onlar Qüdrəti salamladılar və içəri girməyə izin istədilər. İsmayılzadə cavanları gülərüzlə qarşıladı:

– Buyurun, uşaqlar, mənə görə qulluğunuz?

Cəmil özünü irəli verdi, usta Ramazanın dəniz buruğunda işlədiyini söyləyib, kadr şöbəsinə gəldiklərini bildirdi. İsmayılzadə “məndən asılı işdir?” – deyə soruşanda, Cəmil Tahiri İsmaylızadəyə təqdim etdi:

– Burada işləmək istəyir. Yeddillik məktəbi qurtarıb. İkimiz də bir kənddənik. Mən bir il bundan qabaq gəlmişəm. Kəndə məzuniyyətə gedəndə Bakıdan ona danışdım, həvəsə gəldi.

– Elə özümün də qabaqdan həvəsim vardı! – deyə Tahir yoldaşının sözünü kəsdi. – Doğrusu, çoxdan neft qəhrəmanı olmaq fikrində idim.

– İndiyəcən harada işləyirdin? – deyə Qüdrət soruşdu.

– Kolxozda... – deyə Tahir cavab verdi, – yoldaş İsmayılzadə, elə mənim o biri yoldaşlarım da gəlmək istəyirlər. Kolxoz bizsiz də dolanar. Fermada arvadlar də işləyə bilərlər... Mənim anam inək sağandır. Keçən il orden alıb.

– Çox gözəl, çox gözəl! – deyə Qüdrət, mətləbin uzandığını görüb, arxası divara söykənmiş təmiz, ağ örtüklü divanda cavanlara yer göstərdi: – Əyləşin, niyə ayaq üstə durursunuz?

Tahirlə Cəmil yanaşı oturdular.

– Hə, mal-qara çoxalır, azalır?

Tahir trest müdirindən cavab almaq əvəzinə sual eşitdiyinə mat qalmış kimi, bir an duruxdu, sonradan-sonraya dilləndi:

– Çoxalır, yoldaş İsmayılzadə. Keçən baharda inəklərimizin hamısı balaladı. Bir az quraqlıq oldu. Ot-ələf azdı. Qonşuluqdakı “Marks” kolxozunun ehtiyatı varmış, bizə xeyli borc verdilər. Payızda özümüz yonca əkdik. İndi borcumuzu da vermişik, ehtiyat da yığmışıq.

– Atan nəçidir?

“Anket soruşur” deyə düşünən Tahir, bir qədər özünü yığışdırdı. Cavab verməyə hazırlaşanda, Qüdrət onun könlündən keçəni duymuş kimi, əlavə etdi:

– Elə-belə, maraqlanıram. Ürəyinə başqa şey gəlməsin.

– Atam müharibə başlanan günlərdə vəfat elədi... Kolxozun baş mehtəri idi.

Qüdrət heyfsləndi:

– Bu yaxşı olmayıb... Bizim torpaq komissarı həmişə yaxşı mehtərin azlığından şikayət eləyir... Atan çoxdan xəstə idi?

– Vallah, əvvəlləri çox gümrahdı. Müharibə olan kimi ah-uf eləməyə başladı. Atları səfərbərliyə alınan gündən yorğan-döşəyə düşdü.

– Deməli, atların dərdindən naxoşladı, hə?

– Xeyr, xeyr. Həmişə durub-oturub deyərdi ki, dava vaxtı gərək mənim atlarım bütün Sovet İttifaqında birinci yer tuta. Naxoşlamamışdan bir-iki gün qabaq Budyonnı yoldaşa kağız yazırdı ki, olmaya-olmaya mənim atlarımı topa, arabaya qoşduralar. Yaxşı olar, qızıl süvarilər üstünə minib qılınc oynatsınlar.

Qüdrət kimi, onun dostu da Tahirin hekayəsini dərin bir maraq içində dinləyir, papirosunu bərk-bərk tüstülədirdi.

– Atamın naxoşluğuna səbəb deyəsən, ayrı şey oldu, – deyə Tahir əlavə etdi.

– Nə?

– Əvvəl günlər cəbhədən ağır xəbərlər gəlirdi. Zarafat deyil, o boyda şəhərlərimiz əldən gedirdi. Ordu geri çəkilirdi. Nə bilim görünür, kişini fikir naxoşlatdı. Mən onu başa salırdım ki, ata, biz gec-tez qalib gələcəyik. Qəm yemə.

– Bəs o nə deyirdi?

– Nə deyəcək? “Allah ağzından eşitsin, oğul” deyirdi. “Gün o gün olsun ki, biz nemsənin dalını yerə qoyaq. Mən də ölməyib, o günü görüm”. – Tahir dərindən köksünü ötürdü, – yazıq kişiyə bu qismət olmadı...

Qüdrət dostuna baxdı və qəmgin-qəmgin gülümsündü.

Aralıqda sükut oldu. Qüdrət telefonun dəstəyini götürüb kimə isə zəng etdi, sakit və təmkinli səsilə telefondakı adama dedi:

Bu saat Tahir Bayramlı adlı bir nəfər gələcək. Ona cavan fəhlələrin ümumi yaşayış evində yer verərsən! – Qüdrət dəstəyi yerindən asıb Cəmilə üz tutdu: – Mənim adımdan ustaya de ki, axşam növbəsində işlətsin. Ancaq şərtim ağır olacaq. Mədəndə işləyən adamlardan ilk növbədə möhkəmlik tələb olunur. Əgər yarı yoldan qayıdacaqsansa,

indidən aç söylə. Qışın soyuğunda, boranında, yayın istisində, cırcıramasında peşman olarsan – Qüdrət sözünə ara verdi, imtahanedici nəzərlə bir xeyli Tahirin üzünə baxdı, onun razılıq işarəsi olaraq başını tərpətdiyini görəndə əlavə etdi: – Mən cavanları işə götürəndə bir şərt də kəsirəm: həm işləyib, həm də oxumalısan!

Qüdrət yenə susdu və sanki fikirləşmək üçün Tahirə vaxt verdi. Sonra o, səsini ucaltdı:

– Əgər bu şərtlərə razısansa, get, başla! Aydındır, yoxsa bir də izah edim?

Qüdrət bu sualı izah edəndə, yenə gülümsədi. Elə bil ki, özü də bu sözləri tez-tez deməyi xoşlayırdı. Tahirə isə elə gəldi ki, onun trestində işləmək çox asan olacaq və qoyduğu şərtlərin heç biri də onu fikrindən daşındıra bilməyəcək.

Cavanlar bir-bir qabağa yeriyib İsmayılzadənin əlini sıxdılar və sevinə-sevinə kabinetdən çıxdılar. İsmayılzadə yenə də xəfifcə bir təbəssümlə gülümsəyərək dostuna baxdı:

– Doğrudan da mənim bəxtim yaman gətirir ha! – dedi. – O biri trestlər cavanları səfərbərlik yolu ilə gətirirlər, amma mənim terstimə, bax, özləri öz ayaqları ilə gəlirlər. – Qüdrət gözlərini məchul bir nöqtəyə zilləyərək, xəyala dalmış kimi, baxdı. – Bunların içindən gələcəkdə görkəmli neft ustaları yetişəcək. Azərbaycan neftinin taleyini bunlar həll edəcəklər. Sabahı düşünən adamların bəxti həmişə gətirər, əzizim...

Qüdrət ayağa qalxıb, pəncərəyə yanaşdı, dodaqlarını bir-birinə qısaraq əsnədi və yuxusuzluqdan qızarmış gözlərini pəncərədən, eşiyə zillədi. Buradan neft mədənlərinin yalnız bir parçası görünürdü. Yeni tikilmiş buruqda qaldırıcı maşın təzə qazıma borularını çəkib yuxarı aparır, onun yanındakı köhnə buruğun kaçalkası yorğun-yorğun enib qalxırdı. Bir az o yanda üçüncü mədən idarəsinin yeni suvanmış birmərtəbəli binası ağarırdı. Həmin binanın böyründəki buruqda kaçalka, nə üçünsə, hərəkətsiz dayanmışdı. Qüdrət yalnız yeddi-səkkiz gün bundan əvvəl tresti təhvil götürdüyü halda, artıq bütün buruqları, onların gücünü və imkanlarını öyrənə bilmişdi. Dayanmış buruğa baxanda, onun qaşları düyündəndi və o, dəyirmi stol üstündə başqa aparatlarla yanaşı duran daxili telefonun dəstəyini götürüb üçüncü mədəni istədi:

– Yoldaş Səmədov, – dedi, – əgər o birisi buruqlar da – belədirsə, trestin kəsir işində çapalamağına təəccüb eləmək lazım deyil. 1090-cı buruq dayanmışdır. Yox, yox, mən buradan lap aydın görürəm, orada heç kim gözümə dəymir. Yoxlayın, yoxlayın!

Qüdrət dəstəyi yerinə qoyanda, dostu da ayağa qalxdı. Qüdrət sükut içində onun üzünə baxdı, borc istədiyi min metr qazıma borusunu nə qədər çətinliklə verdiyini də gizlətmədi:

Bir başqası olsaydı, əlbəttə, bir metr də verməzdim, – dedi, – özün bilirsən ki, bu saat mənim də vəziyyətim çox ağırdır. Trestin yalnız adı var. Amma ehtiyacımız xirtdəyəcən... Elə düşünmə ki, minnət qoyuram. Yeni quyuları qazdırıb qurtarınca şirin yuxu üzünə həsrət qalacağam.

– Axı, trestin geriliyinə səbəb sən deyilsən ki?

– Mən, ya başqası, nə fərqi var? Ölkəyə hər gün beş yüz ton neft borclu qalırıq. Burada respublikanın şərəfini gözləməyənlər varsa, mən buna soyuqqanlı baxa bilmərəm ki!

Qüdrətin dostu: “Bəlkə həmişə irəlidə getməyinə səbəb elə budur?” deyə öz-özündən soruşdu və Qüdrətin üzünə zənlə baxdı.

– Məgər belə deyil? – Qüdrət onun bu baxışının mənasını bilmək üçün sualını bir də ucadan təkrar etdi: – Belədir, belə deyil? Bayaq sən mənim iş metodumu xəbər alırdın. Ən gözəl metod, irəlidə getməyə vərdiş eləməkdir. Mən geridə qaldığım zaman doğma qızımın da, arvadımın da üzünə dik baxa bilmirəm. Baxa bilmirəm, ona görə ki, bu gerilik onlara da dərd olur. Həftələrlə idarədə, divanın üstündə mürgüləmək, evdə oturub qızıma ata nəvazişini hiss etdirməmək o qədər böyük hünər deyil. Amma mən ailəmin qeydinə qalmalıyam, mən qızımın hər addımına fikir verməliyəm. Bunun üçün də neftin sirrini bilmək azdır. Mən pedaqoji kitablarını, məşhur tərbiyəçilərin mulahizələrini oxumalıyam. Geri qalanda isə bunların heç biri mümkün olmur.

– Bağışla, Qüdrət, sözünü kəsirəm, deyəsən Lalə xanım gəlir. Onun tresti qiyamət eləyir ha... Əlbəttə, belə arvadı olanın kefi də həmişə kök olar. Məni bağışla, mən getdim. Ərlə arvadın görüşünə mane olmaq insafdan deyil. Hələlik...

Dostlar gülümsündülər. Lalə içəri girdi. Salam verib hər ikisilə görüşdü. Qüdrətin dostu üzr istəyib getdi.

Trestə təyin olunduğu gündən bəri evinə dəyməmiş Qüdrət, arvadının gəlişindən hədsiz dərəcədə sevindi. Onun nəzərində Lalə yalnız

vəfalı bir arvad deyil, yaxın bir dost və köməkçi idi. Onlar görüşməyə imkan tapmadıqları zaman bir-birinin yoxluğunu çox tez hiss edirdilər. Bu bir həftə müddətində Lalənin də başı çox qarışıq olmuşdu, təkdənbir Qüdrətin trestinə zəng etmişdisə də, onu kabinetində tapa bilməyib, gecədən xeyli keçənə qədər gözləmiş, gəlmədiyini görüncə, oxuduğu kitabı bir tərəfə ataraq, çarpayısına uzanıb yatmışdı. Kim bilir, bəlkə də ərlə-arvad arasındakı həsrət hissini onların belə az-az görüşməyi daha da qüvvətləndirmişdi? Qüdrətin evə çox gec-gec gəlməyi Laləni tamam başqa bir səbəbə görə həyəcanlandırırdı. O, Qüdrətin ağır işdən sonra çox yorulduğunu, amma bu barədə danışmağı sevmədiyini, xəstələnəndə belə üzündəki təbəssümün yox olub getmədiyini bilirdi. Lakin o, Qüdrətin ən kiçik müvəffəqiyyətsizliyini belə öz şəxsi dərdi kimi daşıyır, onun hər bir addımını uzaqdan da olsa diqqət və həyəcanla izləyirdi. Ümumiyyətlə onların ailəsində sevginin də, kişi və ya qadın nəvazişinin də mənası tamam başqalaşmışdı. Kənardan baxan ağzıgöyçəklər, Qüdrətin ailə münasibətindəki zahiri soyuqluğu onların bir-birini sevmədiyində görürdülər. Hətta Lalənin bəzi rəfiqələri "bir az ehtiyatlı ol ha, yəqin qeyri-qanuni arvad saxlayır" – deyə xəbərdarlıq etmişdilərsə də, Lalə buna çox etinasız cavab vermiş, ürəyində, bu sözü deyən rəfiqəsini təqsirləndirmiş, "sən belə şeyləri anlamağa qadir deyilsən" deyə düşünmüşdü, amma utandığından bu sözləri onun üzünə deməmiş, mülayim bir ifadə işlətmişdi.

– Bilirsənmi, əzizim, mən Qüdrətin məziyyətini də, qüsurunu da eyni dərəcədə sevirəm. Əgər sən deyən doğru olsa, o yəqin bunu da məni çox sevdiyindən eləyir...

Lalənin rəfiqəsi qaqqıldayıb gülmüş, onun bu qəribə məntiqini istehza ilə qarşılamışdı:

– Deməli, onda ya sən onu sevmirsən, ya da sənin özün...

Lalə bu qaba cümləni sərt bir hərəkətlə yarıda kəsib, xudahafizləşmədən rəfiqəsini tərk edib getmişdi.

Budur, Lalə Qüdrətin qarşısında dayanmış, Qüdrət də ayaq üstündə durub ona baxırdı. Ərlə-arvadın gözü bir-birinə sancılmışdı. Bəs onları düşündürən nə idi?

Lalənin ilk sözü bu oldu:

– Qüdrət, katibənə de, bir stəkan çay gətirsin!

Qüdrətin də ilk sözü bu oldu:

– Nə üçün ayaq üstündə durursan?

Lalə düşünürdü: “Sənsiz mənim üçün çətindir, Qüdrət... Amma belə görünür ki, məni görməyəndə də sənin həyatından heç bir şey əksilmir”.

Qüdrət isə düşünürdü: “Yox, əzizim, arxamda sən durduğunu bilməsəm, hər addımda büdrəyərəm”.

– Katibən hanı?

– İstirahət vermişəm.

Lalənin gözləri yorğun idi. İrəlidə gedən trestlə, geridə qalana istirahət eləmək çətindi. Biri kəsirdən çıxmaq, o birisi kəsirə düşməmək üçün çalışırdı. Lakin Qüdrət Lalənin kölgələnmiş üzünə, yanaqlarındakı solğunluğa diqqət yetirəndə onun da ağır işdən yorulduğunu aydın hiss edirdi.

– Bilirəm yorğunsan, Lalə...

– Yox, mən dünən evdə idim...

– Elə isə gözünə yuxu getməyib...

– Doğrudur, yata bilmədim. Sənə zəng elədim. Dedilər ki, dəniz buruğundasan. Gecə saat dörddə qorxulu deyilmi?

– Aylı gecə idi. Dəniz elə sakit idi ki...

Aralıqda sükut oldu. Deyəsən Qüdrət dünənki küləyi unutmuşdu.

– Qüdrət, çaynikin yoxdurmu?

– Bu saat... – Qüdrət o biri otağa keçdi, toz basmış elektrik çaynikini haradansa tapıb gətirdi.

– Neçə gündür çay içməmisən?

– Səhər içmişdim...

Aralığa yenə sükut çökdü. Lalə çaynikin üstündəki tozu görüb gülümsündü. Onun əlində qəzetə bükülmüş bir şey vardı. Deyəsən Qüdrət onu da görməmişdi.

– Haradan belə? – deyə Qüdrət soruşdu.

– Evdə idim...

– Bu nə üçündür, əzizim? Mən ac deyiləm...

– Trestin kəsirdən çıxan günə qədər özüm sənə yemək gətirəcəyəm... – deyə Lalə bağlamanı açdı. – Geriliyə səbəb nədir?

Qüdrət idarədə olmasaydı, Laləni bərk-bərk qucaqlar, o yanağından – bu yanağından öpüb deyərdi:

– Fəxr edirəm ki, məni bu qədər sevirsən.

Amma heyf ki, o, balkonda ayaq səsləri eşitdi, bu səslərdən harada isə yenə bir hadisə üz verdiyini aydın başa düşdü.

– Yoldaş Səmədov?

– Bəli, mənəm, yoldaş İsmayılzadə? 1090-cı buruğu deməyə gəlmişdim.

O, içəri girmək istəyirdisə də, evlərindən yenicə qayıtmış katibə onu içəri buraxmır, “dayan, arvadı ilə söhbət eləyir” deyirdi.

– Gəl, gəl, – deyə Qüdrət onu çağırdı.

Mədən müdiri qapının ağzında, şax dayanmış halda raport verdi:

– Buruq işə salınıb. Pəncərədən baxa bilərsiniz. Qüdrət baxmadı. Mədən müdirini yeməyə dəvət elədi:

– Buyur, qonağım ol, – dedi.

Səmədov isə dabanı üstə dönüb çıxdı. Qüdrət Laləni başa saldı:

– Qızıl kimi oğlanlardır. Heyf ki, fəhlə qüvvəmiz azlıq eləyir. Amma mən bunu heç yerdə deməyəcəyəm. Trest kəsirdən çıxacaq, əzizim, mütləq çıxacaq!

Lalə gəlməyindən narazı idi. Qüdrət iştaha ilə yeyir, çayın qaynamağını gözləyirdi...

## 7

“Arşın mal alan” tamaşasından çıxanlar Vəli ilə Tellinin mahnısını oxuya-oxuya gedirdilər.

Tahir lap balacalığından mahnı oxumağa böyük həvəs göstərdiyindən, ikinci dəfə gördüyü bu filmin ariya və duetlərini artıq əzbərdən bilirdi. Amma onu həyəcanlandıran nə film idi, nə də kino salonundan çaxarkən oxuya-oxuya gedən adamlar. O yalnız Bakı haqqında, burada qalıb-qalmayacağı haqqında düşünürdü. Qüdrət İsmayılzadənin onu hörmətlə işə qəbul etməsi, bu hadisədən sonra balaca otaqdakı yeni yoldaşlarının sevinməsi, axşamüstü tamaşaya gətirdiyi cavanlar üçün yer istəyən Lətifənin ora-bura yüyürüb əl-ayağa düşməsi bir-bir Tahirin xəyalından gəlib keçirdi. Cəmil, Səməndər və Biləndər onu aralığa almışdılar.

– Hələ bu nədir? Gündə kef çəkirik!.. – deyə Cəmil Tahiri həvəsləndirmək üçün tez-tez Bakını tərifləyir, qəsdən mübaliğə ilə deyirdi: İkicə gün burada qalsan, kənd tamam yadından çıxacaq.

Tahirin gözləri qarşısında vərəq-vərəq açılan bu yeni aləm, özü də hiss etmədən onun könlünü zəbt edirdi. O, şəhərin izdihamına yavaş-yavaş alışır, küçələrdəki baş gicəlləndirən hərəkət də ona tədricən təbii görünməyə başlayırdı. Onun dinib-danışmadığına diqqət yetirən Cəmil,

bu sükutunun səbəbini qəribsəməyində görür, sanki ayrı şeylər barədə fikirləşmək üçün ona imkan verməyə çalışır, söhbətini kəsmirdi.

– Bu dəfə kəndə qayıdanda, düzü, ora mənə bir təhər göründü. Elə bil səssizlikdən qulağım cingildəyirdi... Ə, Tahir olmaya ürəyin darıxır?

Cəmil bu sualı verəndə, onlar tramvayın duracağına çatmışdılar. Küçədə gedib-gələnlərin sayı-hesabı yox idi. Dirəkdən asılmış iri fənərlərin işığı asfalt yolu parıldadırdı. Cəmillə yoldaşlarının gözü tahirdə idi. Ondan cavab gözləyirdilər. Bunu hiss edən Tahir xəfif-xəfif gülümsəyir, nə üçünsə, cavab verməyə tələsmirdi. Səməndər də səbir edə bilməyib xəbər aldı:

– Hə, necədir, dost?

– Əlbəttə ki, bura hara, kənd hara? – deyə Tahir sağ əlini yuxarı qaldırıb nəhayətsiz görünən düz küçəni göstərdi. – Elə burada bizim kənddən on dəfə çox adam olar. Həmişə belədir?

– Əşi indi nə var ki? Bayram olanda adam əlindən keçib gedə bilmirsən.

Bu söhbət zamanı, yan tərəfdə tramvay gözləyən fəhlə gənclər kiminsə qarmonda çaldığı oyun havasının ahənginə uyaraq, əl vurmağa başladılar və bir an içində dairə düzəltdilər. Tahirin də gözləri onlara zilləndi. Ortalığa çıxan bir nəfər cavan rus, əllərini dizinə çırpa-çırpa, sarımtıl uzun saçlarını titrədə-titrədə böyük bir həvəslə oynayırdı. Onun ayaqları altından qopan səs, oyun havasının ahənginə görə vurulan dəf səsini xatırladırdı.

– Onlara bax, dördüncü mədənin fəhlələridir! Ey, Mişa, görünür planın dolandan bəri qudurmusan!.. – deyə Səməndər qarmonçalan tərəfə qışqırdı və yoldaşlarına üz tutdu: – Bəri gəlin, mən də bir qaytağı oynayım...

– O rus balası bizim havamızı bilir?

Tahirin bu sözləri Səməndərə qəribə göründü:

– Bilər də, hələ o yana da ötər. Niyə bilməsin?

Onlar Tahiri də dartıb apardılar, dəstəyə qoşuldular. Oynayan oğlan get-gedə qızışır. Mişanın dolub boşalan qarmonu qarşısında ayaqlarının bütün məharətini əl vuran qızlara, oğlanlara göstərirdi. Bu gənclər müharibə qurtarandan bəri gah küçədə, gah dəniz qırağında, gah da gəzinti yerlərində səslənən bu qarmon ətrafında daha tez-tez yığışırdılar.

Rəqs edən oğlan, öz sevgilisi önündə qılıncını siyirərək irəli uzadan və eyni zamanda təzim edən orta əsr cəngavəri kimi, qara saçlı bir qızın qarşısında əllərini irəli uzadıb diz çökdü:

– Rica edirəm! – deyə onu rəqsə dəvət elədi.

Qız bir an içində irəli atıldı, oğlandan da məharətlə rəqsə başladı və nəhayət onu yorub haldan saldı.

– Ey-y, Mişa, çal görüm qaytağını!..

Qarmonçu, Tahirin heç gözləmədiyi bir ustalıqla qaytağı çalanda, rus uşaqları daha da ucadan əl vurdular. Səməndər ildırım sürətilə ortaya çıxdı və rezin top kimi atılıb-düşməyə başladı. Cavanlar bu şişman oğlanın belə cəld oynamağına heyran qalıb qışqırdılar:

– Bravo, bravo!..

İzdiham get-gedə artır, küçədən ötənlər cavanların ətrafında sıxlaşır, boyunlarını irəli uzadıb, Səməndərin oynamağına tamaşa edirdilər. O, yerdən toz qaldıra-qaldıra gəlib özündən əvvəl oynamış qızı bir də çağırdı. Qız yorğunluğuna baxmayaraq, yenə də oyundan imtina eləməyib ortaya çıxdı.

Səməndər, bir xeyli onun başına fırlandıqdan sonra qız təngnəfəs olduğunu görüb geri çəkildi. Səməndər qələbəsindən daha da eşqə gəlib bir neçə dəfə daha çılğın bir ehtirasla fırlana-fırlana, dırnaqları ucuna qalxaraq, qürurla döşünü qabarda-qabarda oynadı və axırda "huy!" deyə nazik bir səslə qışqırıb, ortalıqda hərəkətsiz bir vəziyyət aldı.

Alqış səsləri küçəni doldurdu. Elə bu anda tramvay duracağa yan aldı. Cavanlar boş vaqonlara doluşdular.

Tahir Səməndərin məharətinə heyran qalıb ona ürəkdən vuruldu: "Vay sənin, bu nə qiyamət oğlanmış!.." deyə xəyalından keçirdi.

Müxtəlif millətdən olan cavanların bu ümumi sevinci Tahir üçün yeni bir hadisə idi. Uzaq kəndlərində o belə şeyləri görməmişdi. Sarı saçlı oğlanın qaytağı çalması və qara saçlı qızını Səməndərlə bərabər gözəl rəqs etməsi Tahirin ürəyində özünün də bir dürlü izah edə bilmədiyi qəribə hisslər oyadırdı. Ona elə gəlirdi ki, bütün bunlar yalnız Bakıda ola bilər və şəhərin ən gözəl adətlərindən biri də məhz budur. Lakin gənclərin bu qayğısızlığı, təbiətcə ciddi və təmkinli olan Tahirə bir cürə görünürdü. Onun çox tələsik hasil etdiyi qənaətə görə bu cavanları hər şeydən çox belə əyləncələr məşğul edirdi. O bu fikirdə ikən, içəridə yer tutub oturan Səməndərlə Mişa arasında tamam ayrı bir söhbət başlandı:

– Ey, Mişa, demə ki, bilmirəm, hələ çox özünə qürrələnmə, mən iki yüzəm, sən yüz əlli.

– Bu nə sözdür? – deyə Tahir Cəmildən soruşdu.

– Planlarını deyir. Briqadalar yarışır.

Tahirin baxışları ciddi ifadə aldı.

Səməndərlə Mişanın söhbəti birdən qızışdı:

– Mən özümə arxayın olmasaydım, qarmoşkanı yenə də toz basardı. Onca gündən sonra köhnə quyulardan ikisi remontdan çıxır. Onda baxarıq.

– Baxarıq, baxarıq! – deyə Səməndər istehza ilə gülümsədi. – Buna bax a, elə bil bu işləyir, biz başımızın altına yastıq qoyuruq. Arxayın ol, sən iki yüzə çatanda mən üç yüzə çatmasam, adımı dəyişərəm. Sən nə bilmisən, bayrağı əldən vermək zarafatdır?

Tahir yenə maraqlandı.

– Nə bayrağıdır?

– İki ildir müdafiə komitəsinin keçici bayrağı onların trestindədir.

Səməndərlə qarmonçunun söhbətini o biri cavanların qalmaqalı kəsdi. Kim isə yan tərəfdən deyirdi:

– Onların evini özfəaliyyət dərnəyi yıxıb. Çalıb-oxumaqla plan dolmaz axı...

– Dolar, dolar. Elə biz oxuya-oxuya gəlib dayanacağıq Lalə İsmayılzadənin qabağında, deyəcəyik ki, yoldaş trest müdiri buyurun, o divardakı bayrağı öz əlinizlə götürün, verin bizə. Bir yerdə çox qalanda ürəyi darıxır.

– Onu görməyəcəksən?

– Görərik, görərik!..

Tramvay vaqonundan qalxan səs-küy artıq onların söhbətini aydın eşitməyə qoymurdu. Səməndər özündən arxayın halda Tahirə deyirdi:

– Nə qədər hıqqanırlarsa, bir şey çıxmır. Uşaqsan? Bayraq əldən getdi, gərək onda kürt düşmüş toyuq kimi evdən bayıra çıxmayaq.

Onlar mənzilə çatandan sonra çarpayılarına uzanıncaya qədər Tahir yenə dinməz-söyləməz Səməndərə baxır, “vallah, yaxşı oğlandır!” – deyə fikrindən keçirirdi.

# İKİNCİ FƏSİL

## 1

Tahir Cəmillə bərabər axşam növbəsində işə getmək üçün motorlu qayıqlar dayanan balaca körpüyə gələndə, Xəzərin bəriyə doğru şütüyən ağ köpüklü dalğaları sahildəki boz qayalıqlara çırpılaraq şarıldayırdı. Qürub edən günəşin qızıl şüaları dənizə əks etmişdi. Dalğalar bir-birini qovaraq gəldikcə alov kimi qızarırdı. Sanki dənizdə böyük bir yanğın vardı. Srağa gün Bakının ulduzlarını, doyunca seyr etmiş Tahir, indi sahildə durub dənizə baxarkən alova bənzəyən bu dalğaları görüb, yenə Cəmilin nağıllarını xatırladı və iki gündən bəri seyr elədiyi mənzərələrin heç birini başqa yerlərdə tapmaq mümkün olmadığını düşünürdü. Burada çoxdan yaşayanlar və eyni lövhəni hər gün seyr edənlər, Xəzərin bu ülviyyətinə, ondakı boyaların bu zənginliyinə Tahir kimi valeh olmurdular. Deyəsən, onların gözü çoxdan doymuşdu və Tahirə elə gəlirdi ki, Cəmil də, o biri fəhlələr də dənizə baxmaq istəmirlər. Onların bu laqeydlikləri, təbiəti etibarilə bir qədər xəyalpərvər olan Tahirə qəribə görünürdü. O, həris gözlərini dalğalarda gəzdirməyə başladı. Lap uzaqdan aşırıla-aşırıla gələn böyük bir dalğanı sahilə qədər gözdən qoymayıb, onun hər an rəngdən-rəngə girdiyini, bəzən qan kimi qırmızı, bəzən də üfüqdə yanan bulud parçası kimi çəhrayı olduğunu görəndə, heyrətdən ağzı açıla qaldı, elə bil buraya nə üçün gəldiyini və haraya getdiyini də unutdu.

Lakin bu halda "Çapayev" qayığı yan tərəfdən şığıyıb çıxdı və körpüyə yan aldı. Axşam növbəsinin fəhlələri hərəkətə gəlib bir-bir qayığa atıldılar. Qolsuz matros köynəyi geymiş kapitan, qalın əzələli qolunu havada oynadaraq onları tələsdirdi:

– Tez olun, tez olun! Onsuz da usta Ramazanın yanında günahkaram, – deyə yoğun səsilə, uzun papirosunu tüstülədirdi.

Bunu eşidən Cəmil, Tahiri başa saldı:

– Günahını boynuna alsa da, inanmıram ustanın əlindən yaxa qurtara. Yəqin haradasa, vurmağa gedibmiş. Düz on beş dəqiqə gecikib... Hesabnan gərək indi orada olaydıq.

Axırıncı fəhlə qayığa minəndə motor yenə guruldadı. "Çapayev" yavaş-yavaş körpüdən aralanıb, yarımdairə halında dövrə vuraraq sonra yoluna düzəldi. Bir dəqiqə belə keçməmişdi ki, Tahir sahilə

doğru baxarkən, qayıqlar dayanan balaca körpünün cənub tərəfində üç yandan hündür və bozumtul təpələr silsiləsilə çevrələnmiş geniş bir liman gördü. Bu limandakı buruqlar səltənəti qış fəslində çılpaqlaşmış qalın bir meşəni xatırladırdı.

Cəmil, Tahirin kirpiklərini qırpmadan diqqətlə baxdığı sahil boyunu göstərdi.

– Bax bu mədənləri görürsənmi? Bir zaman buralar dəniz imiş... Diqqətlə baxsan görərsən ki, buruqlar qayda ilə düzülübdür. Amma köhnə zamanda ağına-bozuna baxmırlarmış, kefləri istədiyi yerdə buruq qoydururlarmış.

Tahir kənddə özü ilə bir sinifdə oxumuş Cəmilin Bakıya işləməyə gələndən bəri xeyli irəli getdiyini və bir ildə çox bilik qazandığını düşünüb, ona səmimi bir qibtə ilə baxdı, gözlərini döyə-döyə soruşdu:

– O nə üçündür?

Cəmil də onun şüurunu zəbt edən fikirləri üzündən oxumuş kimi, özünü çəkib, qəsdən sakit-sakit, bu sahədə öz üstünlüyünü Tahirə hiss etdirməyə çalışaraq, təmkinli bir müəllim ədası ilə dedi:

– Keçmişdə mədənlərin sahibi ayrı-ayrı adamlardı. Hər kəs təkcə özü üçün əlləşirdi. Yer korlandı, korlanmadı, onlara təfavüt eləmirdi. Demirdilər ki, axı bunun sabahı da var, yeri korlayıb zay eləməyək... Amma sonra başa düşdük ki, buralar xalqındır, buruqları nə qədər qayda ilə qazısaq, o qədər də çox məhsul götürərik. Bunun üçün də gərək torpağa hörmət eləyəsən.

Tahir də, torpağın sirrini yaxşı bilən kəndli balası kimi, öz biliyini Cəmilə göstərmək istədi:

– Əlbəttə, bu doğru sözdür. Torpaq çox şıltaq olur. Bir az ona zor eləsən, acığı tutub bol məhsul verməyəcək. Gərək bir il istirahətə buraxasan, tez-tez mədəni gübrə verəsən.

Cəmil onunla razılaşa bilməyib başını buladı.

– Yox, aşna, neftli torpağın sirri başqadır. Dərsə gedəndə müəllimdən öyrənəcəksən. O, çox qəribə əhvalatlar danışır. Sahibkarlar arasında bərk çəkişmə olurmuş. Bir yerdə sən quyu qazanda, o da həmin yerin lap qonşuluğunda qazdırırmış ki, o qatın neftini özü çıxarsın. Ona görə də heç ağına-bozuna baxmırmış... – Cəmil əlini sahilə doğru uzatdı: – Amma o limanı görürsən? Elə bil şəkildir.

Tahir, yoldaşının bu izahını maraqla dinləməkdə ikən "Çapayev" qayığı dəniz buruqlarının cərgəsinə yetişdi. Cəmil isə bir neçə an sükut edib əlini alnına sürtə-sürtə nəyi isə xatırlamağa çalışdı:

– O zaman, – dedi, – texnika da qüvvətli deyilmiş. Suyu qurutmasaydın buruq qazımaq mümkün olmazmış. Ancaq indi görürsənmi? İndi suyun altından kefin istəyən qədər neft çıxarırsan.

Cəmil qürurla dəniz içərisindəki buruqlardan birini göstərdi. Onun baxışlarında qazıma işinin hər sirrinə vaqif olan bir ustad ifadəsi vardı. Tahir də yoldaşının bu qürurunu aydın hiss edirdi. Cəmilin ona göstərdiyi buruqda indi iş getmirdi və kənardan baxan naşı adama elə gəlirdi ki, fəhlələr quyunu qazıb axırda oradan bir şey çıxmadığını görərək, buruğu büsbütün tərk etmişlər.

– Deyirlər ki, bu buruq hər gün yüz əlli ton neft verir... – deyə Cəmil sözünə davam etmək istəyəndə, Tahirin şübhə dolu nəzərlərini sezdi və sözlərində zərrə qədər də mübaliğə olmadığını ona başa saldı:
– O nazik borulara bax, neft onların içilə sahildəki ehtiyat anbarlarına gedir. Üzdən baxanda deyirsən ki, bu nədir, niyə dəmir-dümürü suya töküblər? Ancaq o dəmirin içilə gedən neft bir dəqiqə də kəsilmir, gecə-gündüz hey axır.

Tahir, dördkünc şəklində qurulmuş, yuxarıya qalxdıqca ensizləşən, uzun dəmir qülləni göstərib soruşdu:

– Axı bu qədər ağır şey necə olur ki, yıxılmır?

Dostunun sualı Cəmilə çox sadəlövh göründü. O da Tahirə sualla cavab verdi:

– Niyə yıxılsın, axı? Bütün buruq dəmirdən qayrılmış yoğun dirəklərin üstündə dayanıb.

Qayıq o biri buruğun yanından keçəndə, Tahir onun dibinə qədər nəzər saldı və suyun içərisinə doğru uzanan yoğun dirəkləri gördü.

– Yaxşı, bəs bu dirəklərin uzunluğu nə qədər olar? – deyə xəbər aldı.

– O dənizin dərinliyindən asılıdır. Bəzi yerlər dayazdır, orada dirəklər gödək olur. Amma bizim buruq qoyulan yerin dərinliyi iyirmi metrdən çoxdur.

Qayıq dəniz buruqlarının böyründən şütüyərək açıq dənizə çıxdı və uzaqda görünən tək buruğa doğru yönəldi. Burada dalğalar qayığı atıb-tutur, gah sağa, gah da sola tərəf əyirdi. Tahir, suda qərq olacaqlarını güman edib qorxusundan udqunduqca, Cəmil ona baxıb gülür və ürək-dirək verirdi:

Hələ bu nədir ki? Bəzi vaxt elə boran qopur ki, üç-dörd gün buruqda gecələyirik. Elə vaxt olur bizə heç azuqə də gətirə bilmirlər.

Tahir, geniş açılmış gözlərini döydü:

– Niyə axı?

– Çünki o cür boranda qayıq çevrilib hamını batırar. Görmürsən, suyun dərinliyi ən azı yetmiş beş-səksən metr olar. Buradan dənizin qırağına üzüb çıxmaq hər oğulun hünəri deyil.

Tahirin bütün fikri qayığın atılıb-düşməyində idi. O, tez-tez usta Ramazanın buruğuna tərəf baxıb udqunur, ora çatmağa tələsirdi. Bu, əlbəttə, iş həvəsindən doğan bir arzu deyildi. İndi Tahirdə qorxudan başqa sadəcə bir uşaq marağı da oyanmışdı. O, Bakıya uzun illərdən bəri şöhrət qazandıran, onu bütün dünyada tanıdan qara qızılın "mədənini" öz gözlərilə görmək istəyirdi. Ona elə gəlirdi ki, buruqda fəhlələr qan-tər içində çalışır. Hamı əldə-ayaqdadır, bir işi görüb qurtarmamış o birisi başlanır, maşınların sürətli hərəkətindən adamın başı gicəllənib, gözləri qaralır.

– Bura bax, Cəmil, buruqda işləmək çox çətindir, hə?

– Niyə çətin olur ki? Bu saat özün görəcəksən. Çətin işi maşınlar görür. Bəs texnika nə üçündür?

– İndi usta buradadır?

– Yəqin... Bu günlərdə istirahət də eləmir. Birdən, işdir, avariya olsa bütün əməyimiz itir.

– Axı nə ola bilər ki?

– Çox şey... Sən bilmirsən ki, hər dəqiqə yerin altında min oyun olur. Bir də görürsən balta fırlanır, amma heç bir verşok da dərinə getmir.

– Niyə ki?

– Çünki bərkə dirənir, gücü çatmır, qırılıb xarab olur. Ondan sonra gəl onu çıxar görüm necə çıxarırsan.

Bu sözləri Tahir nə qədər maraqla dinləyirdisə, bir o qədər də az başa düşürdü.

Birdən qayıq nəyə isə toxunub silkələndi. Tahir başını qaldırıb baxanda, buruğa yan aldıqlarını gördü. Kapitanın yanındakı qarabuğdayı uşaq, qayığın baş tərəfindəki ucu ilgəkli uzun və yoğun kəndiri kəmənd kimi atdı və körpünü əvəz edən qalın taxtalara bitişdirilmiş dirəyə keçirdi. "Çapayev" yedəklənən üzüyola at kimi irəliləyib, yırğalana-yırğalana taxta-şalbanlara toxundu, yenə geriləyib bir də irəlilədi və axırda sakitləşdi.

Fəhlələr qayıqdan düşüb buruğa qalxdılar.

Tahir Cəmillə bərabər döşəməyə ayaq basanda, bütün qurğunun əsim-əsim əsdiyini görüb elə bil bu dəqiqə yerindən qopacağını güman edəndə, Cəmilin qolundan bərk-bərk yapışdı. Cəmil yenə qaqqıldayıb güldü.

– Əyə, sən nə yaman qorxaqsanmış! Bəri gəl, titrəməyinə nə baxırsan? Ayağımızın altı möhkəmdir. Eh, sən hələ nə görmüsən? Bu buruq elə boranlara sinə gərib ki.

Bu anda Tahirin gözləri buruğun üstündən səmaya dikəlmiş dəmir qülləyə və onun zirvəsində ayaq üstündə durmuş fəhləyə zilləndi. Ona elə gəldi ki, həmin fəhlənin həyatı bir tükdən asılıdır, əgər bircə dəqiqə bərk külək əssə və ya bir təsadüf nəticəsində ayağı sürüşsə, fəhlə müvazinətini itirəcək və kəllə-mayallaq gəlib dənizə düşəcəkdir. Kim bilir, onu xilas etmək mümkün olacaqmı? Bunu fikirləşəndə Tahirin bədənindən soyuq bir cərəyan keçdi və o, cəld gözlərini qüllədən çəkdi, buruğun içindəki maşınlara və alətlərə baxdı. Hər şeydən əvvəl nəzərini cəlb edən dirillometr oldu. Sonralar, bu cihazla quyudakı baltanın üzərinə düşən təzyiqi ölçdüklərini öyrəndi. Onun uzun, qara əqrəbi bir nöqtədə hərəkətsiz dayanmışdı. Dirilliometrin dibində oturmuş, sağ əlini gicgahına dayayıb gözlərini yerə dikmiş buruq ustası müavini Vasilyevi görəndə Tahir fikirləşdi: “Yəqin bu maşının dilini hamıdan yaxşı bilən odur”.

Cəmil Tahirin qolundan tutaraq, quyunun yanında durmuş və qaldırıcı maşının hərəkətinə diqqətlə göz qoyan usta Ramazana tərəf apardı. Buradakı şeylərin hamısı Tahirə yeni və maraqlı görünürdü.

– Usta, Tahir budur, – deyə Cəmil yoldaşını Ramazana təqdim edəndə, o gah ora, gah da bura zillədiyi gözlərini çəkib, qoca buruq ustasına baxdı.

Günlüyü əyilmiş boz şapkasının altından ağ saçları görünən usta, qaşqabaqlı halda, bozumtul gil məhluluna bulaşmış iri və qabarlı əlini qalın brezent şalvarına sürtüb Tahirə uzatdı... Onlar bir-birinin əlini sıxdılar.

Usta qəzəbli və sərt görünən yorğun gözlərini bir an Tahirin üzündə dolandırdı. Fikri özgə yerdə imiş kimi, bir müddət dinmədi. Nəhayət o, Tahirin səbirsizliklə gözlədiyi ilk sözü ağır və təmkinli bir əda ilə söylədi:

– Çox gözəl! Çox əcəb!

Görünür, Cəmil Tahirə dair ustaya hələ heç bir şey demədiyi üçün, Ramazan onun gəlişini bu cür biganə qarşılayırdı. Lakin bu biganəlik

uzun sürmədi. Yan tərəfdə gil məhlulu hazırlayan fəhlələrə yanaşaraq, onlara nə isə dedikdən sonra, usta yenə Tahirin yanına qayıtdı və onun ilk sualı bu oldu:

– Hə oğlum, bir de görüm özün gəlmisən, yoxsa gətiriblər?

Usta Ramazan "gətiriblər" sözünü nisbətən ucadan və xüsusi bir ifadə ilə söylədi. Bu suala necə cavab verməyin daha xeyirli olduğunu bilməyən Tahir, Cəmilin üzünə baxdı. Cəmil dostuna kömək etmək üçün:

– Könüllü gəlib, usta, – deyə ucadan səsləndi. – Mədəndə işləməyə çoxdan həvəsi varmış.

Ramazan dinmədi, "könüllü" sözünü eşitdikdən sonra, onun ürəyində Tahirə münasibəti dəyişdisə də yenə sir-sifətinin qırışığı açılmadı.

Tahir elə bil onun sərt baxışlarından qorxub gözlərini yerə dikdi. Usta:

– Hə, yaxşı oldu gəldin, bacıoğlu... – dedi və qazıma borularını quyuya endirən fəhlələrə tərəf dönərək, işini unudub maraqla Tahiri süzən cavan oğlanı səslədi: – Qrişa! Oğlum nə baxırsan, bu da sənin kimi bir oğlandır də...

Qrişa, bir suyu Səməndərə oxşayan, gödək və kürən bir oğlandı. O, fəhlə yoldaşı ilə bərabər qazıma borularını çıxarmaq üçün quyuya tərəf gələndə, təsadüfən Tahirin böyrünə toxundu. Üzr istəmək əvəzinə hələ bir Tahirin üzünə çımxırdı da:

– Ay uşaq, əl-ayağa dolaşma!

Tahir gözləmədiyi təkandan yıxılmamaq üçün müvazinətini saxlamağa çalışaraq, tərs-tərs Qrişaya baxdı və onun "təhqirinə" dözməyərək, ustanın da eşidib-eşitmədiyinə fikir vermədən:

– Uşaq özünsən! – dedi. – Əl-ayağa da dolaşan mən deyiləm, sənsən. Görürsən adam durub, o yandan get də...

Qrişanın yanındakı fəhlə də sözə qarışdı:

– A bala, gəmidə oturub, gəmiçi ilə dava eləmə. On dəqiqə olmaz, gəlmisən, indidən belə eləsən, sonra lap korlarsan ki!

Tahir onun da üstünə bozardı:

– Hər yoldan ötən üçün təhərimi dəyişməyəcəyəm ki?

Ramazan isə dinmir, təzə şagirdini imtahan edir kimi, onun hər bir sözünə, hər bir hərəkətinə diqqət yetirirdi. O, ürəyində Tahirin bu məğrurluğunu bəyənir, onunla öz gəncliyi arasında qəribə bir bənzə-

yiş görürdü. Yaxşı xatırladığı məşəqqətli gənclik illərində o da hər sözü götürməz, heç bir təhqiri əvəzsiz qoymazdı. İndi isə o, Tahirdən gözlərini çəkmir, "Başı qapazlı olmaq istəməyən uşaqdan xoşum gəlir" deyə düşünürdü. O, özünün zəngin həyat təcrübəsindən çox gözəl bilirdi ki, belə adamlar əksər hallarda ağır söz eşitməmək üçün səliqəli olmağa çalışır, məhz qürurunun sayəsində həmişə irəlidə getməyə və barmaqla göstərilməyə can atarlar.

Qrişa özünün günahkar olduğunu ürəyində etiraf eləyirdisə də, üzdə Tahirə xor baxır, quyunun yanında durub ustanın əmrini gözləyirdi.

Ramazan belə ixtilafları həmişə sülh yolu ilə yatırardı. İndi də yavaş-yavaş yerindən tərpənərək:

– Yaxşı, yaxşı, dalaşmayın. Bölünməmiş ata malınız yoxdur ha? – deyərək, Qrişa ilə o biri fəhləyə əmr verdi: – Sallayın boruları!

Cavan fəhlə cəld bir hərəkətlə əlindəki açarı quyuya endiriləcək boruya keçirərək hərlədi və açarın uzun dəstəyini düz qabağında duran fəhləyə uzatdı. Borular bir-birinə bitişdi və sonra xırıldayaraq yavaş-yavaş quyuya enməyə başladı.

Bu sadəcə əməliyyata heyrətlə tamaşa edən Tahir, hər şeyi birdən tez öyrənməyə tələsərək usta Ramazandan soruşdu:

– Bu nədir belə, usta?

Ramazan təzə gələn şagirdin işlə bu cür tanış olmaq istədiyini bəyəndisə də, adəti üzrə qaşqabaqlı cavab verdi:

– Tələsmə, bacıoğlu, hamısını biləcəksən.

Tahir ustanın belə acıqlı cavab verməyində özünü müqəssir gördüsə də, Qrişaya dediyi sözlər üçün heç bir peşmançılıq hissi duymadı. "Lap yaxşı eləmişəm. Nə olar, olar. Qoy indidən bilsin ki, mən hər itə, qurda yaltaqlanmayacağam".

Bu anda qoca usta başını dik qaldırıb dəmir qüllənin zirvəsində durmuş fəhləni səslədi:

– Heydər, yatma, bala!

Tahir də gözlərini ustanın göstərdiyi səmtə zilləyib, buruğun qülləsində dayanmış fəhləyə baxdı.

O, aşağıdan qalxıb bərabərinə yetişən qıfılı qazıma borusuna keçirdi. Boru dərhal aşağı enməyə başladı.

Usta təzəcə gəlmiş fəhlələrə üz tutdu:

– Hə, indi siz başlayın.

Ustanın hər bir hərəkətinə diqqətlə göz yetirən Tahir yerindən qımıldanmırdı. Ramazan bir xeyli vaxt fəhlələrə nə barədə isə əmrlər verib qurtardı və nəhayət, Tahirin səbirsizliklə gözlədiyini xatırlamış kimi, ona sarı döndü:

– Hə, bacıoğlu, bu gündən sonra gərək buraların qayda-qanununa alışasan. Qoy Cəmil səni gəzdirib, öyrətsin.

Bu sözlərin mənası Cəmilə aydın idi. Çünki o özü də ilk dəfə bura gələndə, fəhlələrdən biri onu təhlükəsizlik texnikasının ən zəruri tələblərilə tanış eləmişdi. Bu vəzifəni indi Cəmilin özünə tapşırırdılar.

– Oğlum, – Cəmil, – deyə usta sözünə davam etdi... – Bilirsən də?

– Bəli, usta, mən Tahiri başa salaram.

Cavan dostlar qocadan aralandılar. Cəmil buruqlardakı mexanizmlərin adını deyə-deyə onlardan hər birisinin vəzifəsini qısaca izah etməyə başladı. Hansı alətin nə zaman qorxulu olduğunu və hər bir təhlükədən necə qorunmaq lazım gəldiyini ona söylədi. O, Tahirin tez-tez verdiyi sadəlövh suallara artıq nə gülür, nə də təəccüb edirdi.

– Kənardan baxanda deyirsən nə var, borunun ucuna baltanı bağla, salla quyuya, qaz getsin. Daha orasını bilmirsən ki, bu maşınların hərəsini əməlli-başlı öyrənməkdən ötrü gərək yekə bir kurs keçəsən.

Cəmil hər bir briqadaya daxil olan ayrı-ayrı adamların vəzifələrindən danışanda, Tahiri bir məsələ maraqlandırdı:

– Deməli, mən burada nəçi olacağam?

Hələlik şagird. Amma bizim usta bir yerdə ayaq döyənləri xoşlamır ha...

Bu sözlər Tahirin ürəyindən oldu: "Şagird... Gərək, mən on gündən sonra bu adı üstümdən götürdəm".

Onlar kəlləçarxa doğru uzanan əyrim-üyrim taxta pilləkənin dibinə çatanda, Tahir Cəmili dayandırdı.

– Yuxarıya nəyə qalxırlar?

– Orada gərək fəhlə olsun. Ona verxovoy deyirlər. O, yuxarı qaldırılan, aşağı salınan boruları qarmağa keçirir.

– Onun işi çətindir hə?

– O baxır adamına. Heydəri görürsən? Çox qoçaq oğlandır. Usta onun xətrini yaman istəyir. Gəlsənə biz də onun yanına dırmaşaq, hə?

Tahir yuxarı baxdı. Doğrusu gözləri qaralan kimi oldu:

– Hələ yox, – cavabını verdi, – qoy bir az alışım.

Cəmilin dodaqlarında xəfif bir təbəssüm titrədi. O bilirdi ki, Usta Ramazan bu gün də olmasa, sabah Tahiri mütləq ora dırmaşdıracaq.

– Yaxşı, – deyə Cəmil dostunun qolundan tutaraq, buruqdan kənara, mədəni budkaya sarı uzanan taxta körpünü göstərdi: – Bax, o balaca daxmanı görürsənmi? Orada telefon, radio aparatı var. Kim yorulsa orda dincəlir. Qəzet, jurnal oxuyur. Papiros çəkənlər də ora gedirlər.

– Niyə ki? – deyə Tahir biganə bir tərzdə xəbər alıb əsnədi. – Burada papiros çəkmək olmaz?

– Yox, yanğın törəyə bilər. Neft, qaz olan yerdə lap bircə qığılcım da bəs elər.

Dostlar, mexanizmlərin səsini ötmək üçün ucadan danışa-danışa usta Ramazana yanaşdılar. Qoca Tahirə üz tutaraq:

– Hə oğlum, – dedi, – çünki oldun dəyirmançı, çağır gəlsin dən, Koroğlu. İndi ki, gəlmisən, hazırlaş, vışkaya dırmaşacaqsan!

Bu təklif Tahir üçün çox gözlənilməz oldu. Onun ən çox qorxduğu da elə bu idi.

Usta Ramazan, yanında işləməyə gələn cavan şagirdləri həmişə bu cür imtahandan keçirərdi. Nədənsə, onların cəsarətli olub-olmadıqlarını başqa istedadlarından tez bilməyə tələsirdi. Bu ilk imtahandan çıxanları axıracan da bəyənər və onların özgə qüsurlarını asanlıqla bağışlardı. Usta Ramazanın qənaəti belə idi: “Qoçaq oldu, sonrası düzələr”.

Qoca ustanın əli Tahirin çiyninə endi. O, digər əlilə qülləni göstərib, təzə şagirdinə ürək-dirək verdi:

– Qorxma, elə çətin bir iş deyil. Çıxarsan, baxıb öyrənərsən. Elə bir şey deyil. – Usta bir də başını yuxarı qaldırıb yenə qüllədəki oğlanı çağırdı. – Heydər, bala, düş aşağa!

Ramazan, Tahirin ürkək baxışından qorxduğunu o dəqiqə sezdi:

– İstəmirsən? – deyə soruşdu.

Tahir, gülümsəyib cavab verdi:

– Yox, niyə ki, burada nə var ki, usta?

– Elə isə qoy Heydər düşsün, sən dırmaş! Neçə yaşın var, bala?

Tahir geniş açılmış qara gözlərini ustaya dikib heç özünün də xəbəri olmadan udqundu:

– On səkkizə girmişəm, usta.

Qüllədəki oğlan yavaş-yavaş pillələri enib yerə düşəndə, axşam növbəsinə gəlmiş dostlarını gülə-gülə salamladı. Ramazan isə Tahirin çiynindən əlini çəkib bir də qülləni göstərdi:

– Hə, çıx görüm!

İndi bu sözlər xahişdən çox əmrə bənzəyirdi. Doğrusu, Tahirin ürəyindəki qorxu azalmışdı. Ancaq o, bunu üzə vurmamağa çalışırdı. O birdən, uşaq vaxtı yoldaşları ilə bağladığı mərci xatırladı. Axşamdan xeyli keçmiş Tahirin yoldaşları onlarda oturub, qoca babasının söylədiyi Məlikməmməd nağılına qulaq asırdılar. Tahirin atası da burada idi. Hamı qocanı diqqətlə dinləyir, elə bil bir sözünü buraxmaqdan belə qorxurdular.

Nağıl qurtaranda uşaqlar arasında kimin qoçaq olmağından söz düşdü. Onlar bəhsə girişdilər. Cəmil Tahirə dedi: "Əgər qoçaqsansa apar oxlovu qəbiristanda filən qəbrin üstünə sanc qayıt, biz də gedib yoxlayaq". Tahir ürəyində qorxuya düşdüsə də, babasının nağıllarından ruhlanaraq özünü yığışdırdı, ayağa durdu, taxçadan oxlovu götürdü. Getmək istəyəndə, anası razı olmadı "Bircə otur yerində!" deyib, onun qolundan bərk-bərk yapışdı. Tahir atasının üzünə baxdı. O dinmirdi. Tahir yoldaşlarının yanında utanmamaq üçün dartındı, anasının əlindən qopub eşiyə yönəldi. Qəbiristanla onların evi arasında təxminən beş yüz addımlıq məsafə vardı. Gecə zil qaranlıqdı. Tahir yenə qorxub, yarı yoldan qayıtmaq istədisə də bunu qeyrətinə sığışdırmadı. Yüyürə-yüyürə gedib oxlovu qəbir daşının yanına sancdı və yüyürə-yüyürə də qayıtdı. O, içəri girəndə dodağı gömgöy olmuş, rəngi də kül kimi bozarmışdı.

Hamı Tahirin qoçaqlığına təəccüb edirdi. Atası dedi: "Gedin yoxlayın!" Tahir dedi: "Təkcə Cəmil getsin".

Tahir indiki kimi xatırlayırdı: Cəmil qorxub getmədi. Uşaqların hamısı durub dəstə ilə qəbiristana yüyürüşdü. Doğrudan da Tahir oxlovu mərc gəldikləri yerə sancmışdı.

Usta Ramazan, Tahirin bir neçə an tərəddüd göstərib fikrə getdiyinə yaxşı məna vermədi: "Heç nə, qorxaqmış" – deyə düşündü, amma yenə də ondan ümidini kəsməyib soruşdu.

– Hə, niyə dayandın, qorxursan?

Tahir nə edəcəyini bilmirdi. Deyəsən bu dəmdə Cəmil ona güclə sezilən incə bir istehza ilə baxırdı. Tahir gözlərini dolandırıb yuxarıya nəzər saldı. Elə bil qüllə əvvəlkindən ikiqat hündür olmuşdu. Tahir qorxsa da, ustanın təklifindən boyun qaçırmağı özünə ar bildi. Nəhayət o, "ölmək-ölməkdir, xırıldamaq nə deməkdir?" fikrilə, qəti və cəld addımlarla fəhlələrdən aralanıb yuxarı dırmanmağa başladı.

Ustanın da, o biri fəhlələrin də gözü Tahirdə idi. O iki-üç metr qalxdıqdan sonra dönüb yerə baxdı və yenə tərəddüd göstərdi. Lakin artıq gec idi. İndi geri dönmək heç mümkün deyildi. Aşağıdakı fəhlələrin gülə-gülə baxdıqlarını görüncə, tez cəsarətini toplayıb yenə dırmandı.

– Bala, o heç kənddə alma ağacına dırmanmayıb, tut çırpmayıb yəni? – deyə Usta Ramazan Tahirin tərəddüdünə işarə edib Cəmildən soruşdu. Tahirin hər addımına başqalarından daha çox diqqətlə göz yetirən Cəmil, elə bil Tahirin əvəzinə həyəcanlanır, kəsik-kəsik nəfəs alırdı. Ustanın sualını eşidəndə belə o, dostundan gözlərini çəkməyib dedi:

– Sənətinin adı nə idi?

Tahir qüllənin tən ortasında dayandı. O, aşağıda dalğalanan mavi dənizi görəndə ixtiyarsız olaraq gözlərini yumdu. İlk dəfə təyyarəyə minib yerdən ayaq üzən adamlar kimi o da içində nəyinsə qopub düşdüyünü zənn edir, ürəyi hiddətlə və qorxu ilə döyünürdü. “Durduğum yerdə xətaya düşmədim? – Deyə sürətlə xəyalından keçirib, tez geriyə dönmək və qorxduğunu hamının yanında etiraf etmək istədi, ancaq yenə də yarı yoldan qayıtmağı şəninə sığışdırmayıb daha da sürətlə dırmandı. Bayaq Heydərin dayandığı yerə çatanda ətrafına baxındı. “O məni imtahan eləyir!” fikrilə, ürəyinə soxulan qorxu hissini inadla özündən rədd etməyə çalışır, gəldiyi kimi də sağ-salamat yerə düşəcəyinə özünü inandırırdı. Bu anda aşağıdan Ramazan səsləndi:

– Hə qorxmursan ki?

– Yox, usta nədən qorxacağam? – deyə Tahir həyəcanını gizlətməyə çalışıb, ustaya ucadan cəsarətlə cavab verdi.

Bu anda başqa bir fəhlə də Tahirin yanında göründü. O, yuxarı qaldırılan qıfılı boruya keçirməyə başladı.

– Tahir, – dedi, – səni imtahan eləyirlər. Yaxşı ki, yarı yoldan qayıtmadın. İndi, bura bax, gör torbanı necə keçirirəm.

Fəhlə danışa-danışa işini görür:

– Yaxşı bax, elə çətin iş deyil, gördün? – deyirdi.

Boru aşağı enməyə başladı.

Arada Tahir qürrələndi.

– Axı bunu eləməyə nə var ki?

– Əlbəttə! Bax torba qalxır. Tut keçir!

Tahir ilk dəfə qazıma borusuna əl vuranda, ovucları yapışqana bənzəyən bozumtul gil məhluluna bulaşdısa da, cəld bir hərəkətlə

qıfılı boruya keçirdi. Qaldırıcı maşın onu çəkib aşağıya endirdi. Borunun ucu quyunun ağzındakı boruya toxunanda bütün qüllə titrədi. Bu dəqiqə ayağının altından taxtaların qaçdığını güman edən Tahir, dənizə düşə biləcəyindən qorxub iki-üç dəfə udqundu. Çox keçməmiş yenə aşağıdan qalxan borunu qıfıla keçirdi və özünə yenə təsəlli verib, ayağının altını diqqətlə yoxladı. "Əşi, mən nədən qorxuram?" deyə düşünərək, bir də aşağıya baxmaq qərarına gəldi.

Boruları bir-bir qıfıla keçirmək əməliyyatı bir saatdan çox çəkdi.

Hava isə yavaş-yavaş qaralır, Tahirin bir az əvvəl gördüyü mavi dənizi indi havadan seçmək olmurdu. Buruğun lampaları yanında dənizə düşən işıq, Tahirlə yer arasındakı məsafənin uzunluğunu yenə onun yadına saldı. Usta Ramazan indi Tahirin gözünə dəymirdi. Bəlkə o şəhərə getmişdi? Bəlkə Tahiri tamam yadından çıxarmışdı? Bunu düşünəndə Tahirin ürəyi gizildədi. Burada hər dəqiqə ona bir gün kimi uzun görünürdü. Tahirin başı üzərində yanan lampanın işığı sallanan borunu parıldadırdı. O, birdən Ramazanın sakit səsini eşidəndə balaca uşaq kimi sevindi. Usta, Tahirə aşağı düşməyi təklif edirdi. Ancaq tahir bunu əvvəlcə zarafat bildi, elə-belə onu dolamaq üçün bu sözləri dediyini güman edib, camaatı bir də özünə güldürməmək üçün canını dişinə basıb xeyli gözlədi. Onsuz da bayaq fəhlələrin gülə-gülə baxdıqlarını görmüşdü. Usta onu yenə çağırdı:

– Bəri düş, oğlum!

Bu dəfə qoca başını yuxarı qaldırıb baxırdı, deyəsən Tahirin ürəyindəki şübhədən xəbər tutmuş, dediyi sözlərin heç də zarafat olmadığını dönə-dönə ona hiss etdirirdi.

Tahir yanındakı fəhlələrdən aralandı, yerdə nəyi isə tapdalayıb qıracağından qorxan adamlar kimi, yavaş-yavaş, ehtiyatla və ayaqlarının altını dönə-dönə yoxlayaraq aşağı endi.

İndi də hamı ona baxırdı. Tahirin üst-başı gil məhluluna bulaşıb ləkə-ləkə olmuşdu. Usta yenə də sərt baxışlarını onun üzünə dikdi:

– Ən çətini bu idi, – dedi, – bir də boran qopanda səni imtahan eləyəcəyəm. O imtahandan da çıxsan, dostumsan!

Ürəyində Tahiri bəyənən qocanın bu ilk sınaqdan sonra da qaşqabağı açılmadı. O, bir yerə toplaşmış fəhlələrə üz tutdu:

– Başlayın! – deyib kənara çəkildi və quyudan bir az aralı qoyulmuş yekə dəmir qapağın üstündə oturub, demisini doldurmağa başladı.

Tahir ustanın durğun baxışlarından, ağır və təmkinli hərəkətlərindən özü barədə nə fikrə gəldiyini bilməyə tələsdisə də, heç bir vəchlə qocanın ürəyini oxuya bilməyib, şübhə və tərəddüd içində qaldı.

Bu anda haradansa gəlib ustanın qarşısında dayanan bir qız, qocaya nə isə xəbər verib geri qayıdanda, Tahirin gözünə sataşdı. Onun haradan və nə üçün gəldiyi ilə maraqlanan Tahir, elektrik lampalarının titrəşən işıqlarında onu oğrun-oğrun, amma çox diqqətlə süzdü. Qızın uzun, gur hörüyü sinəsindən aşağı sallanmışdı. Tünd abı parçadan gödək bir tuman, göy sətindən də iş köynəyi geymişdi. Döş cibində ucları iti qəddənmiş bir cüt qara karandaş, əlində isə qəzetə bükülmüş qalın bir kitab vardı.

Tahir onu birdən tanıdı. Gənc fəhlələrin otağına Dadaşlı ilə bərabər gələn, axşam də cavan fəhlələri kinoya aparan qız idi. Cəmili görəndə, o, utancaq bir tərzdə gülümsünərək salam verdi. Sonra da Tahirin üst-başına baxıb, xəfif bir tərzdə istehza ilə gülümsündü. Deyəsən qız da bunu tanımışdı. Onun nə üçün qımışdığını fikirləşəndə, Tahirin ürəyinə şübhə damdı: "Yəqin mənim üst-başıma gülür. Daha bilmir ki, iş paltarımı hələ almamışam".

Doğrudan da burada heç bir fəhlə öz paltarında işləmir, Tahir kimi də palçığa bulaşmırdı. Lətifənin istehzası iki səbəbdən ola bilərdi: o, ya Tahirin nabələdliyinə, ya da səliqəli paltarını korlamağına gülürdü.

Lətifə, deyəsən, Tahirin bir qədər tutulduğunu duyub, sifətini ciddiləşdirdi və ona ani bir nəzər salaraq, cəld aralandı. Tahir isə yerindən tərpənməyərək, onun dalınca baxdı və uzun, gur hörüyün birinin də arxasından sallandığını gördü. Həmin qız olduğuna zərrə qədər də şübhəsi qalmadı. Sonra Cəmilə tərəf dönüb, yalnız onun eşidəcəyi bir səslə xəbər aldı: – Ogünkü qız deyil?

– Hə... Özüdür ki, var, necə məgər?

– O burada işləyir?

– Hə...

Tahir Lətifəyə lap yaxından, doyunca tamaşa etmək istədi. Ancaq bu mümkün olmadı. Bir azdan sonra Lətifə buruğa yan alan balaca bir qayıqla sahilə yola düşdü.

Doğrusu, Cəmil Tahiri usta Ramazanın yanına gətirəndə, qocanın tutqun qaşqabağı Tahirə o qədər də xoş gəlməmişdi. Onun çox acıqlı bir adam olduğunu yəqin edən Tahir, birinci imtahandan sonra da Bakıda qalıb-qalmayacağını qərarlaşdıra bilmədi. Bütün gecə növbəsində

iş gedən müddətdə Tahirin qocadan aldığı bu ilk intiba getdikcə daha da qüvvətləndi. Qoca bir dəfə də olsun onun üzünə mehriban bir nəzər salmadı və Tahirə elə gəldi ki, usta onun buruqda işləməsinə elə-belə, böyüyünün əmrini yerinə yetirmək üçün razı olmuş, əsil həqiqətdə isə, o, hər zaman Tahiri danlamağa, gözüm çıxdıya salmağa bəhanə axtaracaq və öz xoşu ilə işdən boyun qaçırıb kəndələrinə qayıtmağına səbəb olacaqdır. Əlbəttə, bu hal Tahiri çox həyəcanlandırırdı. Hər dəqiqə nəinki yalnız cavanlara, hətta təcrübəli fəhlələrə də ucadan tənbeh edən və tapşırıq verən usta, Tahirlə üz-üzə gələndə yenə eyni zəhmli gözlərilə bir an ona baxır və tez də ötüb o biri fəhlələrə yanaşırdı. Tahir bu xüsusda Cəmilə işarə vurmaq istəyirdisə də, usta Ramazanın duyuq düşəcəyindən çəkinib dinmirdi. Buruq ustası müavini Vasilyev Tahirin yaxınlığında uca səslə:

– Ramazan İskəndəroviç! Bəsdir, yorğunsunuz, üç gündür yatmamısınız. Gedin, dincəlin! – deyəndə, Tahir onun tutqunluğunun səbəbini çox yorğun olmasında görüb, özünə təsəlli verdi və birdən Lətifənin istehzalı baxışlarını xatırladı. Qızın iri gözləri daha da böyüyüb Tahirin təsəvvüründə canlandığı zaman, ürəyində nə isə şirin bir arzunun oyandığını duyub, özünə təsəlli verməyə başladı və qoca ustanın ilk nəzərdə görünən kimi, sərt və acıqlı bir adam olmadığına özünü inandırmağa çalışdı. Bu andan sonra Lətifənin xəyalı onun gözləri qabağından getmir, bəzən daha da hündürdən guruldayan maşınların səsi və ucadan bir-birinə nə isə deyən adamların bağırtıları onu fikirdən ayıranda, Lətifə müvəqqəti olaraq yadından çıxırdısa da, hər şey adi qaydasına düşəndə Tahir yenə onu xatırlayır, özünə o qədər də aydın olmayan bir ümidlə gülümsəyirdi.

Səhər, mavi üfüqdən qırmızı günəş doğanda və dalğalar sakitləşəndə, Tahirlə yoldaşları gündüz növbəsinin fəhlələrini gətirən "Çapayev" qayığı ilə sahilə qayıdan zaman, Tahir yenə Lətifəyə rast gəldi. Bu dəfə qızın gözlərində heç bir istehza ifadəsi görməyib sevindi, ilk gecə növbəsinin yorğunluğunu unudaraq, aydın yay səhərində Lətifənin boyuna-buxununa, günəşin şüalarında indi daha da yaraşıqlı görünən çəhrayı yanaqlarına baxanda, onun əvvəllər düşündüyündən qat-qat gözəl olduğunu gördü. Tahir indi onun əynindəki sadə libası da bəyəndi. Hələ rayon mərkəzində oxuyanda ipək paltar geyən, üzünü kirşanlayan, dodağını boyayan, lakin heç də göyçək olmayan qızlara və qadınlara çox rast gəlmiş Tahir Lətifənin bu sadəliyində də ürəyinə yatan gözəllik nişanələri tapırdı.

Tahirin heyranlıqla parlayan nəzərlərini öz çöhrəsində hiss edən Lətifə, səbirli addımlarla qayığa yanaşanda, ixtiyarsız olaraq başını dik qaldırıb Tahirə baxdı. Onun günəşdə yanıb mis rənginə çalan dolğun yanaqlarını, nazik dodağı üstündə yenicə tərləmiş bığ yerini görəndə, üstəlik uzunboğaz çəkməsinə, qalife şalvarına, qoşa cibli mixəyi köynəyinə nəzər salanda, yenə də dodağında o istehza titrədi. Tahir yalnız indi başa düşdü ki, onun gözlərində bu ifadə həmişə olur və o Tahiri ələ salmaq xəyalında deyil, əksinə, Lətifə ona qarşı çox nəvazişkar bir tərzdə baxır. Tahir də ona nə isə bir söz deмək, ondan nə isə bir söz eşitmək istədi. Lakin Lətifə addımlarını yeyinlədib cəld qayığa mindi, sahildən aralanıb mədənlər arasından uzanan asfalt yola çıxmış Cəmil isə, birdən yuxudan oyanan kimi olub sağına-soluna boylananda, Tahiri yanında görmədiyindən, geriyə dönüb onu səslədi:

– Bəri gəl, Tahir, buralara nabələdsən, birdən azıb-elərsən!

Cəmildən iki-üç addım irəlidə gedən usta Ramazan da bu sözləri eşidirdi. Üç günlük ağır və fasiləsiz işdən sonra bərk yorulduğu üçün, ayaqlarını sürüyə-sürüyə gedirdi. O da dönüb geriyə boylandı və tahiri gözlədi. Tahir özünü onlara yetirəndə, usta Ramazan bığaltı qımışdı:

– Hə, buruq xoşuna gəlirmi? – deyə ondan soruşdu.

Dünəndən bəri qaşqabağı bir dəfə də açılmamış ustanın bu təbəssümündən Tahir ürəkləndi:

– Maraqlı işdir, usta... – dedi, – mən elə bilirdim ki, buruqdan çıxanda üst-başım qapqara mazut olacaq. Axı kinolarda fəhlələri həmişə mazutlu göstərirlər.

Usta Ramazan asfalt yolun üst yanındakı köhnə buruqda yeraltı təmirlə məşğul olan fəhlələri göstərib, təsdiqləyici bir tövrlə başını tərpətdi:

– Elələri də var, oğlum... – dedi, – bax, onlar həmişə elədir. Hə, yaxşı oldu, gəldin, bala. Sənətimiz çətin sənətdir. Ancaq çox vacib sənətdir. Hər buruğu qazıb qurtaranda, illah da quyu bol nöyüt verəndə, bilirsən ki, böyük-böyük işlərə köməyin dəyir. Bala nöyüt fəhləsinin üst-başı qaradır, ancaq ürəyi brilyant kimi parıldayır.

– Kirovu gördüyümə inanmırsan bala?

Tahirin yanaqlarında qızartı əmələ gəldi. Az qala qocanın sözünü yarımçıq kəsib cavab verdi:

– Yox, niyə inanmıram? Deyirəm, yəni lap dostsunuz?

– Rəhmətlik çox mehriban adamdı, oğlum... Elə, tanış olduğumuz gün mənimlə dostlaşdı. – Qoca dərin bir ah çəkdi. – Eh, namərdlər onu cavan yaşında əlimizdən aldılar... Hələ Leninqrada gedəndən sonra da məni yadından çıxarmırdı. Bir neçə kərə kağız da yazmışdı. Oralara yolu düşən adamlardan da həmişə məni soruşarmış... – Ustanın yorğun gözləri doldu və o iki-üç dəfə başını tərpətdi. – Ölümündən xəbər tutanda, azı on il qocaldım... Azərbaycana çox yaxşılıq eləmişdi... O namərdlər elə bil gülləni mənim ürəyimə vurdular. Ax, ona əl qaldıranı gərək dara çəkəydilər! – Ustanın gözlərində qəzəb qığılcımları parıldadı və o, havada yumruğunu düyünləyib dişini qıcıdı. – Gedək, bala gedək? Hər gün buradan keçəndə o yadıma düşür... Bu görünən buruqları qazanda gecəli-gündüzlü burada olardı. Az-az adam fəhlənin dilini onun kimi bilərdi.

İlk təsadüfdə Tahirə son dərəcə qəzəbli görünən qoca Ramazana qarşı özünün də aydın dərk edə bilmədiyi bir ehtiram hissi oyanmağa başladı. İndi Tahirə elə gəldi ki, heç vaxt onun dünəndən bəri xəyal etdiyi kimi acıqlı və kinli ola bilməz. Tahir əvvəlcə sağ tərəfində gedən Cəmilin, sonra da sol tərəfində elə bir pəncə vura-vura addımlayan usta Ramazanın üzünə zənlə baxdı. İndi Tahir hər gün rast gəldiyi adi bir insanla deyil, təcrübəli neftçi və yaxşı insanla yanaşı addımlamağı hər adama qismət olmayan bir səadət hesab edir və o, başını yana tərəf çevirib usta Ramazana baxdıqca gözləri iftixar hissilə alışıb-yanırdı.

Tramvayın duracağına yetişəndə, usta Ramazan cavanlardan ayrılmalı oldu.

Tahir onun uzaqlaşdığını görüb Cəmilə tərəf döndü:

– Doğrusu, bütün gecə usta mənim ürəyimə qorxu salmışdı. Öz-özümə fikirləşirdim ki, evim yıxıldı, o məni görəndə elə bil qutuda ilanı görür.

– Niyə ki?

– Əşi, üzü bir dəfə də gülmədi.

– Onun xasiyyəti belədir. Sən sir-sifətinə niyə baxırsan? Özündən mehriban adam hanı? Ancaq iş vaxtı zarafatla arası yoxdur. Bir də, axı, iki oğlu çoxdan cəbhəyə gedib, hələ heç biri qayıtmayıb... Deyəsən evdə də elə bununçun az-az olur. Yəqin arvadı səhər-axşam gözünün qorasını sıxır, qocanın da buna ürəyi tab gətirmir.

Tahir, usta Ramazanın qaşqabaqlı olmağının əsil səbəbini başa düşəndən sonra kədərləndisə də, ürəyində ona haqq verdi: "İki oğul qurban vermək asan məsələ deyil ki?"

Onlar gəlib cavan fəhlələrin ümumi yaşayış evinə çatanda, Tahir oturub anasına kağız yazdı. Salam-duadan sonra Bakını bacardığı qədər təriflədi. Tahir, Bakının Cəmil deyəndən min qat qəşəng olduğunu yazmağı özünə borc bilib, daha burada qaldığını anasına bildirdi və məktubun sonunda Bakıya yola düşən adamlarla sazını göndərməsini xahiş etdi. Məktubu üçkünc büküb ünvanını yazandan sonra, balaca otaqda Cəmilin çarpayısı ilə yanaşı qoyulmuş təzə çarpayıda uzandı. Lakin birdən-birə onun gözünə yuxu getmədi. İki-üç gündən bəri gördükləri və eşitdikləri bir-bir gəlib xəyalından keçdi və axırda o, yenə Lətifəni xatırladı:

– Cəmil, onların evi haradadır?

– Kimin?

– Lətifəgili deyirəm...

– Necə məgər? Aşna, deyəsən bir dəfə görməknən aşiq olmusan?

– Yox, canım elə-belə soruşuram. – Tahir etiraz etdisə də, ehtiyatsızlıqdan bu barədə çox tez söz açdığı üçün utanıb yanaqları qızardı.

Cəmil gülüb zarafata saldı:

– Əlbət ki. Əvvəlcə elə-belə soruşarsan, bir azdan sonra tanış olarsan, teatra, kinoya aparарsan, lap axırda da ürəyini açıb deyərsən. Sənin işin asandır. Özün yaxşı saz çalıb-oxuyan, bir qucaq da söz bilirsən.

– Hə, indi deyəcəksən ki, sazı da bundan ötrü sifariş eləyirəm?

Cəmilin sir-sifəti ciddi bir ifadə aldı, qaşlarının arası düyünləndi və o, dostunun könlünə toxunacağından ehtiyat edib, söhbətin mövzusunu dəyişdi:

– Sabahdan, texniki minimum dərsləri başlanır. Bu gün səhər mədənin kontorunda elan asıblarmış. Mənə də yolda Biləndər dedi.

– O nə üçündür?

– Necə nə üçün? Bəs bir yerdə ayaq döyüb durmayacağıq ki? Mən üç-dörd günə imtahan verib, dərəcəmi artırmaq istəyirəm.

– Elə isə yaxşıdır. Kim siyahı düzəldir?

– Nə siyahı? Özün getməsən də, onlar səni axtarıb tapacaqlar.

Bu söhbətdən Tahir başa düşdü ki, Cəmil "irəli getmək adamın özündən asılıdır" – deyəndə mübaliğə etmirmiş: "Oxuyacağam, mən də elə bundan ötrü Bakıya gəlmişəm".

– Yaxşı, – deyə yenə Cəmilə üz tutdu – nə vaxt işləyib, nə vaxt dərsə gedəcəyik?

– Boş vaxtımızda... – Cəmil əsnədi. – Yaman yorğunam, yataq, yuxudan qalxanda hamısını başa sallam.

Aralığa sükut çökdü. Bu anda uzun bir fit səsi eşidildi. tahir:

– Bu nədir? – deyə təəccüblə soruşdu.

– Paroxoddur! Hər gün bu vaxt Həştərxana yola düşür.

– Amma limanda yaman çox paroxod var ha! Bəs onlar hara gedir?

– Onların çoxusu tankerdir. Neft daşıyır.

– Buruqdan çıxan kimi?

– Yox, canım, sən nə danışırsan?

Cəmil dostunun naşılığını onun özünə hiss etdirmək istəməsə də, Tahir bunu dərhal anlayıb, lap pul kimi qızardı və bir də belə suallar verməməyi kəsdirdi.

– Qaraşəhərdə neftayıran zavodlar var. Biz ora veririk onlar da ayırıb hazırlayandan sonra o biri şəhərlərimizə göndərir. Bizim quyulardan çıxan neftdən azı yüz otuza qədər maddə alınır.

– Əşi nə danışırsan? – deyə Tahir qeyri-ixtiyari yerindən dikəlib Cəmilə baxdı.

– Daha niyə təəccüb eləyirsən? Bizi aparıb o zavodları göstərəndə, bir nəfər mühəndis deyirdi. Hələ son zamanlarda təzə maddələr də tapıblar. Bakı neftinə neft çatmaz. Qara qızıl nədir, burada çıxan neft brilyantdan da bahadır. Yoxsa Bakıya bu qədər göz dikən olmazdı ki? Yataq, yataq, gözümdən yuxu tökülür. Usta həmişə deyir ki, Hitlerin belini sındıran Bakı oldu.

Cəmil susdu. Birdən, nəyi isə xatırlamış kimi, yerində dirsəkləndi:
– Buranın teatrını görmüsən?

– Yox, necə bəyəm?

– Sabah gedək, baxaq.

– Hansına? Mənim musiqili komediyadan xoşum gəlir.

– Eh, orada yüngül şeylər oynayırlar. “Xanlar”ı görmürsənmi?

– Rayon teatrında onu oynamırlar ki?

– Mən burada bir dəfə baxmışam, çox xoşuma gəlib.

– Elə isə əvvəlcə ona gedək, – deyə Tahir razılaşdı və bu andan sonra dostlar gözlərindən tökülən yuxunun qucağında xumarlanıb bir daha dinmədilər.

## 3

Dram teatrının salonunda nəfəs-nəfəsə oturmuş adamlara baxanda Tahiri heyrət götürdü. Rayon mərkəzində gördüyü iki yüz nəfərlik tamaşa otağını bu salonla müqayisə edəndə, bu axşam bütün şəhərin buraya axışıb gəldiyini düşündü. Böyük salonun parterində, iki mərtəbə lojalarında və amfiteatrında iynə salmağa yer yox idi. Sanki tamaşaçılar da Tahirin indiyə qədər gördüyü və tanıdığı adamlara bənzəmirdilər. Hamının səsi bir-birinə qarışmışdı. Salonun tavanından asılmış böyük çilçırağın işığında rəng verib-rəng alan müxtəlif sifətlər və ən çox da onların zəngin, rəngbərəng libasları Tahirin heyrətini birə min artırırdı. Tahirə elə göründü ki, guya hamı ona baxır, onun sadə və yoxsul geyimindən danışır, belə təntənəli bir salona kənd yerində geydiyi uzunboğaz çəkmə, qalife şalvar və qoşa cibli mixəyi köynəkdə gəldiyinə istehza edirlər.

Tahir Cəmillə bərabər on üçüncü sırada yerlərini tapıb oturduqdan sonra, utancaqlıqdan onun üzündə tər damcıları tumurcuqlanmağa başladı. O, gözlərini yerə dikdi, yaxınlığında oturduğu adamları dinləmək və özünə dair onların nə dediklərini eşitmək istədi. Ancaq heç bir kəsin ondan danışmadığını biləndə həm sevindi, həm də təəccübləndi. Yox, tamaşaçılar Tahiri lağa qoymurdular, onun haqqında pis söz demirdilər. Qızlar, oğlanlar qayğısız bir tərzdə gülüşür, bəziləri indi göstəriləcək əsərdən, bəziləri isə Tahirin heç ağılına gəlməyən şeylərdən danışırdılar.

Bir azdan sonra işıqlar söndü, salonu bürümüş gurultu yavaş-yavaş azalıb pərdə açılanda, səs tamamilə kəsildi. Səhnədə göstərilən pyesin ilk şəkillərini Tahir o qədər də aydın başa düşmürdü. Bəzi çətin ifadələrin mənasını Cəmildən soruşduqda, böyründəki tamaşaçılar:

– Səs salma, yoldaş! – deyə ona imkan vermirdilər. Axırda Tahir də, hamı kimi, bütün diqqətini topladı, aktyorların sevinc, ya qəzəbindən, sakit və qəti hərəkətlərindən, səhnədə danışılan sözləri təxmini mənasını anlamağa və bu yolla da əsərin məğzini dərk etməyə başladı. Pyesdə hərəkət və mübarizə qüvvətləndikcə, Tahir tamaşa salonunda oturduğunu belə unudurdu. Xüsusən inqilabçı qonağı tutmaq istəyən jandarmların qabağında namaz qılmağa başlayan ana çox xoşuna gəldi. Onun işlətdiyi hiylə, bütün tamaşaçılar kimi, Tahirin də gülüşünə səbəb oldu:

– Afərin, arvad! – deyə onu özlüyündə təriflədi də.

Jandarmlar qamçı çəkib ananı döyməyə başlayanda, Tahirin ürəyi qəzəblə doldu. Ona elə gəldi ki, döyülən öz doğma anasıdır. Tahir tamaşaya baxdığını unudub, yerindən sıçramaq, yüyürmək və anaya qamçı vuran o alçaq polisi əzişdirmək istədi. Ana, ağır zərbələrin ağrısından iztirab çəkəndə, Tahir dözə bilmədi, yerindən qalxmaq istədi.

Cəmil:

– Neyləyirsən? – deyə ona teatr salonunda olduğunu xatırlatdı.

Əvvəlcə ananın çəkdiyi məşəqqətlərdən bu qədər həyəcana gələn Tahir, bir azdan sonra, onun, əlacsızlıqdan qonaqla yoldaşlarının gizləndiyi yeri nişan verəcəyindən qorxmağa başladı. Ana son qüvvətini toplayıb jandarmlara cavab verəndə, salon dərin bir sükuta qərq oldu. Onun sözləri Tahirin ürəyini sonsuz bir qürur və sevinc hissilə doldurdu. O, elə bil Tahirin sevə-sevə oxuduğu bayatılardan birini deyirdi:

Fələyin zindanı kürəyimdədir,
Zalımın zənciri biləyimdədir.
Qonağın yerini soruşursunuz?
Yarın ürəyimi, ürəyimdədir.

Bu çözləri Tahir dərhal əzbərlədi və ananın mərdliyinə hamı ilə birlikdə ucadan əl çaldı.

Xanların yaralandığı səhnə və dəfn mərasimi Tahirin könlündə silinməz bir iz buraxdı. O, tamaşa salonundan çıxıb evə çatıncaya qədər bu barədə Cəmillə söhbət elədi.

Əsər haqqında eyni rəyə gəlsələr də, bir məsələ onların arasında mübahisəyə səbəb oldu. Cəmil, Xanlar kimi bir fəhlənin dövlətli ailəsində yaşayan Mehribana vurulduğunu düzgün saymırdı. O, iddia edirdi ki:

– Qız nahaq yerə doktor Söhbəti xoşlamır, onların ürəyi bir-birinə daha yaxındır.

Tahir isə bununla razılaşmır:

– Yox, düz fikir deyil! – deyirdi. – Qız Xanların mərdliyini sevir, Xanlar kasıb olanda nə olar? Məhəbbət elə şeydir ki, o adamın dövlətli-kasıblığına baxmaz. Mehriban görür ki, doktor Söhbət, Xanlar qədər onu istəyə bilməz.

Cəmil öz fikrinin üstündə möhkəm durur, təkrar edirdi:

– Yox, Mehriban çox göyçək qızdır. Əgər xasiyyətlərini götürsən, Söhbətlə Mehriban bir-birinə daha yaxındır. Bir də, Mehriban Xanları yox, Söhbəti daha çox tanıyırdı. Çünki Söhbət onların evinə daha tez-tez gəlib gedirdi.

– Nə olsun ki! Bəzən bircə dəfə görmək də bəs eləyir.

Cəmil güldü:

– Bunu sən məndən yaxşı bilərsən. Bir dəfə görməklə Lətifəni...

Tahir bərk tutulub qızardı. Hətta onun sifətində tünd ləkələr də əmələ gəldi:

– Bax, mənə sataşma ha! – dedi. – Mən tamaşadan danışıram. Lətifədə işim yoxdur.

Cəmil əlilə havanı yararaq, qəti bir ifadə ilə dedi:

– Uzun sözün qısası, Xanlar kimi qəhrəman bir fəhlə heç vaxt o cür fint-firuşka qızı sevməzdi.

– Yox, aşna, Mehriban çox gözəl qızdır. Ona elə demək lap insafsızlıqdır!

Mübahisə qızışanda qapı açıldı, işdən qayıdan Səməndərlə Biləndər içəri daxil oldular. Onlar iş paltarlarını çıxartdılar, səliqə ilə qatlayıb çarpayılarının ayaq tərəfindən asdılar Səməndər şişman qarnını irəli verib soruşdu:

– Hə, teatra getdiniz?

– Getdik, – deyə Tahir Səməndərə baxdı və onun həris-həris parıldayan gözlərindən bu günkü tamaşa ilə deyil, yeməyə bir şey olub-olmaması ilə daha çox maraqlandığını duydu.

Səməndər müqəddiməni o qədər də uzatmadı və yorğun halda çarpayıya oturdu.

– Bufet zəhrimar bağlanıb, yeməyə nəyiniz var? – deyə səsinin ahəngini bir az xəfifləşdirərək xəbər aldı.

Cəmil pəncərənin qabağından qəzetə bükülmüş pendir-çörəyi götürüb ona uzatdı.

– Al yazıqsan. Bu gün zalım qızı bufeti heç açmayıb. Yaxşı ki, bunu səhər yeməyindən saxlamışam. Yoxsa ilan vuran yatar, sən yata bilməzsən.

Səməndər, bütün yorğunluğunu unutmuş kimi, yerindən quş surətilə sıçrayıb, özünü pendir-çörəyin üstünə atdı. Sonra hamı "Xanlar" tamaşasında Tahirlə Cəmilin mübahisəsinə səbəb olan mətləbdən da-

nışmağa başladı. Səməndər Cəmilin pendir-çörəyini yesə də haqqın tərəfini saxladı:

– Aşna, Tahir düz deyir. Xanlar kimi oğlanı Mehriban niyə istəməsin axı? Fəhlə olanda nə olar? Fəhlənin Allahı yoxdur bəyəm?

**4**

Bu hadisədən üç gün sonra Tahir küçədə Lətifəyə rast gəldi. Onların gözü bir-birinə sataşdıqda, Lətifə ayaq saxlayaraq, Tahirə nə isə demək istədiyini hiss etdirdi, dərhal da ona yanaşdı.

– Salam, Tahir!

– Salam!

Əl tutuşdular. Qızın uzun kirpikləri arasından parıldayan iri gözlərində Tahirin bir neçə dəfə gördüyü istehzalı təbəssümdən artıq heç bir-iz qalmamışdı. O gülümsəyirdisə də, bunun başqa bir səbəbdən irəli gəldiyi indi Tahirə büsbütün aydın idi. Bu səbəbi də Lətifə tezcə açıb söylədi:

– Bu gün səhər Qüdrət İsmayılzadə buruğa gəlmişdi. Səni xəbər alırdı.

– Nə üçün?

– Necə nə üçün? Maraqlanırdı. Səndən xoşu gəlib... Ustaya səni bərk tərifləyirdi.

– Doğrudan? Nə deyirdi axı?

Tahirin gözləri necə bərəldisə, qızı gülmək tutdu:

– Deyirdi, atan bizim ordu geri çəkiləndə ürəyi bu dərdə tab gətirməyib, Allah rəhmətinə gedib.

– Daha bunun harası tərif oldu ki? Yəqin İsmayılzadə atamı qorxaq hesab eləyir də. Axı, mənə deyən gərək niyə belə şeyləri danışıb, kişini biabır eləyirsən?

– Niyə biabır olur ki? Yəqin vətənimizi çox sevirmiş də...

Tahir şübhə və tərəddüdlə bir neçə an sükut edib, sonradan-sonraya xəbər aldı:

– Yaxşı, bəs trest müdiri mənim özümdən nə dedi? Nəyimi təriflədi?

Bu sualı verəndə Tahir udqundu. Qızın yanında İsmayılzadənin ondan pis bir söz dediyini güman edib, qıpqırmızı oldu.

Lətifənin nəzərindən yayınmayan bu zahiri dəyişiklik, Tahirə qarşı onda çox səmimi bir fikir oyatdı: “Nə utancaq oğlandır!”

– Daha niyə utanırsan? – deyə Lətifə də fikirləşdiyini gizlədə bilməyib soruşdu: – Hara gedirdin?

– Səməndər üçün kitab almağa.

– Hansı kitabı?

– ”Qurbanəli bəyi”

– Hə, Molla Nəsrəddinin hekayəsidir. Ancaq o ayrıca çap olunmayıb. Gərək Molla Nəsrəddinin hekayələr kitabını istəyəsən.

– Kitabxananı görməmişəm. Göstərməzsən?

– Nə üçün göstərmirəm? Gedək.

Lətifə qabağa düşdü. Tahiri asfalt yolun altındakı mədəniyyət sarayına doğru apardı:

– Səni üzv yazdırıram. Müdirə mənim rəfiqəmdir.

Onlar bir-birilə yanaşı addımlayaraq küçə ilə gedəndə, Lətifə oxuduğu maraqlı kitabların adını çəkir, bəzilərinin qısaca məzmununu danışırdı. Tahir isə bu qıza nisbətən çox az şey oxuduğunu görüb, istər-istəməz utanırdı.

Lətifə onun rusca bilib-bilmədiyini soruşanda Tahir etiraf elədi:

– Sənə nisbətən çox az bilirəm.

Lətifə onu həvəsləndirmək istədi:

– Mədəniyyət sarayı yanında rus dilini öyrənən cavan fəhlələrin iki-üç dərnəyi var. İstəsən səni ora yazdıraram. Neftçi gərək bu dili möhkəm öyrənsin. Yoxsa texnikanı mənimsəməkdə çətinlik çəkər. Bax, mən ruscanı da bilirəm, hələ ingiliscə də oxuyuram.

– Necə?! – deyə Tahir təəccübünü gizlədə bilmədi. – İngiliscə?

– Bəli. Hələ bacarsam almanca da öyrənəcəyəm. Yoxsa elə bilirsən ki, düşmənin dilini bilmək faydasızdır? Yox, bu dillər həmişə bizə gərək olacaq.

Tahirin əl-ayağı yerdən üzüldü: “Bakıda yaşamağın bu xeyri var” deyə xəyalından keçirtdi və Lətifənin biliyinə, çalışqanlığına qibtə eləməyə başladı.

Nəhayət onlar qəsəbənin mədəniyyət sarayına gəlib çatdılar.

İçəri qapıların birində “Rayonun səyyar kitabxanası” sözləri yazılmışdı.

– Burada olmayan kitabları Sabir kitabxanasından gətirdə bilərsən, – deyə Lətifə yenə Tahirdən qabaq içəri girdi. – Vay! Zivər yoxdur. – Lətifə, növbəyə durmuş uşaqlara kitab verən qoca arvada müraciətlə soruşdu: – Bu gün istirahətdədir? – Bəli.

– Anastasiya İvanovna! Bu oğlanı üzv yaza bilərsiniz?

– Əlbəttə!

Lətifə gülümsəyib Tahirə baxdı:

– Mənə görə başqa qulluğun?

– Qul sahibi olasan.

Tahirin, tez-tez atasından eşitdiyi bu köhnə ifadəni Lətifə başa düşmədi:

– Nə dedin? – Deyirəm ki, çox sağ ol!

– Dəyməz!

Tahir Lətifənin sadə xasiyyətini ürəkdən bəyəndi və onun bu nəvazişkarlığına qarşı nə isə bir təşəkkür eləmək istədi:

– Daha sən zəhmət çəkmə, – dedi, ancaq qızın ayrılıb getməyə hazırlaşdığını görəndə bu sözləri dediyinə də peşman oldu. Lətifə əlini irəli uzatdı.

– Hələlik, – deyə daha da incə bir nəvazişlə gülümsədi.

Tahir könülsüz halda onun əlini sıxdı, amma birdən özünü toplayıb:

– İzin ver, indi də mən səni ötürüm! – dedi.

– Yox, sağ ol. Tələsik işim var. Mən getdim. O, sürətlə kitabxanadan çıxdı.

Qoca kitabxanaçı Tahiri üzv yazıb, istədiyi kitabı verdi.

Tahir tez-tələsik eşiyə çıxıb küçədə oyan-buyana nə qədər boylandısa da, Lətifəni görə bilmədi və ehtiyatsızlıq etdiyi üçün özünü danlaya-danlaya ümumi yaşayış evinə gəldi. “Vallah, yaxşı qızdır!” – deyə fikirləşib, uzun müddət onun xəyalından ayrıla bilmədi. Bu nə idi? Onun ürəyinə bəlkə Lətifənin məhəbbəti qonmuşdu?

## 5

Qayıqda altı nəfər gedirdi. Hamısının da gözü Tahirə zillənmişdi. O, uc tərəfdə, “Çapayev” sözünün yanında Cəmillə yanaşı oturmuşdu.

Dəniz ayna qədər təmizdi. Qayıq beşik kimi yavaş-yavaş yırğalanır, adamlar isə şimaldan əsən sərin mehdən xumarlanırdılar. Yorğun düşüb sakitləşmiş Xəzərin üstünə yenə əlvan bir axşam enib gəlirdi. Günəşin özü yox, yalnız üfüqdə yanan al-çəhrayı əksi görünürdü.

“Çapayev” isə ayna suları yara-yara şığıyır, fəhlələri axşam növbəsinə aparırdı.

Tahir anasının kənddən yolladığı sazı torbadan çıxarıb kökləməyə başladı.

Usta Ramazan onu həvəsləndirmək istədi və fikri-zikri sazda olan Tahirin də aydın hiss etdiyi bir mehribanlıqla əlini onun çiyninə qoydu.

– Çal, oxu, oğlum, mahnı adamın bütün dərdini unutdurur... – qoca köksünü ötürdü və Tahirə elə gəldi ki, o yenə də oğlanlarını xatırladığı üçün belə deyir.

– Bu saz ki, var, səsini eşidəndə adamı cavanlaşdırır.

Tahir telli sazını sinəsinə basdı və gözəlləmə çaldı. Onun baxışları ilham və məhəbbətlə doldu. Tahir oxudu:

Yarım çıxıb yenə bağda gəzməyə,
Sallanıban yüz min naz ilən gəlir.
Bir aynaqabaqlı mah, qələm qaşlı,
Ağ üzə xalları düzülən gəlir...

Tahirin gözləri elə bil doğrudan da yarına zillənmişdi. Ancaq onun yarı görünmürdü. Çünki hər tərəf dənizdi və yalnız su içindəki buruqlar bir-bir gəlib qayığın böyründən keçirdi. Tahir oxuduqca heç kəsin üzünə baxmırdısa da, yenə də hamının gözü onda idi. Deyəsən, özünə məxsus sadəcə bir məharətlə çaldığı və oxuduğu gözəlləmə qayıqda oturanların ürəyindən idi. Hamının üzü gülürdü.

Cəmil də bu mahnıdan vəcdə gələrək qışqırdı:

– Sağ ol, Tahir, sağ ol! Hər şeyin öz yerindədir, amma hayıf ki, bircə Zöhrən əskikdir.

Lakin Cəmil yanılırdı. Tahirin ürəyində və təsəvvüründə Zöhrəni Lətifə əvəz edirdi. Tahir nəğmə deyərkən, Lətifənin xəyalını gözləri qarşısına gətirməsəydi, sözləri bu qədər təsirli çıxmazdı. Tahir, mahnının son bəndini zilə çəkəndə də, Lətifənin haradasa uzaqdan oturub bu mahnıya qulaq asdığını zənn edir və daha da cuşa gəlib, sazın tellərini lap ürəkdən ehtizaza gətirirdi.

Son günlərdə Tahir ona tez-tez rast gəlirdi və hər dəfə də əvvəllər yaxşı görə bilmədiyi gözəl bir cəhətini kəşf edir, fikrində yanılmadığını görüb sevinirdi. Qızın yoldaşcasına dediyi sözləri Tahir son dərəcə xeyirxah bir məsləhət kimi dinləyir və çox tez ayrıldıqlarına təəssüflənirdi. Hər dəfə gəlib-gedəndə könlündən keçən "səni sevirəm" kəlmələrini deməyə fürsət axtarırdısa da, Lətifənin özündən utanıb dinmirdi. Saz çalıb oxumaqla ürəyini ona açmaq istədiyindən, qayığın buruğa yaxınlaşdığını görüb, səsini daha da ucaltdı və başını dik tutaraq, Lətifənin işlədiyi mədəni budkaya doğru baxdı:

Sallana-sallana gedən Salatın,
Ha yana gedirsən, qız qayıt indi.
Süsəndən, sünbüldən, tər bənövşədən
Dəstinlə qönçəni üz, qayıt indi...

O, sükut edəndə qayıqdakıların üz-gözünü təəssüf ifadəsi bürüdü. Tahir sazını torbaya saldı, iplə bağlaya-bağlaya qımışdı:

– Birinci nömrə qurtardı!.. – deyə ayağa qalxdı. Qayıq buruğa yan alan kimi hamıdan əvvəl düşdü.

Onun baxışlarında indi də sevimli yarını axtaran bir aşiq intizarı vardı. Lakin Lətifə görünmürdü. Tahir onun bu gün gəlmədiyini fikirləşəndə, qəlbi həyəcanla çırpındı. O, bir də mədəni budkaya doğru baxdı: "Bəlkə xəstələnib? " – deyə öz-özündən soruşdu.

Bu anda Tahir onun addım səslərini eşidib, sərt bir hərəkətlə sağ tərəfinə döndü.

Onlar bir an sükut edərək bir-birilərinin üzünə baxdılar. Tahir Lətifəyə nə isə demək istəyəndə, qayıqdan düşən fəhlələr gəlib onların yanından keçdilər. Hər ikisi dinməyib, fəhlələrin uzaqlaşmasını gözlədi.

Tahirin baxışlarından yenə də utancaqlıq sezilirdi. O ürəyindən keçəni deyə bilmirdi. Nəhayət Lətifənin xəfif və incə bir təbəssümlə güldüyünü görüb ürəklənən Tahir:

– Axşamın xeyir, Lətifə! – deyə onu salamladı və səsinin titrədiyini hiss edib udquna-udquna duruxdu.

Lətifə onun salamını aldı, nə üçün belə gec gəldiklərini soruşdu.

Tahir, söhbət etmək üçün əlinə yaxşıca fürsət düşdüyünə sevindi:

– Qayığı gözləyirdik. Kapitan yenə də haradasa içməyə getmişdi.

Lakin bu söhbət Lətifə üçün də, Tahir üçün də maraqlı deyildi. Tahir onun tələsdiyini duyub soruşdu:

– Sən hara?

– Növbəm qurtardı, bizim mədəniyyət sarayına "Koroğlu" gəlir.

Tahirin dodağındakı təbəssüm silinib yox oldu və o, qaşqabağını sallayıb, gözlərini yerə dikdi. Lətifə də, dediyinə peşman olmuş kimi, söhbətin istiqamətini dəyişmək istəyərək, Tahirin qoltuğundakı sazı göstərib, yenə eyni yumşaq və mehriban səsilə soruşdu:

– Özüyündürmü?

– Anam kənddən yollayıb. Ürəyim darıxırdı.

Lətifə qaşlarını azacıq yuxarı qaldırıb təəccüblə soruşdu:

– Yəni çala bilirsən də? Bir az bundan qabaq oxuyan kim idi?

– Mən.

– Elə isə qiyamətdir ki...

Tahir, həyəcandan parıldayan gözlərini Lətifədən gizlətmək istəməyərək, başını bir azca da yuxarı qaldırdı, cəsarətlə onun üzünə baxdı:

– Ancaq bunun nə faydası? – dedi. Əgər utanmasaydı, "çalıb-oxumağımdan xoşun gəlirsə, bəs məni niyə sevmirsən?" deyərdi.

Lətifə gənc olsa da, Tahirin ürəyindən keçənləri duyurdu. O, dodağının altında gülümsünüb, başını azacıq yana sarı əydi.

– Düz demirəmmi, Lətifə?

Bu anda usta Ramazanın səsi eşidildi:

– Tahir! Hamı səni gözləyir, bala.

Tahir:

– Sağ ol, mən getdim, – dedi.

Onlar ayrıldılar. Tahir uzaqlaşdı. Cəmilə yanaşdı. Qürurdan çox sevinc ifadə edən bir səslə onun qulağına pıçıldadı:

– Gördün? Mənə vurulub...

Cəmil uzaqda olsa da, Tahirlə Lətifə arasındakı söhbətin məzmununu təxminən bilirdi. O bilirdi ki, hələ onların heç biri vurulacaq qədər bir-birinə yaxın deyil.

Tahir onun azca istehzalı bir ifadə ilə parıldayan baxışlarını duyub soruşdu:

– Görmədin? İnanmırsan?

– Lətifəni gördüm, ancaq sənə vurulduğunu görmədim, – Cəmil öz cavabından xoşlanıb mənalı-mənalı güldü. – Tələsmə, yavaş gedən çox gedər...

Tahir pərt halda ondan ayrılıb ustaya yaxınlaşdı:

– Mən gəldim usta! – dedi.

Usta Ramazan yoğun, çal qaşları altında sərt və incik baxan gözlərilə Tahirə baxdı. Tahir onun baxışlarındakı bu narazılığın Lətifə ilə özü arasında baş vermiş söhbətdən əmələ gəldiyini duydu.

Lakin usta bu xüsusda ona bir kəlmə belə demədi, ucadan hamıya müraciət elədi:

– Başladıq!

Bir an belə keçməmiş buruğun bütün mexanizmləri hərəkətə gəldi.

## 6

Gecə saat on birə yaxın qazıma borusunun yoxluğu üzündən buruqda işlər dayandı. Borular hələ dünən axşamdan gətirilməli idi. Ancaq indiyə kimi dəniz sahilində yatıb-qalmışdı. Usta Ramazan acığından ora-bura vurnuxaraq, təchizat işlərinə baxan Bədirlini qaba sözlərlə söyür, qazıma idarəsinə zəng edir, heç kimi tapa bilməyib, axırda Qüdrəti axtarmağa məcbur olur, onu kabinetində tapmadığı üçün daha da qanı qaralırdı. Ən axırda o "Çapayev" qayığın kapitanına zəng edib:

– Gəl, məni trestə apar! – dedi.

Qayıq gəldi və usta İsmayılzadəyə şikayətə getdi.

Bu zaman buruqlar arasından siyrilib çıxan ay buruğu işıqlandırdı. Ayın kəsik şüaları indi sakit-sakit ləpələnən dənizə əks etdikcə, dalğacıqlar gümüş pullar kimi parıldaşırdı.

Tahirlə Cəmil quyudan kənarda, işə yaramayan qazıma borularının üstündə oturdular və şəhərə doğru baxdılar. Bu gün Bakı elə bil həmişəkindən də gözəldi. Şəhərin belinə yarımqurşaq kimi dolanan minlərcə sahil işıqları yerə səpilmiş ulduzlar kimi sayrışırdı. Sanki bu işıqlar sulara tökülmüş və dənizin dibinə enmişdi.

Cəmil, yarımdairə halında uzanıb gedən sahili göstərib dedi:

– Bax, mən bu ulduzları deyirdim. Yaxşı bax!

Tahir heç bir söz demədi. Lətifədən ayrılandan sonra onun könlü açılmırdı. Cəmilin mənalı gülüşləri, usta Ramazanın sərt baxışları qəlbinə bərk toxunmuşdu. Lakin məhz bundan kədərləndiyini Cəmilin qarşısında etiraf etmək çətindi. Gözləri sahilə zillənmişdisə də, sayrışan elektrik işıqları əvəzinə hər yerdən Lətifə ona baxır, deyəsən o da Cəmilin kinayəsində həqiqət olduğunu təsdiq edərək, istehzalı bir təbəssümlə gülürdü.

– Hə, necədir? – deyə Cəmil əlini onun böyrünə toxundurduqda, Tahir fikrindən ayrıldı və incik halda başını bulayaraq Cəmilin üzünə baxdı.

– Nə olub sənə? Bəlkə dediklərim xətrinə dəyib, – deyə Cəmil təəccüblə soruşdu.

– Yox, əşi, sən mənə nə demisən ki?

– Bəs niyə mısmırığını sallamısan?

Tahir acığını unudub, gözlərini məchul bir nöqtəyə zillədi:

– Ürəyim darıxır, – dedi, – evdən ötrü burnumun ucu göynəyir.

Cəmil Tahirin zahirən çox sakit söylədiyi bu sözlərdəki əsəbi nidanı dərhal hiss etdisə də, onun ürəyinə yenidən toxunmamaq üçün səsinə mehriban və mülayim bir ifadə verdi.

– Axı, bu kənddə nə görmüsən?

– Hər şey... – Tahir əsəbi bir tərzdə onun sözünü kəsdi. – Nəyim çatışmırdı? Bir atım var idi ki, üstünə qalxanda ürəyim tel-tel olurdu. Bulaq başında səhənglərini dolduran qızların yanından səyirdib keçəndə, hamısı gözünü mənə zilləyib həsrətlə baxırdı...

Cəmil, onun xətrinə dəyməmək üçün sözlərini zarafat tərzində demək istədi:

– Balam, qızlarda, gəlinlərdə işim yox, amma kolxozun atını niyə öz adına çıxırsan?

Tahir dostunun sözlərinə etiraz edib, "kolxoz da elə mənim deyil?" demək istərkən, arxa tərəfdən addım səsləri gəldi. Onlar hər ikisi dönüb baxdı. Buruq ustası müavini Vasilyev, əlində Tahirin sazı onlara tərəf yeriyirdi.

Briqadanın üzvləri arasında Sergey Timofeyeviç Vasilyevin çox böyük hörməti vardı. O, yeddi-səkkiz ildi ki, usta Ramazanla birgə işləyirdi. Özü Bakıda doğulmuş, ta uşaqlıqdan azərbaycanlılarla qapı bir qonşu olmuşdu. Atası 1918-ci ildə alman-türk silahlıları ilə vuruşma zamanı fəhlə dəstəsinin komissarı sifətilə cəbhəyə getmiş və Bakının qəhrəman müdafiəsində əsil igid kimi döyüşüb həlak olmuşdu. Sergey Timofeyeviç özü hələ atası ölməmişdən fəhlə idi. Həmişə də azərbaycanlılarla durub-otururdu. Onun həyat tarixçəsində daima həzin kədərlə xatırladığı bir hadisə baş vermişdi: on altı-on yeddi yaşında ikən qonşularının qızı Fəridəyə vurulmuş və müsəlman qızını sevməyin nə dərəcədə qorxulu olduğunu dərk etməyə başlayandan sonra da bu məhəbbətini ürəyindən qoparıb ata bilməmişdi. Bunu etiraf eləməyə cəsarəti çatmasa da, hərəkətlərindən, baxışından Sergey bunu aydın hiss edirdi. Fəridə yaxşı bilirdi ki, bu əhvalatdan ata-anası xəbər tutsa, şəhərdə rüsvay olmamaq üçün, hər halda onu sağ qoymayacaqlar. Rusa ərə getmək zəmanənin adətinə, ənənəsinə müğayir bir işdi. Nəhayət Fəridə on səkkiz yaşına çatanda onu bir başqasına ərə verməli oldular. Qız nə qədər ah-vay qopartdısa da, özündən otuz yaş böyük dul bir kişinin varına, dövlətinə satılmaqdan yaxa qurtara bilmədi. Lakin bundan sonra da Sergeyin məhəbbəti sönmədi. O, fəhləliyə getdisə də, Fərideni bir an belə yadından çıxarmadı. Hər axşam Fərideğil yaşayan hündür binanın qabağında dayanır, xeyli müddət onların pəncərəsinə

baxır, Fəridəni görə bilməyib, kədərli halda evə qayıdırdı. Günlərin birində Fəridə ərinin evindən ata-anasıgilə qonaq gəldi. Qızın vərəmli sifətinə baxanda, Seregeyin kədəri daha da artdı.

Üç ay belə keçməmiş Fəridənin ölüm xəbəri bütün məhəlləyə yayıldı. Sergeyin necə dərin bir həyəcan keçirdiyini yalnız ata-anası deyil, qonşuları da duyurdular. O, təziyə yerinə gələndə, özünü saxlaya bilməyib, hönkürtü ilə ağladı. Tanışlar bunun səbəbini Fəridə ilə Sergeyin ta uşaqlıqdan yaxın qonşu olmaqları ilə izah edirdilər. Əsil həqiqəti yalnız Fəridə ilə Sergey bilirdi. Qız bu sirri özü ilə bərabər qəbrə apardı.

Sergey Timofeyeviç otuz iki yaşına çatıncaya qədər evlənmədi. Lakin nəsillərinin kəsilməyi ona ağır gəldi. Axırda indiki arvadını aldı və ona öz məhəbbət macərasını açıb söylədi.

Vasilyev Fəridənin əhvalatından sonra da azərbaycanlılarla aranı vurmadı. O, Fəridənin ata-anasını yox, zəmanəni təqsirləndirirdi. Hələ indi də onlarla salaməleykümünü kəsməmişdi. Əldən-ayaqdan düşmüş qocalar, Sergey Timofeyeviçin xətrini istəyir və onunla birlikdə, qızlarını vaxtsız öldürən köhnə dünyaya lənət yağdırırdılar.

Sergey Timofeyeviç Azərbaycan xalq nəğmələrini çox sevirdi. O, hətta özü də arabir qəmgin bayatılardan titrək səsilə oxuyurdu. Bəlkə də elə bunun üçün fürsətdən istifadə edib, Tahiri oxutdurmaq və Tahiri dinləmək istəyirdi. O çox çətin sezilən rus tələffüzü ilə təmiz azərbaycanca Tahirlə Cəmilə müraciət etdi:

– Ay uşaqlar, boş oturmağın faydası yoxdur, qoy Tahir oxusun, biz də qulaq asaq.

Cəmil sazı ondan alıb Tahirə uzatdı:

– Usta düz deyir. İşsiz oturanda yadına həmişə kənd düşür.

Qan Tahirin başına vurdu. “Xəbərçilik eləyir” – deyə düşünüb, narazı bir halda başını buladı və sazı ondan alıb torbanı açdı.

– Nə oxuyum, usta?

– Nə istəyirsən, oxu.

Vasilyev onların böyründə oturdu və sazını kökləyən Tahirə baxa-baxa sükuta qərq oldu.

Tahir sazını sinəsinə basanda yenə evi və kəndi xatırladı. Dağlar, dərələr yadına düşdü. Bulaqdan su gətirməyə gedən qızlar, gəlinlər təsəvvürünü çulğaladı və o, həsrətlə köksünü ötürüb, sazını çala-çala zilə çəkdi:

Qədəm qoyub yar yanına gələndə,
Elə gəl, elə get, yol inciməsin.
Şəkər ləblərindən mənə busə ver,
Dodaq tərpənməsin, dil inciməsin.

Tahirin səsini eşidən o biri fəhlələr də müxtəlif tərəflərdən yavaş-yavaş gəlib onlara yanaşdılar. Tahir onların heç birini görməyib, xəyalı uzaqlarda, yenə oxumağa başladı.

Bülbül fəğan elər, gül həvəsindən,
Qoşa nar asılıb yar sinəsindən.
Elə gəl, elə get bağ-bərəsindən,
Bülbüllər hürküşüb, gül inciməsin.
Gözəllər içində sən qızıl güllər,
Dolansın başına şeyda bülbüllər.
Əsmə, səba yeli, titrəmə çöllər,
Cığalar tərpənib, tel inciməsin...

Hər tərəfdən "sağ ol!" səsləri yüksəldiyi zaman, Tahir ixtiyarsız olaraq dönüb geriyə baxanda fəhlə yoldaşlarını gördü:

– İndi də ikinci nömrə qurtardı... – deyə gülümsədi. – Bəs usta harada qaldı?

**7**

Qüdrət İsmayılzadə yeddi-səkkiz gündən bəri evində gecələməmişdi. Azərneft birliyində səhər-axşam yeni buruqların layihəsi müzakirə olunur, İsmayılzadə ilə geoloqlar arasındakı münaqişələr get-gedə qızışır, çox vaxt səhər saat dörddə-beşdə qurtarırdı.

Qüdrət, yeni dəniz buruqlarında aparılan qazıma işlərinin sürətilə qətiyyən kifayətlənmədiyi üçün, Azərneftdəki gurultulu mübahisələr qurtarandan sonra də evinə qayıtmır, işi ləngidən səbəbləri öyrənmək məqsədilə, ayrı-ayrı briqadalara bilavasitə özü baş çəkir, elə oradaca tapşırıqlar verir, o günün sabahısı da təyin etdiyi vaxtda gəlib, tapşırıqlarının doğrumu, yanlışmı yerinə yetirildiyini yoxlayırdı. Trest nəzdindəki qazıma idarəsinin iş sürəti artmışdısa da, Qüdrət bunu yalnız işdəki dönüşün ilk mərhələsi hesab edirdi. Hələ də, bəzən ən cüzi bir səbəb nəticəsində ayrı-ayrı buruqların işi dayanır, verilən gündəlik tapşırığın yarısı da ödənilmirdi. Ona görə də Qüdrəti öz kabinetində

tapmaq olmurdu. Katibəsi telefon zənglərinə: “yoxdur, dənizə gedib” sözlərindən başqa bir cavab verə bilmirdi. İki-üç saatdan bəri katibənin yanında oturub, İsmayılzadənin yolunu gözləməkdən yorulmuş bir nəfər müxbir kor-peşman geri qayıtmağa hazırlaşanda, dəniz buruqlarından yenicə qayıdan Qüdrətlə qapıda üz-üzə gəldi:

– Yoldaş İsmaylzadə, mən sizi görmək istəyirdim, – dedi.

– Buyurun, buyurun! – Qüdrət, adəti üzrə yenə də gülərüzlə kabinetini göstərib, özü sürətlə yazı stolunun dalına keçdi. – Mənə görə qulluğunuz?

Müxbir, vəsiqəni çıxardıb göstərəndən sonra dəniz kəşfiyyatı ilə maraqlandığını söylədi. İsmayılzadə yorğun olsa da, müxbiri əliboş qaytarmaq istəməyib, onun suallarına çox ətraflı cavab verdi. Müxbirin, neft istehsalı haqqında son dərəcə səthi bir təsəvvürə malik olduğunu o dəqiqə hiss edən Qüdrət, tamam sadə məsələlərdən danışmağa başladı:

– Abşeronun əbədi odlar diyarı olduğu ta qədimdən məlumdur. Hələ tarix – miladidən çox-çox əvvəl atəşpərəstlik meydana çıxdığı zaman bizim qədim babalarımız bir sıra atəşgahlar qurub, oda sitayiş edərlərmiş. Yunanlar buraya basqın edəndə, həmin atəşgahları uçurdub xarabaya döndərmişdilər. Bu hadisə yeddinci əsrdə vaqe olmuşdur. Sonralar Suraxanı kəndində tikilmiş atəşgah indi də durur. Yerdən çıxan qazı qədim adamlar ilahi bir şey hesab edirdilər. Ancaq elm aydnlaşdırdı ki, bu, mövhumi bir şey deyil, güc və qüdrətdir. Kustar üsulu ilə nefti çıxaran yerli əhali ondan adi bir yanacaq kimi istifadə edirdi. Ərəb tarixçilərindən birinin yazdığına görə bakılılar hələ səkkizinci əsrdə, odun yoxluğundan neftli torpağa od vurub yandırarmışlar. Mötəbər mənbələrin verdiyi məlumatdan bəllidir ki, 1735-ci ildə bu günkü Balaxanıda neft verən 52 quyu varmış. Bizim qədim babalarımız arasında son dərəcə mahir neft ustaları olduğunu təsdiq edən tarixçilər göstərir ki, quyu üsulu ilə alınan nefti dəvə karvanları ilə uzaq ölkələrə aparırlarmış... Əlbəttə, bütün bunlar, neft istehsalının o zamankı səviyyəsinin nə dərəcədə aşağıda olduğunu təsəvvür etməyə imkan verir.

Müxbir nəzakətlə Qüdrətin sözünü kəsib, soruşdu:

– Abşeronda ilk buruq nə vaxt qoyulmuşdur?

– Sənaye üsulu ilə Bakıda qazılan ilk buruq 1869-cu ilə təsadüf edir. Bu işi Mirzəyevin mədənində başlamışlar. Lakin ilk qüvvətli fan-

tan Balaxanıda, 1873-cü ildə olmuşdur. Bu zamandan etibarən qazma işləri sürətlə artmış, bir çox yerdə zəngin neft yataqları işə salınmışdır. Bunlar indi bizə çox sadə və gülməli görünür. Birinci fantan vuran quyunun dərinliyi yalnız 29 metrdi...

Müxbir təəccübdən böyüyən gözlərini Qüdrətə dikib qaldı.

– Təəssüf ki, – deyə İsmayılzadə yorğunluğunu gizlədə bilməyib əsnədi, – çox təəssüf ki, neftin tarixini hələ də layiqlə tədqiq edən olmamışdır... İnqilabdan əvvəl Abşerona soxulan xarici kapitalistlər yalnız vəhşi istismara fikir vermiş, xalqımızın adət və ənənələrini, tarixini, xüsusən neftin ilk qəhrəmanlarını öyrənməklə qətiyyən maraqlanmamışlar. Sovet alimlərinin bu sahədə gördükləri iş az olmasa da, hələ kafi deyildir. Abşeronun hər parçası zəngin neft yataqları ilə bərabər böyük və maraqlı əfsanələrlə doludur...

– Dəniz kəşfiyyatının tarixindən bir söz deyə bilməzsinizmi?

– Dəniz kəşfiyyatının tarixi o qədər böyük deyildir. Ona görə də bu sahədəki təcrübəmiz hələ çox azdır. İndiyəcən qazılan quyuların əksəriyyəti yaxşı səmərə verməmişdir. Ancaq geologiyanın çıxardığı nəticəyə görə Xəzər dənizində zəngin neft yataqları vardır. Son illərdə qoyulmuş bəzi buruqlar da bunu aydın sübut etməkdədir. İndi artıq bizə məlumdur ki, Abşeronun çox yerində iyirmi beş qatdan neft götürə bilərik.

Müxbir onun dediklərini qısa qeydlər şəklində cib dəftərçəsinə yazaraq, yenə sual verdi.

– İndiki quyular ən dərin horizonta gedib çatırmı?

– Xeyr, bu hələlik mümkün deyildir. Ancaq biz bu yolda çalışırıq. Bundan başqa, axırıncı neft təbəqəsinin hansı dərinlikdə olduğunu təyin etməmişik. Biz dərin horizontlardan neft çıxarmağa cəhd edirik, bunun üçün yeni ixtiralar üzərində işləyirik. Geoloqlarımız ən dərin təbəqələrin kəşfi üçün lazımi tədqiqat aparırlar.

– İndi Bakıda ən dərin quyu neçə metrdir?

– Dörd min... Lakin bu quyu hələlik təkdir...

– Dənizdə, yoxsa quruda?

– Quruda.

– Dənizdə mümkün deyildirmi?

– Xeyr!

Qüdrət bunun səbəbini ətraflı danışdı. Dəniz buruqlarının qazılmasında rast gəldikləri texniki çətinliklərdən bir neçə misal belə gə-

tirdi. O, Bakı neftçilərinin bu sahədəki qəhrəmanlıqlarından bəhs edəndə, müxbirin təsəvvüründə gələcək neft sahələrinin xəritəsi aydın şəkildə canlanmağa başladı.

– Dənizi zəbt edəcəyimizə zərrə qədər də şübhə ola bilməz! – deyərkən, Qüdrətin səsində müxbiri dərindən həyəcana gətirən bir inam vardı. – Hər bir işdə oldüğü kimi, burada da insan iradəsinin qalib gələcəyi mənə gün kimi aydındır.

– Mən də buna şübhə etmirəm! – deyə müxbir İsmayılzadənin alışıb-yanan gözlərinə baxdı. Bir an ona elə gəldi ki, dənizə hücum edən ordunun sıralarında özü də gedir.

Qüdrət papiros yandırdı, Müxbir yenə soruşdu:

– Bu saat dənizdə ən dərin buruq harada qazılır?

İsmayılzadə, usta Ramazanın kəşfiyyat buruğunu nişan verdi:

– Onun dərinliyi üç min metr olacaqdır... Qoca usta indiyədək bu məsafənin yalnız üçdə birini qət etmişdir. Təxminən min iki yüz metrlikdə birinci neft təbəqəsinə rast gələcək. Lakin o, bu təbəqəni vurub keçməlidir.

Müxbir yazmağına ara verdi, bloknotunu cibinə qoydu:

– Usta Ramazanla görüşə bilərəmmi? Onun buruğuna getmək mümkündürmü? – deyə soruşdu.

– Nə vaxt istəsəniz!

– İndi mümkündürmü?

– Xeyr, indi məsləhət görmürəm. Külək bərkiyə bilər.

– Siz indi dəniz buruğundan gəlirsinizmi, əgər qorxuludursa, özünüz nə üçün gedirsiniz?

– Mən başqa... Mən fırtınalı günlərdə də təhlükədən çəkinməməliyəm. Bunun səbəbi məlumdur: sənətimiz belədir. Neftçinin borandan qorxub geri çəkilməyi, əsgərin silahı atıb səngərdən qaçmağına bərabərdir. – Qüdrət ayağa qalxdı, pəncərəyə yanaşıb dəniz sahilinə doğru baxdı. – Siz mənə sabah zəng eləyin, dəniz sakit olsa gələrsiniz, bərabər gedərik. Yarım saat əvvəl çox gözəl idi, indi daha külək qalxmışdır.

Bu anda qapı açıldı, əlində şapkasını öykələyən usta Ramazan hirsli addımlarla içəri girdi.

– Yoldaş müdir, – əgər mane oldumsa, üzr istəyirəm.

İsmayılzadə ona tərəf addımladı:

– Buyur, usta buyur!.. Elə yaxşı oldu gəldin. Müxbir yoldaş da səninlə görüşmək istəyirdi.

Müxbir diqqətlə ustaya baxdı. Ortaboylu, enlikürəkli qocanın xırdaca gözləri qızarmışdı:

– Buyursun, – deyə o, əvvəlcə İsmayılzadə ilə, sonra da müxbirlə görüşdü. – Ancaq işlərim dayanıb, özü də Bədirlinin dövlətindən... Canım, belə də iş olarmı?.. Biz geri qalanda şəxsi tənqidin atını sağa-sola çapırlar. Ancaq işin qabağına kötük itələyənlərə toxunmaq istəmirlər. Qardaşoğlu, – usta müxbirə üz tutdu, – məndən yox, belələrindən yaz, kömək elə bizə!..

Qüdrət, qoca ustanı sakit etmək üçün yenə gülümsəyərək, olduqca sakit bir səslə xəbər aldı:

– İşlər niyə dayanıb? Nəyin çatışmır?

Ramazan qazıma borularının iki gündən bəri körpüdə tökülüb qaldığını söyləyərək, yenə hirsli-hirsli əl-qolunu ölçdü:

– Vallah, hər xırda-xuruşdan ötrü sənə başağrısı vermək istəmirəm. Doğrusu, şikayətlə aram yoxdur. Bu gün lap canım boğazıma yığıldı.

Qüdrət yanında ustaya yer göstərdi.

– Buyur, əyləş!.. İşimizə aid olan heç bir şey mənim başımı ağrıtmır, usta. Bu saat Bədirli ilə danışaram.

O, telefonun dəstəyini götürüb zəng elədi. Cavab almadığı üçün stolun üstündəki şirmayı düyməni basıb katibəsini çağırdı:

– Bədirlini axtar, harada olsa, mənə zəng eləsin! – deyə tapşırdı.

Yuxusu gözündən tökülən uzunboy katibə, gözlərini ovuşdura-ovuşdura kabinetdən çıxdı.

– Bütün işlərimizi korlayan intizamsızlıqdır, usta. Hər kəs öz işinə məsul olsa, planı yüz nədir, iki yüz faiz də doldurarıq. Təsəvvür edin ki, bəzən bir baltanın vaxtında buruğa göndərilməməsi üzündən iki gün işləməyən briqadalar da var.

Usta əlindəki şapkanı dizinin üstə qoyub oturdu və Qüdrətin sözünə qüvvət verdi:

– Bəs mən nə deyirəm? Trestin adını batıran elə-belə şeylər deyil? Canım, gözüm, əgər işin öhdəsindən gələ bilmirsənsə, vicdanın olsun, gəl de ki, bacarmıram, yerimə bacaran adam qoyun. Əslinə baxsan, tənqid eləməkdən də yorulmuşuq. Belələrinə söz kar eləmir. Söyülməyə öyrəşməkdən də pis iş olar? Adamın üzündə gərək həya olsun, söz deyiləndə utansın, bilsin ki, bundan təkcə bir adama zərər dəymir, bu boyda məmləkətin işi axsayır.

Bakı neftçilərinin çox danışmağı sevmədiklərini və onların nəzərində iş görmək əvəzinə nitq söyləməyin nə qədər ağır bir söyüş olduğunu çoxdan bilən müxbir, ustanın yalnız iş xatirinə bu qədər uzun danışdığını görüb, onun dediklərini də cib dəftərçəsinə yazmaq istəyirdi, ancaq yazmağa başı qarışanda elə bil qocanın sözləri arasındakı rabitəni yaxşı qavraya bilməyəcəyindən qorxub, bütün diqqətini topladı və əlini çənəsinə dayayıb, yenə qulaq asmağa başladı. Ramazan isə, ürəyindəki yanğını söndürmək istəyirmiş kimi, sözlərinə ara vermədən deyirdi:

– Əgər mən işləyəndə gözümün qabağına fabriklərimizi, zavodlarımızı gətirməsəm, elə bil biyara gedirəm. Gərək saatla yox, vicdanla işləyəsən. Vicdanın yoxdusa, çəkil nöyütdən, get özünə ayrı peşə tap!

Müxbir zarafatla usta Ramazanın sözünü kəsdi:

– Məgər ayrı peşədə vicdan lazım deyil?

Ramazan eyni ciddiyyətlə ona da cavab verdi:

– Əlbəttə lazımdır. Ancaq mətləb burasındadır ki, nöyütdə vicdan da azlıq eləyir. Gərək damarlarında qanla bahəm nöyüt də axsın. Uzun sözün qısası, – qoca usta sözünün ahəngini yumşaldıb Qüdrətə üz tutdu, – uzun sözün qısası, xahişim budur ki, mənim işimi dayandırmasınlar, bu gecə nə təhər olsa qazıma borularını mənə çatdırsınlar.

Usta özü də uzun danışdığını hiss etdi, bir anlıq sükutdan sonra başını bulayıb, dediklərinə yekun vurdu.

– O qədər danışdırırlar ki, adamı...

Bu halda Qüdrətin stolu üstündəki şəhər telefonun zəngi cingildədi. İsmayılzadə dəstəyi götürdü:

– Yoldaş Bədirli, – dedi, istirahət yaxşı şeydir... Bəli... 155-ci buruğun qazıma borularını nə üçün indiyəcən sahildə qoymusunuz? Gəmi vermirlər? Almaq lazımdır. Almağı bacarmaq lazımdır, yoldaş Bədirli!..

İsmayılzadənin dodaqları səyrildi. Onun əsəbiləşdiyini yalnız bundan bilmək olurdu. Qüdrət saatına baxdı:

– İndi saat on iki olub. İki saat bəsdirmi? Bəs deyil? Azdır? Elə isə vaxtını yarım saat da azaldıram. Əgər bu iş üçün iyirmi adamı da yuxudan qaldırmaq lazım gəlsə, qaldırın. Bu gecə hava çox sərindir, qoy onlar bir neçə saat təmiz havaya çıxsınlar.

Qüdrət dəstəyi yerindən asdı və usta Ramazana tərəf döndü:

– Saatını düzəlt, usta, – dedi, əgər borular saat ikinin yarısına gəlib çatmasa, zəhmət çək, mənə zəng elə.

Ramazan cib saatını çıxarıb baxdı, ayağa qalxdı və razılıq edib getmək istədi. Qüdrət onun qolundan tutub saxladı:

– Sən öz xahişini dedin, usta, indi də mənim sualıma cavab ver.

– Buyur...

– Tahir Bayramlı necədir? Deyirlər yaman saz çalıb oxuyandır...

Usta Qüdrətin şagirdlərlə belə tez-tez maraqlanmasını bəyənir, "cavanlara fikir verdi, işi irəli gedəcək" deyə düşünürdü. İndi də əlinə fürsət düşdüyünü görüb, Tahiri az qala göyə qaldırmaq istədi.

– Diribaş oğlandır. Bizim kənd uşaqları yaman qabiliyyətli olurlar, bir oxumaq oxuyur ki, səsi düz Narginəcən gedir.

– İşi, işi necədir? Mən düz diaqnoz qoymuşam ya yox?

– Elə, işi də. Mən ki çox razıyam.

Qoca usta yalnız Tahirin deyil, işıqucu gördüyü hər bir şagirdinin üstündə mehriban bir ata kimi əsməyə çoxdan adət eləmişdi. Bunu büruzə verməsə də, ürəyi, təzə və bacarıqlı ustalar yetirmək eşqilə çırpınırdı. Onun fikrincə plan doldurmaq hər bir neftçinin vəzifəsi idi, amma cavanları tərbiyələndirmək, onları gələcək üçün, ölkə üçün yetişdirib boya-başa çatdırmaq əlavə diqqət və qayğı tələb edirdi. Ramazanın tanıdığı bacarıqlı ustalar arasında bu müqəddəs borcunu unudanlar və şagirdə artıq yük kimi baxanlar az deyildi. Hələ kənd cavanlarından dəstə-dəstə gəlib neft sahəsində işləyən və bir azdan sonra həvəsdən düşüb geri qayıdanlar da vardı. Ramazan bunun günahını buruq ustalarında görürdü: "Özlərindən başqa heç kəsi istəmirlər. Axı onlar ölüb gedəndən sonra niyə deməsinlər ki, bax, filan cavan ustanı filankəs yetirib?"

– Mən ki, çox razıyam, – deyə o, bir az da qəti və möhkəm ifadə ilə təkrar etdi. – Bir kərrə başa saldınmı o saat yadında qalır. Amma hayıf ki...

İsmayılzadə:

– Nə hayıf ki? – deyə sözünü kəsdi...

– Hayıf ki, bir gözü evlərindədir. – Qoca usta Qüdrətin qaşqabağını turşutduğunu görəndə sözlərinin ona pis təsir bağışladığını düşünüb tezcə də əlavə etdi. – Mən ona baxanda həmişə cavanlığım yadıma düşür. Mən də Tahir kimi bir az tərs idim. Hər yetənin sözünü götürməzdim.

Ramazan bu dəmdə Bakıya gəldiyi zamanları xatırladı. Atası rəncbər idi. Kəndin bəyindən yer alıb əkər, məhsulun yalnız altıdan birini özü götürərdi. Ramazan on yeddi yaşında idi. Günlərin birində bəyin

bığıburma cavan oğlu at belində xırmana gəldi və Ramazanın atasını məhsulu gizlətməkdə təqsirləndirib, yamanlamağa başladı. Ramazan buna dözməyib, bəy balasına yağlı bir söyüş söydü. Onlar dalaşdılar. Bəy balası atını məhmizləyib getdi.

Ramazanın atası öyüd-nəsihət verib neçə dəfə "get, bəydən üzr istə" dedisə də, Ramazan buna razı olmadı "acından ölsəm də onun qabağında əyilməyəcəyəm" deyib durdu. Bəy o il torpağını icarəyə verməkdən boyun qaçırdı, onları naşükürlükdə təqsirləndirdi. Amma Ramazan yenə də inadından dönməyib, Bakıya fəhləliyə gəldi.

– Elə mən özüm də mədənə təzə gələndə, öz qabağımdan yeyən deyildim, – deyə Ramazan çal bığlarının altından qımışdı. – Amma yenə də fikrim-zikrim elə o köhnə daxmamızda idi. Ha çalışırdım ki, puldan-paradan düzəldib ora qayıdım.

İsmayılzadə nüfuzedici bir nəzərlə ustanın gözlərinin içinə baxıb, iki-üç dəfə başını buladı:

– O zamanlarla indinin fərqi çoxdur, usta. İndi gənclik Bakını sevir. İndi Bakı onlar üçün işıq və bilik mənbəyi olmuşdur. Hamısı buraya ideal kimi baxır. Elə deyilmi?

– Elədir. – Qoca köksünü ötürdü. İsmayılzadə də bunun mənasını dərhal başa düşdü. – O zaman biz katorqadan qaçırdıq. Bakının mədənlərində cəhənnəm əzabı çəkirdik. İndi işləməyə nə var ki?

Aralığa ağır bir sükut çökdü. Qüdrət birdən ustanın qoca arvadını xatırladı. Qüdrətin ailəsilə Ramazanınkı arasında qədim bir dostluq vardı. Qüdrət:

– Məndən Nisa xalaya salam söylə, usta! – dedi. – Onu çoxdan görməmişəm. Gərək bu günlərdə gedib düşbərəsinə qonaq olam.

– O da gözüm üstə! – deyə Ramazan Qüdrətə və müxbirə əl verib, yaşına görə çox gümrah və cəld addımlarla kabinetdən çıxdı.

Müxbir də ayağa qalxdı:

– Qiyamət qocadır! – dedi, – mən belə sadə insanların hər bir sözündə dərin bir məna görürəm. Sabah mütləq onun buruğuna gedəcəyəm.

O çıxandan sonra, kabinetində tək qalan Qüdrət evinə zəng etdi. Cavab almadıqda fikirli-fikirli ayağa qalxdı, otaqda gəzinməyə başladı. Son günlər içərisində arvad-uşağını büsbütün unutduğu üçün özünü danladı, yığışıb evə getmək qərarına gəldi və stolun siyirməsini bağladı. yenə katibəsini çağırdı.

– Get, istirahət elə, evi də bir dəfəlik yaddan çıxarmaq olmaz.

Katibə də narazılığını gizlədə bilmədi.

– Özünüz neçə gündən bəridir bir dəfə də evdə olmamısınız. Lalə bacı axşamdan bəri zəng eləməkdən yorulub.

– Mən də gedirəm. – İsmayılzadə qəti addımlarla qapıya yönəldi. Ancaq bu anda daxili telefonun zəngi səsləndi. O, geriyə dönməyə məcbur oldu və cəld dəstəyi götürdü:

– Mənəm. Necə? Avariya? Hansı buruqda?

Katibə təəssüflə başını bulayıb çıxdı.

– Gəlirəm, bu saat gəlirəm!

Qüdrət dəstəyi az qala yerinə çırpıb, yüyürək addımlarla kabineti tərk etdi. Ev-eşik yenə yadından çıxdı. Maşında uzanıb yatmış şoferini oyatdı, ucadan səsləndi:

– Yüz əlli dörd!..

Maşın sürətlə dəniz sahilinə doğru şütüdü. On dəqiqədən sonra qayığa minib, sahildən iki kilometr uzaqdakı yüz əlli dörd nömrəli dəniz buruğuna çatdı. Qayıqdan düşüb avariya olduğu yerə yanaşdıqda, fəhlələrin qan-tər içində palçıq fantanı ilə vuruşduqlarını gördü.

Belə hallarda tez və qəti tərpənən Qüdrət, fantanın səbəblərini dərhal aydınlaşdırıb, quyunun ağzına altı düyməli bir qapaq vurmalarını əmr etdi. Bunu demək nə qədər asandırsa da yerinə yetirmək bir o qədər təhlükəli və çətindi. Quyudan çıxan daş qırıntıları güllə kimi iti gəlir və qabağına keçən hər şeyi əzişdirirdi. İsmayılzadə gənc fəhlələrin qorxub geri çəkildiklərini görəndə, onları cəsarətləndirmək üçün özü irəli atıldı.

– Qorxmayın, uşaqlar, – dedi, – ay ay, ay! Nədən qorxursunuz? Dalımca gəlin!

Cavanlar İsmayılzadənin çox yumşaq bir səslə dediyi bu sözlərdən ürəklənib quyunun lap yanındakı qapağa tərəf gəldilər. Bu anda daha da bərk uğuldayan quyudan palçıqla qarışıq daşlar fəvvarə vurdu. Cavanlar yenə qorxub geriyə sıçradılar. Ancaq İsmayılzadənin qaçmadığını görüb yenə də ona yanaşdılar.

Nəhayət bütün fəhlələr köməkləşib, qapağı quyunun ağzına basa bildilər.

Neft sahəsində çoxdan təkdir olunmuş bu hadisədən pərtləşən uzunboylu, arıqsifətli, açıq mavi gözlərilə sakit-sakit baxan qoca buruq ustası Qüdrəti görüb daha da məyus olmuşdu.

– Bu nədir, Timofey Sidoroviç? – deyə İsmayılzadə qocaya sərt və məzəmmət dolu nəzərlə baxdı.

Timofyey Sidoroviç gözlərini yerə dikib cavab verdi:

– Günah məndə oldu...

– İnanmıram! – İsmayılzadə müxtəlif vəziyyətlərdə, ayaq üstündə durmuş yorğun fəhlələrə üz tutdu: – Timofey Sidoroviç deyir ki, müqəssir odur. Ancaq mən buna inanmıram. Onun belə səhvlər buraxdığını eşitməmişəm, mən onu çoxdan tanıyıram.

Usta, sinəsinə enmiş başını elə bil yuxarı qaldırmaq istəməyib yerə baxır, onun məhz nə cavab verəcəyini sükut içində gözləyən fəhlələr isə əsil müqəssiri açıb söyləyəcəyini güman edərək həyəcanlı bir intizarla onun dodaqlarına baxırdılar. Amma deyəsən Timofey Sidoroviç bir kəlmə də danışmaq istəmirdi.

Bu halda cavanlardan biri irəli çıxdı:

– Yoldaş İsmayılzadə, – dedi – təqsir məndədir... Fikrim özümdə deyildi. Vaxtında ustaya xəbər vermədim.

Timofey Sidoroviç şagirdinə acıqlandı:

– Səndən soruşmurlar! – dedi və fikirli-fikirli quyudan aralanıb uzaqlaşdı.

İsmayılzadə isə daha heç kəsə bir söz deməyib qayığa mindi və usta Ramazanın buruğuna yola düşdü. Onu usta özü qarşıladı.

– Bu zaman nə əcəb səndən? Niyə gedib dincəlmirsən?

Ramazana cavab vermək əvəzinə irəliləyib rotora yanaşan Qüdrət, Vasilyevi və o biri fəhlələri salamladı. Sonra qəsdən, hamı eşitsin deyə gileyləndi.

– Bu təzə uşaqlar bütün işlərimizi korlayırlar. Bilmirəm bunların fikri haradadır?

Tahir bu sözlərin təkcə özünə aid olduğunu düşünüb, altdan-altdan, incik bir tərzdə İsmayılzadəyə baxdı:

– Onların günahı nədir? – dedi.

– Harada avariya olsa bilin ki, onların diqqətsizliyindəndir. Hamısının fikri-zikri kənddədir, anasının yanında. Yüz əlli dördüncü buruq niyə korlandı? Çünki şagirdin xəyalı ala dağdadır.

Tahir yenə özünü saxlaya bilmədi.

– Qurunun oduna yaşı nə üçün yandırırlar?

Qüdrət sözlərinin bu cür xeyirli təsirindən razı qaldı:

– Usta, hələ boruları gətirməyiblər, eləmi? – deyə Ramazana üz tutdu.

Usta saatını çıxardıb baxdı:

– On dəqiqə vaxta qalıb, yəni Bədirlidə elə qeyrət?

– Əgər gətirməsə, öz bəxtindən küssün. – İsmayılzadə yenə Tahirə tərəf döndü. – Hə, anan tez-tez yadına düşür?

Tahir bu dəfə başını aşağı saldı: "Səhərdən bəri bunu demək istəyirdin? Ay nə bilim avariya belə gəldi, təzə uşaqlar elə getdi. Bir yolluq sözünü de, qurtarsın getsin". O bunu könlündən keçirib, yenə bir söz demək istədisə də, – Qüdrətin hörmətini gözləyib dinmədi.

– Niyə cavab vermirsən?

– Axı nə deyim? Kənd də yadıma düşür, anam da... Olmaz bəyəm?

– Əksinə! Qeyrətli oğul gərək həm anasının qeydinə qalsın, həm də onun üzünü qara eləməsin. – Qüdrət Tahirin qolundan yapışdı. – Düz deyirəm, yox?

Tahir onun səsinin ahəngindən zarafat etmədiyini anlayıb, başını dik qaldırdı və düz Qüdrətin gözlərinin içinə baxdı.

– Bəli, lap düz!

Usta Ramazan Qüdrətlə Tahirin söhbətini qəribə bir ürək çırpıntısı ilə dinləyirdi. Onların arasındakı mübahisə sülh ilə qurtaranda, o, fərəhlə nəfəsini dərdi və öz tərəfindən əlavə etdi:

– Tahir elə oğlan deyil, yoldaş Qüdrət, anasının üzünü qara eləməz...

Bu anda buruğun işıqları titrədi. Hamı dönüb bir səmtə baxdı. Yekə bir qayıq buruğa yan almışdı. İsmayılzadənin sifətində yenə öz adi təbəssümü parıldadı. Bədirli qazıma borularını gətirəndə düz saat ikinin yarısı idi...

O, qayıqdan düşüb buruğa qalxanda İsmayılzadəni görüb sevindi: "Yaxşı oldu, özü gördü" deyə düşünüb dərindən nəfəs aldı.

– Ohh... Gülə-gülə adamın boğazını kəsir! – deyə öz-özünə pıçıldadı...

## ÜÇÜNCÜ FƏSİL

### 1

İsmayılzadə buruğu tərk edib gedəndən bir azca sonra artıq dan yeri ağarırdı. Dəniz üzərində pambıq tayaları kimi bir-birinin üstünə qalaqlanmış ağ buludlar ağır-ağır hərəkət edib cənuba doğru sürünürdü. Gecədən əsməyə başlamış yay küləyi, yavaş-yavaş qüvvətlənir, dənizin dalğaları ləngər vururdu. Üfüqdən baş qaldıran günəş indi bozumtul, qırmızı rəngə çalırdı.

Buruqda çalışan fəhlələr isə, hər şeyi unudub, boş keçən saatların əvəzini çıxmaq üçün təzə boruları quyuya sallayırdılar. Ramazan bir an belə fəhlələrdən aralanmır, ən adi işlərə diqqət yetirir, tələsmədən gah Cəmili, gah da Tahiri başa salırdı.

Günəş qalın buludları yırtıb hər tərəfə işıq saçanda artıq rotor adi, yeknəsəq səsilə fırlanırdı. Qazıma işi axşamkı sürətlə davam edir, hər kəsdə gərgin bir diqqət nəzərə çarpırdı.

Lakin Tahirin fikri yenə kənddə və anasının yanında idi. İndi onun ürəyini ana həsrəti göynədirdi. Bütün həyatı boyu anasından bu qədər ayrı yaşadığı yadına gəlmirdi. Burda hər şeyi bəyənir, hər şeydən zövq alırdısa da, ana nəvazişinin və ana qayğısının yoxluğunu hiss etdikcə, balaca bir uşaq kimi qəribsəyirdi: "O burada olsaydı, Bakını heç nəyə dəyişməzdim. Gətirsəm harada olacaq, kimin yanında qalacaq?.. Yox, bu mümkün deyil. Bir də, öz komasını buraxıb şəhərə gəlməz" deyə sürətlə fikrindən keçirəndə, usta Ramazanın səsini eşitdi, diqqətini toplayıb dirillometrin əqrəbinə baxdı və saatı xatırladan cihaz Lətifənin işə gəldiyi vaxtı onun yadına saldı. Tahir onu belə tez unudub kənd fikrinə düşdüyünə özü də təəccüb elədi.

Tahir daha kənd və anası üçün deyil, Lətifə üçün darıxırdı. Hər zaman olduğu kimi indi də Lətifəni xatırlayanda, kəndə qayıtmaq fikrindən vaz keçdi və tez-tez gözlərini həmişə qayıq gələn tərəfə zilləyib baxmağa başladı. Lakin Lətifəni gətirəcək "Çapayev" qayığı görünmürdü: "Ürəyimi ona açıb deyəcəyəm, nə olar, olar" – o tələsdikcə, vaxt da çox ağır-ağır keçir, elə bil hər dəqiqə bir saat kimi uzanırdı. Tahirin gözləri isə, həmişə qayıq gələn səmtdən ayrılmır və onun bu həsrət dolu baxışları usta Ramazanın nəzərindən yayınmırdı. Lakin qoca onun məhz Lətifə üçün bu qədər həyəcanlandığını xəyalı-

na belə gətirmirdi. O, yalnız Tahirin işdən yorulduğunu, evə tələsdiyini və buna görə də dəqiqələri saydığını güman edirdi: “Cavandır, öyrəşməyib” deyə ürəyində ona bəraət qazandırırdı. Bəzən altdan-altdan Tahirə baxan Cəmil isə, onun məhz Lətifənin intizarilə çırpındığını çox gözəl bildiyindən, dodağının altında mənalı-mənalı gülürdü. Cəmil Lətifəni Tahir kimi qeyri-ciddi və keçici bir məhəbbətlə deyil, daha dərin, daha vəfalı bir məhəbbətlə sevdiyini düşünürdü. O, özünü zahirən Lətifəyə qarşı son dərəcə biganə göstərsə də, onu sevdiyini heç kəsin yanında etiraf etməsə də, hətta bu xüsusda işarə vuran yoldaşlarına qaba cavablar versə də, Tahirin ona belə tez vurulduğu kimi, tez də soyuyacağına əmin idi. Odur ki, Tahirlə Lətifənin qısa görüşləri və söhbətləri Cəmili zərrə qədər də qorxutmurdu: “Tahir uşaqdır, duza gedir!” – deyə özünə əmin olan bir sevgili ədası ilə kənardan-kənara dostuna baxıb oğrun-oğrun gülürdü.

Bu halda usta Ramazan acıqlı bir səslə bağırdı:

– Tahir! Fikrin haradadır, bala?

Tahir səksənib fikrindən ayrıldı:

– Nə olub usta?

– Daha bundan artıq nə olacaq? – Qoca, gil məhlulunun kəsilib geri qayıtmadığını göstərdi. – Yüz kərə demişəm ki, bir şey olsa, tez mənə xəbər ver.

Tahir günahını başa düşüb yerində dondu, gözlərini yerə dikdi.

– Uşağa buyur, ardınca yüyür buna deyiblər də... Axı səni yekə adam bildik, iş tapşırdıq. Görmürsən nə olub?

Tahir ustanın bu acıdilliyini görən kimi, ilk dəfə onun haqqında düşündüklərini xatırlayıb, məyus-məyus xəyalından keçirdi: “Elə mən deyən kimidir. Buynuzu göründü”.

Usta Ramazan, gil məhlulunun axımını dayandırmaq üçün quyudan bir neçə addım aralı qoyulmuş sement və şüşə tozu ilə dolu kisələri göstərib fəhlələrə əmr verdi:

– Tez gətirin!

Fəhlələr onun əmrini dərhal yerinə yetirdilər. Usta özü quyudan bir an belə ayrılmayaraq, fəhlələrin quyuya tökdükləri maddələrin qədərinə fikir verir, “artır, yenə artır!” deyə səslənirdi.

Tahir ilk dəfə şahidi olduğu bu hadisədən usta Ramazanın həyəcanlandığını görüb, nə isə böyük bir səhv buraxdığını hiss edirdi. Usta yenə arabir Tahirə qanlı-qanlı baxır, narazı halda başını bulayırdı.

Bu halda “Bahar” adlı qayıq buruğa yan aldı. Dadaşlı qayıqdan düşüb buruğa gəldi, salam verdi. Hamı ilə, o cümlədən qaşqabağı yerlə gedən Tahirlə səmimi görüşdü. “Buna nə olub görəsən?” – deyə təəccüblə öz-özündən soruşdu və elə bil bütün fəhlələrə eşitdirmək üçün ucadan söyləndi:

– Niyə indiyə kimi gəlib uçota girməmisən?

– Girməyib, çünki bir ayağı kənddədir. İşinin də səmərəsi belə... – deyə usta Ramazan quyunu göstərdi. – Gərək o birilərə nümunə ola, amma o özü işləri korlayır.

Dadaşlı heç bir şey başa düşməyib soruşdu:

– Nə eləyib ki?

– Neyləyəcək? Korlayıb də... Vaxtında görməyib, xəbər də verməyib.

Dadaşlı, iclasda məsələni qoymağa adam axtarırmış kimi, üz-gözünü turşudub deyinməyə başladı:

– Elədirsə, təşkilata çağırıb başa salarıq, – dedi. – Yoldaş Bayramlı! Niyə indiyə kimi gəlib uçota girmirsən?

– İşim rayondadır. Gərək yazım, göndərələr – deyə Tahir katibi inandıran rəsmi bir tərzdə cavab verdisə də, könlündən tamam başqa bir fikir keçdi: “Belə getsə, çox çətin olacaq...”

Dadaşlı onun bəhanəsini bəyənmədi:

– Hər halda iclaslarda iştirak edə bilərsən. Bu necə olub ki, avariya eləmisən?

Tahir gözlərini döydü:

– Avariya nədir?

– Avariya da... Yəni işləri korlamısan.

Tahir onun üstünə bozardı:

– Sənə nə? Sən kimsən?

– Mən? Necə yəni kiməm? Komsomol təşkilatçısı!

– Lap Allah ol. Buranın ağası usta Ramazandır!

– Sən gərək siyasi savadsızlığını ləğv eləyəsən. O necə komsomoldur ki, mövhumatdan danışır, özü də istehsalata kömək eləmir?

Tahir acığını uda bilmədi:

– Elə görürəm sən yaman kömək eləyirsən. Mən iki həftədir buradayam, bir dəfə də səni buruqda görməmişəm.

– Çünki mən istehsalatda çalışıram. O qədər vaxtım olmur. Gəlib uçota girərsən, ondan sonra məsələni ayırd elərik.

– Nə məsələmi?
– Elə bu diqqətsizliyini...
– Yaxşı, yaxşı, – deyə Tahir o yana çevrilib, Dadaşlıdan aralandı.

Dadaşlının Tahirə çox rəsmi və qaba görünən bu hərəkəti, əslində onun cavan fəhlələrlə həmişə açıq, düzünə və heç kimə xətir qoymadan danışmağı sevməyindən irəli gəlirdi. O, mədən komsomolçularını hər zaman qabaq sıralarda görmək istəyirdi. O özü ikinci mədənin bacarıqlı neft ustalarından biri idi. Onun rəhbərlik etdiyi briqada həmişə mədənin üzünü ağardırdı.

Dadaşlının qara, arıq, uzun və bozumtul üzü elə birinci görüşlərindən Tahirin o qədər də xoşuna gəlməmişdi. Onun sir-sifəti ilə bu rəftarı arasında bir uyğunluq axtaran Tahir, komsomol təşkilatçısına verdiyi cavabların birindən də narazı deyildi.

– Yaxşı eləmədin, Tahir, – deyə Cəmil dostunun qulağına pıçıldadı. – Axı niyə belə tərs cavab verirsən?

Tahir yenə də özünü tamam haqlı sayır, “bir sözünün əvəzinə ikisini deməsəm, elə bilirəm ki, maymağam” deyə düşünürdü. O, hətta dostu Cəmilin də nəsihətini cavabsız qoymayıb, az qala onun da üzünə çımxırdı.

– Görmürsən, nə deyir? Guya mən onun qabağında gərək ikiqat əyiləm.

– Yox, yox, sən haqsızsan. O çox namuslu oğlandır. Yəqin sənin xeyrini fikirləşib deyir.

Bu söhbəti eşitməyən komsomol təşkilatçısı, yan tərəfdə, gil məhluluna şüşə tozu qatmaqla məşğul olan Vasilyevin yanında durub gülə-gülə Tahirlə öz arasında baş verən ixtilafdan danışırdı:

– Nə dikbaş oğlandır, lap adamın ağzından vurur. Yəqin ərköyün böyüyüb, deyəsən o hələ şəxsi tənqidin dadına baxmayıb.

Vasilyev, belə işlərdə zəngin təcrübəli bir adam kimi, Dadaşlını başa saldı:

– Pis oğlan deyil. Ancaq onunla dil tapmağa çalış. Yanına çağır, ayrılıqda danış. Yəqin sözlərin onun xətrinə dəyib. Sən bizim fəhlə cavanlara baxma. Onlarla nə qədər sərt danışsan, yenə tənqiddən inciməzlər, amma bunun xasiyyəti başqa cürədir.

Dadaşlı, Tahirin kənarda işsiz dayandığını görüb, onu Cəmilin vasitəsilə yanına çağırtdırdı və mədəni budkaya apardı. Onlar, üstünə təzə jurnal və qəzet qoyulmuş stolun dalında əyləşdilər. Tahir, küsülü kimi, yanakı oturdu.

– Sən nə yaman acıqlısan? – deyə Dadaşlı gülümsədisə də, onun sir-sifətində elə bir dəyişiklik əmələ gəlmədi, yalnız dodaqlarının ucu azacıq qaçdı və ağ, seyrək dişləri göründü. – Axı niyə o saat adamın ağzından vurursan?

Ustanın yanında böyük bir günah işlədiyini yalnız indicə tam mənasilə anlayan Tahir susur, aralarında baş verən ixtilafı bir daha qızışdırmaq istəmirdi.

– Əlbət ki, mən səndən incimirəm, – deyə Dadaşlı səsini yavaşıtdı. – O barədə arxayın ol. Küsü saxlamağa heç birimizin haqqımız yoxdur. Amma sözün doğrusunu gizlətmək də faydasızdır. Mənim dediyim odur ki, hər bir komsomolçu gərək qabaqcıl ola.

“Hə, başladı təbliğata” deyə Tahir sürətlə xəyalından keçirdi.

– Bax, bizim trestdə üç briqada var. Hamısını da barmaqla göstərirlər. Niyə? Çünki onlar neftin mənasını yaxşı başa düşürlər. Neft nədir? O təkcə yanacaq deyil. Neft, respublikamızın namusu, şərəfidir!

Tahir özü də fərqinə varmadan yavaş-yavaş yerində qurcalanıb düz oturdu. Amma yenə də Dadaşlının üzünə baxmır, inadla sükut edirdi.

– Ona görə sən də, mən də o biri yoldaşlarımız da gərək gecə bilməyib, gündüz bilməyib can yandıraq.

Dadaşlının sözləri Tahirin beyninə o qədər də batmırdı: “Bu barədə qəzetlər hər gün yazır. Mən uşaq zad deyiləm ki?”

– Gedək, deyəsən növbəniz qurtarır. Yəqin yorğunsan. Get dincəl. Elə mən də yorulmuşam.

Bütün bu danışıqlardan sonra da Tahirin, Dadaşlı haqqında rəyində heç bir dəyişiklik əmələ gəlmədi: “Uçota girsəm, atama od vuracaq” deyə düşündü.

Onlar budkadan çıxdıqları zaman, Tahirin səbirsizliklə gözlədiyi “Çapayev” qayığı nəhayət buruğa yan aldı. Ancaq o bomboşdu. Qayığın burun tərəfindən ayaq üstündə durmuş kapitan uzaqdan-uzağa ustanı səslədi:

– Ramazan dayı! Düz yarım saat tez gəlmişəm. Daha bir sözün yoxdur ki?

Usta yorğunluqdan tutulmuş kal səsi ilə cavab verdi:

– Nahaq gəlmisən. Bəs uşaqlar hanı?

– Ömrümdə səni razı sala bilmədim də... – Kapitan kəndiri buruğu sürtülmüş yoğun direyinə keçirdi və özü sıçrayıb fəhlələrə yaxınlaşdı. – Uşaqlar hələ gəlməmişdilər. Sizi aparınca onlar da gəlib çıxarlar.

Usta Ramazan axımın qabağını almamış axşam növbəsini buraxmaq istəmirdi. Quyuya tökülmüş sementin və şüşə tozunun təsiri ilə yalnız iki saat sonra axımın kəsildiyini görüb, dərindən, sərbəst bir nəfəs aldı və yalnız onda:

– Gedək, uşaqlar, gedək, – dedi. – Mən də bərk yorulmuşam. Bir də, Nisa qarı evə gec-gec getməyimdən narazılıq eləyir. Qorxuram axırda əlimdən şikayət yazdıra...

Vasilyev işdə vaxt-vədə gözləməyən qocaya qayığı göstərib dedi:

– Get, get, mən buradayam. Dünən gecə sən trestdə olanda mən bir saat mürgülədim.

Ramazan öz müavininin bu qayğısından həmişə qəribə bir həyəcan duyardı. O, Vasilyevi yalnız mahir bir neftçi kimi yox, həm də vəfalı bir dost və mülayim bir insan kimi sevərdi. Amma nədənsə bu xüsusda onların arasında bir dəfə də söz-söhbət olmamışdı. Bu dostluq hissi çoxdan bəri ətə-qana hopmuşdu və görünür, bu barədə ayrıca danışmağa heç bir ehtiyac yox idi. Ramazan da, Vasilyev də, çoxlarının dava-qalmaqalla həll etdikləri bir məsələni məhz bu dostluq sayəsində çox tez və asan həll edirdilər. Bunun bircə səbəbi vardı: Vasilyevin fikrini Ramazan, Ramazanın da fikrini Vasilyev dinləməyi bacarırdı. İlk doğru sözü demək şərəfi Vasilyevə qismət olanda, bundan Ramazan sevinər, Ramazana qismət olanda Vasilyev ləzzət alardı. Özləri bunun fərqinə varmasalar da, əsil həqiqətdə onlar bir-birini tamamlayırdılar. Ramazan adamları ruhlandırmağı bacarırdısa, Vasilyev mexanizmlərin ən xırda kəsrini belə tapıb düzəldərdi. Deyəsən onları bir-birinə sevdirən də elə bu idi.

Ramazan onun "evə get" təklifini eşidəndə, yorğun gözlərini qaldırdı:

– Yox, dost, elə sən də yorğunsan, – dedi, – get, beş-altı saat dincəl, onacan mən gözlərəm.

Vasilyev incik bir nəzərlə onun üzünə baxdı:

– Sən nə danışırsan, Ramazan İskəndəroviç, belə də şey olarmı? Sən get, mən qalıram.

Ramazan onun səsindəki inciklik nidasının nə qədər səmimi olduğunu aydın hiss edirdi.

– Yaxşı, gedim, yoxsa qarı məni boşayar, – deyə qoca usta çox çətin sezilən bir tərzdə gülümsədi.

Növbənin fəhlələri qayığa doluşdular. Tahir Cəmillə yanaşı oturdu və sazını dizinin üstünə qoydu. Birdən komsomol təşkilatçısının

hədə-qorxusunu xatırladı, ilk addımdan üstünə düşəcəklərini güman edib, “mənimki tərs gətirdi” deyə fikirləşdi, vaxt ikən, biabır olmamış kəndə qayıtmağı qərara aldı. Əgər usta onun xətrini istəsəydi yenə dərd yarı idi. Tahir qorxurdu ki, komsomolda məsələsi qoyulsa, hamıdan qabaq gövdəsini qılınclayan elə usta özü olacaq.

“Çapayev” buruqdan uzaqlaşdı. Cəmil Lətifənin gəlməməsindən pərt olmuş zənn etdiyi Tahirə baxa-baxa güldü:

– Tahir, niyə oxumursan? – dedi. – Bir ağız desənə, qulaq asaq!

Tahir tutqun baxışı ilə yoldaşlarının bu təklifini çox yersiz saydığını hamıya bildirmək istədi:

– Səhər-səhər heç Bülbülün də səsi yaxşı çıxmaz. Bir də, kənardan baxanlar bizə nə deyər? Soruşmazlarmı bunların kefi niyə qalxıb?

Cəmil israr etmədi. Sakit-sakit ləngər vuran qayıqda o biri yoldaşları dərhal mürgülədiklərindən, bu xahişinin üstündə durmayıb susdu.

Tahir birdən Lətifəni xatırladı. “Bəs o?” deyə öz-özündən soruşdu və iş bir az çətinləşəndə tez kəndə qaçmaq fikrinə düşdüyü üçün özünü danladı. Bu andan etibarən Lətifə onun xəyalından ayrılmadı. Uzaqdan-uzağa sahildə gözlərilə Lətifəni aramağa başladı. Burada qaynaşan adamlar içərisində onu görmək çətin olsa da, Tahir bu arzusundan əl çəkmədi və Lətifəyə oxşatdığı bir qızı gözdən qoymayıb, ta qayıq körpüyə yan alıncaya qədər ona baxdı. Lakin Tahir zənnində yanılmışdı. Lətifə də, o biri fəhlələr də hələ görünmürdülər.

Get-gedə sifəti daha da tutqunlaşan Tahir, Cəmilə baxdığı zaman onun dodaqlarında yenə xəfif bir kinayə oxudu və üzünü ondan gizlətmək üçün başqa bir səmtə döndü.

“Çapayev” sahilə yan alanda, Lətifə ilə fəhlələr körpünün yeddi-səkkiz addımlığındakı birmərtəbəli kiçik binanın arxasından çıxdılar.

O dəmdə Tahirin eyni açıldı. Lətifə ilə üz-üzə gələn kimi:

– Sabahın xeyir! – dedi.

Lətifə nə üçünsə pərt idi. Qaşları düyünlənmişdi. O, Tahirin salamına çox soyuq cavab verdi və gözlərini tez ondan çəkib uzaqlaşmaq istədi. Tahir onun kefsiz olduğunu yalnız indi duyub yavaşcadan:

– Niyə qanın qaradır? – deyə xəbər aldı.

Bu dəfə Lətifə elə baxdı ki, elə bil gözlərində “sənə nə?” sözləri yazılmışdı.

– Bağışla ha... Demə ki, Tahir heç nə qanmır. Görürəm kim isə xətrinə dəyib.

– Əlbəttə dəyib. Hamı qanacaqlı olsaydı, daha milis nəyə lazım idi?

– Axı nə olub ki?

Lətifə deyəsən pərtliyinin səbəbini açıb söyləmək istəmirdi. Tahir də bənd olmayıb söhbətin mövzusunu dəyişdi:

– Bu axşam teatra gedəcəksənmi?

Lətifənin qaşqabağı yenə açılmadı:

– Yox!.. – deyə qısa və sərt cavab verdi.

– Axı nə olub ki?

– Bundan artıq nə olacaq? Gündüzün günorta çağı böyürdən çıxıb mənə sataşır.

– Kim axı?

– O qarmonçalan Mişanın briqadasında Hüseynqulu var ha...

– Tanımıram.

– Tanımasan yaxşıdır. Elələrilə mən özüm hesablaşaram. Səhər-səhər haradasa içib, küçə uşaqları kimi ağzına gələni danışırdı.

Tahir qəzəbindən udqundu:

– Olmaya pis söz dedi?

Lətifə gözlərini yerə dikdi:

– Elələrini şəhərdən sürgün eləsələr də azdır...

Qızın səsində çox əsəbi bir nida vardı. Dişlərini qıcadığı aydın görünürdü. – Mən axşam qayıdandan sonra ustasına deyib dərsini verdirərəm. Xalqın uşaqları boş vaxtını oxumağa sərf eləyir, amma bu...

Tahir Lətifənin qayığa tələsdiyini görüb, nə isə bir söz demək, ona təsəlli vermək istədi.

– Tək niyə gəlirsən ki?

Bu sual Lətifəyə daha da toxundu.

– Bəs kiminlə gəlim?

Tahir tutulub dinmədi. Utanmasaydı, "məndən yaxşı kavaler?" deyərdi.

– Deməli, teatra getmirsən?

Lətifə indiyəcən heç bir oğlanla teatra getməmişdi. Dedi-qoduya səbəb olmaqdan çəkinirdi. O, bəzən atası ilə, bəzən anası ilə, çox vaxt da rəfiqəsi Zivərlə gedirdi. Tahirin bu cür sərbəst və arxayın bir tərzdə onu teatra dəvət etməyi bərk acığına gəldi.

– Razısan? – deyə Tahir bir də soruşanda, o qəti və sərt bir hərəkətlə başını bulayıb cavab verdi:

– Yox! Birdən, ikidən, mənimlə teatra getmisən?

– İndiyəcən getməmişəm, bundan sonra gedərəm!

– Yoldaşım da var, pulum da. Sağ ol!

Tahir yavaşcadan, yalnız Lətifənin eşidə biləcəyi bir səslə dedi:

– Niyə acığın tutur? İstəmirsən getmə, – Lətifə qaşqabağını daha da bərk sallayıb, cəld addımlarla uzaqlaşdı və bir də geriyə baxmadan aşağı enib qayığa atıldı.

Onun bu etinasızlığı Tahirə çox toxundusa da, o, zahirən şəstini pozmayıb, məftun nəzərlərlə arxadan Lətifəni bir xeyli süzdü.

Usta Ramazanla bərabər sahildən aralanmış Cəmil:

– Tahir, bəri gəl, ondan sənə yar olmaz!.. – deyə zarafat elədi və öz sözündən xoşlanaraq hırıltı ilə güldü. Onun bu hərəkəti Tahiri lap haldan çıxartdı. O, səksənmiş kimi tez dönüb Cəmilə baxdı və sərt addımlarla ona yanaşdı:

– Nə üçün olmaz? – Tahirin tutqunlaşmış səsi titrəyərək, onun pərtliyini büruzə verdi.

– Niyə acığın tutur, balam? Üzünə gülür, dalda səni ələ salır. Elə bir nişanlısı var ki, sən onun heç əlinə su tökməyə layiq deyilsən.

Tahiri fikir götürdü: "Kişinin oğlu düz deyir də. Lətifə acıqlanıb getdi. Məndən üz döndərdi. O, indiyəcən xətrimə dəyməmək üçün üzümə gülürmüş. Zərrə qədər də mənə könlü yox imiş" deyə düşünəndə, onun sifəti bulud kimi qaraldı:

– Olsun! – deyə ucadan səsləndi və hirsindən gözləri parıldadı.

Usta Ramazan Tahirlə Cəmilin bir-birilə nə üçün acıqlı danışdıqlarını bilib ayaq saxladı:

– Tahir oğlum, – belə getsə işini korlarsan. Hara tələsirsən? Sən ki hələ uşaqsan...

Ümumi yaşayış evinə çatanda, yoldaşlarından biri ona məktub gəldiyini xəbər verdi. Tahir çarpayısının üstünə qoyulmuş zərfi açıb oxudu:

"Əzizim oğul! Sən gedəli ürəyim yaralı quş kimi çırpınır. Hər gecə yuxumda hey səni görürəm. Görürəm ki, dəryada üzürsən. Allah eləməmiş, birdən ehtiyatsızlıq edərsən, başına bir iş gələr. Dilim qurusun, ay oğul, mən nə deyirəm? Niyə getməyinə razı oldum? Qızıl inəyi sağanda elə gəlib durursan gözümün qabağında.

Əzizim balabanı,
Asta çal balabanı.
Hamının balası gəldi,
Bəs mənim balam hanı?

Gözümün işığı! İstəyirəm yollara çıxam, gəlib-gedəndən səni soruşam. Ananı niyə yadından çıxardın? Səndən başqa pənahım yoxdur, elə bir əl boyda kağız yollasan bəsdir. Sən ki, bilirsən, bu dünyada səndən başqa mənim heç kəsim yoxdur. Soruşsan kolxozda nə var nə yox? Sağlıq-salamatdıqdır, oğlum. Əmin uşaqları davadan qayıtdılar. Hamısı səni soruşurdu. Yerini dedim, kağız yazsınlar. Qohum-qardaşın sənə salamı var.

Sənin dərdindən ölən anan Gülsənəm”

Tahirin ürəyində qəribə bir həsrət baş qaldırdı: ana həsrəti! Hər şey onun yadından çıxdı, Bakını da, arzu və xəyallarını da, Lətifəni də unutdu. Ananın məktubunu bir də oxudu.

Sonra paltarını soyunmağa başladı.

**3**

Tahir çarpayısında çoxdan uzanmışdısa da, yata bilmirdi. Əllərini boynunun ardında çarpazlayıb gözlərini otağın tavanına zilləmişdi. İçəri səssizdi. Amma Tahirin pəncərəsinin eşik tərəfindən sallanmış uzun sarmaşıqlar arasında civildəşən boz sərçələrin səsini aydın eşidirdi. Elə bil onun yatmağına da bu civilti mane olurdu.

Tahirlə bir vaxtda soyunub yerinə girmiş Cəmil isə çoxdan yatmışdı. Kim bilir, bəlkə də Tahirə belə görünürdü? Onun Lətifəyə dair dəniz sahilində zarafat tərzilə dediyi sözlər Tahirin könlünə toxunduğu üçün, ta indiyə qədər Cəmillə bir kəlmə də danışmamışdı.

– Olsun! – deyə Tahir pıçıldadı, anasının məktubunu bir də açıb oxudu, sonra qatlayıb zərfə qoydu, yerindən səssizcə qalxdı, hər an ehtiyatla ətrafına baxaraq paltarını geyindi. İş paltarını səliqə ilə büküb çarpayısının başından asdı. Diqqətlə Cəmilə nəzər salaraq, onun bərk yatdığını yəqin etdikdən sonra ayaqlarının ucunda yeriyib çarpayısının aşağısındakı tumboçkanı açdı, oradan heybəsini çıxardı. Sonra yastığının altından yun şərfini götürüb heybəyə qoydu. Pərakəndə halda pəncərənin qabağına tökülmüş kitablarını da götürüb heybənin o biri gözünə doldurdu. Oranı-buranı axtardı. Uzunboğaz çəkmələrini qəzetə bükmək istərkən, xışıltı Cəmili oyatmasın deyə qəzeti bir tərəfə atdı, çəkmələrini də elə tozlu-tozlu heybəyə basdı. yenə diqqətlə Cəmilin üzünə baxdı. Bu dəmdə onun üzündə çətinliklə sezilən istehzalı

bir təbəssüm oxuyub, bir an duruxdu: “Bəlkə yatmayıb?” deyə şübhəli-şübhəli özü-özündən soruşdu. Nəfəsini belə çəkmədən yenə gözlədi. O istehzalı təbəssüm Cəmilin dodaqlarını, sonra da yanaqlarını bürüdü. “Yatmır” deyə düşündü, iki-üç dəfə qəsdən öskürdü. Yox, Cəmil gözlərini açmadı. Deməк, Tahirə belə görünürmüş...

Pırıldaşaraq uçuşan sərçələrin səsi Tahiri səksəndirdi.

– Cəhənnəmə ki! – deyə o, sazını qoltuğuna vurdu, heybəsini çiynindən asaraq dırnaqlarının ucunda, səssizcə addımlarla yeriyib qapını açdı və çiyni üzərindən geriyə baxaraq otaqdan çıxdı.

Cəmil, üstündəki adyalı kənara atıb ayağa qalxdı, tez-tələsik paltarını geyindi və bir baş usta Ramazanın evinə yüyürdü.

Qoca birmərtəbəli evinin qabağında, yarım metr hündürlüyündə ağac məhəccərlə əhatə edilmiş bağçada susəpənlə güllərə, çiçəklərə su verirdi. Bağçanın ortasında tək bir püstə ağacı vardı. Ağacın dövrəsində bir lək pomidor, iki-üç lək də tərxun, soğan və noxud əkmişdi. Məhəccər boyu, dairə şəklində balaca bostan dövrəsini bürümüş gül-çiçək elə uzaqdan da qızarırdı. Usta Ramazan əyilib-qalxır, hər gülün, hər çiçəyin üstünə qonmuş tozu təmizləmək üçün suyu yuxarıdan seyrək yağış kimi yağdırırdı.

Usta susəpəni yerə qoyub sıx düşmüş güllərdən bir neçəsini qopardı, balaca bir dəstə düzəltdi və doğrulanda, tövşüyə-tövşüyə gələn Cəmili gördü, tələsik də soruşdu:

– Hə xeyir ola, Cəmil, nə əcəb, sənsən?!.

Cəmil məhəccərin eşik tərəfində dayanaraq, nəfəsini dərməmiş:

– Tahir gedir, usta... – dedi.

– Hara?

Yəqin kəndə gedir də...

– Bəs niyə buraxırdın?

– Mənimlə arası dəyib. Əslinə baxsan elə bir söz də demədim. Zarafata dözümü yox imiş.

Usta Ramazan susəpəni götürüb bağçadan çıxdı və Cəmilə yaxın gəldi. Təəccüblə parıldayan xırdaca gözlərini bir neçə an onun üzündə gəzdirdi:

– Bəlkə məndən inciyib? – dedi və bir xeyli sükuta qərq olub, gah Cəmilə, gah da yerə baxdı, udquna-udquna başını tərpətdi. – Ha fikirləşirəm, elə pis söz dediyim yadıma gəlmir.

Cəmil, ağır günah işləmiş bir adam kimi, məyus-məyus dedi:

– Yox, usta, bilirəm ki, məndən inciyib...

– Vağzala getdi?

– Yəqin ki.

– Yaxşı, bir tədbir tökərik. – Qoca usta fikirli-fikirli, beş-altı pilləli daş pilləkənlə qalxıb şüşəbəndli balkona çıxdı və divardan asılmış telefonla kimə isə zəng etdi. Sonra içəri girib papağını başına qoydu, əlindəki gül dəstəsini yemək stolunun üstünə atdı və tələsik addımlarla geri qayıdıb, yenə həmin yerdə durmuş Cəmilə:

– Oğlum, sən get dincəl, – dedi və özü asfaltlı küçəyə çıxdı.

Cəmil isə bu xəbəri vaxtında ustaya yetirdiyi üçün özündən razı qalıb, sevinə-sevinə gəldiyi yolla da geri qayıtdı.

Beş dəqiqə belə keçməmiş asfaltlı yolda abı rəngə boyanmış M-1 maşını göründü və o, şütüyərək gəlib ustanın qabağında dayandı.

– Hara belə usta? – deyə Qüdrət İsmayılzadənin qarayanız, arıq və cavan şoferi maşının açıq pəncərəsindən baxıb soruşdu:

Qoca usta könülsüz bir tərzdə ona baxıb, cəld maşına mindi:

– Vağzala sür! – dedi – Orada bilərsən.

Şofer maşını geriyə döndərdi və hamar yolla sürərək, vağzala istiqamət aldı. O, Ramazanın evinə İsmayılzadəni çox gətirdiyindən, ustanın özünü də, arvadı Nisa qarını da, müharibənin ilk günlərindən cəbhəyə getmiş oğlanlarını da yaxşı tanıyırdı. O da, İsmayılzadə kimi, bu evə məhrəmdi. Qocanı belə qəmgin halda gördüyü andan, kimi isə yola salmağa getdiyini ancaq o adamın səfərindən narazı olduğunu düşünürdü. Bir azdan sonra isə fikrinə ayrı şey gəldi: Xeyir ola, usta, bəlkə oğlanlarından bir xəbər var?

Bu sualı eşidəndə elə bil Ramazanın yaralı bir yerinə toxundular. Usta, sərt bir nəzərlə şoferə baxdı. Ancaq oğlanın mehriban və səmimi baxışlarından bu sözü pis məqsədlə deyil, xeyirxahlıqla dediyini hiss etdikdə, dilinin ucuna gəlmiş acı sözü uddu və onun gözləri doldu:

– Məndə o bəxt hanı? – deyə yerində büzüşüb fikrə getdi.

Şofer ona təsəlli verməyə başladı:

– Qəm yemə, usta, mən də qardaşımdan əlimi üzmüşdüm. Dünən kağızı gəldi. Sağ-salamatdır. Sən demə partizan olubmuş. Fransa kommunistlərinin dəstəsində imiş. Əsirlikdən qaçıb, düz iki il vuruşub...

– Təki mənimkilər də elə olsun...

– Qara xəbərləri gəlməyibsə, qayıdarlar, usta. Qardaşım yazır ki, bizdən əsir düşənlərin çoxu qaçıb partizanlara qoşulub... Özü də yaralanıb, xəstəxanaya düşüb, amma yenə kəfəni yırtıb çıxıbdır.

– Təki olsun, təki olsun, – deyə qoca öz-özünə danışır kimi, yavaş səslə pıçıldadı. – Salamat olsalar, gərək hesabla bu yaxında gələlər.

– Əlbəttə, əlbəttə! – Şofer bu anda yan tərəfdən qanunsuz çıxan yük maşınına toxunmamaq üçün cəld bir hərəkətlə maşını saxladı. – Dava da belədir, bir az ehtiyatı əldən versən, özün də güdaza gedərsən, yoldaşını da bada verərsən. Eyy, keflisən? – deyə pırtlaşıq saçları alnına tökülmüş mis rəngli şoferin üstünə qışqırdı.

– Dünyanın işini bilmək olmaz, oğlum. – Qoca, köyrək səsinin titrədiyini duyub susdu və yalnız sonradan-sonraya əlavə etdi. – Məsəl var, sən saydığını say, gör fələk nə sayır... Təki sən deyən olsun.

Oğlanın fikri hələ də yük maşınında olduğu üçün, ustanın dediyini yaxşı eşidə bilmədi.

– Nə buyurdun usta?

Qoca, nəmli gözlərini irəliyə zilləyib dərindən köksünü ötürdü:

– Deyirəm ki, Allah ağzından eşitsin. Hələ mən onlardan əlimi üzməmişəm. Hesabla gərək sağ-salamat qayıtsınlar. Bu illərdə az əmək çəkməmişəm. Gecəli-gündüzlü buruqlardan ayrılmırdım. Deyirdim ki, əsgərlərimiz yanacaqdan korluq çəkməsinlər. Doğrudur çox qocalmışam, amma cavanlardan geri qalmıram. Pensiyadan işə qayıdanda mənim arzum bu idi ki, ölkəmiz davadan üzüqara çıxmasın. Sağ olsunlar, bütün dünyanın qabağında üzümüzü ağ elədilər. Çəkdiyim zəhmətə heyfsilənmirəm. Bircə uşaqlar da gəlib çıxsaydılar, ayrı dərdim olmazdı.

Şofer maşını yavaşıtdı və azca sağa tərəf çevirib qabağı izdihamla dolmuş vağzala sürdü, sonra qoca ustaya yenə təsəlli verdi:

– Gələrlər, gələrlər, Ramazan dayı. Axı heç demirsən vağzala niyə gəldin?

– Bu saat bilərsən. – Usta maşından düşüb, işıldayan pilləkənlə yuxarı qalxdı və Tahiri axtarmağa başladı. Ancaq sağa-sola vurnuxan adamlar içərisində onu tapmadığı üçün, qapıda durmuş qadına yanaşıb Bakı – Tbilisi qatarının yola düşdüyü vaxtı soruşdu.

Qadın, nizamı pozan adamlara qışqırmaqdan tutulmuş səsilə cavab verdi:

– On dəqiqədən sonra.

Usta çevik addımlarla perrona çıxdı. Birinci yolda dayanmış qatara yan aldı. Pəncərədən başını çıxardıb yaxın adamları ilə ucadan söhbət edənlərə, biletini konduktora göstərib içəri girənlərə, əlindəki iri çamadanını sürüyə-sürüyə öz vaqonunu axtaranlara baxa-baxa o başa-bu başa gedib-gəldi. Ancaq Tahiri yenə tapa bilməyib kor-peşman qayıtdı, vağzalın çıxış yolunda dayandı və Tahirdən əlini üzüb tamam məyus oldu. "Vaqonları gəzsəm, qorxuram məndən sonra gəlib keçə, görmərəm" deyə düşünüb, buradaca gözləməyi qərara aldı. yenə də qapıda durmuş qadından soruşdu:

– Vaxtına çoxmu qalıb?

– Vətəndaş bir dəfə dedim ki!..

Usta, uzaqdan-uzağa vaqonların pəncərəsindən içəri boylandı. Dördüncü vaqonda, açıq pəncərədən başını çıxarmış bir oğlanı Tahirə oxşadıb, sevincək halda ona tərəf yeridi, ancaq yaxına gəldikdə, Tahir olmadığını görüb, daha da qanı qaraldı.

Bu anda İsmayılzadənin şoferi də perrona çıxıb, ustaya yanaşdı:

– Nə oldu? Gəlməyib?

– Yox.

– Axı kimdir, bəlkə çıxıb-gedib?

– Yox, hələ get...

Ustanın sözü ağzında yarımçıq qaldı. Qoltuğunda göy torbalı saz, çiynində bəzəkli heybə perrona yönələn Tahir göründü. O, Ramazanın böyründən sürətlə vaqonların birinə sarı yüyürəndə, usta onu çağırdı:

– Tahir!

Tahir dönüb baxan dəqiqə yerində donub qaldı. Usta onunla üz-üzə gələndə, Tahir təəccübdən böyümüş gözlərini ona zilləyərək, udquna-udquna soruşdu:

– Kimi qarşılayırsan, usta?

– Heç kimi. Gəldim ki, səni yola salım. Sən vəfasızsan, mənə nə olub?

– Bunu sənə kim xəbər verdi?

– Dünya xali deyil, bala, dünyada yaxşı adamlar da var...

Usta Ramazan mənalı-mənalı başını tərpədib dodaqaltı güldü.

## 3

Ramazan, yarım saat bundan əvvəl bağçasından dərdiyi gül-çiçək dəstəsilə içəri girəndə, arvadı Nisa qarı onun nə üçünsə həyəcanlandığını hiss edib, səbəbini soruşdusa da, tez-tələsik ayaqqabısını geyinən və hətta əlində tutduğu gül dəstəsini stolun üstünə atan qocadan heç bir cavab ala bilmədi, onun içəri girdiyi kimi də tez çıxıb getdiyini görəndə, pəncərədən dinməz-söyləməz onun dalınca baxdı. Gözləri bağçanın qırağında dayanmış Cəmilə sataşanda, "yəqin buruqda bir şey olub" deyə düşünərək sakit oldusa da, bir neçə an sonra ərinin nə üçün məhz belə tələsik getdiyinin səbəbini fikirləşəndə, ürəyinə uğursuz bir şübhə damdı. Ona elə gəldi ki, buruqda adi bir hadisə yox, nə isə müdhiş bir fəlakət üz vermiş, bu səbəbdən də qoca özünü tamam itirib, bağçadan gətirdiyi gül dəstəsini həmişəki kimi yemək stolunun üstündə duran gülqabına qoymağı belə unutmuşdu.

Ramazanı aparmağa gələn abı maşın gözünə dəyəndə, Nisanın həyəcanı daha da artdı: "Görünür yanğın olub" deyə xəyalından keçirdi, gülləri astaca götürüb gülqabına qoydu, ayağındakı çəkələkləri sürüyə-sürüyə həyətə çıxdı, evin qabağındakı dəyirmi hovuzun daşı üzərinə qalxdı və oradan aydın görünən dəniz buruqlarına tərəf baxdı. Yox, yanğın olmamışdı. Sahilə doğru uzanan yollarda da M-1 maşını görünmürdü. Deməli, Ramazan ora getməmişdi. Bəs bu necə işdi? Əgər onu İsmayılzadə çağırmışdısa da, beş addımlıq yol üçün maşın nəyə lazımdır? Bəlkə uşaqlardan bir xəbər vardı?

Nisa, oğlanlarını cəbhəyə yola saldığı gündən Ramazanın hər addımına göz qoyurdu. Nəyi isə ondan gizlətdiyini, evə də yalnız işi çox olduğu üçün yox, məhz bu barədə Nisanın suallarına cavab verməkdən yaxasını kənara çəkmək üçün belə gec-gec gəldiyini düşünürdü. Nisanın fikrincə o, çox vaxt gecələrini buruqda keçirməklə, özünün də dərdini unutmaq istəyirdi. Üzdən təmkinli və sarsılmaz görünən Ramazanın, əslində necə köyrək və zərif qəlbli bir insan olduğunu Nisa hamıdan gözəl bilirdi. Bəzən gücdən düşüb yerinə uzanan qoca, səhərədək sağa-sola çevrilir, narahat yuxuda Nisanın o qədər də aydın başa düşmədiyi neft istilahlarını və tez-tez də oğlanlarının adını təkrar edirdi. Ramazan, partiya işində çalışan kiçik oğlu Paşanı, ali məktəbdə riyaziyyat dərsi deyən böyük oğlu Əhməddən çox istəyirdi. Ancaq bunu bir Nisa, bir də Ramazan özü bilirdi. Gecələr sayıqlayanda, Paşanın adını daha çox çəkən Ramazandan, gecə röyada nə gördüyünü hə-

yəcanlı bir ürək döyüntüsü ilə dalbadal soruşan Nisaya bircə kəlmə ilə cavab verərdi:

– Xeyirdir.

Bu təsəlli ana qəlbini azacıq sakit etsə də, o, evdə yalqız qalanda, xüsusən müharibə günlərinin qaranlıq və səksəkəli gecələrində dərdini ürəyinə salıb səssizcə ağlardı.

İndi isə, hovuzun daşı üzərinə qalxıb yollardan gözünü çəkməyən qarı, yenə də oğlanlarını xatırlayıb, köksünü ötürə-ötürə evinə qayıtdı: "Allah kərimdir" deyə öz-özünə təsəlli verdi, pəncərədən eşiyə boylanmaqdan yorulub mətbəxə keçdi, nahar üçün hazırladığı bozbaşı pilətənin üstündən götürüb kənara qoydu. Kim bilir, əri neçə saatdan sonra qayıdacaqdı? Bəlkə bu gün o heç qayıtmadı? Bu dünyada Ramazan kimi son illərini, bəlkə də son aylarını yaşayan bir qocadan başqa kimsəsi olmadığını etiraf etmək Nisaya ağır gəldi. Məşəqqətli keçən həyatını oğlanlarının gözü qabağında başa vurmaq, son nəfəsində onlara xeyir-dua vermək Nisanın ən böyük arzusu idi. O, gəncliyini məhrumiyyətlər içərisində yaşamış olsa da, hər növ çətinliyə dözüb oğlanlarını boya-başa çatdırmışdı. Onun dərdli sinəsində ana qüruru adlanan ülvi bir qüvvət çırpınırdı. Bu qürur ona, uzun illər boyu çəkdiyi ən ağır iztirabları belə unutdurmuşdu. Əgər o, Paşa ilə Əhməd kimi savadlı olsaydı, öz ana məhəbbətini bu sözlərlə ifadə edərdi: "Sizin səadətiniz üçün mənim tez ölməyim lazımsa, həyatla vidalaşanda bir dəfə də uf demərəm. Ancaq nə etməli ki, mən sizin müharibə alovlarından sağ-salamat qurtulmağınıza əmin deyiləm. Gözləyirəmsə, bu da sizi xoşbəxt görüb, ürək rahatlığı ilə ölməyim üçündür".

Lakin indi Paşanı, Əhmədi görmədən ölmək, onların gələcək xoşbəxtliklərinə əmin olmadan dünyanı tərk edib getmək doğrudan da ağır idi. Oğlanlarının hər ikisi evlənmişdisə də, hələ heç birinin övladı yox idi. Onların arvadları indi də ərlərinin yolunu gözləyirdilər. Nisa gəlinləri ilə, gəlinləri də Nisa ilə tez-tez görüşürdülər. Qarı hər ikisinə eyni gözlə baxır, birinə hədiyyə alanda, o birini yaddan çıxarmırdı. Gəlinlər müharibədən əvvəl də, indi də müəllimlik edirdilər. Nisa, təkcə oğlanlarının deyil, gəlinlərinin də taleyini düşünürdü.

Budur, məğribdə də, məşriqdə də müharibə qurtardı, amma nə Paşadan, nə də Əhməddən bir xəbər var.

Ramazan Tahirlə bərabər vağzaldan qayıdıb gələndə, Nisa qəmli düşüncələrdən ayrıldı:

– Bu nə idi, ay kişi? – dedi. – Lap ürəyimi yedim ki... Hara gedirdin?

Usta gülümsəyib yarı zarafat, yarı ciddi bir əda ilə cavab verdi:

– Tahiri yola salmağa getmişdim, – deyə ardınca gəlib qapıda dayanmış və utandığından içəri girmək istəməyən Tahirə üz tutdu. – Bəri gəl, oğlum, bəri gəl!..

Tahir sazını və heybəsini şüşəbəndli balkonun qapısı ağzında qoydu və başı sinəsinə enmiş halda, elə bil qorxa-qorxa yavaşca və səssiz addımlarla içəri girdi. Təəccüblə üzünə baxan Nisa qarının yanından ötüb (ona salam verməyi də unudaraq) ustanın göstərdiyi kürsüdə oturdu.

– Otur, bala otur! – qoca, Nisaya tərəf döndü: – Tahir dediyim oğlan budur arvad, Bakıda qəribsəyib. Kəndə getmək istəyirdi, qatara gecikdi...

Ərinin sözlərindəki incə istehzanı yalnız indi hiss edən qarı, Tahirin boy-buxununa, üz-gözünə daha da maraqla baxmağa başladı.

Usta gəlib Tahirin düz qənşərində oturdu:

– Hə, indi danış görüm, bu nə əhvalatdı, oğlum? Görünür günah məndə olub, yəqin xətrinə dəymişəm.

Tahir vağzaldan evə gəlincəyədək bir kəlmə də danışmamış qocanın bu tənəli sözlərini eşitdikdə, yavaş-yavaş başını yuxarı qaldırdı, utancaq və ürkək nəzərlərlə ona baxdı:

– Yox, usta, səndən şikayət eləməyə mənim nə haqqım var? – O yenə susdu, bir neçə anlıq sükutdan sonra, getməyinin səbəbini yalnız indicə tapmış kimi, aşağı əyilmiş belini düzəltdi və əlavə etdi:

– Anamı tək qoyub gəlmişəm, usta. Kənddə onun heç kəsi yoxdur.

Tahir yenə anasının məktubunu xatırladı. Onu döş cibindən çıxarıb ustaya göstərmək də istədi. Birdən "lazım deyil özünün azmı dərdi var?" deyə düşünüb bu fikrindən daşındı.

Usta Ramazan Tahirin qəribsədiyini Nisaya söyləyəndə, məhz anası üçün darıxdığını nəzərdə tuturdu, amma onun bu cavabının qeyri-səmimi olduğunu duyub, dedi:

– Daha qaçmaq niyə? Bunu mənə əvvəldən deyə bilməzdin?

– Öz dərdin azdırmı, usta?

Usta qaşqabağını yığışdırdı, nüfuzedici gözlərlə şagirdinə baxdı:

– Dərdim? Mənim nə dərdim var? – dedi və Nisanın burada olduğunu unudaraq səsini ucaltdı: – Mənim dərdim odur ki, oğlanlarımı yollamışam davaya. İndiyəcən heç birindən xəbər-ətər yoxdur. Onla-

rın əvəzinə adam yetişdirmək lazımdır, ya yox? Sən də ol mənim oğlum, ya da nəvəm, çalış irəli get də... Yaxşı, tutaq ki, qaçdın. Bundan anana nə fayda?.. Eh, oğlum, siz xoşbəxt zəmanənin övladlarısınız!.. – Qoca duruxdu.

– Ancaq deyəsən cavanlar bu zəmanənin qədrini yaxşı bilmirlər...

Usta həyəcanlanıb, ayağa qalxdı, əli belində otaqda var-gəl etdi, sonra isə Tahirin başı üzərində dayandı:

– Keçmişdə Paşanı, Əhmədi oxutmaq istədim, gücüm çatmadı, on iki-on üç yaşa çatanda aparıb güc-bəla dəmirçi şagirdi qoydum. Şura hökuməti olmasaydı, onlar da mənim kimi savadsız qalacaqdılar. İndi sizə nə var ki?.. Nə qədər istəyirsiniz oxuyun, işləyin, irəli gedin. İndi elə bir zəmanədir ki, insanın bəxti öz əlindədir.

Tahir nə isə demək istədi, ancaq tez də fikrini dəyişdi. Bunu dərhal hiss edən usta, Tahirə qayğılı və mehriban bir nəzər saldı.

– Hə, de görüm, nə sözün var? Mən də sənin atan...

Tahir cəsarətləndi və qəlbindəki incə narazılığı gizlətmək istədi:

– Usta, məni o qədər də avam hesab eləmə. Mən zəmanəmizin qədrini yaxşı bilirəm.

– Əgər bilirsənsə, oxu də... İndi elə vaxt deyil ki, buruq ustası olmaq üçün otuz-qırx il külüng çalasan, onun-bunun qabağında ikiqat əyiləsən? Bu gün şagirdsən, sabah açarçı olacaqsan. Bir ildən sonra buruq ustası müavini, bir neçə ildən sonra da buruq ustası olacaqsan. Əgər incinarlıq istəsən, o da özündən asılıdır.

Anasının təkliyinə dair dediyi sözlər, indi Tahirin özünə də çox sadə görünürdü. O hiss edirdi ki, qaçmağına səbəb yalnız bu olmadığını usta da duymuşdur. Odur ki, özgə bir bəhanə uydurmaq fikrinə düşdü. "Komsomol işimi gətirmək lazımdır" demək istədi, ancaq bunun üçün də qaçmağın ağıllı bir hərəkət olmadığını tez anlayıb dinmədi.

Ramazan isə onu təbliğ üçün yox, öz daxili etiqadı ilə yanıqlı-yanıqlı deyirdi:

– Özünü tərifləyən adamlardan zəhləm gedər. Ancaq yadında saxla ki, Ramazan hər şagirdin bəxtinə çıxan ustalardan deyil. Yaxşı, mən bu dünyadan köçüb getdim, bəs yerimdə kim qalacaq?

Nisa qarı bayaqkı düşüncələrini xatırladı, ərinin qəmli bir səslə dediyi bu sözlərdə ömrünün sonuna çox az qalmış bir insanın acı etirafını və bu etirafdakı həqiqəti dinlərkən, ixtiyarsız olaraq köksünü ötürdü: "Doğrudan da yaman qocalmısan, kişi..." – deyə fikrindən keçirdi.

Usta gəlib yerində oturdu:

– Ancaq mən ölsəm də bu dünyadan ürəyi rahat gedəcəyəm – deyib, bir neçə dəqiqə fikrə getdi.

Tahir onun gözlərində həqiqətən ölümünə təəssüf etməyən və çəkdiyi bütün əziyyətlərin ağrısını unutmuş bir insan qüvvəti duydu: "Mənim də babam öləndə usta kimi arxayın idi. O bizə baxıb gülümsəyirdi... Bu köhnə adamlar ölümü necə mərd qarşılayırlar!" – Tahir təəccüb və heyrət içində gözlərini usta Ramazana zilləyib, ürəyində öz acizliyinə qarşı baş qaldıran nifrət hissini bəyəndi.

Adətən az danışmağı sevən usta Ramazan, şagirdinin üzünə baxmadı, bütün ürəyini boşaltmağa fürsət tapmış kimi, yenə başladı:

– Bu daxmamı görürsənmi? Deyəcəksən ki, usta öz köhnə daxmasından ayrıla bilmir, amma səni isti yuvandan ayırmaq istəyir. Bilirəm, adamın öz daxması başqalarının sarayından qiymətli görünər. Elə kənd də, kolxoz da bizimdir, mən demirəm ora getmə, yox, əlbəttə yox. Ora da get. Ancaq, oğlum, Bakı ayrı aləmdir. Bax, mənim bu balaca otağımın hər qarışı təkcə mənim üçün yox, gərək hamı üçün əziz olsun. Heç bilirsən niyə? Çünki burada çox gizli inqilabi işlər görmüşük. Nisa Allah şahididir, qoy o desin!

Nisa qarı çox əziz saydığı bu xatirələrdə həmişə öz adının da çəkildiyini eşidən zaman, ürəyi qeyri-adi bir qürur və iftixarla çırpınardı. Elə indi də qəmli fikirlərindən ayrılıb ərinin sözlərini təsdiq etdi:

– Elədir, bala, elədir. Onlar içəridə oturub iclas eləyəndə, mən həmişə bayırda paltar yuya-yuya keşik çəkərdim... Sən demə, Nikolay padşahı taxtdan salmaq üçün tədbir tökürlərmiş...

Usta Ramazan iftixarla dilləndi:

– Bakını sevin, oğlum! Bakının adını həmişə uca tutun! Unutmayın ki, çox yer işığı buradan alır!

Söhbətin qurtardığını güman edən Nisa qarı, balkona çıxdı və orada qurdalanmağa başladı. Onun xörək gətirməyə getdiyini düşünən Ramazan, bir xeyli gözlədisə də, qayıtmadığını görüb içəridən səsləndi:

– Ay arvad, gözləməkdən gözümüzün kökü saraldı, yeməyə nəyin var?

Qarı əlindəki işi bir tərəfə atdı (gəlinlərinin yorğanını yuyub, yununu səliqə ilə didirdi) və qazanı qaz plitəsinin üstünə qoydu:

– Bu saat, bu saat!

Ramazan isə yenə xatirələrə daldı. Həyatının acı səhifələri bir-bir vərəqlənib gözləri qarşısından keçdi.

– Əgər keçmişdə cəhənnəmi görmək istəyirdin, gərək Bakı mədənlərinə gələydin. İndi işləmək su içməkdən hasand olub. Sən jalonkanı görməmisən. Deyərdilər ki, kapitalistlər bunu fəhlələrdən hayıf almaqdan ötrü icad elətdiriblər. Amma bu saat maşın səndə, motor səndə, incinar da özündən. Qüdrət İsmayılzadəni tanıyırsan?

– Bəli.

– Bax, onun atası Salman kişi mənim fəhlə yoldaşımdı. Sahibkarlarnan o qədər vuruşdu ki, axırda ayaqlarına qandalaq vurub Sibirə sürgün elədilər. Hələ bu gün də qayıdır...

Bu anda Nisa xörək qazanını buğlana-buğlana gətirib, yemək stolunun üstünə qoydu:

– A kişi, – dedi, – bəsdir də... Az nəsihət elə! Tahir özü yekə oğlandır, səndən-məndən də yaxşı başa düşür.

Qoca usta qəsdən səsini ucaldıb gah tahirin, gah da Nisa qarının üzünə diqqətlə baxa-baxa dedi:

– Bir var kitab oxuyasan, bir də var öz gözünlə görəsən. Mən ona gördüyümü danışıram. Bu yolda can qoyanları gərək uşaqlarımız da bilə, arvad... Mənim sinəm elə bir kitabdı də...

– Yaxşı, yaxşı özünü az təriflə!..

Ramazan arvadına cavab vermədi. Buğlanan yağlı bozbaşı mübahisəyə tərcih etdi. Nisa acıqlı-acıqlı onun üzünə baxdı:

_Vallah, sənin əlindən şikayət yazdıracağam!

– Niyə ki?

– Dava vaxtı dinmirdim. Deyirdim ki, hamı necə, sən də elə. Bəs indi evə niyə gec-gec gəlirsən? Xörəyi hər gün azı əlli dəfə qızdırıram.

Usta Ramazan nəfəsini dərib:

– Gərək bu buruğu bir ay tez təhvil verəm, arvad – dedi. – Əsil dava elə bundan sonra başlanır. Səngərdən qaçmaq kişilikdən deyil axı...

Tahir bu sözlərin öz ünvanına deyildiyini güman edib daha da pərtləşdi:

– Yox, usta, – dedi, – mən də səngərdən qaçmayacağam!

Bu anda qocanın qulağına bir səs dəydi. Kim isə ağacla qapını döyürdü.

– Hə, buyur görək, qapı açıqdır, – deyə usta ayağa qalxmadan qışqırdı. – Qayınanan səni çox istəyirmiş. Gəl!..

Qapı yenə də döyüldü. Görünür qonaq gələn adam Ramazanın səsini eşitmirdi. Usta yeməyini yarımçıq qoyub qapıya yönəldi.

– Ay səni xoş gördük!.. – deyə gələn adamı qucaqlamaq istəyirmiş kimi, qollarını açıb ucadan səsləndi.

Nisa ilə Tahirin gözləri qapıya zillənmişdi. Usta Ramazan, əlində yoğun bir əsa tutmuş qoca bir kişini çəkə-çəkə içəri gətirdi.

– Nə əcəb səndən? Nə əcəb səndən?

Ustanın, sevinci yerə-göyə sığmırdı. O, əl-ayağa düşüb ora-bura vurnuxurdu, tez kürsü gətirib, özününkü ilə yanaşı qoydu:

– Ay arvad, tez ol, Kərimin də payını çək! – dedi.

Qonaq əsasını qapı yanında divara söykəyib, Nisa ilə ikiəlli görüşdü. Onun gəlişindən qarı da əri kimi sevinərək, tez-tələsik boşqab çıxartdı, Kərim kişiyə də pay çəkdi.

Tahir qonağa altdan-altdan diqqətlə nəzər saldı. Ustanın belə ehtiramla qarşıladığı adam, onun fikrincə son dərəcə əziz, nüfuzlu və çoxdan gözlənilən bir qonaq olmalı idi. Ərlə-arvadın üzündəki mehriban təbəssüm də, qonağın dərin qırışlarla örtülmüş simasına dikilən gülümsər gözlər də Tahirin bu ehtimalını təsdiq edirdi. Ev sahiblərinin bu hörmət və qayğısından qocanın da həyəcanlandığı hiss olunurdu. Onun iri əlləri titrəyir, deyəsən təşəkkürünü bildirməyə belə söz tapa bilmirdi. Boz parusindən köynək və şalvar geymiş bu qocanın gündüz işığında parıldayan gözləri, ən çox da bu gözlərin canlı və iti baxışları Tahirə tanış göründü: "Bu kişini haradansa tanıyıram" deyə sürətlə xəyalından keçirdi.

Ramazanla yanaşı oturan qonağın qarşısındakı dolu boşqab buğlanırdı. Ancaq o, nədənsə, xörəyə deyil, gah Nisaya, gah da Ramazana baxıb gülümsəyə-gülümsəyə başını qaldırıb – salırdı. Bu anda Ramazan qaşığı əlinə alıb, bir müddət havada tərpədə-tərpədə Tahirə üz tutdu:

– Oğlum, bax bu Kərimi görürsən? Mənim köhnə dostumdur. Yaxşı günün yox, yaman günün dostudur! Mənə çox köməyi dəyib. Yaxşı deyiblər ki, hər şeyin təzəsi, dostun köhnəsi... O vaxtlar sən hələ anadan olmamışdın. Bakının üstünə bir yandan osmanlı qoşunu hücum çəkirdi, bir yandan da ingilis dişini qıcamışdı... Əşi, bu nöyütün başında çox bəlalar var. Yaxşı yadımdadır, eser köpəyuşağı başlamışdı ki, bizi qurtarsa, ingilis qurtaracaq... Onda bax, bu gözünə döndüyüm Kərim qolunu çırmayıb düşdü ortalığa, nə yemisən turşulu aş, əz ki əzəsən o eser köpəyoğlunu... Gərək ki, onun çeşməyi də

vardı, mazutlu palçığa düşdü, ha çalışdısa tapa bilmədi... O gündən sonra daha onlardan mədənə gəlib baş-beynimizi tökən olmadı...

"Hə tanıdım, tanıdım, mən Bakıya gələn axşamı tramvayda gördüyümüz kişidir" deyə Tahir sevinclə düşündü və qaşıq əlində donub qaldı.

Qonaq da yeməyə başladı, amma dostunun dedikləri onu bozbaşdan daha çox maraqlandırırdı:

– Hə, hə, – deyirdi. – Gəncənin qoçuları da hamıdan çox canfəşanlıq eləyirdi. Bir cavan uşağı tutub asmışdılar... – Kərim kişi yanıqlı – yanıqlı köksünü ötürdü. Daşnaqlar cəbhəni boşaltmasaydılar, onları Bakıya yaxın qoymazdıq. Amma neyləyəsən, ingilislə şərt bağlayıbmış, fikri o imiş ki, Bakını versin güdaza... Necə də ki, verdi...

Tahir hiss elədi ki, bu mövzudan danışanda, qocaların hər ikisi həm kədərlənir, həm də ruhlanır, onların həyatında çox şərəfli saydıqları səhifələr bir-bir vərəqlənir, Ramazan da, Kərim də Bakının ən ağır günlərində meydandan çəkilmədiklərilə fəxr edirlər.

– Ay kişi, bu səndə nə xasiyyətdir, qoysana kişi xörəyi yeyə... – deyə Nisa qarı ərinə acıqlı-acıqlı baxdı. Amma Tahir üçün belə danışıqlar öz-özlüyündə də maraqlı idi. Siyasi məşğələlərdə keçdiyi dərslər indi ona birdən-birə aydın olur, Bakının çəkdiyi bəlalar bütün canlılığı ilə onun zehnində nəqş bağlayırdı.

– Həmin bu Kərim ilə bir cərgədə hücum eləyirdik. Gördüm ki, yox, qılçamın birini sürüyüb apara bilmirəm... Məndən Kərim soruşdu: "Bəlkə yaralanmısan?" Deyirəm "yox, deyəsən yorulmuşam". Bir az keçir, görürəm yox qılçamdan qan fışqırır... Bax, mən onda gördüm Kərimi, məni çiynində düz bir verst apardı...

Bozbaşı yeyib qurtarandan sonra söhbət başqa bir istiqamət aldı:

– Bu zaman haradan belə, Kərim? – deyə Ramazan soruşdu.

– Xanların qəbrinə getmişdim. Sağ olsunlar, yaxşı düzəldiblər. Fəhlənin qanı nahaq yerə axmayıb... gələndə uzaqdan dəniz buruqlarına göz qoyurdum... Bu güc ki, bizimkilərdə var, öləndə "uf" deməyəcəyəm... Kommunizmi quracaqlar... Amma, Ramazan, hayıf, hayıf bu qocalıq məni lap nakişi elədi... Yoxsa, vallah, mən də taydan-tuşdan geri qalmazdım...

Qonaq köksünü necə dərindən ötürdüsə, Tahir onun ah çəkdiyini güman elədi. Onun ürəyindən qopub gələn təəssüf, Ramazana da ömrünün sona yaxınlaşdığını xatırlatdı. Onların arzusu – öz əllərilə

çoxdan bəri qurduqları möhtəşəm sarayı görmək, doyunca sevinmək, bu dünyadan kam alıb, sonra ölmək idi.

Yekə saat Ramazanın qabarlı əlində göründü:

– Tahir, oğlum, – dedi, – get dincəl, iki saatdan sonra gecə növbəsinə yola düşəcəyik... Sözümüz sözdür, yox?

Tahir bu dəfə həm ucadan, həm də qəti cavab verdi:

– Bəli, usta, – dedi, – sözündən dönən namərddir!..

**4**

Qüdrət İsmayılzadənin anası Tükəzban qarı, nəvəsi Şirmayıya qəribə nağıllar söyləyirdi. Usta Ramazan bir cümlə ilə danışdığı əhvalatı o bir günə də deyib qurtara bilmirdi. Əslinə baxsan, onun nağıl deməkdə xüsusi bir məharəti vardı. Lalə trestə gedəndən Şirmayı evdə həmişə Tükazbanın ümidinə qalırdı. Qızcığaz gündüzlər dərsə gedib – gələr, axşamlar isə sabahkı dərslərini hazırladıqdan sonra nənəsinin nağıllarına qulaq asardı.

Tahirlə usta Ramazan axşam növbəsinə yola düşəndən sonra, Tükəzban qarı, köhnə rəfiqəsi Nisanın yanına gəlmişdi. Əri Salman kişi ilə Ramazan kimi, o da cavanlıqdan Nisa ilə yaxın dost idi. Ərinin əhvalatını xatırlayanda, ikisi də səssizcə ağladı. Onlar hər dəfə görüşəndə keçmişlərdən söhbət açardılar. Həmişə də qəhərlənib ağlayardılar. Deyirlər ki, yaman günün dostlarını qılınc da bir-birindən ayıra bilməz. Bu ifadəni elə bil Nisa ilə Tükəzbanın dostluqdakı sədaqətinə baxıb yaratmışdılar. Onlar az-az görüşərdilər, ancaq söhbətləri uzun çəkərdi.

Bu gün də belə oldu. Ramazandan danışdılar, Qüdrətdən söz saldılar. Gəlinlərin vəfasından, nəvələrin mehribanlığından, ən axırda da zəmanədən danışıb ayrıldılar.

Tükəzban qarı evə qayıdanda Şirmayını yemək otağında tək görüb, əlini dizinə çırpdı:

– Bıy, başıma xeyir, anan hanı?

– İşə getdi, ay nənə...

– Gör başım sözə-söhbətə nə təhər qarışıb ki, bir də ayılanda görmüşəm qaranlıq düşüb...

Şirmayı, adəti üzrə, divanda oturub bardaş quran nənəsinin yanına yüyürər, başını onun dizi üstə qoyub, söylədiyi maraqlı nağılları dinlərdi.

– Ay nənə, anam dedi ki, bu axşam bir az gec gələcəyəm.

– Niyə ki?

– Trestdə iclası var. İstəyirsən, zəng eləyib soruşum.

– Yox, ömrüm-günüm, vaxtını alma.

Şirmayı yenə qarının böyründə uzanıb başını onun dizi üstə qoydu:

– Anam dedi ki, bu axşam musiqi müəlliməsi gəlməyəcək... İndi bir nağıl yox, ikisini danış, yaxşımı?

– İstəyirsən, lap üçünü danışım. – Tükəzban qarı duruxdu. – Hansını istəyirsən?

– Təzəsini, təzəsini!..

– Təzəsi qalıbmı ki?

Uzun bir sükut oldu. Doğrudan da Tükəzban bildiyi nağılların hamısını danışıb qurtarmışdı. Son vaxtlarda öz gözü ilə gördüyü hadisələri də nağıl adı ilə söyləməyə başlamışdı. Ancaq bunu Şirmayı hiss edə bilmirdi. Onun ürəyində nənəsinə qarşı zərrə qədər də şübhə oyanmırdı.

– Ay nənə, – deyə o, qarının qucağına daha da bərk qısıldı, – qoy nağıl uzun olsun, tez qurtarmasın.

Tükəzban fikirləşdi, təzə bir nağıl da danışdı:

– Seyran adlı bir cavan oğlan vardı, qızım... – O, nəvəsinin qıvrım tellərini sığallaya-sığallaya sözə başladı. – Atadan yetim qalmışdı. Kənddən Bakıya gəldi, fəhləliyə girdi. O zamanlar adamın ürəyi açılmır, üzü gülmürdü. Seyran da belə qəmgindi. Həmişə fikri-zikri kənddə idi. Orada anasını tək qoyub gəlmişdi. Puldan-paradan qazanıb onun yanına qayıtmaq istəyirdi. Ancaq bu mümkün olmurdu. Gecə-gündüz əlləşirdisə də, heç nə artıra bilmirdi, aldığı donluqla anası ilə özünü güclə dolandırırdı. Fəhlələrin çoxusu belə idi. Onda mədənlər qapqara cəhənnəmə oxşayırdı. Adamlar, elə bil, od-alov içində yanır, his olurdular. Seyran kəndə qayıtmaq istəyəndə yoldaşları ona dedi: “Hara gedirsən? Bizim üçün yer birdir. Kənd şəhərdən betərdir”.

Onlar çox fikirləşdilər, ancaq pis dolanmaqlarının səbəbini tapa bilmədilər. Götürüb xozeyinlərinin əlindən padşaha şikayət yazdılar, yenə də bir fayda çıxmadı. Atalar demişkən, it-itin ayağını basmaz. Fəhlələr yenə cəhənnəm əzabından qurtarmadılar. Şikayət yazanları tutub qazamata saldılar.

Günlərin birində Bakıya hardansa igid bir cavan gəlib çıxdı.

Cavan bütün fəhlələrin dostu idi. O dedi:

– Əgər belə getsə, bu dünyada lap o günün işığına da həsrət qalacaqsınız. Dünyada əlsiz-ayaqsız adamların payını həmişə it qapar.

Seyran da onun sözlərini eşitdi. Cavandan soruşdu:

– Neyləyək?

Cavan dedi:

– Birləşək, sözü bir yerə qoyaq. Onda heç kəs bizə batammaz.

O gündən Seyranın yoldaşları and içib əhd elədilər ki: "Ölsək də, qalsaq da birik".

Tükəzban yenə qızcığazın saçlarını oxşadı:

– Seyran onunla yaxın dost oldu. O nə desəydi, hamı qulaq asırdı. Ancaq fəhlələrin düşməni də çox idi, qızım... O cavanın Bakıya gəlməyindən xəbər tutmuşdular. Sən görməmisən, o vaxtlar jandarmlar vardı. Kim padşahın pisliyinə bir dil tərpətsə, o saat tutub qazamata salırdılar. Hardansa gələn cavanı da hey axtardılar. Amma fəhlələr onu ələ vermədilər. O, hər gün bir evdə gecələyirdi. Fəhlələrin hamısı onun xətrini istəyirdi. Öz ölümlərinə razı olardılar, ancaq onun tutulmağına yox. Axtardılar, axtardılar, yenə də tapa bilmədilər.

Bu vaxt Seyran anasını, nişanlısını Bakıya gətirmək fikrinə düşdü. Yoldaşları köməkləşib ona bir balaca daxma düzəltdilər. Seyran kəndə qayıtdı. Ora çatanda xəbər tutdu ki, yazıq anası naxoşlayıb, sonra da Allah rəhmətinə gedib.

Seyran anasını çox istəyirdi. Onun ölümünü eşidəndə uşaq kimi hönkürüb ağladı. Anasının qəbri üstə getdi. Ancaq əlindən nə gələrdi? Olan olub, keçən keçmişdi. Anasının yasını saxlayıb, nişanlısı Cavahirə toy eləmədi, elə-belə götürüb Bakıya gətirdi.

Gün keçdi, ay dolandı, Seyranla yoldaşları bir də baydaq götürdülər, küçələrə çıxdılar. "Padşahı istəmirik" dedilər. Atlı kazaklar gəlib onları güllləbaran elədilər. Ölən öldü, qalanlardan çoxunu tutub qazamata saldılar.

Seyranı yaralı-yaralı tutdular. Hər gün onu çağırıb danışdırır, o igid cavanın yerini soruşurdular. Seyran ilqarına düz çıxıb yoldaşlarını satmadı. Onu gündə neçə kərrə döyüb incidirdilər, ancaq yenə də oğlanın yerini demirdi ki, demirdi. Axırda onu da, fəhlə yoldaşlarının bir neçəsini də Sibirə sürgün elədilər.

Şirmayı nənəsindən soruşdu:

– Bəs Leninin yanından gələn necə oldu?

– Sonralar onun da yerini öyrəndilər. Tutub qazamata saldılar...

Tükəzban nağılının bu yerinə çatanda dərindən köksünü ötürüb, sükuta qərq oldu. Əlini nəvəsinin saçlarında gəzdirib yenə sözünə davam etmək istərkən, qapının zəngi çalındı. Şirmayı yerindən sıçrayıb yüyürdü, tez qapını açdı. Gələn Lalə idi. Qızı onun qıçlarına sarıldı:

– Ana, – dedi, – nənəm elə yaxşı bir nağıl başlayıb ki...

Lalə gəlib kələğayısını başından açdı, bir tərəfə tulladı. Onun üst-başı səliqəsizdi. Ancaq açıq qumral gözlərindən yorğunluq tökülürdü. Tiflisi və tumanı gil məhlulundan ləkə-ləkə olmuşdu.

– Bu nədir, ana? – Şirmayı onun üstündəki ləkələri göstərdi. – yenə fantan olub?

– İclas uzun çəkdi. Sonra buruğa getmişdim, qızım, bir balaca işləri korlamışdılar, – Lalə mətbəxə keçdi, əl-üzünü yuyub tez qayıtdı və paltarını dəyişdi. Tükəzban isə ayağa qalxıb, ona şam yeməyi hazırladı, çay qoydu. Qoca da olsa, ev işlərini özü görərdi. Qulluqçunun bişirdiyi xörəkləri yeyə bilmirdi. Hər şeydə öz səliqəsini görmək istəyirdi. Evin ən xırda işlərinə qarışmasaydı, ürəyi darıxardı. Oğlu da, gəlini də bunubildikləri üçün, xətrinə dəyməzdilər. Ailədə çoxlarının qibtə etdiyi mehribanlığı da o yaratmışdı. Qayınanalardan danışılan lətifələr həmişə gəlini haqlı, onları isə haqsız qələmə verirlər. İsmayılzadənin ailəsində hələ belə söhbətlər olmamışdı. Ana evin baş hakimi idi. Burada hamı onun qanunlarına tabe idi. Qüdrət Laləni bəzən danlayan zaman, Tükəzban gəlinin tərəfini saxlar və beləliklə, çox vaxt gəlindən baş verən narazılığın qabağını alardı. O, təkcə, Qüdrətin deyil, bütün evin anası idi. Lalə də onun hörmətini saxlardı. Ailədəki bu qarşılıqlı ehtiram indi artıq ənənə və etiqad halına gəlmişdi. Lalə yalnız Şirmayının məktəb işlərinə qarışardı, vaxtı olanda dərslərini xəbər alar, hesab məsələlərinin həllinə kömək edərdi.

Tükəzban qarı çayı-çörəyi gətirib üzərindən göy örtüklü çilçıraq sallanan böyük yemək stolunun üstünə qoyanda, Lalə də özünü səliqəyə salıb gəldi. O, adəti üzrə qumral saçlarını geriyə daramış, boynunun ardında toplayıb, yarımdairəvi daraqla başına bənd eləmiş, üzü işıldamasın deyə azacıq pudralanmışdı. Geniş alnı, açıq qumral gözləri, ağ və hamar yanaqları indi artıq yorğunluq ifadə etmirdi.

– İşlərin necədir, qızım? – deyə Tükəzban əvvəlcə nəvəsinin, sonra da gəlinin boşqabına kələm dolması çəkdi. – Qüdrətdən bir yolluq əlimi üzmüşəm. Bir həftədir üzünə həsrət qalmışam. Bu gün onu görməmisən ki?

– Elə bu saat yanından gəlirəm. – Lalə xörəyini qabağına qoydu. – İşləri ağırdır, ana. Tresti çox geridə qalıb. Azı yarım il gərək qabıqdan çıxsın ki, bəlkə bizə çatdıra. Özgəsi korlayıb, ağırlıq Qüdrətin boynuna düşüb...

Gəlininin üz-gözündən xörəyi bəyənib-bəyənmədiyini oxumaq istəyən Tükəzban, Lalədən gözünü çəkməyib narazı halda başını buladı:

– Elə həmişə belə olub, qızım. Yaxşı işləməyin xeyri budur də... – Tükəzban ürəyində oğluna həddən artıq əziyyət verənləri yamanladı. – Anası ölmüş ev bilmir, eşik bilmir, təkdənbir gələndə də gözünə yuxu getmir.

Bütün uşaqlar kimi, Şirmayı da böyüklərin söhbətinə qulaq asmağa sonsuz bir maraq göstərirdi. Ancaq o, öz fikrini deməkdən çəkinirdi. Lalə onun belə işlərə qarışmasına razı olmurdu. Ona elə gəlirdi ki, qızı belə şeylər haqqında düşünərsə, dərslərinə ziyan toxuna bilər.

Ancaq bu dəfəki danışıq atasına aid olduğu üçün, Şirmayı Lalənin həmişəki öyüd-nəsihətini unudub, söhbətə qarışdı.

– Ana can, nə olar ki, atam yaxşı işlədiyinə görə belə edirlər də...

Lalə onun sözünü kəsdi:

– Dərsini hazırlamısan, ya yox? Çörəyini ye, get yat!

Böyüklərin söhbətini bütün təfərrüatına qədər dinləmək istəyən Şirmayı, yerində qurcalandı və püstə kimi xırdaca dodaqlarını büzüb mızıldandı.

– Axı nənəmin nağılı yarımçıq qalıb...

Lalə üzünə sərt bir ifadə verdi və bununla da qərarının qəti olduğunu qızına hiss etdirib dedi:

– Sabah danışar.

Lakin Şirmayı da sözün üstündə möhkəm durub inad göstərəndə, Lalə onun sabaha qədər səbr edə bilməyəcəyini görüb istər-istəməz gülümsədi və heç bir söz deməyib, xörəyini yeməklə məşğul oldu.

Tükəzban onlara çay verib, özü də bir stəkan içməkdə ikən, yenə qapının zəngi çalındı.

– Atamdır! – Şirmayı yüyürüb qapını açdı və doğrudan da Qüdrəti görərkən, əlini-əlinə vurub sevincdən atılıb düşdü. Ata üzünə günlərlə həsrət qalmış qızcığaz, həm o gəldiyi üçün, həm də Qüdrət Lalədən tez güzəştə gedib, onun gec yatmasına razı olduğu üçün bu qədər sevinirdi.

Qüdrət qızının boynunu qolu arasına aldı, ağır və yorğun halda gəlib oturdu. Şirmayı ondan üzülüşməyərək, dizləri arasında, ayaq üstə durub, həmişə onun tərəfini saxlayan atasına Lalədən şikayət etməyə hazırlaşdı.

– Nə var, nə yox, ana? – Qüdrət gülümsədisə də, yorğunluğunu gizlədə bilmədi. Yuxusuzluqdan gözlərinin altı kölgələnmişdi.

Anası onun payını gətirməyə gedə-gedə söyləndi:

– Dava da qurtardı, ancaq səni yenə əlimizdən alıblar...

Qüdrət bu sözlərə də adəti üzrə qayğısız bir təbəssümlə cavab verdi:

– Mən təkcə sənin oğlun deyiləm, ana can! – dedi.

Bu halda Şirmayı fürsət tapıb, aralıqdakı qısa sükutdan məharətlə istifadə etdi:

– Ata can, bu gün məktəbdə Puşkinin tərcümeyi-halını oxuduq. O həmişə öz dayəsinin nağıllarına qulaq asarmış. Bəs niyə anam qoymur mən qnənəmin nağıllarına qulaq asım?

Qüdrət ata qüruru ilə qızını bağrına basdı.

– İndi mən deyərəm, izin verər, qızım...

Tükəzban oğlunun xörəyini gətirdi, yenə də öz yerində oturdu. O, oğlu ilə gəlinini bir yerdə görəndə çox az danışar, yalnız zərurət hiss olunduqda öz fikrini söylərdi.

Şirmayı atasının vədindən cəsarətlənərək, əvvəlcə Tükəzbana, sonra da Laləyə baxdı və anasının da xətrinə dəyməmək üçün gülə-gülə inci dişlərini göstərib dedi:

– Nənə, mən yatmıram, nağılını axıracan danışarsan!

Qüdrət xörəyini yeməyə hazırlaşanda, Şirmayı atasının dizləri arasından çıxdı və stulunu nənəsinə yaxın çəkib oturdu.

Lalə də, Tükəzban da Qüdrətin bərk yorulduğunu hiss etdiyi üçün, heç biri onu söhbətə tutmaq istəmədi. Qüdrət xörəyini həris bir iştaha ilə cəld yeyib, üstündən də iki stəkan tünd çay içdi.

– Yaman yorulmuşam, – deyə yalnız indi etiraf edib ayağa qalxdı və iş otağına keçdi. Belə hallarda o yalnız gündəlik qəzetləri və bədii əsərləri oxuyardı. İxtisasına dair məcmuə və kitablara daha müvafiq vaxtını sərf edərdi. Geniş yazı stolunun üstündə kəşfiyyat məsələlərinə dair beş-altı qalın kitab vardı. Onların mühüm saydığı səhifələri arasına Qüdrət nazik kağızlar qoymuşdu. Boz mərmərdən qayrılmış yazı cihazının üstündə iti qəddənmiş rəngli qələmlər göründü.

– Şirmayı bəzən bu stolun dalında şəkil çəkdiyindən, rəsm dəftərini unudub, açıq halda burada qoymuşdur. Qüdrət onun çəkdiyi heyvan şəkillərinə baxa-baxa dəftərin böyründən on gün əvvəl yarımçıq qoyub getdiyi "Obsolyut axtarışı" əsərini götürüb açdı, yazı stolunun qarşısındakı kresloda oturub mabədini oxumağa başladı.

Böyük fransız ədibinin lövhələrindəki məna onun bədii zövqünə çox yaxındı. Lap gənc ikən macəra romanlarına böyük həvəsi vardısa da, həyatın sərt üzünü görəndən sonra, oxuduğu şeylərdən az şey öyrəndiyini gec başa düşdüyünə təəssüf edirdi. O, Valtasarın faciəsini oxuyarkən, ixtira ehtirası ilə alışıb – yanan bu insanın öz doğma qızı qarşısında qızıl üçün (Qüdrət "lənətə gəlsin bu qızılı!" deyə həyəcanla düşündü) yalvardığı səhnə onu sarsıtdı. O, gözlərini yumdu və payızın ılıq havasında bədənini üşütmə bürüdü: "Əgər bizdə belə olsaydı, adamın ürəyi partlardı. Çünki bizdə belə bir etiqad yaranmışdır ki, elm insanı yüksəltməli, qanadlandırmalıdır. Alimin qəlbindəki böyük arzular həqiqətə çevriləndə yalnız xalqı deyil, onun özünü də mənəvi cəhətdən ruhlandırmalı, öz yaratdıqlarına qarşı onda saf bir iftixar hissi oyatmalıdır".

Lalə bir azdan sonra onun dalınca içəri girəndə, Qüdrəti elə oturduğu yerdəcə yuxuya getmiş gördü. Oxuduğu kitab dizinin üstündən sürüşüb yerə düşmüşdü.

Lalə aşağı əyilib kitabı götürəndə, Qüdrət gözlərini açdı.

– Gör necə yorğunam ki, beş səhifə də oxuya bilməmişəm.

Lalə yataq otağını göstərdi:

– Yorğunsan, get yat!

– Bu tezdən? – Qüdrət Lalədən kitabı aldı. – Yox, mən hələ yatmaq istəmirəm. Bəlkə bir yerdən zəng oldu? – Kitabı vərəqləyib oxuduğu son səhifəni tapdı. – Sən də bu əsəri mütləq oxu! – Qüdrət Laləyə təlqinedici bir nəzər saldı və bu sətirləri ucadan oxudu: "Marqarita! Marqarita!.. Ver! Ver! Əbədi vicdan əzabı qarşısında altmış min frank nədir? Axı mən öləcəyəm, bu məni öldürəcək... Dinlə məni! Mənim sözüm müqəddəsdir. Əgər müvəffəqiyətsizliyə düçar olarsam, işdən imtina edib, Flandriyanı hətta Fransanı qoyub gedəcəyəm, əgər sən tələb etsən, günəmuzd işləyən fəhlə olacağam".

– Bu nədir, Qüdrət?

Qüdrət arvadına romanın süjetini danışdı və son səhifələrini ucadan oxuyub, Lalənin də eyni dərəcədə həyəcanlandığını hiss elədi,

yavaş-yavaş ayağa qalxaraq, razı halda öz adi təbəssümü ilə gülə-gülə yataq otağına keçdi...

Şirmayı isə nənəsi ilə yanaşı uzanıb Seyranın hekayəsini dinləyirdi:

– Seyran Sibirə gedəndən sonra Cavahir ağlaya-ağlaya qaldı. Gözünün yaşını çay kimi axıtdı. Böyüklərdən kimə gedib yalvardısa da, heç kəsin ona rəhmi gəlmədi. Elə hamısı deyirdi ki, "Padşahın düşmənidir, Allahına şükür elə ki, dar ağacından asmayıb, sürgünə yollayıblar". Eh, qızım, o vaxt kasıbların dostu nə gəzirdi?.. Cavahirin hər yandan əli üzüldü, əlacı kəsilib ərinin yolunu gözlədi. Seyran gedəndən üç ay sonra bir oğlu oldu. Amma ay keçdi, il dolandı, Seyrandan bir xəbər-ətər gəlmədi. O, Seyranı düz on il gözlədi. Axırda Nikolay padşah taxtdan düşdü. Sibirin yolları açıldı.

Şirmayının gözlərində sevinc qığılcımları parıldadı. O, tez-tez nəfəs alıb, hadisənin xoşbəxt bir nəticə ilə qurtaracağını düşünüb yerində qurcalandı.

Tükəzban isə köksünü ötürdü. Onun dodaqlarında qəmli bir təbəssüm gəzindi. Bir neçə an sükut edib, kədərli və titrək səsilə nağılın sonunu danışdı.

Gedənlərin çoxu qayıtdı, ancaq Seyrandan yenə də səs-soraq çıxmadı...

Şirmayının üzündəki inci təbəssüm yavaş-yavaş silinib getdi, gözləri böyüdü.

– ...Sən demə, yazıq Seyran qürbətdə Allah rəhmətinə gedibmiş...

Tükəzban nağılını qurtardı və doluxsunmuş gözlərini məchul bir nöqtəyə zilləyib hərəkətsiz qaldı.

Ona tərəf çevrilən Şirmayı, nənəsinin arıq və solğun yanaqlarında parıldayan yaş damcılarını görüncə üzü ciddiləşdi:

– Ağlama, nənə, – dedi, – bu ki nağıldır! Ancaq sən demədin, o yazığın günahı nə idi? Niyə onu Sibirə sürgün eləyirdilər?

Tükəzban qəhərlənib udqundu. Onun boğazını nə isə ağrıdırdı. O, nəvəsinin sualına yalnız bir neçə anlıq qəmli sükutdan sonra cavab verdi.

– Seyranın günahı o idi ki, işıqlı gün arzulayırdı, qızım... O istəyirdi ki, körpə balaları işıqlı gün üzünə həsrət qalmasın... – Tükəzban ah çəkdi və nəvəsinin də kədərləndiyini görüb, göz yaşları arasından elə bir zorla gülümsündü:

Qızcığaz ürəyinə daman həzin bir qüssədən köyrəldi:

– Nənə, dedi, – mənim babam da Sibirdə ölüb, elə deyilmi?

Tükəzban yenə əlini onun saçlarında gəzdirdi və bu nağılı danışdığına peşman olmuş kimi, bir də köksünü ötürdü.

– Elədir, qızım, – dedi. – Seyran elə sənin rəhmətlik baban idi... Ondan yadigar qalan oğlan uşağı da atan Qüdrət idi. Babanı hökumət sürgünə yollayandan sonra mən onun-bunun qapısında paltar-palaz yuyub atanı saxladım, böyüyəndə məktəbə apardım. Özüm ac-susuz qaldım, amma atanı oxutdum, qızım.

– Ay nənə, babam nə təhər adam idi?

– Elə Qüdrətə oxşayırdı, qızım...

## DÖRDÜNCÜ FƏSİL

### 1

Lətifə Tahirin yoldan qaytarılması xəbərini eşidəndən sonra, onu gördüyü ilk günlərdən ürəyində Tahirə qarşı oyanan meyl birdə-birə yox olub getmişdi: "Demək, yanılmışam. O məni zərrə qədər də istəmirmiş. Əgər istəsəydi, kəndə qaçmazdı. O, zəif və iradəsiz bir oğlandır". Belə düşündüyü üçün bir daha Tahirlə üz-üzə gəlməməyə çalışırdı. Səhər növbəsindən qayıdan fəhlələrlə qarşılaşdığı zaman, usta Ramazanı və Cəmili salamlayaraq tez də uzaqlaşır, Tahirə sarı heç olmasa ani bir nəzər belə salmırdı. Bu soyuqluğun və etinasızlığın səbəbini Tahir bir növ anlaya bilmirdi. Ona elə gəlirdi ki, Lətifə onun barəsində nə isə pis söz eşitmiş, qızın ürəyində ona qarşı nifrət oyanmışdır. Odur ki, buruqda işini qurtarıb ümumi yaşayış evinə qayıdarkən, bu xüsusda Lətifə ilə danışmağa fürsət axtarırdı. Ancaq dörd-beş gündən bəri belə bir fürsət əlinə düşmürdü. Hamının gözü qabağında onunla danışsaydı, "birdən ağır bir söz deyə bilər, olan-qalan hörmətimi də ayaq altına salıb tapdalayar" deyə düşünən Tahir də özünü zahirən Lətifə kimi soyuq və etinasız göstərməsinə baxmayaraq, əslində yanıb-yaxılır, bəzən köhnə adamlar kimi mövhumata qapılıb, taleyinin küskünlüyündən şikayət edirdi. Birdən o, Cəmilin dəniz sahilində dediyi sözü xatırladı və bütün günahları Cəmilin üstünə yıxmaq fikrinə düşdü. İstirahət günü, Səməndərlə Biləndərin yataq otağından çıxıb getdiyini görəndə o birdən açılışdı:

– Cəmil, kənddən məni sən həvəsləndirib gətirmisən. Belədir, ya yox?

Cəmil birdən Qüdrət İsmayılzadə ilə Tahirin söhbətini xatırladı:

– Mən niyə? – dedi, – özün uşaq deyildin ki? Bir də sən İsmayılzadənin yanında nə dedin? Onda mənim sözümü kəsib demədinmi neft mədənində işləməyə, qəhrəman olmağa həvəsim var? Əgər kişisən, boynuna al. Dedin, demədin?

Tahirin boğazı quruyan kimi oldu. Doğrudan da o, Cəmilin üstünə bozararaq, könüllü gəldiyini iftixarla trest müdirinə dediyini xatırladı və ürəyində haqsız olaraq Cəmilə hücum elədiyini etiraf etməyə məcbur oldu.

– Danmıram, demişəm, – deyə tutqun bir səslə cavab verdi. – Ancaq sən kəndə gələndən sonra Bakını o qədər təriflədin ki, həvəsim birə on artdı. Fikirləşdim ki, məktəb yoldaşımsan, xətrimi istəyirsən, elə mənim də sənə hörmətim vardı. Amma indi...

– Axı indi nə olub ki? Bakı məndən də çox sənin xoşuna gəlmirmi?

– Gəlir. Sözüm onda deyil. Mən səndən danışıram sənin...

– Mən həmin Cəmiləm. Sənin xoşbəxtliyini istəmirəmsə, dünyada məndən alçaq adam yoxdur.

Bu sözləri o köyrək bir nida ilə deyərkən, Tahir söhbətə ara vermək və bir daha dostunun könlünə toxunmamaq istədi. Amma Cəmil özünün zərrə qədər də günahkar olmadığını açıq-aydın gördüyü üçün, yanıqlı-yanıqlı əlavə etdi:

– Axı mənə deyən gərək, sənə nə düşüb ki, naşükür adama yaxşılıq eləyirsən?

Tahir "naşükür" sözünə dözmədi:

– Boynuma minnət qoyma, – dedi, – trest də, mədən də sənin də malın deyil.

– Axı məndən nə istəyirsən, əzizim? Yaxşı, mənim günahım nədir? – Cəmil yerində qurcalanır, Tahirin nə üçün belə qalmaqal saldığını bir növ başa düşə bilmirdi.

– Günahların hamısı səndədir, hamısı!

Cəmil onun hücuma hazırlaşdığını duyub, əvvəlcədən möhkəm başladı:

– Xoşun gəlmir, qayıt. Səni zorla tutub saxlayan kimdir?

Tahir də asanlıqla cəbhəni əlindən verməyib, onun üzünə cəsarətli və tərs bir nəzər saldı:

– Heç kimin ixtiyarı yoxdur məni zorla tutub saxlasın! Mən harda olsam, başımı dolandıra bilərəm. Ancaq mən ustaya söz vermişəm, səngərdən qaçan deyiləm. Mən bu barədə danışmıram.

Cəmil bozardı:

– Bəs nə barədə danışırsan?

– De görüm, yoldaşa vəfasızlıq eləmək insana yaraşarmı?

Cəmil onun nə üçün belə müqəddimə ilə söhbətə başladığını duyub, qəsdən məsələyə siyasi rəng verdi:

– Yox, yaraşmaz! Əgər biri yoldaşının işi dara düşəndə onu meydanda tək qoyub qaçırsa, beləsini o dəqiqə sıradan çıxarmaq lazımdır. Tutaq ki, cəbhədir, düşmən hücum edir. Belə vaxtda kim yoldaşını qoyub qaçsa, yerindəcə güllələnməlidir! Çünki...

Tahir onun sözünü kəsdi:

– Mənim fikrimi azdırma, mən cəbhəni demirəm. Oranın öz qayda-qanunu var. Məsələn, tutaq ki, mən yoldaşımdan qabaq çəməndə bir lalə görmüşəm, xoşuma gəlib. Mən onu üzəndə dostum badalaq vurub məni üzü üstə yıxır ki, laləni özü dərsin. Bu, yoldaşa vəfasızlıqdır, yox?

Cəmil gözlərinin ifadəsilə sirrini biruzə verəcəyindən qorxmuş kimi, başını aşağı salıb yerə baxdı:

– Əgər laləni o səndən qabaq görüb bəyənibsə? Ancaq mən bilirəm ki, sənin davan lalə üstündə deyil.

– Doğrudur. Mən misal üçün belə dedim. Kənddən məni həvəsləndirib gətirəndə mən səni yaxın dost bildim, fikirləşdim ki, mənim yaxşılığımı istəyirsən. Ancaq indi görürəm ki, hamıdan qabaq sən mənim ayağımdan çəkirsən.

– Mən? – deyə Cəmil elə təəccüblə xəbər aldı ki, az qaldı Tahir büsbütün yanıldığını boynuna alsın. Ancaq ürəyinə girmiş şübhə yenə onu rahat qoymadı, "gərək düzünü dedirdəm, məni də hələm-hələm aldatmaq olmaz" – deyə düşünüb yenə soruşdu:

– Mənim sənə nə pisliyim keçib ki, ayağımdan çəkirsən?

– Sənin başın xarab olub, nədir? Nə ayaqdan çəkmək?

– Bax, Cəmil, demə ki, mən heç nə qanmıram. Kor-kor, gör-gör, sən üzümə gülüb ayağımın altını eşirsən.

Cəmil daha dözə bilməyib, başını sərt bir hərəkətlə dik qaldırdı, kirpiklərini qırpmadan durğun bir nəzərlə Tahirin gözlərinin içinə baxdı.

– Harada, nə vaxt?

Tahir ürəyindəkini artıq gizlədə bilmədi:

– De görüm, Lətifə ilə niyə mənim aramı vurursan?

– Əgər o bir kərə sənin üzünə gülübsə, bu hələ sevmək deyil!

Tahir müdafiədən hücuma keçdi:

– Sən deyirdin onun nişanlısı var. Bu yalançılıq nədir bəs? Mən cikini-bikini öyrənmişəm. Nişanlısı-zadı yoxdur. Özü də bu il onilliyi qurtarır. O, savadlı, mən savadlı, onun nəyi məndən artıqdır?

Cəmil Lətifəyə qarşı meylini məharətlə gizlətsə də, bundan Tahirin çoxdan bəri xəbər tutduğunu yəqin edib pərtləşdi. Soyuqqanlı olmağa çalışıb, bu məsələni zehnində götür-qoy elədikdən sonra: "Axı heç bir qızı zorla almaq olmaz, hər şey onun könlündən asılı deyilmi?" – deyə düşündü. Lətifənin hər halda özünə daha çox meyli olduğuna şübhə etmədiyindən, Tahirlə dostluğunu nahaq yerə pozmaq istəməyib, onu sülhə çağırmaq üçün yol aramağa çalışdı. Ancaq Tahirin danışığındakı sərt nidalardan hiss edirdi ki, bu yolu tapmaq o qədər də asan olmayacaqdır.

Cəmil:

– Bura bax, Tahir, – dedi, – sənin fikrin köhnə zamanlara getməsin. Bu saat hər şey qızdan asılıdır.

– Əlbəttə, qızdan asılıdır. Amma sən başlayıb məni onun gözündən salsan, qızın könlü olmaz da...

– Axı mən səndən ona nə demisəm ki?

– Bilmirəm nə demisən, ancaq onu bilirəm ki, qız mənə əvvəlki kimi baxmır.

Cəmil birdən özünü elə göstərdi ki, guya onu həyəcanlandıran Lətifə məsələsi deyil, Tahirin bundan qat-qat mühüm işləri unutmasıdır və guya Cəmil, yaxın bir dost kimi, onun belə yanlış bir yola düşməyinin ziyanını daha yaxşı dərk edir. O, yenə Tahirlə dost olduğunu və aralarındakı incikliyin bu dostluq hissinə heç bir xələl gətirə bilməyəcəyini sübut etmək üçün səsinə mehriban bir ifadə verdi:

– Mən sənin üçün deyirəm, Tahir. Mən sənə yaxşılıq eləmək istəyirəm. Tutaq ki, o səni sevir, nə olsun, sabah toy eləməyəcəksən ki?

Tahir özünə məxsus incə bir sövq-təbii ilə, Cəmilin səsindəki qeyri-səmimi nidanı duyub, ona qəsdən daha da sərt cavab verdi:

– Onu mən özüm bilərəm!

– Mən də bilsəm olmazmı?

– Yox!

– Axı biz hələ cavanıq, Tahir. Tez deyilmi?

Cəmilin onu belə sadəlövh, dərrakəsiz saymağı və indiyəcən layiqincə tanımamağı Tahirə çox ağır və təhqiramiz göründü:

– Mən o qədər də axmaq deyiləm! – dedi və birdən gözlənilməz halda səsini yavaşıtdı: – Mən evlənmək məsələsini oyun-oyuncaq hesab eləmirəm. Onu yaxşıca tanımamış, özü də bir sənət sahibi olmamış evlənmək mənasızdır. Ancaq sən mənim ürəyimi yaralamısan.

Cəmil bu sözlərə qarşı təəccübünü bildirmək üçün qəsdən çiyinlərini çəkib qaşlarını düyünlədi:

– Mən sənə neyləmişəm, balam?

Tahir ovuclarını açıb havanı yardı:

– Bundan artıq neyləyəcəksən? Hamının qabağında biabır oldum. O nə sözdür: “Ondan sənə yar olmaz?” Mən nəyəm bəyəm?

Cəmil yenə də özünü saxlaya bilməyib qaqqıltı ilə güləndə, acığından Tahirin əlləri titrəməyə başladı.

– Bax, hələ indi də məni ələ salırsan! – Tahir ona dalını çevirdi. – Eybi yoxdur, olsun!

– Əşi, bir sözdür, dedim, nə olar ki? Səndə dəvə kini varmış. Yoldaş yoldaşnan zarafat eləməz bəyəm?

– Zarafatın da yeri var!

Aralığa sükut çökdü. Onlar bu danışıqların heç bir nəticə verməyəcəyini görüb, bu barədə bir daha danışmamaq qərarına gəldilər. Tahir yenə pəncərə qarşısında pərakəndə halda tökülmüş kitablara yanaşdı, birini götürüb vərəqləyə-vərəqləyə qayıtdı, balaca stolun dalında oturdu və bir neçə sətir oxudusa da, başına heç bir şey girmədiyi üçün kitabı çarpayısının üstünə atmaq istəyəndə, Səməndər içəri girdi:

– Hə, dost, – deyə üzünü Tahirə tutdu, – “Qurbanəli bəyi” oxuyub qurtardın?

– Yox, hələ qurtarmamışam.

– Qurtar, qurtar, məzmununu mənə danış, Cəmilin borcundan da mənim canım qurtarsın.

– Axı orada nə var ki, özün oxumursan? Mən ayrı kitab almışam. Özün oxu da...

– Əşi, mən neyləyim? Bir sətir oxuyuram, yuxu məni basır.

Səməndərin gözləri Cəmilə sataşdı. Onun pərt oturduğunu görüb, təkrar diqqətlə Tahirə baxdı:

– Aha, görünür, aranıza şeytan girib... Nə olub belə? Niyə bir dodağınız yer, bir dodağınız da göy süpürür?

Cəmil Tahirlə söhbətindən onun xəbər tutmasını istəmədiyi üçün, könülsüz bir tərzdə gülümsündü:

– Nə olacaq? Elə-belə... Kefimiz yoxdur... Pulsuzuq...

– Qurtarıb? Pul məndə... Nə qədər istəyirsiniz, buyurun! – Səməndər şalvar cibindən bir dəstə beşlik çıxarıb irəli uzatdı. – Plan üç yüz faiz... bu da mükafat buyurun!

Hər gün yeməkdən şikayət edən Səməndərin cibindən bu qədər pul çıxdığını görən Cəmil, bir an duruxdu. Səməndər Tahirə baxıb onun sifətində azca da olsun dəyişiklik əmələ gəlmədiyini görəndə, Cəmilin nəyi isə ondan gizlədib demək istəmədiyini hiss edərkən tutuldu, başını bulayaraq şübhəsini bildirdi:

– Yox, aşna, pul məsələsinə oxşamır. Nə isə başqa bir sirriniz var. – O, pullarını cibinə soxaraq Tahirə yanaşdı və əlini onun çiyninə qoydu. – Nə olub, mən ölüm?

– Mən ölüm niyə deyirsən? – Tahir daha da qaşqabağını sallayıb, mis rənginə çalan sifətinin narazı ifadəsilə bu sirri heç bir vaxt açmayacağını ona hiss etdirdi.

– Bayaq gedəndə küçədə Lətifəni gördüm, – deyə Səməndər Cəmilə tərəf döndü və bu xəbərlə onu sevindirmək istədi. – Qəşəng bir paltar geymişdi, yanında da yaxşı bir qız vardı, gülüşə-gülüşə gedirdilər.

Tahir bu anda hər şeyi unudaraq, maraqını gizlədə bilməyib:

– Harada gördün? – deyə birdən soruşdu.

– Yəqin teatra bilet almağa gedirlərmiş... İstirahət günü mən onu həmişə teatrda görürəm. – Səməndər yoldaşının heç olmasa birini maraqlandırdığına sevinib əlavə etdi: – Mən də bilet almışam. Bu gün axşam “Tufan” var. İndi getsən bilet taparsan. Ala, pul verim, get al!.. – O yenə beşlikləri çıxardı. – İstəmirsən?

– Özümün pulum var... – deyə Tahir Cəmilin sözlərini yalana çıxarmaq qəsdilə deyil, ümumən yalan danışmağı bacarmadığı üçün etiraf etdi: – dünən bizə də maaş veriblər. Yaxşı yadıma saldın. Mən də gedib bilet alacağam. Sən yəqin bilirsən ki, o, bu axşam teatrda olacaq?

– Yəqinini deyə bilmərəm. Ancaq teatra tərəf gedirdi, – Səməndər yenə pullarını cibinə qoyub Cəmilə zənnlə baxdı. Onun gözlərinin qıyığı daha da büzüşdü.

– Bura bax, bu nə məsələdir, indi də Lətifə ilə Tahir başlayıb? Bəs sən?

Cəmil Səməndərə tərs-tərs baxdı, azca tutulmuş səsilə qışqırdı:

– Yüz kərə demişəm ki, onun mənə dəxli yoxdur!

– Canım, mən bir söz demirəm ki? Niyə acığın tutur?

Tahir, yolda Lətifəyə rast gələcəyi ümidilə cəld qapını açıb eşiyə çıxdı. Cəmillə danışıb ürəyini boşaltdığına sevinərək, tramvay duracağına tərəf getdi. O, yenə Cəmilin hərəkətləri barədə düşünə-düşünə birdən ayaq saxladı: "Yox, deyəsən mən yoldaşımın xətrinə dəydim".

Lətifənin soyuqluğuna və etinazlığına Cəmilin səbəb olmadığı fikri yavaş-yavaş Tahirin zehnini məşğul etməyə başladı: "Nahaq onun xətrinə dəydim, nahaq..."

Tramvayın dayandığı tinə yetişəndə, işdir birdən Lətifəyə rast gəlsə ona necə yanaşacağını, söhbəti nədən başlayacağını, nə üçün güldüklərini bilmirdi. Özü yaşında olan cavanlar, bir tərəfdə oğlanla oğlan, o biri tərəfdə bir oğlanla bir qız yanaşı durub söhbət edir, gülür, dünyanın bütün dərdlərini unutmuş kimi, şad və qayğısız görünürdülər. Ancaq Tahiri düşündürən yenə də Lətifə idi. Özünün müəyyən dərəcədə müqəssir olduğunu düşünmək nə qədər çətindisə də, indi Tahir Cəmili günahkar hesab edib, özündə heç bir qüsur görməməyi də insafsızlıq sayır, trestdə Qüdrət İsmayılzadənin yanında onu necə təriflədiyini xatırlayır, Lətifə ilə onun uzun müddət heç bir yerdə görüşmədiyini, özü barədə ona elə təhqiramiz bir söz deməyə heç fürsət belə tapmadığını düşünürdü. Tahir birdən: "Əgər doğru adamsansa, bir özünə də bax" deyə xəyalından keçirdi: – "Baxıram, ancaq özümdə heç bir qüsur görmürəm! – Yox, diqqətlə bax, başqalarına ad qoymaq asandır, amma öz nöqsanını görmək çətin!" – Tahirin düşüncələri, elə bil yalnız bir nöqtədə cəm olub, içərisinə güclü fənar işığı saldı: axtardığı qüsurdan biri də gözünə dəymədi. "Aha, – deyə o, birdən nəyi isə xatırlayıb udqundu. – Bəs Cəmil insan deyilmi? Lətifə onu sevməsə də, onun Lətifəni sevməyə haqqı yoxdurmu? Demək, mən təkcə öz xeyrimi düşünürəm". Tahirin gəlib çıxdığı bu son nəticə nə qədər ağır olsa da, o bunuetiraf etməyə məcbur idi. Çünki Cəmil heç bir yerdə Tahirdən və ya Lətifədən sevişdiklərinə dair bir kəlmə də eşitməmişdi. Əgər o vəfasız yoldaş olsaydı, bunubilə-bilə, Tahiri Lətifənin gözündən salmağa çalışardı: "Axı mən nədən bilirəm ki, Cəmil məni ona

pisləyib? Deyə düşünən Tahir, dostuna haqsız olaraq hücum etdiyini anlayıb daha da həyəcanlandı: "Axı onun nə günahı var ki?".

Bu halda tramvay gəldi.

Tahir vaqona minəndə belə fikirlərindən ayrılmadı: "Lətifənin gözü həmişə məndə idi. Bəs indi niyə məni görən gözü yoxdur?".

Birdən onun xəyalından başqa fikir keçdi: "Əgər Lətifə əvvəldən məni istəyirdisə, amma indi xırda bir səbəbdən ötrü məndən üz döndəribsə, deməli, onun məhəbbəti möhkəm deyilmiş..." – bunudüşünəndə Tahirin ürəyi gizildədi və ona elə gəldi ki, Lətifənin özü, kitablarda təsvir olunan bəzi qızlar kimi, hərdəmxəyaldır və onun məhəbbətinə o qədər də bel bağlamaq olmaz.

Tramvay sürətini artırdıqca, onun da fikri iti-iti işləməyə başlayırdı: "Yox, yox, mən özümdən başqa hamını günahkar hesab eləməkdə haqsızam. Əlbəttə haqsızam. Lətifə nə üçün hərdəmxəyal olsun? Bəlkə o yalnız mehribanlığından belə gülərüzlüdür? Bəlkə nə mən, nə də Cəmil ona xoş gəlmirik?.."

Tahirin gözləri vaqonun pəncərəsi qarşısından görünən dənizə baxır, amma təsəvvüründə yalnız və yalnız Lətifə dolanırdı. O yenə düşünür, yenə həyəcanlanırdı: "Bəlkə məndə bəyəniləsi bir şey tapmır?.."

Bu anda onun qulağına bir səs dəydi:

– Axı o qəhrəmandır, adi adam deyil...

Tahir bu sözü deyən qıza baxdı. O da Lətifə kimi gözəldi. O da xurmayı hörüklərini döşündən aşağı sallamışdı. Onun dolğun sifətində, boyasız, lakin nazik çəhrayı dodaqlarında Lətifəni xatırladan incə, bir qədər də istehzalı görünən bir təbəssüm oynayırdı. Qız yanındakı oğlana deyirdi:

– Belə qəhrəmanı yalnız o deyil, hamı sevir!..

Tahir hələ kənddə ikən neft qəhrəmanı olmaq ilə çırpındığı günləri, Bakıya da məhz bu məqsədlə gəldiyini, amma o vaxtdan bəri elə gözə dəyən bir iş görmədiyini fikirləşəndə, ürəyinin giziltisi daha da artdı və onun alnından soyuq tər damcıları axdı: "Bəlkə elə Lətifə də məni buna görə sevmirmiş?"

Tramvay çalxalanıb dayandıqda, onun fikir sapı qırıldı. O nə üçün və hara gəldiyini yadına salanda, bir qədər ürəyi sakitləşdi və axşam nə təhər olsa Lətifə ilə danışmaq qərarına gəldi: "Qoy nə deyir-desin, məni biabır da eləsə ürəyimdəkiləri açıb ona söyləyəcəyəm".

## 2

Elə bu zaman İsmayılzadənin kabinetində buruq ustaları ilə mühəndislərin gurultulu müşavirəsi gedirdi. Otağı göyümtül tüstü bürüdüyündən, adamların siması xəyal kimi dumanlı görünürdü. Lakin hamını həyəcana gətirən bu kəsik və ağır hava deyil, iclasın əvvəlində İsmayılzadənin irəli sürdüyü bir məsələ idi: nə üçün trest geridə qalır? Nə yolla trest kəsirdən çıxa bilər?

Çoxları məyus oturmuşdu. Bu hal özü də geridə qalmağın nə dərəcədə ağır və dözülməz bir şey olduğunu anlamağa kafi idi. Ancaq hamı başa düşürdü ki, qaşqabaq sallamaq və köks ötürməklə işlər öz yoluna düşməyəcək.

Nə üçün trest geridə qalır? – Sual qısa və aydın olduğu üçün, cavab da eyni dərəcədə qısa və aydın olmalı idi.

İndi danışan gənc mühəndis idi; o ortadan ayrılmış saçlarını yatarına sığallayaraq, bütün günahı neft sənayesinə təzə gəlmiş cavanlarda görürdü. Onun fikrincə təcrübə və ənənədən məhrum olan bu gənclər yeni qüvvə deyil, yeni maneə idi.

İki saatdan bəri yalnız “buyurun!” deyə iclasdakılara bir-bir söz verən və trestə gələndən bəri bütün qazıma işlərində gördüyü qüsurları burada deyilənlərlə tutuşdurub, zehnində müəyyən nəticələr çıxaran İsmayılzadə, bu sözü eşidərkən, özü də qoca buruq ustasından deyil, tamamilə gənc bir mühəndisdən eşidərkən, soyuqqanlılığını mühafizə edə bilməyib, yerində doğruldu.

– Bir qədər izah et, yoldaş Fikrət! – dedi.

– Çünki avariyalar çox vaxt onların diqqətsizliyi, təcrübəsizliyi üzündən olur. – Gənc mühəndis saçlarının səliqəsi pozulmadığına tamamilə əmin olduğu halda, yenə əlini başından ayırmadı. – Mən hələ fərarilərin ucbatından nə qədər əziyyət çəkdiyimizi demirəm.

İsmayılzadə dodaqları arasındakı papirosun tüstüsündən acışan sağ gözünü qıyıb, o biri gözü ilə altdan yuxarı Fikrətə baxırdı. O gənc mühəndisin məhz hansı uşaqları nəzərdə tutduğunu bilmək istəyib soruşdu:

– Necə məgər, belələri çoxdurmu?

– Çox deyilsə, az da deyildir.

– Misal göstərə bilərsinizmi?

– Məsələn, 155-ci buruqdan qaçan Tahir Bayramlı...

Bir tərəfdə sakit oturub mürgü döyən usta Ramazan (o, uzun sürən iclaslarda söylənən xeyirsiz nitqlərdən yorulub həmişə mürgülərdi) bu

sözləri əvvəlcə yuxuda eşitdiyini güman etdisə də, birdən ayılıb yaxşı tanıdığı cavan mühəndisin də bu xüsusda danışdığını görəndə söz istədi:

– Olarmı, bir-iki kəlmə?

– Buyurun, usta. Mən qurtardım, – deyə gənc mühəndis çəkilib yerində oturdu.

Usta Ramazan nitq söyləmək üçün söz istəmirdi. Ona görə də yerindən qalxmadı. Yalnız bircə sual verdi:

– Deməli, Tahir istirahət vaxtında vağzala gedib-qayıtmaqla bu yekəlikdə trest geridə qaldı?

Gənc mühəndis, Ramazanın bircə cümləsilə yarım saatdan bəri dediklərinin puça çıxdığını görüb, pərt halda yenə əlini saçlarına çəkdi.

İsmayılzadə ayağa qalxdı:

– Məncə məsələ aydındır, – dedi. – Yoldaşlar birinci suala cavab verdilər. Ancaq əsil sualı – nə yolla trest kəsirdən çıxa bilər? – sualını isə tamam unutdular. Fikrət yoldaş məni bağışlasın, əlbəttə, geriliyin səbəbi cavanlar deyil. Mən, şəxsən, çağırdığım müşavirələrdə bütün trest işçilərinin əməli təkliflərini yazıb götürmüşəm. İlk partiya təşkilatlarında da bu məsələ ciddi surətdə müzakirə olunmuşdur. Trestin kommunistləri geriliyin səbəbini Fikrət yoldaşın dediyi kimi gənclərdə deyil, ümumiyyətlə pis işləməyimizdə görürlər. Onların da dediklərini, bax buraya qeyd eləmişəm. – Qüdrət uzun bir bloknot göstərdi. – Məsələ burasındadır ki, istehsalata yeni gələn cavanlar arasında mühəndis yoxdur.

Halbuki avariyaların səbəbini hamıdan əvvəl mühəndislər bilməlidirlər.

– Axı, siz özünüz də demisiniz ki, avariyalara səbəb cavanlardır... – Fikrət, bu kəşfi üçün sevinmiş kimi, bu dəqiqə gülməyə hazır dayanıb, Qüdrətə baxdı.

Bəli, demişəm... və dediyimə də peşman deyiləm. Ancaq mən bunuxeyirli bir məqsədlə, gənclərin diqqətini artırmaq məqsədilə demişəm. Tərbiyəvi məqsədlə deyilən bir sözə əsasən istehsalatın taleyini həll etmək nə mənə yaraşar, nə də sizə, yoldaş Fikrət!.. Avariyaların səbəbini cavanların təcrübəsizliyində axtarmaq sizin məsuliyyətdən qaçmağınıza dəlalət edir... Axı köhnə quyuları (ona burada "ölü quyular" deyirlər, amma məncə böyük səhv eləyirlər; çünki ölü quyu yoxdur, ölü adamlar vardır) işə saldığımız zaman baş verən

hadisələr, xüsusən təbəqələrin su ilə dolması kimi hallara hamıdan əvvəl mühəndislər məsuldurlar...

Fikrət bu atmacanın hansı tərəfə atıldığını yaxşı bilirdi. Onun rəhbərliyi ilə təzədən işə salınan köhnə quyularda belə hallar çox olmuşdu və nəticədə üç quyu hələ də bir qram neft verməmişdi.

– Aydındırmı, yoldaş Fikrət?.. Bu necə olur ki, möhtərəm geoloqlarımız bu vəziyyəti əvvəlcədən görəbilmirlər? Demək, yenə də günah cavanlarda deyildir.

Qüdrət danışdıqca məclisin sükutu daha da ağırlaşırdı, amma nədənsə çoxlarının ürəyi fərəh qarışıqlı bir həyəcanla döyünürdü. Deyəsən bu, hamının düşündüyü, lakin heç bir yerdə demədiyi və ya yaxud deməyə cəsarət etmədiyi bir həqiqət idi.

– Qocaman buruq ustalarının, işə can yandıran sıravi fəhlələrin və görkəmli mühəndislərin qəlbini oxumaqda çətinlik çəkdikdə, trest bu vəziyyətdən çıxmayacaqdır. Mən onların gücünə də, səmimiyyətinə də inanıram. Fəhlə qüvvəmiz azdır. Bunu hamınız bilirsiniz. Amma bu metodla işləyib, fəhlə qüvvəsini iyirmi qat da artırsaq, vəziyyət dəyişməyəcəkdir. Mən dinlədiyim adamların fikrini öz-özlüyümdə saf-çürük eləmişəm və beş maddədən ibarət yarış şərtləri düzəltmişəm. Bu maddələri briqadalardan tutmuş mədənlərə qədər hər yerdə müzakirə ediblər. Əlbəttə, etirazlar vardır. Amma biz geridə qalanların deyil, irəlidə gedənlərin fikrilə hesablaşmalıyıq... Buyurun, şərtlərlə tanış olun!

Əsil iclas da bundan sonra başlandı. Çoxlarını təəccübə gətirən yarış şərtləri az qala bu otaq boyunda yeni bir müharibəyə səbəb oldu. Hamıdan qabaq yenə Fikrət söz istədi və Qüdrətin razılığını alan kimi yenə əlini saçına çəkdi:

– Xəyal bəsləmək gözəl şeydir. Ancaq biz xəyal sözünü utopiyadan fərqləndirməliyik. Bu beş maddə, beş utopiyadır. Trest altmış faizi güclə ödədiyi halda, burada yüz iyirmi faizdən danışırlar. Bu birinci utopiyadır. Trest turbin qazımasını hələ yeni tətbiq etməyə başladığı halda, burada, altı ay müddətində həmin üsulu bütün yeni buruqlara keçirmək nəzərdə tutulur. Bu da ikinci utopiyadır.

İsmayılzadə gülümsəyərək onun sözünü kəsdi:

– Bu olmadı!

Əvvəllər hamıda Qüdrətin mehribanlığına dair təsəvvür oyatmış xəfif təbəssümü, indi çoxlarına qəzəb kimi təsir buraxırdı. Bədirlinin

“gülə-gülə boğazımı kəsir” cümləsi, indi trestin işçiləri arasında tez-tez işlənən bir zərb-məsəli olmuşdu.

Fikrət duruxdu və trest müdirinin deyəcəyi sözü həyəcanlı bir ürək döyüntüsü ilə gözlədi.

– Məni bir məsələ maraqlandırır, yoldaş Fikrət, siz nə üçün bu qədər mühafizəkarsınız?

Son dərəcə mülayim bir səslə verilən bu sualın cavabını gecikdirməyən Fikrət də, danışığının ahəngini dəyişib, yalnız bir nəfərlə söhbət edirmiş kimi, yavaşcadan dilləndi:

– Xeyr, mən realistəm. Maddələri qəbul etmək nə qədər asandırsa, sonrakı biabırçılığa dözmək bir o qədər çətindir.

– Hər halda mən bilmək istərdim: siz nə üçün mühafizəkarsınız?

– Xeyr, yanılırsınız, yoldaş İsmayılzadə, mən əsil realistəm.

– Unutmayın ki, realistlər arasında da mühafizəkarlar az deyildir, – İsmayılzadə yenə gülə-gülə cavab verdisə də, Fikrət onun ifadəsindəki qətiyyəti duyaraq yerində oturdu, qızarmış halda gözlərini yerə dikdi və sürətlə xəyalından keçirdi: “Mən xəbərdarlıq etdim. Görünən dağın dibi yaxındır”.

İsmayılzadə yenə iclasdakılara göz gəzdirdi. Deyəsən yarış şərtləri trestin rəhbər işçiləri arasında az adamın ruh yüksəkliyinə səbəb olmuşdu. Fikrətin etirazları isə çoxusunun ürəyindəndi. Qüdrətə elə gəldi ki, Fikrətlə sərt rəftar etdiyi üçün onun tərəfdarları daha danışmaq istəmirlər: “Bu maddələri, vəzifəcə məndən aşağıda duran bir başqası meydana atsaydı, yəqin ki, onun tükünü didərdilər” deyə düşünəndə, adamların əhvali ruhiyyəsindəki zəif nöqtələrin də gizlin qaldığına təəssüf edib, Fikrətin sözünü yarıda kəsdiyinə peşman oldu. Sonra yenə müşavirə iştirakçılarına üz tutdu:

– Kim danışmaq istəyir, yoldaşlar? Fikrinizi söyləyin, bəlkə doğrudan da bu şərtlər real deyildir?

Usta Ramazanla yanaşı əyləşmiş bir nəfər ayağa qalxdı:

– Məncə, – dedi, – Fikrət yoldaşın sözlərini qəribliyə salmaq lazım deyil. Bu maddələri utopiya adlandırmaq nə qədər yanlışdırsa da, real hesab etmək də o qədər qorxuludur. Əvvəla ona görə ki, plan düzəldəndə hər bir müəssisənin işçi qüvvəsi və onların ixtisas səviyyəsi nəzərə alınmalıdır. Biz kimə əsaslanıb turbin qazımasına keçəcəyik? Südəmər uşaqlaramı? Tərs kimi bizim trestdə onların sayı üç min nəfərdən çoxdur. Qoy İsmayılzadə yoldaş məndən inciməsin, o indiyə-

dək ən qabaqcıl trestlərdə çalışıb, ancaq biz həmişə axsamışıq. Əlbəttə, bunun səbəbi var, çünki sahəmiz çətindir. Xüsusən dənizdə buruq qoymağın çətinliyini yoldaşlar yaxşı bilirlər. Yüz iyirmi faiz plan doldurmaq bəlkə də gələcəkdə mümkün olacaq, amma indi xəyala qapılmağın faydası yoxdur.

Bütün trestdə məşhur olan bu ustanın dediklərini başı ilə təsdiq edənlərə baxdıqca, Qüdrət də müvazinətini itirir, hamının bu fikirlə şərik olduğunu düşünəndə, yavaş-yavaş ümidi azalmağa başlayırdı. Üç həftədən bəri müşahidə etdiyi trestin yalnız kütləvi bir hərəkət – yarış sayəsində kəsirdən çıxa biləcəyinə dair qəlbində yaranmış möhkəm etimad tədricən sarsılırdı. Yalnız obyektiv şəraiti nəzərə almağın kafi olmadığını, trestdə çalışan canlı insanların istəklərini, ilk növbədə təcrübəli mühəndislərin və qocaman buruq ustalarının başqaları üzərinə təqsirini hesaba almaq lazım gəldiyini uzun illərin iş təcrübəsindən bilirdi. O, indi bütün müşavirəyə yox, nüfuzlu qocalara baxdı:

– Timofey Sidoroviç – dedi, – sizin fikriniz nədir?

Uzunboylu, arıq sifətli, açıq mavi gözlərilə sakit-sakit baxan bu qoca usta, tövrünü pozmadan yavaş-yavaş yerindən qalxdı:

– Mən çox şey deyə bilərdim. Ancaq uzun danışmaq istəmirəm. Çünki tresti kəsirdən qurtarmaq üçün birinci növbədə müşavirə və nitqləri ixtisara salmaq lazımdır. Təəccüb edirəm: nə üçün gənclər, bəzi yoldaşları vahiməyə salır? Gəncləri sevmək lazımdır, yoldaşlar! Sevmək lazımdır gəncləri! Onlardan qorxmaq özgələrinə yaraşsa da, biz neftçilərə qətiyyən yaraşmır. Neft gəncliyin, gənclik də neftin dostudur. Kimin buruğunda da cavanlar əl-ayağa dolaşırsa, qoy onları mənim buruğuma yollasınlar. Qüdrət Salmanoviçin yazdığı şərtlərə gəlincə, o maddələrin hamısı qızıldan qiymətlidir. Mən razıyam!

O, sözlərini böyük bir inadla deyib qurtararkən, sakit gözləri parıldadı və İsmayılzadəyə elə gəldi ki, bundan sonra o biri adamlarda da şübhə yeri qala bilməz. Doğrudan da hamıdan qızğın etiraz edən Fikrət, bu qocanı dinlərkən, nədə isə yanıldığını düşünüb, nəyi isə nəzərdən qaçırdığını güman etdi: “Axı bu niyə belə oldu?” deyə özözündən soruşdu.

– Timofey Sidoroviç, – dedi, – olmazmı izah edəsiniz, axı siz nəyə əsaslanırsınız?

Qoca yerindən dilləndi:

– Necə nəyə? – Yalnız özümüzə! İndiyəcən pis işləmişik, bundan sonra yaxşı işləməliyik. Vəssalam!

Sonra usta Ramazan söz aldı:

– Mehdi Quliyevi tanıyırsınızmı? – deyə hamının təəccübünə səbəb olan bir sualla iclasdakı adamlara müraciət etdi.

Fikrət əvvəlcə, onun da razılıq verəcəyindən qorxurmuş kimi, döyükə-döyükə baxırdı. Ancaq usta çox məyus göründüyündən, Fikrət dərindən, rahat bir nəfəs aldı və ümidlə parıldayan gözlərini qocaya dikdi. Yan tərəfdə oturmuş bir nəfər soruşdu:

– O kimdir, usta?

Ramazan sual verən adama istehzalı bir nəzər saldı: “Dünyada nə avam adamlar varmış. Mehdi Quliyevi də tanımır” deyə düşünüb, ağır-ağır başını yırğaladı.

– Necə yəni kimdir? – dedi. – Sovet İttifaqı Qəhrəmanı!

– Bunun bizə nə dəxli var?

– Var! O da həmin bəyənmədiyiniz cavanlardandır. O da dünənə kimi buruqda işləyirdi, indi qəhrəmandır. Mən başa düşmürəm, nə təhər olur cavanlar faşisti əzir, qəhrəman adı alır, mədəndə işləyəndə əlindən heç nə gəlmir? Əgər cavanları bir özgəsi pisləsəydi, mənə o qədər də yer eləməzdi. Yoldaş Fikrət, axı siz özünüz də cavansınız. Sizə yaraşarmı ki, fəhlə sinfinin cavan nəslini gözdən salasınız?

Biz ona görə qalib gəlirik ki, bizdə köhnə və yeni qvardiya həm daxili, həm də xarici düşmənlərə qarşı, birlikdə, vahid cəbhə ilə bir sırada gedirlər. Yaxşı olar ki, siz, cavanlarla qocaların arasına nifaq salmayasınız!

Fikrət son ümidinin alt-üst olduğunu görəndə, üzündəki qızartı yavaş-yavaş azaldı, axırda sifəti kül kimi bozardı.

Usta Ramazan daha heç bir söz deməyib oturdu. İsmayılzadə ondan soruşdu:

– Təklifin nədir, usta?

– Təklif yazılıb, hər yerdə də camaat fikrini deyib. Daha mən nə deyim? Trestin adını bütün Bakıda biabır eləmişik. Şərtlərimiz ağır olduğuna görə də qəbul eləmək yaxşıdır!

Fikrət yerindən qışqırdı:

– Bu necə məntiqdir, usta?

Ramazan yenə də etiqadla cavab verdi:

– Hər kəsin bir məntiqi var. Mən sən istəyən kimi fikirləşməyə borclu deyiləm.

Fikrət ayağa qalxdı:
– Yoldaş İsmayılzadə, mənə bir də söz verin! – dedi.
İsmayılzadə, nəfəsi daralmış kimi, bərkdən köksünü ötürüb ayağa qalxdı:
– Əgər belə danışıqlardan bir fayda hasil olsaydı, iclası sabaha qədər davam etdirərdim.
– Axı mənim sözlərimi yaxşı başa düşmədilər!
Usta Ramazan yalnız böyründəki adamların eşidə biləcəyi bir səslə atmacaladısa da, hamı onun dediyini eşitdi:
– Çünki söz danışmağı da bacarmaq şərtdəndir!
– İsmayılzadə yenə mühəndis Fikrətə söz verdi. Fikrət danışığına başlamazdan əvvəl bütün iclasdakılara sakit və təlqinedici bir nəzər saldı.
– Məncə, – dedi, – başqa sahələrdə çalışan adamlar hissə qapılsalar da, neftçilərin buna qətiyyən haqları yoxdur. Çünki belə-belə üsullarla işləməyə başlasaq, nəticədə avantyuraya gedib çıxa bilərik. Yoldaş İsmayılzadə, siz elə güman edə bilərsiniz ki, mən ağır işdən qorxduğum üçün belə danışıram. Əlbəttə, bu cür güman etmək heç doğru deyildir. Mən deyirəm ki, bizim trestin yarısı dənizdədir. Oranın xüsusiyyətlərini unutmaq olmaz. Axır bunun yazı var, qışı var, qarı var, boranı var. Stixiya ilə mübarizəni sizin təsəvvür etdiyiniz kimi planlaşdırmaq olmaz. Bəzən bir boran altı-yeddi aylıq əməyinizi bircə dəqiqənin içərisində puça çıxarır. Kənardan baxan müşahidəçilərə elə gəlir ki, dənizdə çalışan Bakı fəhlələri ilə qurudakılar arasında fərq vardır. Halbuki bu belə deyildir. Fəhlə həmin fəhlədir, lakin iş şəraiti tamamilə başqadır.
İsmayılzadə, yazı stolunun qabağında duran balaca dəyirmi stol üstündəki qrafindən Fikrətin su töküb içdiyini görəndə, onun səhərəcən danışmağa hazırlaşdığından qorxurmuş kimi:
– Yaxşı, siz nə təklif edirsiniz? – deyə tələsik soruşdu.
– Təklifim aydındır. Planı artırmayaq. Onu vaxtında ödəmək özü də böyük qəhrəmanlıqdır. Biz yarış üçün ayrı şərtlər düzəltməliyik.
İsmayılzadə qaşqabağını salladı:
– Məncə şərtlərdə qüsur yoxdur, – dedi, – qüsuru şəxsən özünüzdə axtarıb tapsanız və onu tezliklə islah etsəniz həm biz qazanarıq, həm də siz. – Bir anlıq sükutdan sonra Qüdrət iclasdakılara üz tutaraq əlavə etdi: – Yalnız bircə şeyi xatırlatmaq istəyirəm ki, qvardiyaçıla-

rımız düşmən üzərinə hücuma keçəndə qarı-boranı nəzərə almırdılar. Biz hansı əsasa görə bununəzərə almalıyıq? İclası bağlı elan edirəm!

İsmayılzadənin dodaqları xəfif bir tərzdə səyridi.

Oturanlar ayağa qalxdılar, Fikrətlə tərəfdarları bu gözlənilməz nəticədən sonra deməyə söz tapmadılar.

Usta Ramazan isə ikinci mərtəbədən, yük maşınları və M-1 dayanmış həyətə enəndə, köhnə dostu Timofey Sidoroviçə yan alıb deyirdi:

– Hər şeyimiz öz yerindədir. Bircə trest müdirimiz çatışmırdı, onu da yollayıblar, heç bilmirəm bunlar özgə nə istəyirlər?

**3**

Tahir axşam teatr salonunda Lətifəni axtararkən üçüncü sırada birbirilə yanaşı oturmuş Qüdrətlə Laləni gördü. Onlar məramnaməyə baxır, öz aralarında nəyi isə müzakirə edirdilər. Tahirin qulağında səslənən danışıqlar onların dediyini eşitməyə mane olurdu. İlk dəfə İsmayılzadə ilə kabinetində görüşərkən göy sətindən qoşa cibli, sadə iş köynəyi geymiş Qüdrət, indi tünd, mavi şevyotdan, çiyinləri azacıq dik oturan təzə kostyum, hava rəngində uzun yaxalıqlı köynək geymiş, yeri qara, xalları isə ağ olan qalstuk taxmış, dolğun üzünü tərtəmiz qırxmışdı. Saçlarını odekolonla isladıb daradığı üçün, dalğa-dalğa parıldayırdı.

Tahir qeyri-ixtiyari dayanıb, diqqətlə onları süzməyə başlayanda, Lalə, üzünə zillənmiş baxışları hiss edib başını yuxarı qaldırdı. Qüdrət də eyni sürətlə gözlərini qaldıranda Tahiri gördü və dodaqaltı Laləyə nə isə dedi. Onun dediklərinin özünə aid olduğunu hiss edən Tahir, utandığından tez başqa səmtə çevrildi: "Yanındakı arvadıdır" deyə düşündü. Lalənin açıq alnı o dəqiqə Tahirin təsəvvüründə nəqş olundu: "Xoşbəxtlər!" deyə fikirləşəndə, yenə Lətifə yadına düşdü, və o, salonun cərgələrinə göz gəzdirməyə başladı.

Lətifə gözünə dəymirdi. İstirahət günündə buraya bilet tapan bəxtəvərlərin çox yarısı qadınlar və qızlardı. Onların içərisində Lətifənin olmaması Tahirə son dərəcə qeyri-təbii görünürdü. O, buna inanmır, inanmaq istəmirdi. Yəqin haradasa oturub onu gördüyünü və incik halda üzünü başqa tərəfə tutduğunu düşünürdü.

Bu anda işıqlar söndü. Tahir yüyürüb yeddinci cərgənin qurtaracağında yerini tutdu və yalnız indi anladı ki, Lətifəni bu adamlar arasında

axtarıb tapmaq üçün çox-çox bundan əvvəl gəlməli imiş. “Buradadır, yəqin buradadır” deyə qət elədiyi zaman həzin və lirik bir musiqi səsi ucaldı. Adətən bu cür müqəddimələri dinləməyən tamaşaçı, hələ də hay-küyə ara vermirdi.

Tahirin gözləri qarşısında rəssam əlilə canlandırılmış müəzzəm Volqa lövhəsi açılanda salon elə bil ölü bir sükut içində donub qaldı.

Ostrovskinin mənsur şer qədər cazibəli ifadələrini Tahir yalnız indi eşidirdi. Tanımadığı həyat və insanlar onun qəlbinə birdən-birə yaxınlaşdı, səhnədəkilərin dekor və aktyor olduğunu unutdu. Əgər yanında bir oğlan “bu gün filankəs oynayır” deməsəydi bu ilk intihabı bəlkə də tamaşanın sonuna kimi pozulmayacaqdı.

Kədər mücəssəməsi kimi sakit və əzəmətli addımlarla gələn Katerina, Tahirə yenə səhnədəki mənzərənin şərtiliyini unutdurdu. Gənc və gözəl rus qadını heç bir söz demədiyi halda, bütün görkəmi ilə, səhnədə danışan adamların hamısından çox məna ifadə edirdi. Lakin Tahir onun sözlərini eşitməyə tələsirdi.

Nəhayət Katerina dilləndi:

– Ana can, mənimçin doğma anamla sən birsən. Tixon da səni sevir”.

Tahir: “Ana, qayınanadır. Bax, mən belə gəlinləri sevirəm. Ana nə qədər kür olsa, gəlin yenə də onun könlünə toxunmamalıdır” deyə düşünərək, öz anasını xatırladı və Kabanikanın acı sözlərini eşidəndə tez fikrini dəyişdi: “Yox, mənim anam belə deyil, o belə zalım deyil”. Katerinanın mehriban qəlbinə toxunan qaba ittihamlar yağmağa başlayanda, Tahir tamam əsəbiləşib daha Kabanikanı dinləmək istəmədi və bir anlığa gözlərini oradan çəkərək səhnəyə yaxın oturmuş tamaşaçıların üzündə gəzdirəndə, birinci yarus lojada bir qızla çiyin-çiyinə əyləşib boynunu irəliyə doğru uzatmış və kirpiklərini bir dəfə də qırpmadan səhnəyə baxan Lətifəni gördü. Bu anda Tahirin fikri alt-üst oldu. Onunla qabaq-qabağa gələndə necə salam verəcəyini, ilk dəfə ona nə deyəcəyini, ondan nə cavab ala biləcəyini fikirləşib, ürəyi bərk döyünə-döyünə pərdənin qurtarmasını gözlədi. Ancaq pərdə örtüləndə, hazırladığı cavablardan heç birinin yadında qalmadığını görüb pərt oldu.

Foyeyə çıxan adamlara toxuna-toxuna hamıdan əvvəl və cəld addımlarla Lətifənin oturduğu yerə yönəlmək istədi. Elə bil o, Tahirə rast gəlməmək üçün teatrı tərk edib hara isə gedəcəkdi. Qadınlar və qızlar bir-birinin ardına düzülərək, foyedə dövrə vurmağa başladıqları zaman, Tahir onların böyründən sivişib ikinci mərtəbəyə qalxdı. Lə-

fənin yenə həmin qızla qol-qola tutuşaraq, bəriyə tərəf gəldiyini görəndə, addımlarını yavaşıtdı və əllərini yanına qısaraq, dodaqları bir-birindən azca aralanmış halda onunla qarşılaşdı. Həyəcandan titrəyən və tutulmuş kimi boğuq çıxan bir səslə dedi:

– Xoş gördük, Lətifə!

Onun səsini eşidən Lətifə, gözlərini qaldıranda Tahiri görüb bir an, yalnız bircə an duruxdu. Onunla məhz burada, özü də rəfiqəsinin yanında rastlaşdığından narazı qalmış kimi tərəddüd göstərdi. Ancaq birdən Tahirin tanımadığı bir qızın yanında onu pərt etməmək üçünmü, ya nədənsə cavab verdi:

– Sağ ol!

Ancaq bu iki kəlməni necə ürəksiz və rəsmi dedisə, Tahir özü ilə Lətifə arasında baş vermiş inciklikdən burada gəzişən başqa adamların da xəbər tutacaqlarından qorxdu və az qala geriyə dönüb onlardan uzaqlaşmaq istəyirdi ki, Lətifə özünə o qədər də xas olmayan və Tahiri təəccübləndirən bir lütfkarlıqla soruşdu:

– Nə var, nə yox Tahir?

Lətifənin yanındakı qız maraqla Tahiri süzəndə Tahirə elə gəldi ki, Lətifə ona dair rəfiqəsinə nəsə demiş, ancaq onu pisləməmiş, əksinə, tərifləmişdir. Tahir bunuhəmin qızın gözlərində çox çətinliklə sezdiyi incə bir təbəssümdən, özü də məhz Tahiri görəndə və onun adını Lətifədən eşidəndə doğmuş bir təbəssümdən oxudu.

Tahir Lətifənin nəvazişkar cavabından ürəklənərək, elə bil açıqdan-açığa ona təşəkkür etmək istədi, lakin bu anda böyründən ötüb gedən adamların gəzməsinə mane olduğunu duyub, bir qədər kənara çəkildi, təpimiş dodaqları arasında dilini dolandıraraq udqundu. Onun bu sadə hərəkətini sezən hər iki qız gülümsədi və Tahir bunun səbəbini bilib burnunun ucuna kimi qızardı.

Lətifə sanki onu ağır vəziyyətdən çıxarmaq üçün rəfiqəsinə tərəf döndü:

– Zifər. Tanış ol! – dedi.

Tahir əlini irəli uzatdı və qızın nazik barmaqlarını ağrıdacağından qorxurmuş kimi, əlini yavaşdan onun əlinə toxundurub, yeni öyrəndiyi şəhər qaydası ilə öz adını söylədi və yalnız indi duydu ki, Lətifə ondan tamam üz döndərməmiş, bəlkə nədənsə inciyib müvəqqəti küsü saxlamışdır. Bunu yəqin etdikdən sonra, Tahir onun nə üçün incidiyini soruşmaq istəyirdi ki, Lətifə:

– Bəri gəlin, gəzənlərə mane oluruq, – deyə başının hərəkətilə Tahiri də gəzməyə dəvət edib, rəfiqəsinin qolundan tutaraq irəliyə sarı addımladı. Tahir onlarla yanaşı gəzinməyə başladısa da, ancaq danışmağa söz tapmayıb yenə tutuldu.

– Hə, indi danış görüm, hara qaçırdın? – deyə Lətifə üz-gözünü ciddiləşdirib soruşdu. – Yaxşı ki, vağzaldan qaytarıblar, yoxsa usta Ramazan düz kəndədək gedərdi. Sən onu yaxşı tanımırsan.

Tahir istər-istəməz gülümsündü: "Aha, deməli, bundan inciyibmiş. Mən də bütün günahları yazıq Cəmildə görürdüm..." deyə düşündü və barmağını dişlədi, sonra özünü təmizə çıxarmaq üçün dedi:

– Yox, əşi, söz çıxardıblar, kəndə tanışım gedirdi, anama sifariş yollayırdım.

– Bəs qoltuğundakı saz? Çiynindəki heybə?

Lətifənin çox ciddi bir tövrlə verdiyi bu sual, Zifəri güldürdü və bayaq onun gözlərində Tahirin sezdiyi xəfif təbəssümün də səbəbi aydın oldu.

Çiynində heybə, qoltuğunda saz, vaqona doğru yüyürən Tahiri xəyalına gətirərkən, Lətifə da özünü saxlaya bilməyib uğundu.

Tahir yaylığını çıxarıb alnında tumurcuqlanan tər damcılarını sildi:

– Neyləyim, inanmırsınız. Ancaq bilmirəm bu tezliklə bu xəbəri sizə kim yetirib?

Bu dəmdə Tahir istər-istəməz Cəmili xatırladı: "Ondan başqa kim deyəcək?"

– Bu xəbəri sənə kim çatdırıb? Cəmildən eşitmisən? – deyə Tahir qaşqabağını sallamış halda Lətifədən soruşdu:

Lətifə gülüşünə ara verdi:

– Olanı deyiblər, özündən heç kəs bir şey uydurmayıb. Anana sifariş yollayanda saz çalıb oxumayacaqdın ki?

– Axı bu xəbərçinin adını bilmək olmaz?

Tahirin belə inadla sualını təkrar etməyi və necə olur-olsun ondan söz qoparmağa çalışmağı Lətifəyə xoş gəlmədi: "Nə fərqi var ki?" – ancaq o, bu xəbəri Cəmildən deyil, komsomol təşkilatçısı Dadaşlıdan eşitmişdi. O, hər gün rast gəldiyi Lətifə vasitəsilə Tahiri yanına çağırtdırmaq və bu qəbahətinin mənasını ona başa salmaq istəmişdi.

Tahir Lətifənin baxışlarından duydu ki, o, adamın adını deməyəcəkdir. Ona görə də bir daha israr etməyib susdu:

– Amma Cəmilin bu məsələyə dəxli yoxdur ha!.. – deyə Lətifə onun ürəyini gəmirən şübhəni dağıtdı, – Bir də, o hara, mən hara?

"Aha, deməli, ona könlü yoxdur" – deyə Tahir sevinclə xəyalından keçirdi və diqqətlə Lətifənin üzünə baxaraq, fikrində yanılıb-yanılmadığını onun gözlərindən oxumaq istədi, lakin onun üzündə də, gözlərində də bir zaman Tahirin şübhəsini artıran o incə və istehzalı təbəssümü görərkən, "bəlkə sirrini möhkəm saxlayır?" deyə düşünüb, yenə dinmədi.

Onlar foyenin sonuna çatıb geri dönərkən, Tahir ixtiyarsız olaraq Lətifənin qoluna toxundu. Bu hərəkətini qabalıq və nəzarətsizlik sayıb, o dəqiqə üzr istədi:

– Bağışla, bağışla, – dedi və azacıq ona sarı əyilib əlavə etdi: – olan olub, keçən keçib. Gərək məni utandırmayaydın.

– Yaxşı ki, utanırsan. Elə bu özü böyük şeydir. Zivər, Tahirin oxumağını eşitmisən, yaxşı səsi var, – deyə Lətifə qəsdənmi, yaxud birdən yadına düşdüyü üçünmü, söhbətin mövzusunu dəyişməli oldu – Bizlərə tərəf yolun düşəndə çalıb-oxuyar, qulaq asarsan.

– Aha! – deyə Zivər başını tərpətdi.

– İstirahət günü nə vaxtdır?

– Birisi gün.

– Elə onda gəl, yaxşımı?

– Aha, – deyə Lətifənin rəfiqəsi yenə başını tərpətdi və dolğun bir cüt muncuq kimi işıldayan xırdaca gözlərini Tahirə dikib bir xeyli baxdı.

Onun maraq dolu nəzərlərindəki sadə və səmimi ifadəni dərhal sezən Tahirin ürəyini qəribə bir şübhə çulğaladı. Ona elə gəldi ki, qızları, xüsusən Lətifəni maraqlandıran Tahirin özü deyil, bəlkə saz çalmağı və oxumağıdır. Əlbəttə, bunun məhz belə olduğunu etiraf etmək Tahirə ağır gəldi: "bunlar istəyir, mən bunlara kef verim" deyə düşünərkən bir az əvvəl duyduğu sevinc əvəzində könlünə həzin bir məyusluq hissi qondu və onun mis rənginə çalan üzü kölgələndi.

Lətifə, Tahirin sifətində əmələ gələn dəyişikliyə fikir vermədiyi üçün, yenə çalıb-oxumaqdan söz saldı:

– Zivərgil də bizim posyolkada olur. Onun da oxumağa həvəsi var. Özü yaxşı piano çalır, – Tahirə üz tutaraq: – Sən də bir-iki qoşma deyərsən, yox? – dedi.

Lətifənin gözləri Tahirin məyus və tutqun baxışlarına dikilib qaldı və onun bir az əvvəlki kimi sevinmədiyini hiss edəndə, təbəssümü dodaqlarında dondu. O sualını təkrar etdi:

– Yox?

Tahir dinmədi, yalnız başını qaldırıb-saldı onun üzündə bil "əgər sən istəsən, əlbəttə!" sözləri yazılmışdı. Bu anda tənəffüsün qurtardığını bildirən zəng səsi titrəyə-titrəyə cingildədi və foyenin işıqları sönüb yandı. Qızların lojaya yönəldiklərini görən Tahir, yenə pis vəziyyətdə qalmamaq üçün tez:

– Hələlik! – deyib onlardan aralandı və geriyə baxmadan, az qala yüyürə-yüyürə birinci mərtəbəyə endi. Yavaşca addımlarla içəri girən adamları yara-yara və onların təəccüblü baxışlarını özünə cəlb edə-edə gəlib yerini tutdu, o dəqiqə də Lətifə ilə rəfiqəsinin oturduğu lojaya gözünü zillədi. Onun qəlbi indi ümid və sevinclə döyünürdü. "Barışdıq. Əşi, o məni istəyir!" deyə düşünürdü.

Lətifə ilə Zivər bəriyə, parterə baxırdılar. Tahir yerində qurcalanaraq, başını yuxarı qaldırdı və özünü ona göstərmək istədi. Amma Lətifə Tahiri görmür, gözünü parterin cərgələrində dolandırırdı.

Salonun işıqları söndü və bu zaman Tahir qabaq pərdədə gördüklərini yadına salmağa başladı. Ancaq səhnədəki adamlar da, onların danışığı da əvvəlki qədər Tahirə xoş gəlmədi. O, təziyə saxlayan qadınlar kimi, başdan-başa qara paltar geyinmiş arvada baxaraq, öz-özündən soruşdu: "Bu kimdir belə?"

Onun danışığına diqqətlə qulaq asdısa da, dediklərindən heç nə başa düşmədi. Bu pərdədə ona hər şeyi hətta Lətifəni də unutduran məşhur açar səhnəsi oldu. Pərdə yavaş-yavaş enib qapı ağzında dayanmış Katerinanın üzünü örtəndə Tahir yerində mıxlanıb qalmışdı. Sənətin bu ecazkar qüdrətini o ilk dəfə hiss edirdi. O, dərin düşüncələrə necə dalmışdısa, ətrafındakı adamların səslərini və nəfəslərini belə duymurdu. Katerinanı oynayan aktrisanın məharəti, onun hər sözündə ifadə olunan qüvvətli ehtiras, yalnız Tahiri deyil, bütün başqa tamaşaçıları da heyran etmişdi. Ancaq Tahir, gördüyü səhnədən heç bir nəticə çıxara bilmir, yalnız Katerinanın cəsarətinə təəccüb edirdi: "Nə igid arvaddır!" deyə düşünürdü. "Bəlkə birdən əri xəbər tutdu?.. Yox, mən ki bunubelə görürəm, yəqin onda da qorxmaz".

Tahir bu fikirdə ikən, qoluna bir əl toxundu. Başını qaldırıb baxdı. Səməndər idi:

– Hə, dost, demə ki, görmədim, – dedi.

– Nəyi?

– Lətifə ilə gəzdiyini...

Tahir, yoldaşının səmimiyyətlə dediyi bu sözlərə yalnız səssizcə gülməklə cavab verdi:

– Gedək, gəzək!.. – Səməndər Tahirin qolundan tutdu. – Elə mən də onun yanındakı qızı gözaltı eləmişəm, – deyə Tahirin qulağına pıçıldadı. – Hər şey qızdan asılıdır. Fikir verdinmi, Katerina açarı necə götürüb qoynunda gizlətdi? Elə bil o bu açarla, düşdüyü qaranlıq zindanın qapısını açıb, işıqlı dünyaya çıxmaq istəyirdi!

– Məhəbbət elədir də... Mən ha deyim filankəs məndən ötrü dəli-divanədir, nə olsun?

– Əlbəttə, gərək onun da sənə könlü ola...

Onlar foyeyə çıxanda Tahir uzaqdan Lətifəni görüb Səməndərə cavab verməyi belə unutdu.

Bu sadə gənclərin söhbətini dinləyən bir nəfər kişi öz arvadına deyirdi:

– Bu uşaqlara bax, bayaqdan fikir verirəm, elə ağıllı söhbət eləyirlər ki...

Səməndər bu sözlərin özlərinə dair deyildiyini hiss edib bir daha dinmədi. Tahirə üz tutub işarə ilə onu kənara çəkdi:

– Bizə qulaq asırlar... – dedi və fikirli-fikirli əlavə etdi: – Aşna, məhəbbətlə zarafat olmaz!

Onlar teatr salonundan çıxıb fəhlə qəsəbəsinə gedəndə, Tahir artıq Lətifəni hər gün uşaq kimi xırda suallarla məşğul etməməyi, hər dəfə onunla qabaq-qabağa gəlməyə can atmamağı daha düzgün hesab edir və bundan sonra hər addımını ölçüb-biçəcəyinə söz verirdi.

...Cəmil isə heç yana getməyib, evdə tək qalmışdı. O, Tahirlə mübahisə eləyəndən sonra çox pərt idi. Bir başqasından yox, məhz xətrini istədiyi yaxın dostundan eşitdiyi əsassız, amma ağır ittihamlar onun könlünə bərk toxunmuşdu. Nə üçünsə Tahirdə şübhə doğuran, ancaq əsil həqiqətdə yoldaşlıq səadətini hər şeydən yüksək tutan və ani əhvali-ruhiyənin təsirinə düşüb hissə qapılmayan Cəmil, adətən çox şeyi ürəyinə salardı. O, Tahirə cavab vermişdisə də, yenə rahat olub, bir yerdə qərar tuta bilmir, tez-tez əlinə kitab alıb oxumaq istəyirdisə də, fikrini toplaya bilməyib yenə ayağa qalxır, bəzən eşiyə çıxır, ümumi yaşayış evinin dal tərəfindəki xali küçədə gəzinir, sonra yenə evə qayıdıb, dalı üstündə çarpayısına uzanır, gözlərini otağın tavanına zilləyir, düşünür, daşınır, axırda özünün heç bir günahı olmadığını görür, daha da qanı qaralırdı. Ona ən çox yer eləyən bu idi ki, Tahir, onun bir il qabaq gəldiyini bilə-bilə, Lətifəni sevməyə ondan da artıq haqlı oldu-

ğunu başa düşə-düşə, onu bu haqdan məhrum eləmək istəyir, buna hətta vəfasızlıq adı verir, hələ bir onun üstünə hücum çəkib komsomolçuluğunu da şübhə altına alırdı. “Bəlkə günah özümdədir? Bəlkə mən sirrimi Tahirdən nahaq gizlətmişəm? Bəlkə mən bunuəvvəldən ona desəydim, indi aralıqda heç belə söz də olmazdı?” deyə düşünən Cəmil, yenə kitabı kənara atıb ayağa qalxdı, bayaq getdiyi yolla xali küçəyə döndü, səkiyə qalın kölgə salmış yasəmən ağaclarının yanı ilə yavaş-yavaş addımlayaraq, təkdənbir gəlib-gedən adamlardan belə üzünü gizlətməyə çalışaraq, iki-üç dəfə var-gəl elədi. O, Lətifəni sevirdi, özü də çoxdan Bakıya gəldiyi gündən sevirdi. Bəs nə üçün bunutəkcə dostlarından deyil, Lətifənin özündən də gizlədirdi? Cəmil, ağır təbiətli bir oğlan idi, qıza ürəyini açanda ondan yalnız müsbət cavab alacağına əmin olmaq istəyirdi. Doğrudur, Cəmil Lətifənin ona könlü olduğuna inanırdı, ancaq rədd cavab almaq qorxusu onun cəsarətini azaltmışdı. Bir də Cəmil, Tahir kimi, hər dəqiqə Lətifənin xəyalı ilə yaşamır, yaşaya bilmirdi. Çünki buruqda olarkən, bütün fikri-zikri işdə idi. O, birillik təcrübəsindən başa düşmüşdü ki, istehsalatda iş vaxtı kənar fikirlərlə məşğul olmaq yaramaz. Bundan təkcə onun özünə deyil, bütün yoldaşlarına, usta Ramazana, ümumən neft istehsalına ziyan dəydiyini bilirdi. O, buruğun böyük mexanizmində özünün xırdaca bir vint olduğunu anlasa da, bu vintin sərrast işləməyindən də çox şey asılı olduğunu dərk etmişdi. O bilirdi ki, buruğun qurtarmağı hamıya səadət gətirir: fəhlə yoldaşları mükafat alır, briqadanın adı yaxşılığa çıxır, trest tədricən də olsa, kəsrini ödəyir, dama-dama göl olan kimi, bəlkə buruqlardan alınan neft də bir yerə toplanıb Bakının, respublikanın üzünü ağardır. Cəmilə elə gəlirdi ki, o diqqətsiz işləsə, yalnız özünün xəyalları ilə yaşasa, yalnız öz xeyrini düşünsə, başqalarına, birinci növbədə onun namusla çalışan, buruğu öz həyatının ayrılmaz bir hissəsi sayan fəhlə yoldaşlarına ziyan dəyər və bunun nəticəsində o heç kimin üzünə dik baxa bilməz. Bu şüur onda vərdiş və etiqad halına gəlmişdi. İndi artıq Cəmil öz daxili qüsurları ilə mübarizə ehtiyacı duymurdu. Onun fikrincə Tahir hələ bunları başa düşmürdü, amma istehsalata isnişdikcə, tədricən başa düşəcəkdi. Axı, Cəmilin özündə də bu vərdiş birdən-birə əmələ gəlməmişdi, o da vaxtilə hər şeyi tez və asan bir yolla başa vurmaq, sonra kinoya, teatra getmək, Lətifəni tez-tez görmək istəyirdi. “Mən bu barədə niyə Tahirə heç nə deməmişəm? Niyə onu başa salmamışam?” Bu sual Cəmili xeyli düşündürdü, sakit və ılıq gecədə xoş bir ətir qoxusu saçan ağacın dibində dayanarkən, o, dərin-

dən nəfəs aldı və yenə fikrə cumdu. Birdən o anladı ki, daha gecdir, bundan sonra Tahirə deyəcəyi xeyirxah sözlərin müsbət təsiri olmayacaq, əksinə, Tahir bu sözləri bir intiqam kimi qəbul edəcək və aralarındakı inciklik daha da artacaq, qüvvətlənəcəkdir.

O yenə otağa qayıtdı. Dəhlizdəki divar saatında on iki olmuşdu. Deməli, bir azdan sonra Lətifə teatrdan qayıdacaqdı.

Cəmil yenə qərar tutub dayana bilmədi. "Gedib Lətifəni görəcəyəm... Ürəyimi açıb deyəcəyəm... Bir ildir, düz bir ildir mən onu sevirəm" – Cəmil bu qədər səbir edə bilmədiyinə özü də təəccüb elədi: "Deyəcəyəm!" – deyə ucadan səsləndi. Lakin o, qapının ağzında divar saatının çıqqıltısını eşidə-eşidə duruxdu: "Axı mən ona necə deyim ki, səni sevirəm? Birdən o mənə ağır cavab versə?.."

...Cəmil onun yolunu çox gözlədi. Əslinə baxsan səbirsizliklə gözlədiyi üçün də hər dəqiqə ona bir saat qədər uzun göründü.

O ağaca söykənib dayanmışdı. Qəsəbənin üstündəki açıq səmada üzən ayın işığı ağacın sıx yarpaqlarına toxunub parça-parça olmuş, yerə tökülmüşdü. Ətraf o qədər sakit idi ki, uzaqlardan gələn tramvayın güyültülü səsi aydın eşidilirdi.

Qızlar tramvaydan düşüb, təpənin döşünə qalxan daş pillələrə sarı gələndə, Cəmil Lətifəni lap uzaqdan tanıdı. O, Zivərlə yanaşı yeriyirdi. "Ayrılmasalar, mən ona heç nə deyə bilmərəm". Cəmil də yavaş-yavaş, uzaqdan-uzağa onları izləməyə başladı. Qızların söhbətini bütün varlığı ilə dinləyən Cəmilin qulağına bu sözlər gəlib çatırdı:

– Gedək bizə... Evinizə telefon eləyib deyərsən.

– Yox, Lətifə onsuz da nigaran qalıblar. Anamı tanımırsan?

Lətifə onun qoluna girdi və pillələrin sonuna çatanda sağa tərəf çəkdi.

– Gedək!.. – dedi və bir daha onu buraxmadı.

Onlar bir-birindən ayrılmadılar. Cəmil kor-peşman geri qayıtdı. yenə xali küçədə bir xeyli gəzindi. Sonra ümumi yaşayış evinə gəldi. Yoldaşlarının hamısı qayıtmışdı. Otaqdakı lampanı söndürüb yatmışdılar. Küçədə yanan fanar Səməndərin də, Tahirin də üzünü işıqlandırırdı. Onlar sakit-sakit nəfəs alaraq dərin yuxuya getmişdilər.

Cəmil ən çox Tahirin üzünə baxırdı. Tahir gülümsəyirdi. Cəmilə elə gəldi ki, onun bütün sifətində xoşbəxt bir ifadə var.

"Bəlkə də mən gecikmişəm?" deyə Cəmil həyəcanla düşündü və dırnaqlarının ucunda, nəfəsini çəkmədən çarpayısına yanaşdı...

## 4

Lalə ilə Qüdrət isə gecə saat ikiyə qədər mübahisə edib, tamaşa haqqında uzun-uzadı mülahizə yürütdülər. Lalə, Katerinanın intiharını min bir dəlillə təkdir edir, bunuiradə zəifliyi adlandırır, amma Qüdrət əksinə, bu ölümün yeganə çıxış yolu olduğunu iddia edirdi.

– Diqqət yetirsəydin, görərdin ki, Katerina öləndən sonra dirilər ona qibtə edirlər. Çünki o qaranlıq mühitdən, intihar ilə də olsa çıxış yolu tapmaq hünər istəyirdi.

Lalə isə deyirdi ki:

– Əgər o, dini adətlərə və ailə zülmünə qarşı çıxmış olsaydı, ölümə də qalib gələ bilərdi.

Qüdrət öz kitabları arasından "Tufan" əsərini tapıb, misallarla fikrinin doğruluğunu sübut etmək istərkən, yemək otağından telefon zənginin səsini eşidib ora yönəldi. Laləni xəbər aldılar. Mədəndə qazılıb qurtarmaqda olan bir buruqda bədbəxt hadisə üz vermişdi. Təcili tədbir lazımdı.

Lalə telefonun dəstəyini yerinə qoymadan, trestə zəng edib maşın istədi və tez-tələsik geyinib siqnal gözləməyə başladı.

Ərlə arvad arasındakı mübahisə də kəsildi. Onların istirahət günləri çox vaxt belə keçirdi. Ancaq heç biri bundan şikayətlənmirdi. Çünki lazım olan günlərdə, vəziyyət tələb edəndə evə gəlməyib mədənlərdə gecələməyə öyrənmişdilər.

Lalə tez-tez balkona çıxır, küçəyə baxırdı. Hər tərəf səssiz-səmirsizdi. Uzanıb gedən yoxuşlu küçənin sarımtıl işıqları, yavaşca-yavaşca göz qırpırdılar. Şəhərin gündüzlər və gecələr narahat döyünən qəlbi, indi elə bil hərəkətdən qalmışdı. Lakin Lalə həyəcanlı idi. Onun qəlbi şiddətlə döyünürdü. Trestdə hamının böyük ümid bəslədiyi yeni buruq onun hesabilə iki gündən sonra istismara verilməli idi. Əgər orada ciddi bir hadisə üz vermişdisə, bütün ümidlər alt-üst olacaqdı.

Lalənin tez-tez girib çıxmağından nə isə ciddi bir qəza baş verdiyini hiss edən Qüdrət:

– Hansı buruqdadır? – deyə soruşdu.

– Dördüncüdə...

Bu söz Qüdrəti də arvadı qədər həyəcanlandırmağa kifayət edərdi. Bütün ümidlərini övladlarından yalnız birinə bağlayan ata kimi, hər bir trest müdiri də adətən bir və ya iki quyunu o birilərindən daha çox sevir, ümumi istehsal azalanda yeni fantan hesabına kəsiri tez doldura-

cağına ümid bəsləyir. Lalə də dördüncü buruğu yaman günün ehtiyatı sayırdı:

Qüdrət otaqda var-gəl edərək yenə soruşdu:

– Bəs demədilərmi nə olub?

– Yox, demədilər. Mənə elə gəlir ki, avariya olmuşdur. Danışan Minayevdi. Əgər fəlakət olmasaydı, mənə heç vaxt zəng etməzdi...

Lalə yenə balkona çıxmaq və maşının gəlib-gəlmədiyini bilmək istəyirdi ki, bu anda küçədən siqnal səsi eşidib, arxaya baxmadan qapıya yönəldi və tez də eşiyə çıxıb maşına minərək yola düşdü.

O gedəndən sonra Qüdrət daha da narahat oldu. Çox zaman bir-birindən xəbərsiz, mədənlərindəki ağır hadisələrin qarşısını alan Lalə və Qüdrət, yalnız iş qurtarandan sonra bir-birinə əhvalatın təfərrüatını söylərdi. İndi isə onu intizar yorub gücdən salacaqdı. Çünki hər şey naməlum idi, kim bilir nələr olmuşdu və yaxud Lalə buruğa gedib çıxandan sonra nələr olacaqdı. Əgər Qüdrət özü yeni buruqlarda necə müdhiş hadisələr üz verdiyini təsəvvürünə gətirə bilməsəydi, yenə dərd yarı idi. Elə o özü, guruldayan qışqıran, yerin dərinliklərindən daş-kəsəyi göyə fırlayan və qabağına keçən hər şeyi məhv edən qaz fantanını görür, yerin dibində tüğyana gələn qaz və neftin yanar dağ dəhşətilə necə uğuldadığını eşidir və buruğun yanında qorxuya düşən insanların bərəlmiş kimi geniş açılan gözlərini xəyalına gətirdikcə, onun da tükləri ürpərirdi. Hələ yanğın olduğunu yəqin etmiş olsaydı, bu sakit otaqda Qüdrət bir an içində sarsılardı. Ən qaranlıq gecələrdə belə bir neçə kilometrlik məsafəni işıqlandıran, yalnız ümidləri deyil, orada öz səadətinin yandığını güman edib, qorxu bilmədən irəli atılan insanları və milyonlarca dövlət pulunu bir anda məhv edən yanğın, Qüdrətin də şəxsi səadətini əlindən ala bilərdi. Lalə, qadın olsa da lazım gələndə – özünü ölümün ağuşuna ata bilməzdimi?

Qüdrət yaxşı bilirdi ki, belə fəlakətli anlarda insan öz canından deyil, baş vermiş qəzanın ağır nəticələrindən daha çox qorxur. Lalənin məğrur bir qadın olduğunu, cəsarətdə heç bir kişidən geri qalmadığını, lakin bu xüsusda bir kəlmə də danışmağı sevmədiyini yaxşı bilən Qüdrət, onun göstərdiyi qəhrəmanlıqdan başqalarının vasitəsilə xəbər tutduğu üçün, Lalənin ən müdhiş təhlükəyə belə sinə gərdiyini həm iftixarla, həm də dəruni bir sarsıntı ilə xatırlardı. Görünür mədənlərdə baş verən qəzaların şahidi olmaq, bu barədə danışılan hekayələri dinləməkdən asan idi. Çünki hadisə olan vaxt çoxları özünə bu haqda heç bir haqq-hesab verməyə imkan tapmadığı halda, sakit oturub düşünən-

də, istər-istəməz təhlükənin böyüklüyünü duyur, son nəticələrin ağırlığını hiss edirdi. “Birdən Lalə özünü irəli atıb ehtiyatsızlıq üzündən məhv olarsa?”

Bunu fikirləşən Qüdrət, nəfəsi daralmış halda balkona çıxdı. Mədənlərə sarı boylandı. Yox, heç nə görünmürdü. Azacıq təsəlli tapıb balkonda gəzinməyə başladı: “Bizim səadətimiz doğrudan da odlar, alovlar içində yaranır!” deyə düşündü və gündüzkü iclasda danışan Fikrəti xatırladı: “Yox, – deyə fikrən ona etiraz etdi, – hər bir iş sakit gedəndə, insan keyləşir. Belə yaxşıdır. Əlbəttə belə yaxşıdır!”

Bəs Lalə? Əgər ona bir şey olsa? – Qüdrət bu sualları tamam unutmaq istədi. Bir-iki saatdan sonra gülə-gülə qapıdan içəri girib: “qurtardı, hər şey öz yerindədir” deyəcək. Lalə onun könlündə daha böyük yer tutmuşdu. İndi Qüdrət mədənlər arasından şığıyıb, gedən maşını görür, Lalənin yeni buruğa çatdığını, onun gəlişindən ruhlanan adamların üzündəki sevinc və ümid ifadələrini təsəvvürünə gətirirdi. Qüdrət özü də həyəcanlandığının fərqinə varmadan və nə etdiyini bilmədən yataq otağına keçib Şirmayıya yanaşdı. Gecələr yorğun olanda yerinə uzanıb kitab oxuyarkən, çarpayısının başı üzərində yandırdığı qara başlıqlı lampanın yalnız kiçik bir dairəyə düşən işığından qızını aydın görə bilməzdi. Şirmayıya baxıb gülümsədi. O, əlinin birini böyrünə, birini də başının altına qoyub mışıltı ilə yatırdı.

Qüdrət ona baxa-baxa Laləni də yadından çıxara bilmirdi.

Onun yola düşdüyü vaxtdan çox keçmişdisə də, Qüdrətə elə gəlirdi ki, Lalə artıq buruqdakı bədbəxt hadisənin qabağını almaq üçün təcili tədbir görmüş, indi hamı ona təşəkkür edir, belə bir çətin anda onun köməyinə gəldiyini görən üstü mazutlu fəhlələr, onun xətrini əvvəlkindən də çox istəməyə başlayırlar. Hər bir şeydən xəbərsiz olan Şirmayı isə bəzən dodaqlarını tərpədir, yuxuda nə isə görüb qayğısız və xəfifcə bir tərzdə gülümsəyirdi. Lakin Qüdrət birdən gözlərini məchul bir nöqtəyə zilləyib, Şirmayının başı üzərində hərəkətsiz qaldı. Əgər belə deyilsə? Məhv olub gedən sərvəti xilas etmək üçün Lalə özünü irəli atıb yaralanmışsa? Şikəst olmuşsa?

Şirmayı gülümsəyirdi, amma Qüdrətin geniş açılmış gözlərinə o deyil, Lalə görünürdü.

Qüdrət yemək otağına keçib işığı yandırdı. Telefona yanaşdı. Lalənin trestinə zəng etdi. Növbətçi qadın, mürgüdən hövlnak ayıldığını göstərən tutqun və kal bir səslə cavab verdi. Qüdrət ondan dör-

düncü buruğun vəziyyətini soruşdu. Hələ heç bir şey məlum deyil. Buruğun telefon xətti xarabdır. Yoxsa zəng edib soruşardı. Lakin yanğın olmamışdır. Deyirlər ki, yaralanan vardır. Növbətçi qadın da bunuhələ qəti deyə bilmir.

Telefonun dəstəyini yerinə qoyanda Qüdrətin ürəyi daş kimi ağırlaşdı. Öz trestinə zəng etdi. Növbətçi cavab vermir. Yox, bu yaramaz. O haradadır? – Deyəsən yatmışdır. Qudok səsləri aydın eşidilir. Növbətçi dəstəyi götürür.

– Danışan kimdir? Hansı Zonin? Alyoşa, yoxsa Volodya? Bura bax, Volodya maşın lazımdır. Mənim şoferimi axtar. Tapılmasa, yük maşınını göndərsinlər.

İsmayılzadənin trestində sakitlikdir. Volodya Qüdrətin nə üçün həyəcanlandığını soruşur. Onlar iki qardaşdır. İsmayılzadənin xətrini çox istəyirlər.

Hər ikisi trestdə çalışır. Qüdrət də onlardan razıdır.

– Lazımdır, Volodya, lazımdır! – deyə Qüdrət darıxmış kimi üz-gözünü turşutdu. – Əgər yük maşını da olmasa, gör nə edə bilərsən. Nə üçün gec cavab verirdin? Balkonda gəzinirdin? Eybi yoxdur, eybi yoxdur.

Qüdrət dəstəyi asdı. Bu anda qapı ağzında Tükəzban qarı göründü. O, səsə oyanıb oğlunun danışığını dinləyirmiş. Gecə yarıdan sonra Qüdrətin maşın istəməsi onu da həyəcanlandırmışdı.

– Nə olub, qadan ürəyimə?

Qüdrət, gəlib böyründə dayanan anasının nəfəsini duydu. Telefonda qəsdən yavaş danışdığına baxmayaraq, onu yenə də yuxudan oyatmışdı.

– Heç, ana... – deyə Qüdrət əlini onun çiyninə qoyub, azacıq özünə tərəf çəkdi, – get yat, ana can, vallah heç bir şey olmamışdır.

Qüdrət anasının yanında həmişə bu cür and içər ancaq heç bir yalan deməzdi. Bəs indi onu nə üçün aldadırdı?

– Bəs maşını neyləyirsən?

Divar saatı üçün yarısını vurdu. Tükəzban oğlunun yataq otağına baxdı:

– Lalə hanı?

İndi Qüdrət ondan heç bir şey gizlədə bilməzdi: ananın gözlərini aldatmaq, onun qəlbini aldatmaq qədər çətin idi. Bu anda telefonun zəngi yenə cingildədi. Qüdrət dəstəyi götürdü. Öz trestindən maşın göndərildiyini xəbər verirdilər.

– Kimdir, oğul? – deyə Tükəzban, qanı qaçmış dodaqlarını elə bil güclə tərpədərək, səbirsizliklə xəbər aldı.

Qüdrət düzünü dedi:

– Lalənin mədənində nə isə olmuşdur. Gərək mən də ora gedəm. Ancaq sən darıxma, ana. Bu saat qayıdarıq...

**5**

Dördüncü buruq şəhərin ucqar tərəfindəki böyük binalar altında qazılırdı. Bu evlər tikilən zaman geoloqlar burada neft olduğunu bilmirdilər. İndi isə, elmin qüdrətilə burada zəngin neft yataqları tapılmışdı. Evləri uçurub, onların yerində buruqlar qoymağı təklif edənlər də vardı. "Bizə neft lazımdır. Binaları başqa yerdə də tikmək olar" deyirdilər. Onlar neft haqqındakı amerikan aforizmini təkrar etməyi sevirdilər: "Əsrimiz neft əsridir. Onun istehsalını dayandırmağa çalışmaq, Niaqara şəlaləsinin qabağını saxlamaq kimidir". Doğrudan da neft şəlaləsinin qabağını kəsmək mümkün deyildi. Bir də, neft, ölkənin qəlbinə axan təzə qan demək idi. Onun qabağını kəsmək olmazdı.

Neftçilər vuruşurdular. Yerin əl çatmaz qatlarına gecə-gündüz yol axtarırdılar. Gözəl evləri uçurmaq fikri az qala o birilərə qalib gəlirdi. "Uçurulsun!" deyənlərin səsi daha da ucalırdı. "İnsan əməyini və milyonları çölə atmaq olmaz!" deyənlər isə, neft şəlaləsinin qabağından geri qaçmağa hazırlaşırdılar.

Bu zaman üçüncü "cəbhə" açıldı:

– Binalar uçurulmasın amma buruqlar qoyulsun! – dedilər və bu zaman dördüncü buruq tikildi. Qocaman usta şəhərin yarım kilometrliyindən maili qazıma üsulu ilə binaların altına doğru istiqamət aldı. Gözəl binalara toxunmadılar.

Dördüncü buruqdan çıxan süxurları tədqiq edərkən, geoloqlar haqq verdilər. Binaların altında doğrudan da zəngin neft təbəqələri vardı. Maili quyuların sayı yağışdan sonra qalxan göbələk kimi artmağa başladı.

Lakin bütün mübahisələri yalnız dördüncü buruq həll edəcəkdi. Balta iki min metrlik bir məsafə qət etmişdi. Layihədə göstərilən nöqtəyə yüz iyirmi metr qalırdı. Sabahda – biri gündə "hə, yox" cavabı alınacaqdı. Laləni həyəcanlandıran da bu idi. Orada baş verən ən kiçik hadisələrdən də Lalə dərhal xəbər tutmağa çalışırdı. Həssas və diqqətli bir həkim xəstədən ayrılmayıb, hər an onun nəbzini yoxladığı kimi, o da dördüncü buruğun nəbzini bir an əlindən buraxmaq istəmirdi.

O, buruğa yetişəndə olan-olub, keçən-keçmişdi. Cəmillə bərabər Tahirin ilk dəfə dəniz seyrinə çıxanda rast gəldikləri Mehman adlı cavan fəhlə buruqda yanğın törədiyini görüb, brezent plaşına bürünərək, qorxu bilmədən özünü irəli atmış, bədənilə quyunun ağzını örtmüş və yanğını söndürmüşdü. Ancaq qaz fantanı çox güclü olduğundan, onu vurub kənara tullamış, oğlan vışkanın dəmirinə çırpılaraq, ölümcül yaralanmışdı. Mehman bütün ağrılarını unudaraq, yenə özünü doğrultmuş, "çəkil geriyə" deyən buruq ustasının sözünə baxmadan irəli şığıyıb yenə quyunun ağzını örtmək istəyəndə, müvazinətini saxlaya bilməyib, böyrü üstə yıxılmışdı.

Lalə, kənarda uzadılmış bu oğlana yanaşanda, o son dəqiqələrini yaşayırdı.

– Tez xəstəxanaya! – deyə Lalə əmr edəndə, oğlan təpimiş dodaqlarını güclə açaraq və elə bil son qüvvəsini toplayaraq, iniltili bir səslə dedi:

– Lazım deyil. Lalə bacı... Nahaq zəhmət çəkirsiniz.

– Xəstəxanaya! – deyə Lalə heç bir etiraza yol vermək istəməyərək amiranə bir tövr aldı.

Oğlanın gicgahında qan laxtalanmışdı. Qana bulaşmış uzun saçları alnına yapışmışdı. Ağır-ağır nəfəs alır, təkdənbir yavaşcadan əlini qaldırıb salır, müdhiş ağrıdan üz-gözünü əyirdi. O nə isə demək istəyir, amma deyə bilmirdi. Hövlündən açdığı tüksüz sinəsində iri göy ləkələr əmələ gəlmişdi. Üzünə tökülmüş qanı kim isə silmişdi ancaq alnında yenə qurumuş qan izləri görünürdü.

– Bu saat xəstəxanaya! – deyə Lalə, yanında durub boğazını irəliyə uzadaraq, yaralı oğlana baxan şoferinə qışqırdı, kişi kimi sərt və qaba bir hərəkətlə onun qoluna toxundu.

Şofer, qaşqabağını sallayıb oğlanın dövrəsini çulğamış fəhlələrlə bərabər onu yerdən götürmək üçün əllərini irəli uzatdıqda, oğlandan tükürpədən bir inilti qopdu:

– İstəmirəm! Mənə əziyyət verməyin. Onsuz da ölürəm! – deyə əlilə onları geri itələdisə də, gücdən düşüb, bir daha müqavimət göstərə bilmədi.

Fəhlələr onu yerdən hop götürdülər və buruqdan iyirmi beş-otuz addım kənarda duran maşına tərəf apardılar. Lalə də ixtiyarsız olaraq oğlanın dalınca bir neçə addım atdı. İndi oğlanın səsi eşidilmirdi, Laləyə elə gəlirdi ki, o, şüurunu itirib, dinə bilmir.

Lalə dayandı. Bir neçə an onların dalınca baxdı. Fəhlələr hələ maşına yetişməmiş birdən ayaq saxladılar. Lalənin ürəyinə uğursuz bir şübhə damdı. O yerindən qopub, özünü fəhlələrə yetirdi:

– Nə olmuşdur? – deyə xəbər alıb udqundu. – Nə üçün dayandınız?

Heç kim cavab vermədi. Adamlar ölüm sükutu içində donub qalmışdılar. Görünür Lalənin sualını belə eşitmirdilər.

– Aparın, niyə aparmırsınız? – deyə Lalə ürəyini əzən şübhəni özündən rədd etmək istədi.

Yalnız indi ona sarı dönən sarı saçlı, üzünü tük basmış buruq ustası, hər zaman çətin qazımaları boynuna götürdüyü üçün "köhnə canavar" adilə tanınmış Volkov, qəddi bükülmüş halda, sərt bir kədərlə cavab verdi:

– Yoldaş İsmayılzadə, o artıq yoxdur, – dedi və cibindən qan ləkələri ilə örtülmüş yaylığını çıxardı. Mehman mənim oğlum Vanyanı əvəz edirdi. Bu da məni qoyub getdi. Deməli, oğlumun birini cəbhədə verdim, birini də burada... – o, ay işığını əks edib üzündə parıldayan iri yaş damlalarını sildi. O ağlamadı. Vanyanın ölüm xəbəri gələrkən də, onun iradəsindən asılı olmayaraq axıb gələn bu göz yaşları onu dostlarının yanında xəcil etmişdi. Yaxşı ki, gecə idi. Yoxsa indi də köhnə dostları onu danlayar, "uşaq deyilsən ki?" deyərdilər.

Lalə lap yaxına gəldiyi zaman, fəhlələr nəfəslərini gizlədib, elə bil Mehmanın son sözlərini eşitmək istəyirdilər. Lalə isə aşağı əyilib dizi üstə çökdü və oğlanın palçığa bulanmış əlini əlinə aldı. Onun nəbzini yoxladı, nəfəsini çəkmədən bir neçə an hərəkətsiz qaldı. Yox, Mehman artıq yox idi.

Lalə oğlanın alnına tökülmüş uzun saçlarını nəvazişkar bir şəfqət bacısı kimi incə və titrək barmaqları ilə geriyə daradı, doluxsunmuş gözlərilə Mehmanın ay işığında daha da solğun görünən üzünə baxdı. Boğazına tıxanan qəhər onu az qala boğurdu:

– Ah, yoldaşlar, siz nə etdiniz? – deyə fəhlələrə tərəf döndü. – Nə üçün onu elə təhlükəli yerə buraxdınız?

Volkov iri gövdəsini azacıq irəliyə sarı əydi, göyrəldiyini gizlədə bilməyib, ağlamsınmış bir səslə dedi:

– Məgər onu tutub saxlamaq olardı? Siz bilmirsiniz o necə uşaqdı. Dünən elektrik xətti korlanmışdı. Montyor tapılmadı. Pişik kimi vışkaya dırmanıb özü xətti düzəltdi. Od parçası idi, od.

Bu sözlər elə bil fəhlələrin ürəyini daha da köyrəltdi. Ah-uf səsləri eşidildi. Kim isə hıçqırdı. Bu anda buruğa yanaşan minik maşının-

dan fit verildi. Lalə bu səsi tanıyırdı. Dönüb baxdı. Qüdrət maşından düşüb onlara doğru gəlirdi.

Bir dəqiqə belə keçməmiş ərlə arvadın gözləri bir-birinə sancılmışdı. Lalənin qəmgin baxışlarını və kətan kimi ağarmış sir-sifətini görəndə, əvvəlcə buruğun ümidsiz bir hala gəldiyini düşünən Qüdrət, ortada uzanmış oğlana baxarkən yerində donub qaldı. O, hətta bu ölümün səbəbini xəbər almağa da özündə qüvvət tapmadı. Yalnız sonradan-sonraya:

– Axı bu necə oldu? – deyə öz-özü ilə söhbət edirmiş kimi, yavaş səslə soruşa bildi.

Lalə də, fəhlələr də onu cavabsız buraxdılar. Onlar Qüdrəti yaxşı tanıyırdılar. Hansı hallarda ölüm hadisəsi olduğunu o başqalarından az bilmirdi. Bu səbəbdən də, hadisənin təfərrüatını öyrənmək üçün yox, öz təəssüfünü bildirmək üçün sual verdiyini güman edirdilər. Lakin Qüdrət Lalənin üzünə kədərlə dolu ağır bir nəzər saldı.

– Nədən olub? – deyə təkrar soruşdu.

Bu dəfə ona Lalə cavab verdi. Qüdrət hər şeyi anladı: ölüm ona yox, o ölümə doğru getmişdi.

Arvadından aralanan Qüdrət, Mehmanın cənazəsinə lap yaxın gəldi. Onun adını haradansa eşitmiş, sir-sifətini haradasa görmüşdü. Qüdrət, bir anlıq ağır sükut içində oğlanın arıq üzünə və dartılmış kimi uzun görünən düz boyuna baxa-baxa, onu məhz haradan tanıdığını xatırlamağa çalışdı. Birdən onun yadına bir neçə gün əvvəl Bakı qəzetlərinin ilk səhifələrində iri portreti çap olunmuş cavan neft qəhrəmanı düşdü.

– O gün qəzetdə təriflənən oğlan deyilmi? – deyə heç kimə müraciət etməyərək, yavaşcadan, elə bil pıçıltı ilə soruşdu:

Qüdrətin böyründə durmuş fəhlə ah çəkib cavab verdi:

– Özüdür ki, var... Bütün trestin fəxri idi, yoldaş İsmayılzadə... Kiçik bir ehtiyatsızlığın...

Qüdrət fəhlənin boğazına nə isə tıxandığını, sözünü deyib qurtarmağa qoymadığını hiss edəndə özü də köyrəldi.

– Belə dayanmaqdan bir şey çıxmaz. Aparmaq lazımdır! – deyə Qüdrət ağır qüssədən dünyada hər şeyi unutmuş fəhlələrə Mehmanın cənazəsini göstərdi.

Onlar, elə bil istəməyə-istəməyə aşağı əyildilər və Mehmanı götürüb maşına doğru apardılar. Volkov isə şagirdinə əl vurmadı. Görünür onun soyuq bədəninə toxunub öldüyünü yəqin etmək istəmirdi.

O, Lalə və Qüdrətlə bərabər fəhlələrin dalınca gedib, maşının yanında dayandı və cibindən yenə yaylığını çıxartdı.

– Mən dura-dura nə üçün bu məhv olur? – deyə gözlərinin yaşını sildi. – Qüdrət Salmanoviç, bu nə üçün belə olur, hə?

Mehmanı maşında rahatlayan adamlardan gözünü çəkməyən Qüdrət, ona sarı dönmədən cavab verdi:

– Çünki, Semyon Vladimiroviç, bu, bizim gənclikdir. Qızıl gənclik! Belə ölümlər qüvvət nişanəsidir!

Maşın uzaqlaşıb gözdən itəndə, sanki qocanın ürəyini qoparıb apardılar.

Lalə isə yalnız indi ağlayırdı. O hıçqırdıqca, çiyinləri qalxıb-düşür, gözünün yaşı əlindəki balaca ipək yaylığı isladırdı. Qüdrət kəsik-kəsik:

– Ağlama! – dedi. – Onun döşündəki göy ləkələrə baxanda bildim ki, o, güllə qabağına da mərdliklə gedərdi.

**6**

Tükəzban qarının da, Şirmayının da üzü gülmürdü. Ailə üzərinə qəm-qüssə kölgəsi enmişdi. Piano həmişəki kimi ucadan səslənmir, evdən bir dəfə də olsun qəhqəhə yüksəlmirdi. Dərsdən qayıdan kimi adəti üzrə hər gün Laləyə zəng edən, ata-anasından plana dair söz soruşan Şirmayı, son vaxtlar telefona yaxın gəlmir, tez-tez köksünü ötürə-ötürə dərsini alayarımçıq hazırlayır, sonra gəlib nənəsinin dizləri üstünə başını qoyur, ondan təzə nağıl söyləməyi belə xahiş etmədən, paltarlı-paltarlı yuxuya gedirdi. Nənəsi, onu oyatmamaq üçün, yavaşcadan paltarını soyundurur, qollarının üstündə götürüb aparır, çarpayısına uzadırdı. Evdə qanad gərən bu kədəri yalnız ailə üzvləri deyil, qonum-qonşular belə hiss etmişdilər. Çünki Lalə səhər işə gedəndə, axşam evə qayıdanda küçə qapısında və pilləkəndə rast gəldiyi yaxın tanışlardan əvvəlki kimi hal-əhval bilmir, yalnız soyuq bir tərzdə salam verib, çox vaxt da başı sinəsinə enmiş halda keçib gedirdi. Onu bu qədər kədərləndirən yalnız dördüncü buruğun gözlənilən vaxtda hazır olmamağı deyildi (əlbəttə, bu da trest müdiri üçün, xüsusən adı daima yaxşılar sırasında çəkilən Lalə üçün az rusvayçılıq sayılmırdı), ən çox, bəlkə də birinci növbədə Mehmanın ölümü idi. Lalə təbiətcə nərmənazik bir qadın olmasa da, o dəhşətli ölümü, ay işığında gördüyü o solğun simanı, Mehmanın döşündəki o göy ləkələri unutmur, unuda bilmirdi.

Qüdrət də onun kədərinin səbəbini yalnız bununla izah edirdi. O, Mehmanın ölümündən sonra Lalənin əhvalında çox ciddi bir dəyişiklik əmələ gəldiyini aydın gördüyü üçün, gec də olsa işdən üzülüşüb gəlir, hər gün evdə gecələyir, müxtəlif yollarla arvadına təsəlli verməyə çalışırdı. O, bəzən Laləni güldürməyə belə müvafiq olurdusa da, onun laübali bir tərzdə baxan gözlərindən heç bir vaxt kədər ifadəsi silinib getmirdi. O, çox az danışır, qayınanasının təkidilə, iştahsız halda xörəyini yeyəndə, çayını içəndə və bəzən də Qüdrətin kitablarından birini götürüb mütaliə etmək istəyəndə, onun baxışları həmişə qeyri-müəyyən bir nöqtəyə dikilib qalırdı. Lalə get-gedə zəifləyir, tez-tez gözləri qaralır, başı hərlənirdi. Bunun səbəbini gəlininin yorğunluğunda görən Tükəzban qarı, Laləni tez yatırmağa çalışır, amma o, hər an gəlib gözlərinin qabağında duran Mehmana baxa-baxa köksünü ötürür, solmuş yanaqlarından sakit-sakit göz yaşı axıdırdı: "Onun ölümü üçün heç kəs mənə ağır bir söz demir. Mən bilirəm ki, qadın olduğuma görə demirlər. Bu daha ağırdır". Lalə Qüdrətin gəlişini gözləyir, yenə bir təsəlli eşitmək və ürəyinin ağrısını azaltmaq istəyir, amma yenə üzüntülü düşüncələrdən sonra narahat bir yuxuya gedirdi.

Qüdrət istirahət gününün səhərisi trestdə yeni təbəqələri işə salan briqadaları gəzdikdən sonra axşamüstü evə qayıdarkən, dəniz buruqlarından birində gözlənilən neft əvəzinə su gəldiyini eşidib, pərt halda ora getmişdi, trestin baş mühəndisilə bərabər su fantanının səbəbini öyrənib, yalnız gecə saat dörddə evinə dönə bilmişdi.

Bu zaman Lalə artıq qarışıq röyalar görə-görə, arabir də sayıqlayaraq yatırdı.

Dəniz buruğundan daha da qanı qara qayıtmış Qüdrət, Laləni yuxudan oyatmadı, çarpayısına uzanmamış qara papaqlı lampanı yandırdı, yeni gəlmiş məcmuələri gətirib balışının böyrünə qoydu. Lakin onun fikri yenə trestdə, su verən buruqda idi. Hələ bu gün səhərki telefon zəngi, "Azərneft" birliyindən deyilən "siz nə vaxta qədər geridə qalacaqsınız?" sözləri, indi də onun qulağında səslənirdi. Doğrudan da, Qüdrət trestə göndəriləndən bəri planın ödənilməsində elə gözə dəyən bir dəyişiklik olmamışdı. O, şəxsən öz ünvanına yağdırılan ittihamları rədd etməyə haqlı deyildi. O, bütün ümidlərini yalnız gələcəyə, hər gün sərf elədiyi əməyin səmərəsinə, gördüyü mühüm tədbirlərin nəticəsinə bağlamışdı. Bu səbəbdən də, bütün tənbihlərin ağırlığına dözməli, "doğrudur, siz haqlısınız, düzələr" deməli idi. Ancaq bunu

deyəndən sonra da Qüdrətin ürəyindəki narahatlıq azalmırdı. Yenidən verdiyi vədlər onun üzərinə düşən ağır məsuliyyəti daha da çoxaltdığı üçün, mədənlərdə baş verən ən kiçik qəza belə Qüdrətin daxili iztirablarını birə on artırırdı.

Qüdrət ixtiyarsız olaraq Laləyə tərəf baxdı. Yalnız öz çarpayısının baş tərəfini işıqlandıran dairəvi lampa, arvadının üzünü aydın görməyə imkan vermirdi. Ancaq buna baxmayaraq, Lalənin gicgahına enmiş ağ tüklər gözünə dəydi: "Bu nə vaxt ağarıb?" deyə təəccüblə öz-özündən soruşdu. Lampanın başlığını üsulluca, bir az yuxarı qaldırdı. Daha da diqqətlə Laləyə nəzər saldı. Yox, gözləri onu aldatmamışdı. Lalənin yalnız gicgahında deyil, alnının lap yuxarısından sürüşüb tökülən seyrək saçları arasında da ağ tüklər görünürdü. Bəs Qüdrət bunları nə üçün dünən, ya da srağagün sezə bilməmişdi? "Fikirdəndir. Mehmanın ölümü onu hələ də düşündürür" deyə xəyalından keçirib dərindən köksünü ötürəndə, onun qaşları düyünləndi. Elə bu dəmdə ərinin nəfəsini duyan Lalə, oyanıb, gözlərini açdı və ilk sualı da bu oldu:

– Nə üçün qəmginsən, Qüdrət? Olmaya bir fəlakət üz verib?

Qüdrət gülümsədisə də, onun sifətindəki ən xırda cizgilərə də bələd olan Lalə, bu təbəssümə qarışmış xəfif kədəri elə yuxulu-yuxulu da sezə bildi.

Qüdrət:

– Yox, əzizim, – dedi, – heç bir şey olmayıb. Amma elə yorğunam ki...

Lalə tamam ayılıb ərinin üzünə zənnlə baxanda, yanılmadığını yəqin edib soruşdu:

– Nə üçün məndən gizlədirsən?

Bu dəfə Qüdrət kirpiklərini aşağı endirdi.

– Vallah, heç bir şey olmayıb... – dedi, – çox yorğunam. Sən ki bilirsən...

– Yorulmusan, yat. Məcmuələri bir tərəfə at getsin. Özünü nahaq bu qədər üzürsən.

Lalənin tez-tez qalxıb-enən sinəsini görəndə, ona elə gəldi ki, Qüdrətin nəyi isə ondan gizlətdiyini düşünüb arvadı daha da həyəcanlanır. Qadın ürəyini aldatmağın çətinliyini bir daha yəqin edən Qüdrət, Lalənin boynunu əlləri arasına aldı, həqiqəti açıb söylədi:

– Çox fikir eləmə, Lalə. Biz cəbhədəyik, burada həmişə ölüm-itim olacaq.

– Mən daha o barədə fikir eləmirəm, – deyə Lalə, elə bil öz-özünə təsəlli verən kimi, yavaşcadan və ərinə baxmadan dilləndi.

Qüdrət üzünü onun üzünə söykədi:

– Görürəm, görürəm, – dedi və sağ əlini Lalənin başı altına salıb, o biri əlilə tükləri ağarmış gicgahını sığalladı, – budur, bax, bu da fikirdəndir...

– O nədir ki?

– Ağ tükləri yalnız indi gördüm. Fikirdəndir.

– Bəs niyə köksünü ötürürdün?

– Elə bunun üçün. İndiyə qədər heç diqqət eləməmişdim.

Lalə də qüssəli-qüssəli köksünü ötürdü:

– Yəqin qocalıram, – deyib, qəmgin bir təbəssümlə gülümsündü.

Bu dəfə Qüdrətin səsi titrədi:

– Yox, əzizim... Elə bil sən mənim evimə dünən gəlmisən.

Lakin o, ailə həyatının şirinliyindən doymadığını sözlə arvadına bildirməyi artıq bilib susdu.

Lalə yuxulu gözlərini ərinə dikib bir neçə an hərəkətsiz qaldı:

– Təsəlli?..

– Yox, vallah, düz deyirəm. Hələ biz nə yaşamışıq ki?.. Qırx illik ömür nədir ki?

Lalə dinmədi. O, Qüdrətin həyatdan gözü doymamış, möhtəris bir insan olduğunu, bəzən hətta əziyyətin özündə də feyz axtarmağı bacardığını çox gözəl bilirdi.

Aralığa çökən sükut zamanı, yemək otağından uzun kəfkirli saat beşin yarısını vurdu. Nəhayət, Lalə:

– Doğrudan da mən çox fikir eləyirəm, – dedi.

– Axı nə üçün? Yoxsa məhkəməyə veriblər?

– Məni düşündürən məhkəmə deyil. İstintaq apardılar. Volkovu təqsirləndirirdilər. İndi əl çəkiblər. Onun nə günahı var ki? Dedim, əgər onu məhkəməyə cəlb eləsəniz, Moskvayacan varam. Axı Volkov Mehmanı öz doğma balası kimi istəyirdi. Əgər oğlanı təhlükəli yerə o göndərmiş olsaydı, yenə onu günahlandırmaq olardı. Oğlan özü gedib. Volkov qışqırıb, onu geri çağırıb, özü də bir dəfə yox, beş dəfə. Axı cavanlarımız belə tərbiyə alıb. Ölümünə razı olub, buruğu korlamağa qoymayıb. – Onun xatirəsini incitmək nə üçün?

Lalə susdu. Ağır-ağır nəfəs aldı.

– Bu gün Mehmanın anasıgilə getmişdim, – dedi, – yazıq arvad ağlayırdı. Amma gözündən bir damcı da yaş gəlmirdi. Mehman onun yeganə ümidi imiş. Özü tikiş fabrikində işləyir... Təsəvvür edirsənmi? Göz yaşı tamam qurumuşdu... Mən insanların iztirabına dözə bilmirəm, Qüdrət...

Lalənin gözləri dolmuşdu. Az qala bu saat yaş damcıları yumurlanıb solğun yanaqlarından üzü aşağı töküləcəkdi. Onun daxili bir gərginliklə iradəsini ələ almağa çalışdığı hiss olunurdu:

– Dözə bilmirəm... – dedi və özünü saxlaya bilməyib hönkürdü.

Qüdrət onun saçını sığalladı:

– Tədbir görməliyik, əzizim, – dedi, – qoy bu hadisə bizim üçün dərs olsun.

Sonra isə Qüdrət yerinə uzandı. Onun gözünə yuxu gedəndə, qarışıq röyalar görməyə başladı. Lalə düşünür, düşünür, Qüdrəti oyatmamağa çalışaraq, səssizcə ağlayırdı. Mehmanın anası onun xəyalından bir an belə silinib getmirdi.

## BEŞİNCİ FƏSİL

### 1

Tahir tezxniki minimum dərslərinə müntəzəm surətdə davam edirdi. Axır günlərdə müəllimlər hər bir şagirdə çox tələbkar yanaşırdılar. Məşğələlər vaxtında başlayır, vaxtında qurtarırdı. Hər gün keçilən dərsləri o birisi gün nöqtəsi-nöqtəsinə soruşurdular. Bunun səbəbini şagirdlər bilməsələr də, müəllimlər yaxşı bilirdilər.

Mehmanın əhvalatından sonra Qüdrətlə Lalə gənclərin axşam məşğələlərinə, xüsusən təhlükəsizlik texnikasını öyrənmələrinə ayrıca diqqət yetirməyə başlamışdılar. Bütün briqadaların tərkibini gözdən keçirib, FZO və sənət məktəbləri bitirməmiş cavanların siyahısını tutdurmuşdular. Onların bilmədikləri və ya az bildikləri məsələləri aydınlaşdırdıqdan sonra, dərs proqramındakı qüsurları düzəltdirib, istehsalatda baş verən ayrı-ayrı hadisələrdən də cavanları xəbərdar etməyi müəllimlərə tapşırmışdılar.

Qüdrət, mümkün etdikcə özü dərslərə gəlir, cib dəftərçəsini çıxarıb orada hər adın qabağında yazdığı işarələrə görə gəncləri bir-bir

yerindən qaldırıb imtahana çəkir, cavab verə bilməyənləri yenə dəftərçəsinə qeyd edir və "bircə gün vaxt verirəm, bilməsən gözümə görünmə" deyib gedirdi. Bir gün tənəffüs vaxtı Tahir, bu yaxınlarda şikəstliyinə görə hərbi xidmətdən azad olunmuş və şagirdlərin ən sevimli müəllimi sayılan ortaboylu, qaraşın, enli kürəkli, seyrək saçını yandan ayıran Cüməzadədən soruşdu:

– Müəllim, son vaxtlar yaman başlayıblar, bu necə işdir?

Cüməzadə topçu olduğundan, cəbhə istilahlarını tez-tez işlədirdi.

– Yalnız topxana hazırlığı vaxtı əsgərə düz nişan almağı öyrətsək çox gec olar. Əvvəlcədən öyrətmək lazımdır. Topçular riyaziyyatı mükəmməl bilməsələr, döyüş vaxtı haqq-hesabı itirərlər. Belə deyilmi? – Cüməzadə öz sualına özü cavab verib başını tərpətdi. – Hazırlıq əvvəldən, çox-sox əvvəldən başlanmalıdır, əzizim. Neft də belədir. Bu saat dartay və jalonka əsri deyil, trubin qazıma əsridir. Təbiətlə mübarizə faşizmlə mübarizədən az bilik tələb etmir.

– Mən onu soruşmuram, müəllim. Deyirəm, yəni son vaxtlar dərslərimizə nə çox fikir verirlər?

Cüməzadə Mehmanın əhvalatını Tahirə söyləyəndə, onun gözləri qorxu və təəccüb içində parıldadı:

– Ehtiyatlı olmaq lazımdır! – dedi. – İndi cəsarət azdır, gərək neftin dilini də biləsən.

– Bunun üçün də öyrənmək birinci şərtdir! – deyə Cüməzadə fikirli-fikirli Tahirin gözlərinin içinə baxdı. Bu söhbətdən sonra Tahir dərslərinə daha da maraqla qulaq asır və kitabxanadan aldığı texniki kitabları bir-bir və diqqətlə oxuyub qaytarırdı. Mühüm saydığı nöqtələri cib dəftərçəsinə yazıb, başa düşmədiyi ayrı-ayrı çətin istilahları müəllimlərindən soruşdu. Mədənlərdə, briqadalarda iki trestin yarış şərtləri oxunub qızğın müzakirə olunandan sonra, usta Ramazanın kəşfiyyat buruğunda iş sürəti artmışdı. Deyilənə görə başqa briqadalarda da belə sürətlə işləyirdilər. Qəzetlər də İsmayılzadənin trestini tərifləməyə başlamışdı. Amma usta Ramazan Tahirlə Cəmili bir dəqiqə belə gözdən qoymurdu. Mehmanın əhvalatı onu daha da ayıq salmışdı. Hər gün şagirdlərini öyrədir, müstəqil düşünməyə və müstəqil işləməyə alışdırırdı. Ustanın bu sahədə ən yaxın köməkçisi Vasilyev idi. O da, Ramazan kimi Tahiri ilk günlərdən bəyənmişdi. Hər ikisi şagirdlərə xüsusi qayğı göstərirdi. Bu hal səbəbsiz deyildi. Onlar sahibkarların zülmünü unutmadıqları kimi, köhnə buruq ustalarının cavan

fəhlələrlə pis rəftarlarını da yadlarından çıxarmamışdılar. O zamanlar buruqda sahibkarların ən sadiq vəkili sayılan bu ustalar, mədənə yeni gələn fəhləyə, xüsusən istedadlı cavanlara qısqanır, onların irəli getmələrindən qorxub, neft işinin mühüm sirlərini hər cür vasitə ilə onlardan gizlətməyə çalışırdılar. Ramazan özü də belə bir ustanın yanında on beş il ayaq döymüş, yalnız inqilabdan iki il sonra buruq ustası ola bilmişdi. Sovet dövründə o heç bir şagirdinə rəqib kimi baxmırdı. Elə bil köhnə ustalardan hayıf almaq üçün ildə yeddi-səkkiz gənc tərbiyə edib boya-başa çatdırırdı.

Usta Ramazan hələ də Tahirin kəndə qaçacağını güman edirdi. Ona elə gəlirdi ki, Tahir "mən də səngərdən qaçmayacağam" deyərkən ustanın sayıqlığını zəiflətmək istəmişdi. Ramazan:

– Sergey Timofeyeviç, – deyə Vasilyevə tapşırmışdı, – onu bircə dəqiqə də gözdən qoymayın. Cavandır, başa düşmür. Bu saat onun elə vaxtıdır ki, xeyrini şər bilir, şərini də xeyir.

Ramazanın səmimiyyətinə daima ürəkdən inanan Vasilyev də, Tahiri öz doğma balası kimi sevir və onun tərbiyəsinə xüsusi bir qayğı ilə yanaşırdı. Ancaq Ramazan da, o da Tahirə zahirən nəvaziş göstərmir, iş zamanı ondan diqqətli və sayıq olmağı tələb edirdi: "Sərvət intizam gücünə qazanılır" devizi ustanın da, Vasilyevin də nəzərində çox müqəddəs idi. Tahir isə yavaş-yavaş belə sərt rəftarın zərurətini duymağa başlayırdı. Kəşfiyyat buruğu iki min metr məsafə qət etmişdi. Qayda üzrə, korşalan baltanı hər altmış-yetmiş metrdən bir dəyişmək üçün quyuya sallanmış qazıma borularını çıxarmaq lazım gəlirdi. İndi usta bu vəzifəni Cəmillə Tahirə tapşırmış, Vasilyevlə bərabər kənarda, yeni qazıma boruları yığımının üstündə oturub söhbət edirdi. yenə də Tahirdən danışırdılar. Ramazan onun barəsində çoxdan bəri ürəyində gizli saxladığı şübhəni öz müavininə söylərkən, Vasilyev də onun fikrinə şərik oldu:

– Doğrudur, Ramazan İskəndəroviç, – dedi, – təzə uşaqlar arasında hörməti çoxdur. O qaçsa, o birilərinə təsir edəcək. Tahiri bir dəqiqə də gözdən qoymaq olmaz. Bundan başqa, o, bizim axtardığımız uşaqlardandır. Axı Tahir çox istedadlı gəncdir Sizi inandırıram ki, onun fitri istedadı az-az adamlarda olar.

– Bunun üçün bircə yol var, – deyə Ramazan fikirli-fikirli sözünə davam etdi, – gərək vəzifəsini böyüdüb məsuliyyətini artıraq.

Vasilyev sevinmiş kimi əlilə havanı yardı:

– Çox gözəl fikirdir! – dedi.

Usta Ramazan buruğa tərəf baxdı. Qazıma borusu, qabığı tökülmüş boz ilan kimi parıldaya-parıldaya yuxarıya doğru uzandı və birdən yanakı yerə enməyə başlayıb gözdən itdi. Borunun sürətinə zənnlə baxıb şagirdlərinin işinə gözəyarı qiymət qoyan usta: "Yaxşıdır, yaxşıdır" deyə dodağının altında Tahirlə Cəmili tərifləyir və razı halda gülümsəyirdi.

Birdən usta:

– Heç onların yataq otağını görmüsənmi? Yeməklərini yoxlamısanmı? – deyə Vasilyevdən soruşdu. – Nə qədər istəyirəm, vaxt tapa bilmirəm. Ana uşağıdırlar, gərək elə dolansınlar ki, heç nədən korluq çəkməsinlər.

Vasilyev ayağa qalxdı:

– Boruların hamısını çıxardılar. Gedib onları başa salmaq pis olmaz! – dedi.

Ramazan da ağır-ağır yerindən qalxdı. Onlar yavaşca addımlarla quyuya tərəf getdilər.

Əlləri palçığa bulanmış Tahirin gicgahlarından üzüaşağı tər damcıları axırdı. Onun iş paltarı ləkə-ləkə olmuşdu.

– Usta, – deyə o, əvvəlcə Ramazana, sonra da Vasilyevə baxdı, – olmaz ki, boruları quyudan çıxaranda bir az sürətini artıraq! Məsələn, birə iki?

– Əlbət ki, olmaz! – deyə Cəmil onun avamlığına istehzalı bir təbəssümlə güldü.

– Niyə gülürsən, balam? Yarışa girməmişik? Aleksey Staxanovun metodu nədir bəs? Beş dəqiqəyə görüləsi işi bir dəqiqəyə görmür?

Ramazan adəti üzrə həmişə şagirdləri arasında gedən mübahisədə birinə haqq verib, o birini haqsız saymaz, onların ixtilafını qızışdırmaq istəməzdi. İndi də məsələni sülh yolu ilə həll etməyə çalışdı: – Burada mümkün olmayan bir şey yoxdur, – dedi və Tahir bu sözləri eşidəndə qürurla yoldaşının üzünə baxıb, qalib nəzərlə onu süzməyə başladı.

– Ancaq bir iş var: borunu daha becid çəksək, həm quyunun divarları, həm də qüllə uça bilər, – deyə usta, Tahiri başa saldı. Cəmil də öz növbəsində təkəbbürlə döşünü qabardaraq Tahirə baxıb dedi:

– Elə mən də bunudeyirəm də.

– Deməli, hərəniz bir şeydə haqlısınız. Oğul istərəm ki, təzə bir ixtira eləsin, bu işi öz yoluna qoysun! – deyə usta hər iki cəbhəni razı

saldığına əmin olaraq gülümsündü və sonra Vasilyevə tərəf döndü: – Sergey Timofeyeviç, dünəndən bəri heç yatmamısınız. Gedək evə, istirahət eləyin, – dedi.

Vasilyev, buruğun köyşəndən hörülmüş damı altındakı nazik dirəkdən asılı duran brezent pencəyini və parusin şapkasını götürdü, qırışıq alnına tökülmüş sarı, seyrək saçlarını əlilə geriyə darayıb, şapkasını geyindi və pencəyini qoltuğuna vurub buruqdan çıxdı.

Usta Ramazan şagirdlərinə müraciətlə dedi:

– Bundan sonra gərək daha da diqqətli olasınız, uşaqlar. – Tahirin təəccüblə baxdığını görüb izah elədi: – Bir azdan neftli təbəqəyə çatırıq. Gərək hamımız gözdə-qulaqda olaq. Bir balaca oyan-buyan olsa, çəkdiyimiz zəhmət havayı gedər... Hə, başlayın görüm!

Tahir Cəmillə köməkləşərək, yerə uzadılmış borunu qaldırıcı maşına bağladı. Boru yuxarı qalxıb mənzilə çatmamışdı ki, birdən Tahir mədəni budkadan bəriyə doğru gələn Lətifəni görüb hər şeyi unutdu və qıza baxa-baxa qaldırıcı maşının hərəkətini izləməyi belə yadından çıxardı.

– Əgər belə getsə heç nə! – deyə usta təbəssümünü gizlətmək üçün üzünü başqa səmtə çevirdi.

Tahir bu sözlərin özünə aid olduğunu bilib, tez-tələsik Lətifədən gözlərini çəkdi və yuxarı qalxan borunun aşağı ucunu açarla tutub o biri boruya keçirdikdən sonra Cəmilə dedi:

– Bax, ustanın sözü yaman tez yadından çıxdı! – deyə Cəmil açarı burub Tahirə uzatdı.

– Yaxşı, yaxşı, dünya dağılmadı ki? – Tahir də söz altında qalmayıb, ustaya yanaşan Lətifəni oğrun-oğrun süzərək, açarı burdu və komanda verirmiş kimi, əlini qaldırıb saldı: – Burax! – deyə bağırdı.

Boru yeknəsəq bir xırıltı ilə quyuya sallandı.

Lətifə ustaya nə isə deyib gedəndən sonra da Tahirin fikri onun yanında qaldı.

Səhər tezdən Tahirgilin növbəsi qurtarmaq üzrə ikən, "Bahar" qayığı ilə altı nəfərdən ibarət bir dəstə fəhlə usta Ramazanın buruğuna gəldi. Xoş-beşdən sonra briqadanın rəhbəri usta Ramazana gəlişlərinin səbəbini açıb söylədi: – Biz trest müdirimiz Lalə İsmayılzadənin əmrinə görə gəlmişik. Sizə kömək etməyi tapşırıblar.

– Nə kömək? – deyə usta təəccüblə soruşdu və briqada rəhbərini təpədən-dırnağa qədər bir neçə dəfə süzdü. Yoğun əzələləri köynə-

yinin üstündən aydın görünən bu ucaboy fəhlə, qıçlarını bir-birindən aralı qoyub, rəqibini güləşməyə çağıran bir pəhləvan görkəmi ilə dayanmışdı.

– Deyirlər ki, siz çox geri qalırsınız, sizi yedəyə alıb kəsirdən çıxarmaq istəyirik.

Usta bu gəlişi əvvəlcə zarafat bildisə də, fəhlələrin üz-gözlərində heç bir istehza əlaməti görmədiyindən, briqada rəhbəri kimi, o da rəsmi cavab verdi:

– Lalə xanımdan çox razıyam, amma mən hələköməyə möhtac deyiləm. Planı bu günəcən yüz iyirmidən aşağı salmamışam. Ümidvaram ki, belə getsə gələn aydan bir az da qaldıram. Buyurun, gedin, yəqin oranın özündə də fəhlə lazımdır.

Briqada rəhbəri usta Ramazanın hirsləndiyini, ancaq onlara hörmət üçün pis söz deməkdən çəkindiyini duyub soruşdu.

– Yaxşı, biz qayıdıb trest müdirinə nə deyək?

– Deyin ki, sözümüz sözdür. İki trest yarışır, cücəni payızda sayarlar.

– Axı Qüdrət İsmayılzadə razı olub, siz niyə bizi geri qaytarırsınız?

– Olsa da, olmasa da mənə kömək lazım deyil! – Ramazan səsini ucaltdı: – Lalə xanıma mən özüm zəng elərəm. Qaldı, sizə bircə sözüm var, qoy deyim, ürəyimdə qalıb məni narahat eləməsin.

– Buyurun, buyurun!

– Dəvə nə qədər arıq olsa, dərisi sarvana yükdür.

Bu zərb-məsəlin mənasını yaxşı başa düşməyən briqadir dinməyib, əlilə yoldaşlarına "gedək" işarəsi verdi. Onlar yola düşdükdən sonra, usta Ramazan bığaltı gülə-gülə bu söhbəti dinləyən yoldaşlarına üz tutdu:

– Eşitdinizmi, uşaqlar? Sizdə qeyrət olsa, mənim papağımı yerə vurmazsınız!

– Vurmarıq, usta, vurmarıq! – deyə hər tərəfdən fəhlələrin səsi eşidildi.

– Vurmarıq! – deyə Tahir də ayrıca söz verdi.

**2**

Lalə ilə trestin baş mühəndisi Minayev maşından düşüb sahildən yarım kilometr aralı, boz qayalıqların zirvəsində qoyulmuş təzə buruğa qalxırdılar.

Onların tanışlığı çoxdan başlanmışdı.

Dmitri Semyonoviç Minayev Bakı neft institutunu bitirdikdən sonra, mədənlərdən birinə sıravi mühəndis təyin olunmuşdu. O vaxt Lalə İsmayılzadə mədən müdiri idi. O, qonşuluğundakı mədənin həyatı ilə o qədər maraqlanmadığından, orada mühəndis işləyən Minayevi də yalnız uzaqdan-uzağa tanıyırdı. Sadəcə bir təsadüf onları dostlaşdırdı: neftçilər üçün tikilmiş təzə binada mənzil qonşusu oldular. Evlərinin balkonu yanaşı düşdü. Dmitri Semyonoviç hələ subay idi. Arvadı Vera Alekseyevna ilə hələ yenicə məhəbbət romanı başlamışdı. Qız onun evinə təkdənbir gələrdi. İsmayılzadələr Minayevlə tanış olandan bircə ay sonra, Lalə balkona çıxan sevgililərə üz tutub dedi:

– Dünən bizim opera teatrında Anatoli Vasilyeviç Lunaçarski gözəl bir mühazirə söylədi. Suallara cavabı mühazirəsindən az maraqlı deyildi. Bir sözü lap sizə aiddir, qonşu.

Vera ilə yanaşı balkonun məhəccərinə dirsəklənmiş Dmitri Semyonoviç yerində doğruldu, qızılı rəngə çalan dalğalı saçlarını ikiəlli geriyə sığallayaraq soruşdu:

– Necə, necə? O nə dedi?

– O, cavanlara üz tutub gülə-gülə dedi ki, "bacardıqca tez evlənin!" Hamımız gülüşdük. Siz onun məsləhətinə nə vaxt əməl edəcəksiniz?

Dmitri Semyonoviç, ağ və zərif yanaqlarında qızartı görünən Veraya baxa-baxa cavab verdi:

– Günah məndə deyil, qonşu. Veroçka nə üçünsə tamam əksinə hərəkət edir. Anatoli Vasilyeviç "tez evlənin" dedikdə, yəqin ki, on doqquz-iyirmi yaşına çatmış gəncləri nəzərdə tutur. Amma mən artıq iyirmi beş, Veroçka isə iyirmi ikini keçir.

– Hara tələsirsən? – deyə Vera da dillənməyə məcbur oldu.

– Əgər tələsməyin mənası yoxsa, nə üçün tribunadan, özü də belə nüfuzlu adamlar məsləhət görürlər?

Lalə artıq ciddi bir ifadə ilə dedi:

– Mən Anatoli Vasilyeviçin fikrini başa düşürəm. Ailə həyatının da özünə məxsus bir məziyyəti var.

– Məsələn, nə kimi? – deyə bu dəfə kəsik, qara və gur saçlarını alnından yana tərəf eləyən Vera, qırmızı dodaqlarında titrəyən incə təbəssümünü gizlətməyə çalışaraq, Lalənin gözlərinin içinə düz baxdı: – Siz gənc Balkonskinin Pyerə dediyi "dostum, heç vaxt evlənmə" sözlərini xatırlayırsınızmı?

– Bəli, xatırlayıram. Ancaq mən bu məsələdə Lunaçarskiyə ondan daha çox inanıram. Çünki o, Tolstoyu hamımızdan yaxşı bilir və yəqin ki, Balkonskinin həmin sözlərinə də diqqət yetirməmiş deyil.

Görünür Lalənin təşviqi sevgililərə o qədər də təsir eləmədi. Onlar tələsmədilər. Bu söhbətdən yalnız iki il sonra evləndilər. Toy günü Laləni trest müdiri, Dmitrini isə həmin trestin baş mühəndisi təyin eləmişdilər.

Qüdrət toy məclisinin tamadası oldu. Bəylə gəlini də təbrik elədi. O, Dmitriyə müraciətlə nitqə başladı:

– Əziz dostum, bu gündən sən azad gənclik həyatına son qoyursan. İndi hər addımın kontrol altına alınacaq.

Bütün məclis qəhqəhə çəkdi. Qüdrət sözünə ara verməyə məcbur oldu.

– Siz elə fikir edirsiniz ki, mən bunuzarafatla deyirəm? Xeyr. Təəssüf ki, xeyr!

Qonaqlar bu dəfə daha da ucadan gülüşdülər.

– Ancaq Vera Alekseyevna ilə Dmitri Semyonoviç bu kontroldan daha böyük ləzzət alacaqlar.

Artıq məclisin qəhqəhələri Qüdrəti danışmağa qoymurdu. Lakin o özü gülmür, əsil mətləbini deməyə tələsirdi.

– Ailə həyatı böyük bir imtahandır. Bu imtahandan müvəffəqiyyətlə çıxanlar, ictimai həyatda da az büdrəyirlər. Məsələn, bizim kimi. Amma bunun bir şərti var. Həyatın ağır dəqiqələrində ər-arvad yox, həqiqi dost və həmdəm olmaq lazımdır!

– Bax, bu keçməz! – deyə Lalə yerindən söz atdı:

Bütün məclis yenidən qəhqəhə çəkdi. Lakin hamı, Lalənin zarafat tərzində dediyi bu sözlərdə nə isə bir inciklik nidası duydu.

– Yox, əzizim, – deyə Qüdrət gülümsəyərək, nitqini tamamladı, – mən bizim dostları tanıyıram. Vera Alekseyevna biz neftçilərin arasına düşməkdə yanılmamışdır. Mən inanıram ki, o, bu böyük ailənin sərt qanunlarını bəyənəcək və bu evə həqiqi sevinc gətirəcəkdir. Bu isə ailə üçün birinci şərtdir. Bəylə gəlinin sağlığına!

Qüdrət al şərabla dolu qədəhi dibinə qədər boşaltdı. Onun gözü Dmitriyə zillənmişdi.

– Aranızda ixtilaf olsa, onu yatırmağın bircə yolu var: həmişə geri çəkilməyə çalış, dostum. Unutma ki, qanuna görə ərlə-arvad bir hüquqa

malik olsalar da, ailədə bu qanun həmişə pozulur. Nə edəsən ki, arvad kişinin ağasıdır?

– Biz çalışırıq ki, qanun pozulmasın, – deyə Minayev cavab verdi.

– Yox, bacarmayacaqsan?

Bu zarafatlar toy məclisinə nə isə bir sadəlik və sərbəstlik gətirdi.

O günün səhərisi trestdə Dmitri Minayevin ağır iş həyatı başlandı. Ancaq o, bu ağırlığı hiss eləmirdi. Vera, sevişdikləri müddətdə kimə ərə gedəcəyini bilirdi. O, gündüzlər orta məktəbdə dərs deyir, qalan vaxtını evin səliqəsinə sərf edirdi. Dmitri işdən gec qayıdanda belə, xoşbəxt ailə həyatı ona bütün yorğunluğunu unutdururdu.

Trestdə Lalə ilə Minayevin iş prinsipləri bir-birinə düz gəlmişdi. Onlar əvvəlcədən belə qərarlaşmışdılar: "Bir-birimizdən həqiqəti gizlətməyəcəyik. Sərt tənqiddən inciməyəcəyik!"

Onlar təcrübəsizdilər. Lakin neftçilər kollektivində bunun o qədər də qorxusu yox idi. Bir il belə keçməmiş, onlar trestin hər bir buruğuna bələd oldular. Planları hər il artıqlaması ilə dolur və hər il də trest işçilərinin nümunəvi işindən danışırdılar. Lalə ilə Dmitri Bakıda ilk dəfə Lenin ordeni ilə təltif olunmuş neftçilərdəndi.

İndi onlar yeni buruqları plandakından da artıq qazdırır, partiyanın qazıma sahəsindəki tələbini bütün trestlərdən qabaq həyata keçirmək istəyirdilər. İndi görməyə getdikləri təzə buruq da plandan əlavə qazılırdı.

Aylı-ulduzlu bir payız gecəsi idi. Onlar nəfəslərini dərmək üçün dayanıb ətrafa göz gəzdirdilər. Dağ parkında nəfəsli orkestrdə çalınan hərbi marş səsi eşidilirdi. Bakının sahil boyu ilə yarımdairəvi şəkildə uzanan saysız-hesabsız işıqları, yerə səpilmiş ulduzlara bənzəyirdi.

Onların dayandıqları nöqtədən bütün Bakı aydın görünürdü. Yalnız buradan baxan adamlar şəhərin əsil əzəmətini duya bilərdilər. Külək əsmədiyindən, Bakı üzərini xəfif bir duman çulğalamışdı. Bu duman içində üzən evlər, dənizdə üzən saysız-hesabsız gəmilərə bənzəyirdi.

Lalə ilə Minayevin ən yaxşı gördüyü yer, sağ tərəfdəki Bayıl qəsəbəsi idi. Budur, küçələrə səpilmiş fənərlər altında parıldayaraq uzanan müvazi yollarla, uzaqdan xırdalaşmış kimi gözə dəyən tramvaylar və maşınlar süzüb gedirdi. Yolların gözdən itdiyi yerdən yarımada kimi dənizə tərəf uzanan Bayıl burunu, onun dövrəsində, böyük gəmi-

lərə istiqamət göstərmək üçün tez-tez yanıb-sönən rəngbərəng mayaklar görünürdü.

Burunun sağ tərəfində yumru ay dənizə əks etmiş, suları kiçik bir dairə halında işıqlandırmışdı. Bu dairənin tən ortasında tək bir buruq görünürdü. Deyəsən o, usta Ramazanın kəşfiyyat buruğu idi. Orada indi iş gedib-getmədiyini bilmək çətin idi. Çünki buruq uzaqdan, təntənəli yığıncaqlarda neft fəhlələrinin hədiyyə gətirdikləri balaca vışka modellərinə bənzəyirdi.

– Qocanın buruğunu görürsənmi? – deyə Lalə əlini o tərəfə uzatdı.

Minayevin də gözləri dairəvi halda işıqlanmış yerə zilləndi.

– Görürəm, – dedi, – ancaq buradan baxanda kəşfiyyat buruğu məni zəngin bir neft yatağından artıq gözəl bir mənzərə kimi cəlb edir... Bax, bax!.. – Minayev nəyə isə təəssüf edirmiş kimi dərindən köksünü ötürdü. – Bakının bu axşam mənzərəsində ayrıca bir məlahət var. Bizə qonaq gələn şairlər, nə üçünsə həmişə yalnız mazutu və qumu görürlər. Halbuki bu cür qəşəng bir gecə heç bir şəhərdə yoxdur. Mən buradan ayrılıb başqa bir yerə getməyi ağlıma belə sığışdıra bilmirəm.

– Yoxsa elə bir fikrin var? – deyə Lalə ona yanakı bir nəzər saldı.

– Yox, canım, söz gəlişi dedim. Mən burada doğulmuşam, burada da öləcəyəm. Bilirsənmi, Lalə xanım, bu yaxınlarda Tbilisiyə gedəndə cəmisi üç gün qaldım. Onun gözəlliyinə şübhə ola bilməz, deyilmi? Ancaq yaman darıxırdım. Öz-özümə deyirdim ki, “bircə həftə də burada qalsam, yəqin bağrım çatlar”.

– Yerli vətənpərvərlik hissi adamı məhdudlaşdıra bilər! – deyə Lalə baş mühəndisin üzünə baxmadan cavab verdi. – Mən də Bakını heç bir şəhərə dəyişmərəm, ancaq o biri şəhərlərimizin gözəlliyinə göz yummaq nə lazım?

Onlar susdular. Hər ikisi sahil boyuna vurğun nəzərlərlə baxırdı. Dənizin ayna sularında ikinci bir şəhər görünürdü.

– Gərək ki, Maksim Qorki buranı Neapola bənzətmişdir, – deyə Minayev sükutu pozdu, – onun zövqünə ki şübhə ola bilməz?

– Bu xüsusda aramızda ixtilaf yoxdur, – deyə Lalə güldü və irəliyə yönəldi, – Qüdrəti mən çoxdandır görmürəm, bu gün neçə faizdir?

– Səksən beşə qalxıb... Mən hələ də bu sirri başa düşə bilmirəm.

– Burada nə sirr var ki?

– Axı onun trestində çalışan cavanların çoxusu təcrübəsizdir. Südəmər uşaqlarla plan doldurmaq böyük hünər istəyir.

– Bunun əvəzində usta Ramazan kimi pələngləri var.

Onlar buruğa daxil olanda söhbəti kəsdilər. Lalə fəhlələri salamladı. Hamı ona ehtiramla cavab verdi.

Burada qızğın iş gedirdi. Briqada tikintini qurtarmaq üzrə idi. Bir azdan sonra qazıma mexanizmlərini yaxşı tanıdığı bu briqadanın, hər zaman, tapşırığı vaxtından tez yerinə yetirəcəyinə əmin idisə də, hər şeyi öz gözü ilə görmədikcə rahat olmurdu.

Xarratlar taxta-şalban işlərini qurtarmış, çilingərlər də mexanizmlərin əgər-əskiyini düzəldib qaydaya salırdılar.

Lalə işin ayrı-ayrı təfərrüatına nəzər yetirib razı halda geriyə qayıtmaq istərkən, buruqdan kənardakı taxta qırıntılarının üstündə oturmuş qazmaçılar arasında kimi isə görüb ayaq saxladı və usta Ramazanın köməyinə yolladığı briqadiri tanıyanda gah ona, gah da Minayevə baxa-baxa soruşdu:

– Stepan Fyodoroviç, siz nə üçün buradasınız?

Trest müdirlərinə həmişə ehtiram göstərən fəhlələr Lalənin səsini eşidəndə söhbətə ara verib ayağa qalxdılar. Onlardan biri yoğun səslə Laləni salamladı:

– Axşamınız xeyir, yoldaş İsmayılzadə! – dedi.

Lalə ona cavab verdikdən sonra buruqdan bəriyə doğru süzülən işıqda aydın gördüyü yoğun əzələli, ucaboy və cüssəli briqadirdən təkrar xəbər aldı:

– Nə üçün getməmisiniz? Bəlkə mənim əmrim sizin üçün məcburi deyil, hə?

Hamı ilə mülayim və mehriban rəftar edən Lalənin əmrindən çıxanlar çox tez də peşman olurdular. Briqadir də bunugözəl bilirdi.

– Xeyr, yoldaş müdir, məcburidir, – deyə o, heç bir zaman bu fikirdə olmadığını Laləyə hiss etdirmək üçün tez-tələsik cavab verdi. – Ancaq usta Ramazan bizimlə hesablaşmadı.

– Nə üçün?

– Səhər tezdən getmişdik. O bizi geri qaytardı.

– Nə üçün?

– Dedi ki: “Dəvə nə qədər arıq olsa, dərisi sarvana yükdür”.

Minayev bu zərb-məsəlin mənasını başa düşmədiyi üçün, bir neçə dəfə gözlərini yumub-açdı, nəhayət Lalədən soruşdu:

– Bu nə deməkdir?

Lalə özü də məətəl qalmışdı. Köməkdən boyun qaçıran o əcayib insanın gözlənilməz cavabını fikirləşəndə, özünü saxlaya bilməyib güldü:

– Yaxşı ki, elə deyib... O məsəlin çox kobud bir variantı da var, – dedi.

Briqadirin yanında duran qısaboy, üzünü tük basmış arıq bir fəhlə Lalənin əvəzinə cavab verdi:

– Var, var, – dedi. – "Dəvə nə qədər ölü olsa, dərisi bir eşşəyə yükdür".

Fəhlələr qəh-qəh çəkib gülüşdülər. Briqadir qoca ustanın cavabını elə bil yalnız indi başa düşüb tutuldu və deməyə söz tapmayıb başını sinəsinə endirdi. Lalə isə Minayevə tərəf çevrildi.

– Yaman başlayıblar, Dmitri Semyonoviç, – dedi. – köməkdən boyun qaçırırlarsa, demək, nəyə isə ümid bağlayırlar. Deyəsən biz arxayınlaşdığımız üçün özümüz də hiss etmədən geriləyirik? – O, qazmaçılara nüfuzedici bir nəzər saldı. – Ayıq olun, yoldaşlar, – dedi. – Biz onların çağırışını zarafat hesab edirdik. Amma belə görünür ki, onlar zarafat etmək fikrində deyillər.

Lalə ilə Minayev maşına tərəf endilər.

– Lalə xanım – deyə Minayev dərin düşüncədən ayrılıb dayandı, – məncə biz mühüm bir nöqtəni yadımızdan çıxarırıq...

Lalə maraq və sual dolu nəzərlərini ona dikdi.

– Hansı nöqtəni?

– Axı indi dəniz qazmaçılarına Qüdrət İsmayılzadə rəhbərlik edir.

– Nə olsun ki?

– Əgər o mən tanıyan Qüdrətdirsə, arvadından geridə qalmağa razı olmayacaq.

– Çox təəssüf ki, Dmitri Semyonoviç, onu tanıdığın halda, məni hələ tanımamısan.

– Necə məgər?

– Mən də ərimdən geri qalmağa razı olmayacağam. Ancaq məsələ bunda deyil, axı biz rəqabətə girişməmişik. Nə üçün onlar bizim köməyimizi qəbul etmirlər?

– Yəqin səbəbi var. Görünür, o birisi briqadaları da qaytarıblar... öz aramızdır, hər halda məsələ işçi qüvvəsinin azlığında deyil.

– yenə də nahaq qaytarıblar. Mənə elə gəlir ki, Qüdrətin bu işdən xəbəri yoxdur.

Onlar maşına minib yanaşı oturdular.

– Mən evə gedirəm. Bu gecə yəqin Qüdrət gələcək, – deyə Lalə, bir ev xanımı kimi deyil, aralarındakı anlaşılmazlıqdan narazı qalmış bir trest müdiri kimi, onunla məsələni evdə ayırd edəcəyini düşünüb, şoferinə əmr verdi:

– Kolya, evə!

Lakin o, Minayevdən ayrılıb, evlərinin qapısından içəri girəndə, qayınanasını və qızını yatmış görüb, trest rəhbəri olduğunu unutdu və ayaqlarının ucunda yemək otağına keçdi, kələğayısını başından açıb bir tərəfə atdı. Yemək stolunun süfrəsini dəyişdirdi, bufetdən qab-qaşıq çıxardı, güzgü kimi parıldayan çəngəl-bıçaqların yanına təmiz salfet qoydu və yalnız bundan sonra divar saatına baxdı. On ikiyə bircə dəqiqə qalırdı.

**3**

Ayağı yenicə yer alıb gəzməyə başlayan körpə bir uşağın anası kimi Ramazan da Tahirin yavaş-yavaş daha mürəkkəb işləri görməsinə qəribə bir ürək döyüntüsü ilə tamaşa edirdi.

Axşam növbəsinin fəhlələri işə gələndə bütün qazıma borularını quyuya sallayıb qurtarmışdılar. İstirahətdən sonra özünü qıvraq hiss edən Vasilyev də Ramazanla yanaşı durub fəhlələrə göz qoyur, onların ən cüzi səhvlərini belə o dəqiqə düzəldirdi.

Dünəndən bəri Tahirin üzündəki uşaqlıq ifadələri yox olub getmişdi. O, usta Ramazanın neft təbəqəsi haqqındakı sözlərini xatırladıqca, işin bütün məsuliyyətini duymağa başlamışdı. Arabir: "çox gözəl, doğrudur, aha, bax, belə!" – deyə onu tərifləyən usta Ramazanın səsini eşitdikcə, Tahir sevinərək ora-bura vurnuxur, yaşca özündən böyük olan, amma bilik və savadının azlığından hələ də ustanın etibarını qazana bilməmiş fəhlələrdən yaxşı işləyir, xüsusən Cəmilin yanında qürrələnir, yaxşı bilmədiyi şeyləri xəlvətcə ustadan soruşub öyrənirdi. Deyirlər ki, rəqibin gözləri iti olur. Cəmil, gec gəlib tez öyrənən yoldaşının hər addımını oğrun bir diqqətlə izlədiyi üçün, usta ilə onun nə barədə xosunlaşdığını biləndə, Tahirin üstünə ayaq aldı:

– Soruşa-soruşa nənəm də bacarar, – dedi, – naşı adamlar elə bilir ki, sən doğrudan da bir şey qanırsan.

Tahir bu sözləri məhz Cəmildən eşidəndə yaman pərt oldu, bilmədiyi şeyləri bir daha ustadan soruşmamaq qərarına gəldi. Ramazanla

Vasilyev isə, çətin bir iş olan kimi uşaqların, xüsusilə Tahirin xəbər verəcəyinə ümid edərək, kənarda oturub atom bombasından, yaponların necə tez təslim olmasından və Ruzveltdən sonra Trumenin bütün işləri korlamasından danışır, yalnız arabir rotorun səsini dinləməklə kifayətlənirdilər. Ramazan hər məsələni deyib qurtaranda, yenə neftin üstünə gəlir:

– Mən bilirəm, bu davalar hamısı qara qızıldan ötrüdür, – deyirdi. Hitler üstümüzə niyə dişini qıcamışdı? Trumenin ağzından da neft iyi gəlir...

Tahir birdən gil məhlulu cərəyanının kəsildiyini görüb, udquna-udquna, geniş açılmış gözlərilə Cəmilə baxdı:

– Bu nədir, niyə belə oldu? – deyə qeyri-ixtiyari soruşdu.

Cəmil də, əlinə girəvə düşdüyünə sevinmiş kimi, istehza ilə gülüb dedi:

– Əldəqayırma ustaların axırını həmişə belə gördüm. Korladın getdi. Tez ustaya xəbər ver!

Tahir yüyürüb ustanı çağırdı. Ramazanla Vasilyev quyuya yanaşanda hər bir şey onlara aydın oldu.

– Ramazan...

– Korlanıb... – deyə yan-yörəsinə göz gəzdirib nəyi isə axtardı, başını narazı halda bulaya-bulaya arxasına baxmadan mədəni budkaya doğru getdi.

Lətifə, qabağındakı balaca stolun üstünə sərdiyi qalın cildli bir kitabı (Jorj Sandın “Konsuela” romanını) oxuyurdu. O mütaliəyə necə dalmışdısa, qocanın gəlişini belə duymadı.

– Qızım, – deyə usta səslənərkən, Lətifə diksinib başını kitabdan qaldırdı və onun həyəcanlı olduğunu görüb səbəbini soruşdu. Usta tez qazıma idarəsinə zəng etdirdi. Ancaq orada yenə heç kəs tapılmadığından, Qüdrəti çağırmağı xahiş edib, balaca stolun qarşısındakı kürsüdə oturdu, iş köynəyinin biləyilə alnının tərini sildi.

Lətifə telefonun dəstəyini götürdü:

– Tamara, Tamara, tez İsmayılzadəni ver! Eşitmirsən? İsmayılzadəni deyirəm! Kabinetdə yoxdur? Kabinetindən öyrən görüm hara gedib? Lazımdır də... Evinə gedib? Nə əcəb ondan?

– Yoxdur? – deyə Ramazan əllərini dizinə çırpdı.

– Axı nə olub ki? Nə üçün ovqatınız təlxdir, usta? – deyə Lətifə də həyəcanlamağa başladı.

– İşləri korlayıblar...

– Kim?

– Kim olacaq? Uşaqlar... Tahir, Cəmil... Gil zəhrimar axır gedir... Material lazımdır. Bədirliyə qalsa, bir həftə gözləməli olacağıq.

Lətifənin qaşqabağı bulud kimi qaraldı. Gözlərini yerə dikib ürəyində Tahiri danladı. "yenə fikri kənddədir" deyə xəyalından keçirdi. Birdən özünü yığışdırıb yenə dəstəyi götürdü.

– Evinə zəng edimmi usta? – deyə soruşdu.

– Yox, lazım deyil, qızım. Ayda-ildə bir namaz, onu da şeytan qoymaz. Qoy dincəlsin. Gör nə qədər yorulub ki, dayana bilməyib, gedib...

Lakin bu zaman İsmayılzadə Bədirli ilə bərabər cavan fəhlələrin ümumi yaşayış evini gəzirdi. Onlar duş otağına girəndə Qüdrət əlüzyuyana, duşa baxıb dayandı, gözünə sataşan paslı kəfkiri göstərərək:

– Bu nədir, – deyə Bədirliyə tərs-tərs baxanda, onun alt dodağı səyridi. – Neçə aydır buraya ayaq basmamısan? Kranlardan birini aç görüm.

Trest müdirinin belə işlərə qarışması Bədirliyə qəribə və təəccüblü göründü. O, çiyinlərini çəkdi:

– Yoldaş İsmayılzadə, – dedi, – sabahdan özüm hər şeyi yoxlaram, lazım olan tədbirləri görərəm, deyəsən buranın komendantı heç nəyə fikir vermir, siz nə üçün belə xırda işlərlə özünüzü yorursunuz?

– Nə? Xırda? – deyə Qüdrət az qala bağırdı. – Fəhlənin sağlamlığı nə vaxtdan bəri xırda iş olub? Görünür ki, sən hələ Mantaşevin, ya da Hacı Zeynalabdın Tağıyevin qanunları ilə yaşayırsan. Bir bax, bir bax! Kranı aç görüm!

Bədirli yenə dilinin bəlasına düşəcəyindən qorxub dinmədi, kranlardan birini açdı. Su, kəfkirin yekə bir deşiyindən fışqıraraq töküldü.

– Bu duşdur, yoxsa fantan? – deyə Qüdrət dişlərini qıcadı. – Lap bu gecə təmir elətdir, qurtaran kimi mənə telefonla xəbər ver. Aydın oldu, yoxsa bir də izah edim?

Bədirli müti bir tərzdə başını tərpətdi:

– Bəli, aydındır.

İsmayılzadə, Tahirlə Cəmilin yatdığı otağa girdi. Burada Səməndərdən başqa heç kəs yox idi. O, dalı üstündə uzanıb Tahirin adına gələn qəzeti oxuyurdu. O yenə də qəzetə, kitaba pul vermirdi. Ancaq "Qurbanəli bəy"i oxuyub məzmununu Cəmilə danışmışdı.

– Yaman xoşuma gəldi, balam, – demişdi, – Molla Nəsrəddin nə məzəli kişi imiş... Bu gündən sonra nəyini tapsam oxuyacağam.

Doğrudan da o, kitabxanaya gedib üzv yazılmış gözaltı elədiyi Zivəri orada görəndən sonra daha da həvəslənib, hər gün, kitab almaq bəhanəsilə, kitabxanaya yol açmışdı. İndi o, Cəmillə ayrı-ayrı hekayələr barədə mübahisəyə belə girişirdi. Cəmil ona artıq "Qarın" deməkdən çəkinir, bəzən çox ciddi və ağıla batan fikirlər söylədiyini görüb, onun fitri istedadına təəccüb edirdi. Səməndər, oxuduğu hekayələrə dair özünün dediyi bəzi fikirlərə qəzet səhifələrindəki məqalələrdə də rast gələndə, altından xətt çəkib Cəmilə göstərir:

– Gördün, mən deyəni yazır? Məsələ çox oxumaqda deyil, balam, yaxşı başa düşməkdədir, – deyirdi.

Əvvəllər Cəmilə elə gəlirdi ki, Səməndər haradansa bu fikri eşitmiş, yalnız başqa adamların rəyini təkrar edir, ancaq sonralar gördü ki, onun mühakimələrində özünə məxsus möhkəm bir məntiq var. Xüsusən o, Cəmilin yaxşı diqqət yetirmədiyi nöqtələrə dair fikir yürüdəndə:

– Bax, bunudüz deyirsən, yaxşı tapmısan! – deyə Səməndəri tərifləməyə məcbur olurdu.

Səməndər son günlərdə "Kommunist" qəzetini əlindən yerə qoymurdu...

– Salam! – deyə Qüdrət İsmayılzadə Səməndərə baxanda, o, qəzetdən başını qaldırdı. Təəccüb ifadəsilə parıldayan qıyıq gözlərini Qüdrətə zillədi.

Səməndər İsmayılzadəni tanımırdı. Amma Bədirlinin arxadan gəldiyini və Qüdrətin yanında əzilib-büzüldüyünü görəndə, tez ayağa durdu.

– Buyurun! – dedi.

İsmayılzadə nazik yun yorğanları qaldırıb bir-bir döşəkağılarına baxdı:

– Hə, bunlar təmizdir, – deyə pəncərəyə yanaşdı və pərakəndə halda tökülmüş kitabları görüb yenə Bədirliyə tərəf döndü:

– Sən evində kitabları pəncərəyə yığırsan? Bəlkə heç yerli-dibli kitabın yoxdur, hə?

Bədirli Qüdrətin əsəbinə toxunan yaltaq bir təbəssümlə güldü:

– Var, yoldaş İsmayılzadə... Niyə yoxdur?

– Elə isə hər otaq üçün bir etajerka aldırarsan. Aydın oldu, yoxsa bir də izah edim?

– Bəli, aydındır.

Sonra Qüdrət Səməndərin qabağında dayandı:

– Hansı mədəndə işləyirsən qoçaq? – deyə soruşdu.

– Mən o biri trestdənəm.

– Burada səndən başqa kim olur?

– Cəmil, Biləndər, Tahir...

Tahirin adını eşidəndə, Qüdrət pəncərənin yanındakı kitablara bir də baxdı:

– Bu kitablar kimindir? – deyə soruşdu.

– Bunlar Cəmilindir, bunlar da Tahirin...

İsmayılzadə Tahirin kitabları arasında yeddi-səkkiz şer məcmuəsi, bir roman ("Dumanlı Təbriz"), bir də rus dili dərsliyi görüb dəftərçəsini çıxartdı. Ora nə isə qeyd edib qapıya yanaşdı, Səməndərlə xudahafizləşib çıxdı. Onu addım-addım təqib edən Bədirli də qoltuğundakı zorba portfeli açdı, kağız-qələm çıxarıb, dizinin üstündə İsmayılzadənin dediklərini yazdı.

Onlar küçədə dayanmış maşına minib dəniz sahilinə yola düşdülər.

– Bilirsənmi, yoldaş Bədirli, – deyə Qüdrət onun üzünə bir dəfə də olsun baxmayıb, ürəyində qövr edən bir sözü açıb söylədi: – Bəzi adamlar naçalniklərinə yaltaqlanmaqla, öz işlərindəki qüsurları örtüb-basdırmaq istəyirlər. Çünki onlar iş üçün yox, özləri üçün can yandırırlar.

– Mənim də belə adamlardan zəhləm gedir! – deyə Bədirli yenə yaltaq təbəssümlə irişdi və onun alt çənəsindəki mırıq dişləri göründü.

İsmayılzadə ilə Bədirli maşından düşüb sahilə enəndə, fəhlələr təzəcə gətirilmiş taxta-şalbanları gəmiyə doldururdular. İş yerini projektora bənzəyən iri bir fənər işıqlandırırdı.

Dənizin ləpələri sahili döyəcləməkdən yorulmuş kimi, yavaşcadan gəminin yanlarına toxunub, ağır-ağır da geri qayıdırdı.

Bədirli, hələ dünən buruqlara yollamalı olduğu taxta-şalbanların yenə burada qaldığını görəndə Qüdrətdən bir də ağır söz eşidəcəyini bildiyi üçün, onu qabaqlamaq istədi:

– Hamı işə can yandırsa, vallah, dağı-dağ üstünə qoyarıq. Azərneftin süründürməçiləri mənim canımı boğazıma yığıblar. Belə də müsibət olar? – O, əl-qolunu ölçdüsə də, Qüdrət onun bu bəhanəni

yalnız indicə uydurduğunu hiss edib, sərt bir əl hərəkətilə havanı yararaq, Bədirlinin sözünü kəsdi:

– Yaxşı, yaxşı, – dedi, – niyə bunuəvvəldən mənə xəbər verməmisən?

– Axı trest müdirinin taxta-şalbana nə dəxli? Belə xırda şeylər...

– Canım, bu xırda sözünü əzbərləmisən, nədir? – Qüdrət, bayaqdan bəri gah süni bir təbəssümlə gülüb ona xoş gəlmək istəyən, gah da aşağı əyilib müti bir qul kimi hər sözə "bəli, bəli" cavabını verən bu adamın adi və təbii hərəkətlərindən də qəzəblənməyə başladı. – Xırda iş yox, xırda adamlar var. Anladın, yoxsa bir də izah edim?

– Bəli, bəli, anladım! – Bədirli yenə eyni təbəssümlə gülüb, boynunu yana sarı əydi.

Qüdrət artıq dözmədi.

– Mənə adam kimi cavab ver, yoldaş Bədirli! Elə güman eləmə ki, mən bu hərəkətlərini xoşlayıram. Mənim əlimdən yaltaqlıqla can qurtarmaq istəyirsənsə, zəhmətin əbəsdir! – deyə o, taxta-şalbanları gəmiyə daşıyan fəhlələrə yanaşıb salam verdi.

Fəhlələr arasında İsmayılzadəni köhnədən tanıyanlar belə, onun salamını sadəcə bir hörmətlə alıb yenə uzaqlaşdılar.

Ürəyində Bədirli ilə bu adamları müqayisə edən Qüdrət, onların məziyyətlərindən təsəlli tapmış kimi, yenə öz adi təbəssümü ilə gülümsəyib, gəmiyə doğru addımladı. Dənizdən əsən sərin meh onun qıvrım saçlarını yavaşcadan tərpədir, üz-gözünə sərinlik gətirirdi.

Gəminin baş tərəfində durub, bir nəfər yoldaşilə yükü yerbəyer edən gödək, yoğun və çevik bir fəhlə Qüdrəti görüb doğruldu. (O, buradakı briqadanın başçısı idi).

– Salam, yoldaş İsmayılzadə! – deyə o, yeni gətirilən taxtanın ucundan tutub dartdı və yerini rahatladı. Qüdrət elə bil onun iş həvəsini soyutmamaq üçün bir qədər sükut etdi, gələnlərə-gedənlərə baxdı və o biri taxta gətirilənə qədər briqada başçısına müraciətlə dedi:

– Xahiş edirəm sabahacan burada bir taxta da qalmasın, müştərisi çoxdur.

– Gözüm üstə! – deyə briqadir, hərbi adam kimi əlini gicgahına yaxınlaşdırdı.

Bu cavab Qüdrət üçün kafi idi: "Söz verdi, eləyəcək!" O, qanı qaralmış halda dal tərəfində dayanan Bədirliyə döndü:

– Bunlardan öyrən! – dedi, – işləməyi də, adamlığı da!

Bədirli, Qüdrətlə özü arasında əmələ gələn uçurumun dərinliyini yalnız indi hiss etməyə başlayır, hər sözünün nifrətə səbəb olduğunu duyur, İsmayılzadənin ondan nə istədiyini bir növ anlaya bilmirdi: "Nə üçün məni görən gözü yoxdur? deyə öz-özünə sual verir, amma cavab tapa bilmədiyindən qanı daha da qaralırdı.

Qüdrət birdən yorğunluq hiss edib, fəhlələrdən aralanaraq maşına doğru gələndə, Bədirli yenə gülümsəyib, sarımtıl və mırıq dişlərini göstərdisə də, Qüdrət ona baxmadan maşının gerisində yox, şoferlə yanaşı oturdu. Bunu gördükdə Bədirlinin ürəyinə daha pis bir şübhə damdı: "Məni işdən qovmağa bəhanə axtarır" deyə düşünərək, oturacaq yerindəki zorba portfelini götürüb dizinin üstünə qoydu. Amma elə bil iynə üstündə oturdu.

Onlar idarəyə yetişən kimi, Qüdrətin katibəsi buruqdan zəng etdiklərini, hansı bir mühüm iş üçünsə onu soruşduqlarını Qüdrətə xəbər verdi. O, yerində oturmamış tez-tələsik usta Ramazanı telefona çağırtdırdı.

– Nə var, nə yox, usta? Deyirlər məni istəyirsənmiş... Necə? Gil məhlulu axıb gedir? yenə Bədirli? Əşi bu zalım oğlu mənim də canımı boğazıma yığıb. – Dəstəyi yerindən asıb katibəsini səslədi: – Baş mühəndis buradadırmı?

– Xeyr, material aparıb, usta Ramazanın buruğuna getdi.

– Çoxdan?

– Xeyr, on beş-iyirmi dəqiqə bundan əvvəl.

Katibə yorğunluğunu gizlədə bilməyib əsnəyəndə, əlini ağzına tutdu.

– Görürəm yorğunsan, get evə, dincəl, – deyə Qüdrət katibəsini işdən buraxdı.

Bu anda şəhər telefonu səsləndi. Qüdrət qarşısındakı divar saatına baxıb dəstəyi götürdü. Şirmayı zəng edirdi.

– Hə, mənəm, qızım, – deyə o, bir anlığa bütün yorğunluğunu unutdu. Uşaqlara məxsus səmimi və məsum bir təbəssümlə güldü. – Tuflin hazırdır, qızım. Bəlkə bu gün gəldim. Ancaq sən yat, məni gözləmə. Sabah bütün günü evdə olacağam. Yaxşı? Sədəf müəllimə gəlmişdimi? Təzə notalar lazımdır? Taparam. Təki sən oxumağında ol...

Qüdrət dəstəyi yerindən asdı, aşağı əyilib yazı stolunun alt gözündən bir cüt uşaq tüflisi çıxardı, qəzetə bükdü.

Şirmayının musiqi müəllimәsi Sədəf, onu istedadlı gənclərin konsertinə hazırlayırdı. Qızının bu ilk çıxışı, Qüdrəti usta Ramazanın kəşfiyyat buruğundan az həyəcanlandırmırdı.

Gözləri stolun şüşəsi altında qoyulmuş məlumat vərəqəsinə sataşdı. Götürüb baxdı. Bu gün plan dünənkinə nisbətən bircə faiz artmışdı. Bunun səbəbini düşünəndə, Bədirli içəri girdi.

– Yoldaş İsmayılzadə, – dedi, – bütün günahları məndə görürsünüz. Uşaqlarım ölsün, usta Ramazan müqəssirdir. Özünə o qədər arxayındır ki, materialları vaxtında istəməyib...

Qüdrət, Bədirlinin uşaqlarına and içməsindən, sözlərində yalan olmadığını başa düşdü və onunla həddindən çox sərt dolandığını ürəyində etiraf etməyə məcbur oldu. Lakin yenə də:

– Qoca kişidir, onun yadına düşmür, sən yadına sal! – dedi. – Elə bilirsən ki, adamları danlamaqdan mənim xoşum gəlir? Qətiyyən yox! Sən mənim qulum deyilsən, köməkçimsən. Əgər məndə bir qüsur görüb deməsən belə çıxır ki, nədənsə qorxursan. Canım, nədən qorxursan axı? Qorxu ilə işləmək olmaz ki? – Qüdrət səsini yavaşıtdı: – Səndən bircə xahişim var: adamların üzünə şax bax, çalışma ki, filankəsin xoşuna gələsən. Mən sahibkar deyiləm. Mən də adi bir vətəndaşam. Hamımızın məqsədimiz birdir. Xülasə, sözləri deməkdə fikrim odur ki, gələcəkdə öz işinlə adamlara xoş gəlməyə çalışasan.

Düzdür. – deyə Bədirli trest müdirinin xahişini yalnız indi başa düşüb, gözlərini yerə dikdi: “Nə qədər sərtdirsə, bir o qədər də mehribandır” deyə fikirləşdi. – Ancaq sizdən bir xahişim var, yoldaş İsmayılzadə: məni çağırın kabinetə, istədiyiniz qədər danlayın, söyün, amma adamların yanında biabır eləməyin. Çünki siz onları tanımırsınız. Heç birində qanacaq yoxdur, o saat çıxıb boynumda oturarlar.

– Bax, bunda da yanılırsan. Məncə hər kəs birinci sırada öz qüsurlarını görməlidir. Kim insanları ucdantutma pis hesab eləyirsə, onun öz ürəyi təmiz deyil. Əgər mən buradakı adamların hərəsində mənəvi bir gözəllik nişanəsi tapmasaydım, bu gün də onlarla işləyə bilməzdim. Axı, bir də, insanlar anadan pis doğulmurlar ki? Balaca uşaqlar yaltaq olmurlar. Onlarda bu xasiyyət böyüdükdən sonra əmələ gəlir. Müqəssir kimdir? Əlbəttə, onları bu işə məcbur edənlər!.. Köləlik hissini, Çexov demişkən damcı-damcı sıxıb qanımızdan çıxarmalıyıq. İndi belə şeylərə qətiyyən ehtiyac yoxdur. Aydındırmı? Yoxsa bir də izah edim?

Qüdrət bu dəfə gülümsədi. İnadla Bədirlinin üzünə baxaraq, sözlərinin ona necə təsir etdiyini yoxlamaq istədi:

– Düz deyirəm, yox?

– Bəli.

– Bax, o gün mühəndis Fikrət burada çıxış elədi. Mən onun fikirlərini bəyənmədim. Çünki zərərli fikirlərdir. Ancaq məndən çəkinməyib, açıq danışmasını bəyəndim. Əgər o etirazını deməkdən qorxsaydı, mən trestdəki əhvali-ruhiyyəni düzgün təyin edə bilməzdim, çıxardığım nəticə yanlış ola bilərdi, kor-koranə işləyib tresti bir yana çıxara bilməzdim. Amma indi haradan mənə zərbə dəyəcəyini əvvəldən bilirəm, ona görə də hazırlaşıram, ayağımın altını bərkidirəm. Xülasə, mənə elə gəlir ki, xahişim sənə aydın oldu.

Qüdrət yenə saatına baxdı. On iki tamama bircə dəqiqə qalırdı:

– Baş mühəndis buruqdadır. Əminəm ki, avariyanı tezliklə ləğv edib qayıdacaq. – Qüdrət qızının tuflisini götürüb qapıya yanaşdı və çiyni üzərindən Bədirliyə baxaraq soruşdu: – Getmirsən?

Bədirli də onun dalınca çıxdı:

– Mən bu gün növbədəyəm, – dedi, – siz buyurun, gedin.

Qüdrət evinə yola düşdü. O, şəhərə çatanda hələ küçələrdən ayaq kəsilməmişdi.

Hər iki tərəfdən şütüyərək, asfalt üzərində süzən avtomobillərin fənərləri evlərin aynasına və asfalta əks edir, kinolardan, teatrlardan qayıdan adamların üzünü işıqlandıraraq keçirdi. Bu adamlar elə bil müharibə zamanındakı qaranlıq gecələrin heyfini almaq üçün yavaş-yavaş, sallana-sallana yeriyirdilər. Yoxuşsuz küçə saysız-hesabsız işıqlar içində üzürdü. Cınqıldayaraq ötən tramvayların baş tərəfində, zəfər bayramından indiyədək parıldayan qızıl işıqlar yanırdı. Dörd ildən bəri zil qaranlıqda yatan şəhər, indi artıq bütün gözəlliyi ilə rəng verib-rəng almaqda idi. Bütün gecələri göy kağızlarla örtülüb toz basmış pəncərələrdən indi göz qamaşdıran işıq sütunları uzanırdı.

Qüdrət doğma şəhərin ta uşaqlıqdan sevdiyi bu axşam sərinində maşınının yan şüşəsini açıq qoyub rahat-rahat nəfəs alır, yorğunluqdan xəfif bir tərzdə sızıldayan bədəninin ağrısını unudaraq, şirin-şirin mürgüləyirdi.

O, evinə yetişəndə hamını yatmış bilib, cibindən öz açarını çıxardı və qapını səssizcə açdı. Yemək otağının işığını yanan gördükdə, “hələ oyaqdırlar” deyə düşünüb uşaq kimi sevindi. Dəhlizdən yemək otağı-

na adlayanda, onu gözləməkdən yorulub, başını stola söykəyərək yatmış Laləni gördü. Onu oyatmamaq üçün ayaqlarının ucunda yeridi, süfrəyə səliqə ilə düzülmüş çay dəsgahına baxdı və səssizcə əyilib Lalənin açıq boynundan öpdü. Lalə azacıq diksinərək gözlərini açdı və ərini görüb yuxulu-yuxulu gülümsündü:

– Bu gün nə əcəb belə tez? – deyə incə bir kinayə ilə xəbər aldı.

Qüdrət əlindəki tufliləri pianonun üstünə qoyub Laləyə cavab vermədən anası yatan otağa keçdi. Qapını açıq qoyub, bəridən düşən işıqda anası ilə yanaşı çarpayıda uzanmış qızını gördü və aşağı əyilib onun da üzündən öpdü.

Tükəzban yuxudan hövlnak oyandı:

– Sənsən? – deyə ürəyi bərk döyünə-döyünə oğlunun üzünə həsrət dolu gözlərilə bir xeyli baxdı: – İşlərin nə təhərdir, qadan ürəyimə?

Qüdrət həmişə belə sayıq yatan qoca anasını yuxudan oyatdığına təəssüfləndi:

– Sən yat, ana can, – dedi, – bilirəm, Şirmayı səni yorub, haldan salıb... Şeytan gör necə yatıb? Gündüz o qədər ora-bura vurnuxur ki, yanında top da atsan yuxudan oyanmaz.

Tükəzban yerindən qalxmaq istərkən, Qüdrət onun çiynindən tutub qoymadı:

– Nahaq qalxırsan, ana can... – dedi. – Lalə buradadır, hər şeyi hazır eləyib... Amma o qədər gözləyib ki, axırda yorulub yatıb...

Tükəzban, oğlundan yaşınırmış kimi, arıq çiyinlərini nazik yorğanda gizlətdi, bir oğluna, bir də nəvəsinə baxdı, elə bil damağında ailə səadətinin bütün şirinliyini duyub, bir-iki dəfə ağzını marçıldatdı. Şirmayını oyatmamaq üçün pıçıltı ilə dedi:

– Bilirəm, ər-arvad bəhsə giribsiniz. Şirmayı bu gün qəzeti oxuyub məni başa salırdı. Nə olar ki, görünür zəmanənin adəti bundadır. Neyləyirsiniz eləyin, amma canınıza da yazığınız gəlsin.

– Baş üstə, ana! – deyə Qüdrət gülə-gülə sağ əlini gözünün üstünə qoyub, Tükəzbandan azca aralandı. – Sənin sözün mənim üçün qanundur. Ancaq yat, narahat olma...

Tükəzban ilk və sonbeşiyi olan Qüdrəti min əziyyətlə boya-başa çatdırdığından, onun üstündə, öz təbirincə, nanə yarpağı kimi əsirdi. Qüdrət də bunuçox gözəl bilirdi. Əri Salman cavan yaşlarında Sibirə sürgün edildikdən sonra köməksiz qalmış Tükəzban, yalnız ərini çox istədiyinə görə yox, həm də bircə balasının dərdindən onun-bunun

qapısında paltar-palaz yumağa razı olmuşdu, amma başqa ərə getməyə rəy verməmişdi. "balam sağ olsun!" deyə təsəlli tapıb, Qüdrət mühəndis oluncaya qədər səbir etmişdi.

– Mən demirəm pis işlə oğul... Mənim dediyim odur ki, sən hökumətə elə sabah da lazım olacaqsan, – deyə həmişə onu vaxtında çörəyini yeməməkdən, günlərlə ailəsindən kənarda qalıb yuxusuz gecələr keçirməkdən saqındırmağa çalışırdı. Qüdrət, anasının könlü xoş olsun deyə çox vaxt yorğunluğunu büruzə verməzdi. Xüsusən müharibə illərində evə telefon eləməyə belə imkan tapmadığı günlər olanda: "sən qorxma, ana can, mənim evə gəlməməyimə baxma, işim elədir ki, mədənlərdə tez-tez lazım oluram, orada işim-gücüm yatmaqdır, yeməyim də öz qaydasındadır" deyə Tükəzbanı arxayın edərdi.

Qüdrət indi də anasını dilə basdı:

– Əşi, indi nə var ki? – dedi, – hər gün dənizdə gəzib kef çəkirəm. Gündə yüz kərə çimirəm, üzə-üzə hey gedirəm uzaqlara...

– Yox, yox, ağrın ürəyimə, çox uzağa getmə, dəniz ləçər arvada oxşayır, birdən Allah eləməmiş, dilim qurusun, mən nə deyirəm? İşdir, qəzadır... – deyə Tükəzban qızdırmalı kimi yerində uçunmağa başladı.

– Eh, ay ana, nə var ki?.. – deyə Qüdrət qayğısız bir halda əllərini havada oynatdı. – Özün bilmirsən mən nə təhər üzürəm?

Qüdrət yenə dilindən xataya düşəcəyindən qorxub, Lalənin yanına keçdi.

– Hə, arvad, yenə səxavət əlini açmısan, – deyə yemək stolunun üstünə düzülmüş yağı, pendiri və qara kürünü göstərdi – qiyamətdir, çay ver gəlsin!

Lalə çayniki elektrikə keçirdi:

– Səhərdən zəng eləməkdən yorulmuşam. Trestdə tapılmırsan. Bilirdim bu gün gələcəksən. Nə üçünsə ürəyimə dammışdı, – dedi, – hə, işlərin necədir?

– Niyə, pis getmir. Ancaq materiallarımız çatışmır.

– Daxili ehtiyatları səfərbərliyə almaq lazımdır! – deyə Lalə, dəb halına gəlmiş bir cümlə ilə ərinə baxıb güldü və bununla da müharibə illərində trestdəki daxili ehtiyatların qurtardığına işarə etmək istədi. Amma Qüdrət sir-sifətinə ciddi bir ifadə verdi, son zamanlar fəhlələrin topladıqları və təmir edib işə saldığı köhnə avadanlığı xatırlayaraq, arvadına da bu yolla kömək eləmək istədi:

– Sən gülürsən, ancaq yenə də istifadə olunmamış şeylər çoxdur, orada-burada atılıb qalmış alətləri, boruları işə saldırmışam. Son vaxtlarda uşaqlar qəribə bir üsul ixtira eləyiblər. Lazım olmayan dəniz vışkalarını sökmədən bir yerdən başqa yerə köçürürlər. Bilirsən bu bizim işimizi nə qədər asanlaşdırır?

Lalə başını buladı:

– Yox, bizdə belə deyil. İstifadə olunmamış bir mismar da qalmayıb...

Qüdrət nazik doğranmış çörəkdən bir parça götürüb üstünə yağla kürü çəkdi:

– Mən ayrı materialları nəzərdə tuturam, – dedi – çatışmayan bilirsən nədir? Qazıma borularımız çatışmır, taxta-şalban ki, lap azlıq eləyir. Bir neçə buruqdan çıxarılan istismar boruları yay kimi əyilib xarab olub... Onları əvəz etməyə ən azı üç min metr təzə boru lazımdır. Traktorlarımızın çoxusu təmir olunmayıb... Hər şeyi təzədən başlamışam.

– Amma işin o qədər də pis getmir. Plan 85 faizə qalxıb... Sən on beş faiz artmısan, amma mən hələ yerimdə sayıram... – Lalə duruxdu, birdən gözlərini Qüdrətin üzündə dayandırdı. – Hələ bir de görüm, bizim adamları nə üçün geri qaytarmısınız, hə,

– Hansı adamları?

– Sizə kömək üçün üç briqada göndərmişdim. Onları deyirəm.

– Həəə... – Qüdrət qaşlarını azacıq yuxarı qaldırdı, – qaytardıq, çünki bunun faydası yoxdur.

– Məgər sənə plan doldurmaq lazım deyil?

– Əlbəttə lazımdır! – Qüdrət əlindəki çörəyi dişlədi və yeməyə ara vermədən sözünə davam etdi: – Axı, bir də mən yalnız bu ili düşünmürəm. Mən, xüsusən dənizdəki vuruşmaların sabahını nəzərdə tuturam.

Lalə onun fikrini başa düşmədi:

– Bu nə deməkdir?

– Çayın qaynadı, götür! – deyə Qüdrət, pıqqıldayan çayniki göstərdi. – Bu o deməkdir ki, mən cavanları tərbiyə edib yetişdirməklə məşğulam. Onları bir dəqiqə belə unutmaq olmaz. Son hadisələr, elə biri Mehmanın əhvalatı göstərdi ki, gənc qvardiyanın tərbiyəsi neft istehsalından az mühüm deyildir...

Lalə çiyinlərini çəkdi:

– Qəribə məntiqdir! Bizim briqadaların buna nə dəxli var?

– Var, var. Qoy cavanlar indidən heç kəsə ümid bağlamadan işləməyə adət eləsinlər!..

– Məncə əksinə! – deyə Lalə rəsmi bir ifadə ilə izah etməyə başladı. – Gənclər hər an bizim köməyimizi hiss etməlidirlər. Onlardakı inamı artırmaq üçün bu köməyin tərbiyəvi əhəmiyyəti var...

Qüdrət öz fikrinin üstündə möhkəm durmuşdu:

– Adamlarda bu hissi cəmiyyətimiz özü yaradır. Mən, işdəki müstəqilliyi nəzərdə tuturam. Şəxsi ehtiyac insanı öyrənməyə, axtarıb tapmağa məcbur edir.

– Şəxsi ehtiyac başqa, işdə mütəqabil kömək başqa... Əgər sən deyən yolla getsək, Cek Londonun qəhrəmanları kimi, bizim də cavanları şəxsi şöhrət duyğuları zəhərləyə bilər...

– Bax, burada mən heç bir məntiq görmürəm... – Qüdrət də artıq rəsmiyyətə keçdi: – çünki istehsalatın ictimai xasiyyəti belə duyğuların inkişafına hər zaman mane olur. Xüsusən bizdə fəhləni həyəcana gətirən istehsalatın ümumi mənafeyidir.

– Aha, sən mənə siyasi dərs verməyə başladın... Unutma ki, bizdəki fəhlə gənclərin əksəriyyəti kənddən yeni gəlir...

– Nə olar ki? Kənddə də ictimai xarakterli təsərrüfat hökm sürür...

Ərlə-arvadın söhbətini kənardan dinləyən olsaydı, burada siyasi məşğələ keçildiyini güman edərdi.

Ancaq onlar, yarım zarafat tərzində gedən bu söhbət zamanı ali məktəbdə oxuduqları vaxtı xatırladılar. İmtahanlardan qabaq fəhlələr bir yerə toplaşar, bir-birinə sual verib cavab alar, yorulmaq nə olduğunu bilmədən, uzun-uzadı mübahisə edərdilər. Qüdrət üçün də, Lalə üçün də, əziz olan o günlərdə, hər ikisi belə qayğılardan azaddı. Onlar ali məktəbdə keçdikləri siyasi fənləri, burada, bu mürəkkəb iş prosesində əyani olaraq görmüş, yalnız indi həqiqi mənasında anlamağa başlamışdılar.

Lalə Qüdrətin yadına, trestə göndərildiyi ilk həftəni saldı:

– Axı sən o zaman demədinmi fəhlə qüvvəsi çatışmır?.. Mən briqadalarımızın boşalmağını gözləyirdim. Təzə quyuları qazıb təhvil verdilər, mən də köməyə yolladım...

– Özü də Ramazanın buruğuna?

– Nə olar ki?

– Necə nə olar? Yoxsa onun cavabından xəbərin yoxdur?.. – Qüdrət şaqqıldayıb güldü. – Deyəsən sənin briqadirin usta Ramazanın sözünü hələ də başa düşməyib...

Lalənin yanaqları xəfif bir qızartı ilə örtüldü. Elə bil qoca ustanın dedikləri şəxsən ona aid idi.

– Əgər onun ehtiyacı yoxsa, fəhlələri başqa briqadalara göndər, – deyə məsləhət gördü.

– Bura bax, arvad, səndən briqadir filan istəmirəm, mənim bu saat üç traktora ehtiyacım var. Kömək eləmək istəyirsənsə buyur göndər, onda deyim ki, yarışda öz qanuni arvadımdan kömək almışam...

– Necə, necə? Qanuni arvad? Bu nə sözdür? – Lalə əlindəki çay stəkanını havada saxlayıb hərəkətsiz qaldı. – Belə çıxır ki...

– Belə çıxır ki, mənim əsil ehtiyacım sənə bəlli deyil...

– Bəllidir. Çünki o ehtiyac məndə də var... Müharibə hər şeyi köhnəltdi. Yalnız texnikamızı deyil, neft təbəqələrini də köhnəltdi... Bu saat elə buruqlarımız var ki, hansı təbəqəsini açırıqsa su verir. Bilirsənmi bu nədəndir? Müharibə zamanı çoxları "ver gəlsin, ağına-bozuna baxmayın" deyib, adamlarımızı diqqətsizliyə, məsuliyyətsizliyə öyrədiblər. Bunların paxırı indi açılır. Ancaq mən də Laləyəm. Bir qram nefti də torpağa bağışlayan deyiləm. Hər vasitəyə əl atacağam. Təmir briqadalarını artıracağam, köhnə quyuların hamısını işə salacağam.

– Əlbəttə, əlbəttə! – deyə Qüdrət stəkanı boşaldıb Laləyə tərəf uzatdı. – Köhnə quyuların özü də balaca məsələ deyildir. Bu saat çox mədən onların hesabına dolanır... Ancaq... – Qüdrət sükuta qərq oldu. – Ehtiyac doğrudan da böyükdür. Müharibənin yaralarını sağaltmaq üçün təzə kəşfiyyata daha ciddi fikir verilməlidir!

– Orada az danışmısınız, bir az da burada danışın!.. – deyə Tükəzban qarı dəhlizdə dayanaraq əvvəlcə oğlunun, sonra da gəlinin üzünə baxıb, narazı halda başını bulayırdı. – Hamamı qızdırmışam, oğul, gəl bir vannaya gir, canın rahat olsun.

– Can, ay ana, niyə yatmadın? – Qüdrət ayağa qalxdı və onun boynunu qucaqlayıb qızının yanına apardı. – Sən narahat olma, hər şeyi özümüz elərik...

Tükəzban qarı deyinə-deyinə yerinə uzandı. Qüdrət yenə Lalənin yanına qayıtdı.

Lalə qayınanasına haqq verdi:

– Deyəsən biz doğrudan da bir tərəfli olmağa başlamışıq, Qüdrət. İstehsalat bizim intim hisslərimizə də hakim olub. Elə deyilmi?

– Səncə bu mənfi haldır, yoxsa müsbət?

Lalə ərinə birdən-birə cavab vermədi. Onun fikrincə belə söhbətlər, hər iki trestdə işlərin öz qaydasında getməməyindən irəli gəlirdi. "Qüdrət geri qalmasaydı, mən yerimdə saymasaydım, əlbəttə, bizim evdə də bu xüsusda danışmağımıza ehtiyac qalmazdı".

– Sən necə bilirsən, Qüdrət, anan haqlıdır, yoxsa haqsız?

Qüdrət yeməklə məşğul olduğundan, arvadına yalnız sonradan-sonraya cavab verdi:

– Başqa sahələrdə çalışan dostlarımıza fikir verirsənmi? Onlar həmişə bizi quruluqda təqsirləndirirlər. Guya biz həyatın başqa nemətlərindən ləzzət almağı bacarmırıq. Amma mən belə hallarda "Polad necə bərkidi" romanının qəhrəmanını xatırlayıram. İnsan mənəvi cəhətcə yalnız o zaman həqiqi mənada zənginləşə bilər ki, onun həyat idealı bütün başqa hissləri üzərində hakim olsun. Bu vaxt onun məhəbbəti də, hissi, ehtirası da, nə isə, daha dərin bir məna kəsb edir. Təsəvvür elə ki, biz yalnız evlə-eşiklə məşğul olub, əlimizi ağdan-qaraya vurmuruq. Biz belə həyatdan nə ləzzət ala bilərik?

– Bu cür həyatdan ləzzət alanlar var, ya yox?

– Var. Əlbəttə ki, var. Amma bu necə ləzzətdir? Yox, əzizim, mən şəxsən belə həyatın gözəlliyinə inana bilmirəm. Yəqin ki, bu cür adamların evində hava da azlıq eləyir?

Bu anda qonşu otaqdan kaman səsi eşidildi. Ərlə-arvad söhbətə ara verdi. Kaman çalan Dmitri Minayev idi. Lalə çay tökə-tökə, Qüdrət isə hərəkətsiz dayanıb musiqini dinlədi.

– Qonşumuz qiyamət çalır. Bilmirəm o nə üçün muzıkant olmayı? – deyə Qüdrət yarıciddi, yarızarafat soruşdu.

– O, kamanını həmişə yeni ixtira üzərində işləyəndə çalır, – deyə Lalə otağın dilsiz sükutunu pozdu.

– Nə ixtira eləyir? – deyə Qüdrət də maraqlandı.

Lalə, çayla dolu stəkanları gətirib stolun üstünə qoydu. Amma Qüdrətin fikri-zikri yenə də Minayevdə idi. Onun istedadlı bir ixtiraçı olduğunu çoxdan bilirdi, hətta özü Minayevin vaxtilə heç kəsi yaxın qoymağa cəsarət etmədiyi qiymətli bir ixtirasını öz trestinin mədənlərində təcrübədən keçirməyə razı olmuş və çox gözəl nəticələr əldə etmişdi. Odur ki, ixtira adı gələndə, Qüdrət ondan dörd əlli yapışırdı.

Lalə hər gün Minayevin ixtirası ilə maraqlanır və baş mühəndisi tələsdirirdi. Ancaq bu xüsusda ərinə ilk dəfə indi məlumat verirdi.

– Əgər onun ixtirasını təcrübədən keçirib yararlı olduğunu görsək, böyük yenilik olacaq, – dedi. – Təzə qazılan quyulardakı iş sürəti çox artacaq.

Qüdrət sevincindən qalxıb oturdu:

– Bəs niyə bunu mənə deməmisən? Belə ixtiralar hamıdan qabaq mənə lazımdır ki... – dedi.

– Deməmişəm, çünki məndən xahiş eləyib ki, heç kəs bilməsin. Hələlik öz aramızda qalsın. Qurtarandan sonra boğazından assan da gizlətməyəcək.

Qüdrət ayağa qalxdı və pianonun üstündəki təzə qəzetləri gətirib gözdən keçirdi. Aralarındakı sükut zamanı kaman səsi yenə aydın eşidildi. Minayev həzin bir hava çalırdı. Ərlə arvad elə bil musiqinin ahəngindən ixtiranın asanmı və çətinmi başa gəldiyini bilməyə tələsirdilər. Ancaq bunubilmək mümkün deyildi. Çünki Minayevin titrəyən barmaqları ucundan süzülən səs dalğaları, elə bil yalnız şəhər üzərində qanad gərmiş gecə sükutunun dərinliyini ifadə edirdi. Əgər o, çaldığı hava ilə ürəyindən xəbər versəydi, bəlkə də onun sevindiyi və kədərləndiyi bilinərdi və bununla da Qüdrət ixtiranın nə yerdə olduğunu təxminən hiss edə bilərdi.

Kaman susdu.

Qüdrət oxuduğu qəzetdə nəyi isə görüb ayağa qalxdı. Lalə onun birdən-birə ağaran üzünə baxarkən, iki-üç dəfə udqundu. Əri haqqında nə isə təhqiramiz bir söz yazıldığını güman edib həyəcanlandı:

– Sənə nə oldu, Qüdrət? – dedi, – rəngin niyə qaçdı?

Qüdrət hirslə əlini qəzetə çırparaq, üçüncü səhifədə çap olunmuş bir qeydi göstərdi. Bu qeyddə Lalə İsmayılzadənin trestindən Qüdrət İsmayılzadənin trestinə fəhlə qüvvəsilə kömək gəldiyi yazılmışdı. Qeydin sonunda "Yarışanlar bir-birini ruhlandırırlar" cümləsi iri hərflərlə yığılmışdı.

– Axı bu köməyi sizdən kim istəyir? – deyə Qüdrət qəzeti havada xışıldadaraq qeyri-ixtiyari qışqırdı. – İşçi qüvvəsinin azlığı haqqındakı söhbət mane, yalnız mane olur. Adamlarda məsuliyyət hissini azaldır.

Lalə də ayağa qalxdı:

– Sakit ol, Qüdrət, – dedi, – daha niyə qışqırırsan? Qonşular eşitsələr nə deyərlər?

– Mən rəsmi etiraz edəcəyəm! – deyə Qüdrət daha da əsəbi bir halda səsləndi.

Lalə boynunu azca yana sarı əyərək, ərini sülhə çağırdı.

– İstəmirsən, istəmə. Biz düşündük ki, yarış rəqabət deyil, biz hər iki tərəfin qalib gəlməsini arzu edirdik.

– Axı bunuqəzetə yazdıran kimdir? Yəni Qüdrət İsmayılzadə o qədər aciz oldu ki, onu yedəyə alırlar?

Qüdrət "yedək" sözünü istehzalı bir əda ilə, ağzını əyərək söylədi və əsəbi halda otaqda var-gəl etdikdən sonra gəlib, yenə yerində əyləşdi.

Bu anda Minayev balkonda göründü və küçəyə baxan qapıya tərəf gəldi. İsti yay günlərində hər iki ailə bura çıxıb dəyirmi stolun arxasında oturar, qadınlar söhbət edər, kişilər isə şahmat oynayardılar.

Minayev bu evə məhrəm olduğu üçün, izin istəmədən içəri girdi və təəccüb dolu gözlərini gah Qüdrətə, gah da Laləyə dikərək soruşdu:

– Nə olub, qonşu? Bu nə dava-qalmağaldır?

Qüdrət yenə qəzeti göstərdi.

– Canım, belə də iş olar? Bizim evimizi yıxan elə bu avral əhval-ruhiyyəsi deyilmi? Hamı ona-buna ümid bağlayır, axırda da bütün trest quyruqda sürünür. Nə üçün siz adamlarımızı işdən soyudub, bizə ziyan vurursunuz? Axı bilmirəm bunuqəzetə yazdıran kimdir?

Minayev:

– Qüdrət Salmanoviç, əsəbiləşməyin, – dedi, – biz sizi yoldaşcasına yedəyə almaq istəyirik. Lazım deyilsə, briqadaların hamısını geri qaytararıq.

– Biz onları heç qəbul etmək fikrində olmamışıq da. Ancaq mənim trestimdə bu qəzeti oxuyanlar indi məndən narazılıq eləyəcəklər ki, göndərilən köməyi geri qaytarıram. – Qüdrət əlilə havanı yardı: – Korlamısınız bütün işləri...

Divar saatı ikini vurdu.

– İndi yatmaq vaxtıdır, Qüdrət Salmanoviç, ancaq siz xırda bir şeydən ötrü əsəbiləşirsiniz.

– Yenə xırda? – deyə Qüdrət, Bədirlini xatırladı. – Əgər bu xırda şeydirsə, bəs böyük nəyə deyirsiniz?

Lalə, bir daha Qüdrətin əsəblərinə toxunmamaq üçün, əlilə dodaqlarını tutub Minayevə susmağı məsləhət gördü.

– Məncə, ağır işdən sonra möhkəm yatmaq daha faydalıdır. Gecəniz xeyrə qalsın! – deyə Minayev balkonun qapısına tərəf yeriyib, tez də gözdən itdi.

Lalə ərinə heç bir söz deməyib yataq otağına keçdi. O, Qüdrəti tamamilə haqsız hesab edirdi. On beş illik mehriban ailə həyatında o, bir dəfə olsun Lalənin üstünə belə qışqırmamışdı. O daima gülər üzlü və şad görünərdi. Ailəyə həmişə sevinc gətirən bir ərin bu qışqırığı Lalənin qəlbinə toxunmuşdu. O, böyük səhv də buraxmış olsaydı, Qüdrət yenə də onunla bu cür əsəbi rəftar etməməli idi. Lalənin fikrincə hər ikisi evdə olduğu kimi, işdə də bir-birinin köməkçisi və dostu idi. Lalə, bu günə qədər həmişə irəlidə gedən və başqalarına nümunə göstərilən Qüdrətin “arvad kölgəsində” dolanmaq istəmədiyi üçün belə acıqlandığını güman edirdi: “Biz adi ər-arvad deyilik, biz mübarizə yoldaşıyıq” deyə düşünən Lalə, ərini köhnə fikirli olmaqda təqsirləndirməyə başlayırdı. O, soyunub yerinə girəndən sonra da, Qüdrəti haqsız sayır, indiyə qədər onun ürəyində xəstə bir şöhrətpərəstlik duyğusunun yuva saldığını düşünürdü. Laləyə elə gəlirdi ki, Qüdrət həmişə ondan irəlidə getdiyi üçün, bu xəstəliyini büruzə verməyə ehtiyac hiss etməmişdi. Amma indi o heç yerdə təriflənmirdi, tresti hamıdan geridə idi. Qabaqcıllar sırasına çıxmağa da uzun bir müddət lazım olacaqdı, bunuda Qüdrət qeyrətinə sığışdırmır və qəzetdəki məqalə belə onun şöhrətpərəstlik duyğularını təhqir edirdi. “Gənclər məsələsi də, avral əhval-ruhiyyəsi də bəhanədir. Ona toxunan budur ki, niyə məhz arvadım məni yedəyə alsın” deyə fikirləşən Lalə, üzünü örtüb yatmaq istədisə də, gözünə yuxu getmədi. O, böyrü üstə çevrildi və yenə həyəcanla düşündü: “Axı mən, ya o, nə fərqi var? Bir də ki, biz şöhrət xatirinə çalışmırıq ki?..”

Lalə, Qüdrətin ayaq səslərindən, kabinetə keçdiyini, yazı stolunun dalında oturduğunu və nə isə yazdığını hiss etdi, nəfəsini çəkmədən dinləməyə başladı. Elə bil o, bu lal sükut içində, azacıq aralanmış qapıdan aydın eşidilən qələm səsindən, onun nə yazdığını bilmək istəyirdi: “Əslinə baxsan, məndə də təqsir var. Gərək briqadaları göndərməmişdən özü ilə məsləhətləşəydim” deyə xəyalından keçirib, o biri tərəfinə çevrildi. Qüdrət, qələmlə axırıncı nöqtəni vurub ayağa qalxdı və

səssiz addımlarla gəlib yataq otağının qapısını örtdü. Bundan sonra Lalə heç bir səs eşitmədi və dumanlanan şüurunda röyamı gördüyünü, yoxsa hələ ayıqmı olduğunu, o qədər də aydın dərk etmədən yuxuya getdi.

**4**

– Ay arvad, indi mənim heç nədən qorxum yoxdur, mən xoşbəxt ölürəm, elə, qızım da bir oğula bərabərdir. Mən bu dünyadan o dünyaya arxayın köçüb gedirəm...

Atasının heç bir təəssüf ifadə etməyən sakit bir səslə dediyi bu sözləri Lalə indi də xatırlayırdı. Boranlı bir qış günü idi. Pəncərələrin şüşəsini mütəmadiyən cingəldədən şiddətli xəzri əsirdi. Küçələri arşın yarım hündürlüyündə qar basmışdı. Tramvayların hərəkəti dayanmışdı. Tez-tez yolları təmizləsələr də ara vermədən yağan qar göz açmağa qoymurdu. Son əlli ildə Abşeronda bu cür qar yağdığını görən olmamışdı. Lalənin atası Əlimərdan kişi dəniz sahilində təzə bir quyu qazıb qurtarmaq üzrə ikən, özünü soyuğa verib sətəlcəmdən xəstələnmişdi. Həkimlərin dediyinə görə, sağalmağına ümid yox idi.

Əlimərdan kişi, yanından bir dəqiqə belə aralanmayan arvadına deyirdi:

– Qızım bu il orta məktəbi qurtarır. Bundan sonra incinar oxutdurarsan. Allah qoysa, böyüyüb sənə oğulluq elər...

O, dünyaya gözlərini yumdu. Amma kənardan baxana elə gəlirdi ki, röyada nə isə görüb razı halda gülümsəyir. Qansız dodaqlarında donub qalmış bu təbəssüm, onun iyirmi illik həyat yoldaşını da aldatmışdı. Arvadı elə bilirdi ki, Əlimərdan huşa gedib, vəsiyyətini tamamlamaq üçün nə barədə isə fikirləşir. Onun ölümündən xəbər tutanda, xəstənin yanında oturmuş qohum-əqrəbadan tük ürpərdən bir şivən qopdu.

Lalə məktəbdə idi. Atasının ölümündən beş dəqiqə belə keçməmiş özünü içəri salıb, ağlaşan arvad-uşaqları yara-yara acı bir fəryad qoparıb, Əlimərdanın cənazəsini qucaqlamışdı.

Ağlaşma səsləri xəzrinin vıyıltısına qarışırdı.

Bu hadisədən düz iyirmi il keçmişdi, amma Lalə yenə də heç bir şeyi yadından çıxarmamışdı. Atasını fəhlə yoldaşları böyük bir ehtiramla dəfn etdikdən sonra, Lalənin anası qızının ümidinə qaldı. Aldıqları təqaüdlə dolanmaq çətin idi. Qız şair olmaq istəyirdi. Atasının

vəsiyyətini bildikdə fikrini dəyişdi. Neft institutuna girdi. Ancaq ömründə ilk dəfə gördüyü ölüm onun qəlbində silinməz bir iz buraxmışdı. Bu xüsusda onun yanıqlı bir şeri də vardı. Onu köhnə kitablarının arasında hələ də saxlayırdı. Qüdrət təkdənbir bu şeri oxuyarkən, təəssüflə deyirdi: "Hayıf, Natəvandan sonra əsil şairə sənsənmiş!.."

Ali məktəb həyatı mütəmadi təhsil və təcrübədə keçdi. Onun ən çox sevdiyi neft alimi Qubkin idi. Bu səbəbə görə də kitab oxumaqla bərabər, gəzməyi, ayrı-ayrı neft mənbələrini öz gözü ilə görüb tədqiq etməyi sevirdi.

Hələ üçüncü sinifdə ikən dünyanın ən zəngin neft hövzələrini gəzib-dolanmışdı. Amma o, Bakını hər yerdən üstün tutur, atasının vəsiyyətini bir an belə unutmurdu. Onun son nəfəsdə dediyi sözlərə belə məna verirdi: "Qızım, mən də mühəndis olmaq istəyirdim, amma zəmanə buna imkan vermədi. Heç olmasa sən bu dünyadan kam al.

Qüdrət ondan iki sinif irəlidə idi. O da Lalə kimi mədən mühəndisi olmaq istəyirdi. İclasda təsadüfən tanış olmuşdular. Lakin bu təsadüf uğurlu çıxdı. İlk görüş son görüş olmadı. Qüdrətin ayrı-ayrı çıxışları, Bakıya, Bakı fəhlələrinə dair dediyi sözlər Lalənin ürəyinə yaxın idi. Qüdrətin atasına dair başqalarından eşitdiyi maraqlı hekayələr qızın könlündə, özü də duymadan ona qarşı dəruni bir hiss oyatmışdı. Lalə artıq onu sevdiyini və tez-tez görüşmək arzusu ilə çırpındığını başa düşəndə, atasının ölümündən sonrakı böyük kədərini unutmağa başlamışdı. İndi artıq həyatda yalqız olmadığını görməklə təsəlli tapırdı. Onlar ikisi də uzun-uzadı məktublar yazmadan, eşqin ülviyyətinə dair ehtiraslı nitqlər söyləmədən sevişirdi. Qüdrət çox vaxt tamam başqa şeylərdən danışır – "ay səni sevirəm, sənsiz yaşaya bilmirəm" kimi sözlərə nə üçünsə əvvəldən nifrət edirdi. Lalənin anası da Qüdrətin xoşuna gəldi. Gülsüm arvad Əli Bayramov klubunda həm özü dərzilik edir, həm də cavan qızlara bu sənəti öyrədirdi, hər gün qızını danlayıb: "sən oxu, qazancını istəmirəm" deyə onun axşamlar qəzet idarəsindəki işindən ayrılmasını tələb edirdi.

– Yox, ana can, – deyə Lalə onunla razılaşmırdı, – mənim xərcimi ödəyə bilməzsən...

– Nə xərcin var ki? Bəzənib-düzənən deyilsən ki?

– Kitablar, ana can, kitablar... Donluğumun doxsan faizi kitablara gedir.

Doğrudan da Lalənin otağında kitab əlindən tərpənməyə yer yox idi. Əvvəlləri rusca mütaliə etməklə kifayətlənirdisə də, son siniflərdə ingiliscə öyrənmişdi, əlinə keçən texniki əsərlərə son qəpiyini belə əsirgəmirdi. O, bədii əsərlərə də mənəvi bir ehtiyac kimi baxırdı. Rus klassiklərindən çoxunun külliyatını almışdı.

– Bax, mənim pullarım bunlara gedir!.. – deyə qız əlilə kitabları göstərib, anasının haqsız olduğunu əyani vasitə ilə sübut etməyə çalışırdı.

Qüdrət ilk dəfə onlara gələndə, Gülsüm arvad əl-ayağa düşüb plov bişirmək istədi. Qüdrət buna razı olmadısa da, Lalənin təkidilə xörək hazırlandı. Elə süfrə başında ana məsələnin nə yerdə olduğunu hiss edib sevincindən yerə-göyə sığmadı: "Qızıma layiq oğlandır" – deyə Gülsüm arvad könlündə qızına və gələcək kürəkəninə xeyir-dua verdi. Qüdrət gedəndən sonra Lalədən onun barəsində bir söz qopartmaq istədisə də, "yoldaşımdır, bir yerdə oxuyuruq" cümləsindən başqa Lalə ona heç bir şey demədi. Sonra məlum oldu ki, Əlimərdan Qüdrətin atasını tanıyırmış, elə Gülsüm özü də onun Sibir əhvalatını bilirmiş...

Qüdrət məktəbi qurtarıb mühəndis sifətilə mədənə gedəndən sonra da Lalə ilə əlaqəsini kəsmədi. Gah məktəbə gəlir, gah evə gəlir, gah da telefonla Laləni çağırıb kinoya, teatra aparırdı.

Tükəzban bu əhvalatdan çox gec xəbər tutmuşdu. Lalə məktəbi qurtarandan altı ay sonra Gülsüm arvadın evinə gəlib, ata-baba adətilə nişan üzüyü gətirmişdi. Nişanlılar təzə qayda ilə toy eləmək istəyirdilərsə də analar buna razı olmadılar, "bizim də əhdimiz var" dedilər. Köhnə qayda ilə toy elədilər. Fayton və zurna-balaban işə düşdü. Lalə şəhərin bu başından o başına köçməli oldu. Qüdrət onun anasını da öz evinə gətirdi. Tükəzban qarı təkliyin daşını atdı. O, həyatda sevincin nə olduğunu yalnız bu gündən sonra layiqincə başa düşdü.

Gəlin də, onun anası da nəcib adam çıxdılar. Ər-arvad işə gedəndə evdə tək qalan qocalar, danışmağa söz, görməyə iş də tapırdılar. Gülsüm arvad daha kluba getmir, uzun illərin əziyyətindən sonra qızının və kürəkəninin sayəsində xoşbəxt ömür sürürdü. İndi Əlimərdanın arzusu yerinə yetdiyi üçün Gülsümün də ürəyi rahat döyünürdü. Arabir dərindən köksünü ötürür: "keşkə Əlimərdan sağ olaydı, qızını, kürəkənini görüb sevinəydi" deyirdi.

Şirmayı həyata ayaq basanda, Gülsüm də əri kimi dodaqlarında donmuş bir təbəssümlə dünyaya göz yumdu "mən xoşbəxt ölürəm"

dedi. Lalənin mədəninə yemək aparıb evə qayıdanda yağışa düşüb xəstələnmişdi. Ər də arvad da eyni xəstəlikdən öldü. Onların nəsli yaşadığı üçün hər ikisi "xoşbəxt ölürəm" deməkdə haqlı idi.

Amma Lalə hələ də bu ağrıları unutmamışdı.

O, atasını da, anasını da yaxşı xatırlayırdı...

**5**

Səhər Lalə gözlərini açanda, Qüdrəti çarpayısında görməyib təəccüb elədi. "Bu nədir, görünür o heç yatmayıb, gecə ikən trestə gedib" deyə düşündü, bu vaxt, yemək otağında bufeti açıb-örtən və səhər yeməyi hazırlayan qayınanasını çağırdı:

– Ana! Qüdrət hanı?

Tükəzban qüssəli bir təbəssümlə dedi:

– Mən səndən xəbər almaq istəyirdim, qızım... Anası ölmüşü deyəsən yenə də mədəndən çağırıblar.

– Yox, ana, o məndən küsüb gedib... – deyə Lalə köksünü ötürdü. O qalxıb geyinməyə başlayanda kabinetin yataq otağına açılan qapısı ağzında, saçlarını səliqə ilə daramış, yenə də cəhrayı lentini bağlamış, yanaqları azca qızarmış, gözləri sual və təəccüblə parıldayan Şirmayı göründü. Üzündə, yaşına heç də uyğun gəlməyən bir ciddiyyət vardı.

– Nə olub qızım? – deyə onun sifətindəki dəyişikliyi o dəqiqə sezən Tükəzban soruşdu.

Şirmayı gah nənəsinin, gah da anasının üzünə baxıb sükut edirdi. O, birdən Laləyə doğru yönəlib yenə eyni ciddiyyətlə xəbər aldı:

– Ana, "iradə" nə deməkdir?

Lalənin gözləri Şirmayının əlindəki kağız parçasına sataşdı və o, həyəcanla əlini irəli uzadaraq, kağızı dartıb aldı:

– Hər şeyi oxumazlar! – dedi.

– Öyrənmək istəyirəm, ana can, "iradə" nədir. – Qızcığaz püstə dodaqlarını büzdü və sualında heç bir qəbahət görmədiyindən, köyrəlib ağlamaq dərəcəsinə gəldi.

Lalə, baş tərəfi mətbəə hərflərilə çap olunmuş bloknot vərəqəsində bu sözləri oxudu: "Lalə! Hələlik mənim işimdə qüsur çoxdur. Ancaq mən heç kəsdən kömək ummaram. Mənim iradəm kafi qədər möhkəmdir və yarışda qalib gələcəyimə şübhəm yoxdur. Qüdrət."

Bu anda eşik qapısının zəngi çalındı. Şirmayı yüyürüb qapını açdı. Gələn onun musiqi müəllimesi Sədəf idi. O, tələbəsinin gözlərində parıldayan yaş damlalarını dərhal gördü:

– Şirmayı, nə olub sənə?

– Heç müəllimə... – deyə qızcığaz özünü saxlaya bilməyib hönkürdü.

Sədəf onun boynunu qucaqladı və yemək otağındakı pianonun yanına gətirdi. Bu zaman saçlarını arxaya darayıb, adəti üzrə boynunun ardında toplamış Lalə də gəldi. Sədəfə salam verdi. Onlar əl tutuşdular, hal-əhval bildilər.

Sədəf Şirmayını göstərib qaş-göz işarəsilə Lalədən soruşdu.

– Buna nə olub?

– Lazım olmayan şeyləri oxuyur, – deyə Lalə qızına tərs-tərs baxıb, üz-gözünü yığışdırdı. – Həmişə deyirəm məndən soruşmamış nə bir kağıza, nə də bir kitaba əl vurmasın. Sözümə baxmır... Sədəf xanım, gəlin, bizimlə çay için, sonra dərsinizə başlayın.

– Yox, yox sağ olun, mən bu saat içib gəlirəm, – deyə Sədəf onun təklifindən boyun qaçırdı və dərsinə başladı.

Sədəf beş il əvvəl dövlət konservatoriyasını bitirmişdi. Əri Mustafa müharibənin əvvəlində cəbhəyə gedib, Leninqrad uğrundakı qanlı hava vuruşmalarında həlak olmuşdu. Onun qəhrəmanlığına dair bir çox hekayə və nağıl yazılmışdı. Sədəf bu yazıları toplayaraq, xüsusi bir alboma yapışdırıb saxlayırdı. Mustafanın ölüm xəbəri gələndən bir neçə gün sonra onun şəklini böyütdürüb, kiçik otağındakı çarpayısının baş tərəfindən asmışdı. Mustafa uşaqlıqdan təyyarəçilər dərnəyinə davam etmiş və sonra hərbi məktəbdə oxuyub qırıcı təyyarəçi olmuşdu. Onların hissəsi Bakıda ikən orada düzəlmiş musiqi dərnəyinə rəhbərlik edən Sədəflə tanış olub sevişmişdi. Mustafa onun sadəliyini, o da Mustafanın mərdliyini bəyənmişdi. Onların toyundan ikicə gün sonra müharibə başlamış, Mustafa da o gündən cəbhəyə göndərilmişdi.

Qırx ikinci ilin ağır vuruşmalarında həlak olmuş Mustafanın ölüm xəbəri gələndə, Sədəf buna inanmadı. Əslində o bu xəbərə indi də inanmır, Mustafanın xəyalı ilə yaşayırdı. Bunu yaxşı bilən Lalə Sədəfin xətrini çox istəyirdi. O bəzən konsertlərdə oxuyan artistləri royalda müşayiət edər və dinləyiciləri çox razı salardı. Ancaq Mustafanın ölüm xəbəri gələndən sonra konsertlərdə çıxış etmir, onun yasını saxlayırdı. Köhnəpərəst olmasa da, ailə məsələsində ata-baba adətlərini sevirdi. Sifətdən o qədər gözəl deyildi. Ancaq ona çirkin də demək olmazdı. Orta boylu, nazik əndamı, sərt qara saçları, qaraşın sifəti, uzun kirpikləri, həmişə qüssəli görünən yumru gözləri və bir azca qalın qaşları vardı.

Ailəsi dağılandan sonra, İsmayılzadənin evindəki xoşbəxtliyə baxıb təsəlli tapırdı. O, Şirmayını doğma qızı kimi istəyir və onun musiqi dərslərindəki müvəffəqiyyətindən ana kimi sevinirdi. Ancaq gözlərindəki qüssə bir an belə onu tərk etmirdi.

Şirmayının dərsi qurtarmamış, Lalə küçədən maşının qudok səsini eşidib Sədəflə xudahafizləşdi, trestə yola düşdü.

Müəllimə isə bu günkü dərsindən razı deyildi. Şirmayının fikri dağınıq idi. O, taktların çoxusunu düz vurmurdu. Həmişə səbirli olmağa adət etmiş Sədəf bu dəfə də mülayim və mehriban bir səslə şagirdinin səhvlərini göstərir, o istədiyi kimi çalmayınca, yeni xanəyə keçmirdi.

– Əzizim, – deyirdi, – istedadlı gənclərin konserti olanda, musiqini yaxşı bilən adamlar gələcək. Ona görə hər taktı vuranda gərək diqqətli olasan. Yoxsa ikimiz də biabır olarıq.

Amma yenə də Şirmayı fikrini bir yerə toplaya bilmir, bəzən çox qaba səhvlər buraxırdı.

Sədəf tənəffüs verdi.

– Çayını iç, – dedi və Tükəzban qarı ilə söhbət zamanı Lalənin nə üçün onu danladığını öyrəndikdən sonra, elə bil məcburi çay içən Şirmaıya üz tutdu: – Anan haqlıdır, balaca uşaqlar hər şeyi oxumazlar.

– Niyə balaca oluram, müəllimə? – deyə Şirmayı etiraf etdi və bu yeni "təhqir"dən də incidi.

Sədəflə Tükəzban qarı bir-birlərinə baxıb gülümsədilər.

Sonra yenə də dərs başlandı.

– Konsertə çox az qalır, – deyə Sədəf ona bir də xatırlatdı, – səhnəyə çıxanda ürəyin bərk-bərk döyünəcək. Ancaq sən buna fikir vermə. Möhkəm ol. İradəni ələ al.

Şirmayı bu tanış səsi eşidəndə, cəld bir hərəkətlə başını çevirib Sədəfə baxdı:

– Müəllimə, – dedi, – "iradə" nədir? Anamdan soruşdum, cavab verməyib acıqlandı. Pis sözdür?

Sədəf onun saçlarını oxşadı:

– Əksinə! – dedi, – "iradə" çox böyük sözdür. Ancaq mən səni necə başa salım?

Sədəf bir an duruxub, sükut içində uzaq və məchul bir nöqtəyə baxdı. Ərinin həyatından yazılmış "İradə" adlı bir vaqeəni xatırladı. Hava vuruşmasında, üç ölümcül yara almış Mustafa öz təyyarə meydanına qayıtmaq əvəzinə, yaralarının müdhiş ağrılarını unudaraq,

canını dişinə tutub düşmən təyyarəsilə vuruşur, onu şəhərə yaxın buraxmaq istəmir, qolundan bir yara da alır, təyyarəsini tək əlli idarə edərək, düşmən quzğununu vurub yerə salır, yalnız bundan sonra çoxlu qan itirmiş və rəngi kağız kimi ağarmış halda qayıdıb öz təyyarə meydanlarında düşür.

Sədəf Şirmayıya bu vaqeəni danışmadı. Danışsaydı, özünü saxlaya bilməyib ağlayardı.

– "İradə" böyük sözdür, əzizim, – dedi, – əgər iradənin nə olduğunu bilmək istəsən, ata-anana və onun neftçi yoldaşlarına bax. Yağışda, qarda, çovğunda, boranda vuruşurlar, heç bir çətinlikdən qorxmurlar. Çünki onlar cəsur və iradəli insanlardır.

– Bəs anam məni niyə danlayır, müəllimə?

Sədəf cavab vermədi. Gözlərində sezilən qüssəli təbəssümünü gizlətmək üçün kirpiklərini aşağı saldı.

**6**

Lətifə ilə Tahir arasında da iradə məsələsi üstündə ixtilaf törədi. Kəşfiyyat buruğunda baş vermiş avariya min bir əziyyətlə ləğv olunandan sonra, onlar qayıqla sahilə gəlib, evə də birlikdə getməli oldular. Lətifənin qaşqabağı açılmır, o, bir dəfə də başını yuxarı qaldırıb Tahirin üzünə baxmırdı. Usta Ramazan bu işdə Tahirin müqəssir olduğunu açıb-ağartmadığı üçün Tahirə elə gəlirdi ki, Lətifənin belə incik görünməsinə səbəb yenə Cəmildir. "Bu şeytan oğlu şeytan niyə bizim aramıza girir?" deyə fikirləşib, ürəyini Lətifədən də gizlətmədi.

– Yenə nə olub, məndən sənə nə deyiblər?

– Nə deyəcəklər? Özüm bilmirəmmi?

– Mən də bilim də... Günahım nədir ki, üzümə baxmırsan?

Lətifənin gözlərində qəzəbli bir qığılcım yanıb söndü.

– O dəfə qaçdın, bir söz demədim. Elə güman elədim ki, uşaqsan, anadan uzaqda ürəyin darıxır. Qoca kişi tutub səni yoldan qaytarandan sonra, dedim yəqin səhvini başa düşmüsən, ağlını başına yığıb əməlli-başlı işləyəcəksən. Ancaq indi mən görürəm ki, yanılmışam. Sən zərrə qədər də ağıllanmamısan.

– Axı nə olub ey?

– Bundan artıq nə olacaq? Səni adam bilib iş tapşırıblar. Sən də kişinin adını batırırsan.

– Nə kişinin, hansı kişinin?

– Bura bax, Tahir, məni də, özünü də uşaq yerinə qoyma. Sən özün yaxşı bilirsən mən nəyi, kimi nəzərdə tuturam. Dünənki avariyanın səbəbi kim olub, hə? Yoxsa indi də Cəmil günahkardır?

– Sən onu az mənim gözümə sox!.. – deyə Tahir üzünü yana tərəf çevirdi.

– Səndən ömründə neftçi olmaz! – deyə Lətifə böyürlərindən ötüb gedən adamları saymayaraq səsini ucaltdı. Bu söz indi Tahirə ən ağır təhqir kimi tə'sir etdi. O, sərt və qəti bir hərəkətlə Lətifəyə tərəf döndü:

– Niyə olmur?

– Çünki neftçiyə üç şey lazımdır, onun heç biri səndə yoxdur.

– O nədir elə?

– Diqqət, cəsarət, iradə!..

Onlar vidalaşmadan ayrıldılar.

Tahirə dəyən bu zərbədən sonra, axşam, dərs vaxtı ona ikinci bir zərbə də dəydi. Cüməzadə yerin sirlərindən, gil məhlulunun axınından danışırdı. Bu anda sinif otağının qapısı açıldı və Qüdrət İsmayılzadə içəri girdi. Müəllimlə şagirdlər sükut içində ona baxdılar. yenə sual-cavab başlayacağını güman edirdilər. Ancaq o salam verib, Cüməzadəyə yanaşdı.

– Bağışlayın, yoldaş müəllim, üzr istəyirəm, – dedi.

Arxa sırada oturmuş Tahirin gözləri də İsmayılzadəyə zillənmişdi. Ürəyinə bir şey dammış kimi, gözlərini yerə dikdi, yanaqlarını qızartı bürüdü. Qüdrətlə Cüməzadə arasında belə bir mükalimə oldu.

Qüdrət – Tahir Bayramlı necə oxuyur?

Cüməzadə – Dərslərdən yaxşıdır.

Qüdrət – Doğrudanmı?

Ortalığa sükut çökdü. Qüdrət narazı halda başını buladı:

– İnanmıram, – dedi, – o həmişə hekayə və şeirlə maraqlanır. Kitablarının arasında bircə dənə də texniki əsər yoxdur. Bəs o necə oxuyur?

Cüməzadə Tahiri müdafiə eləmək istədi:

– Bütün dərslərdən beş alır, yoldaş İsmayılzadə.

Tahirin qaşqabağı açıldı. O gülümsündü. “Sağ ol, müəllim!” deyə ürəyində Cüməzadəni tə'riflədi. Amma Qüdrət yenə başını buladı.

– Məncə siz onu həddindən artıq tərifləyirsiniz, – dedi. – Tahir nə qədər iste'dadlıdırsa, bir o qədər də iradəsiz və diqqətsizdir. Düzdür, yox?

– Orası elədir, yoldaş İsmayılzadə, – deyə Cüməzadə istər-istəməz razılaşdı.

Tahirin üzü yenə tutuldu. O, gözlərini yerə dikdi. “Elə bil aralarında şərt bağlayıblar” deyə düşündü. Bu sözləri ona ayrılıqda desəydilər, əlbəttə, Tahirə bu qədər ağır gəlməzdi. Sabah bu əhvalatdan Lətifə də xəbər tuta bilərdi. Üçüncü zərbəyə dözmək üçün doğrudan da cəsarət və iradə lazımdır.

**7**

İki saatdan çox idi ki, kəşfiyyat buruğunda elektrik xətti korlanmışdı. Briqadanın tərkibində montyor olmadığı üçün bütün mexanizmlər dayanmış, fəhlələr işdən soyuyub, mə’dən idarəsindən montyorun gəlməsini gözləyirdilər. Hamının, xüsusən usta Ramazanla Vasilyevin ovqatı təlx idi. Boş keçən hər saat, trest müdirinə verilmiş təntənəli və’din vaxtında ödənilməsinə əngəl törədirdi. Oktyabr bayramı günü yaxınlaşır, bütün yerli qəzetlər xüsusi başlıq altında “fəxri lövhədə” qaliblərin adını qeyd edir; müxbirlər, fotoqraflar səhərdən axşama kimi mə’dənlər arasında gəzinərək, yarışa dair maraqlı mə’lumat toplayır, şəkillər çəkir, dəniz buruqlarını da yaddan çıxarmayıb, iki gündən bir usta Ramazanın yanına gəlib-gedir, onun vədini həm özünə, həm də qəzet oxucularına xatırladırdılar. Hələ dünən axşamüstü Moskvadan gələn müxbir, usta Ramazanın bütün briqadasının şəklini çəkmiş, buruqda işin gedişinə dair məlumat alıb qayıtmışdı. Usta, müxbirə cavanları, xüsusən Cəmili çox tərifləmiş, ancaq Tahirə dair bir kəlmə belə deməmişdi.

Bu dərd Tahiri yandırıb tökürdü. Lakin o, heç kimi təqsirləndirmir, bütün günahların yalnız özündə olduğunu dərk edir, quyudan uzaqda, buruğun taxta döşəməsi üstündə oturan, ayaqlarını aşağı sallayaraq söhbət edən, bir-birinə nə isə deyib gülən fəhlə yoldaşlarına qarışmırdı, hər zaman qayıq dayanan tərəfdə gəzinərək hey düşünür, bu rüsvayçılığı namusuna sığışdıra bilmirdi. Lətifənin son sözlərini xatırladıqca, ona ürəkdən haqq verir, “təqsir məndədir” – deyib tez-tez dərindən köksünü ötürürdü. İndi buruqda iş dayandığından, onun bütün fikri özündə, öz günahının ətrafında dolanırdı: “Ustanın gözündən düşmüşəm. Dünəndən bəri mənə baxdıqca elə bil düşməninə baxır”.

Tahir bu fikirdə ikən, böyrünə bir əl toxundu. Səksənmiş kimi dönüb baxdı. Cəmil idi.

– Nə olub, aşna, nə çox fikir eləyirsən? Bəri gəl, uşaqlar deyir ki, Tahiri çağır, oxusun.

O, Tahirin qolundan tutub aparmaq istədi. Tahir dartınıb onun əlindən qopdu:

– Yox, oxumayacağam. Mənim kefimə soğan doğranıb, bilmirəm siz nə haydasınız?

Amma o, Cəmilin bu gəlişindən razı idi: hər halda ilk dəfə onun qayğısına qalan Cəmil olmuşdu.

– Gəl, oxu, hamısı yadından çıxsın. Onsuz da üç-dörd saat boş oturacağıq. Montyor tapılası, o gələsi. Uzun çəkər...

Tahir gözlərini uzaqlara dikmiş, üzərinə axşam qaranlığı çökməyə başladıqca mavi rəngini itirib qaraya çalan sakit dənizə baxırdı. Üfüqdən görünən gəmi yavaş-yavaş böyüyür, Nargin adasının böyründən ötüb Bakıya sarı irəliləyirdi. Tahirin gözləri o gəmiyə baxırdı, amma fikri yenə də özü ilə, öz kədəri ilə məşğul idi. “Bu gündən sonra hər şey bir tərəfə, iş bir tərəfə” deyə düşünürdü.

– Deməli, oxumursan?

Tahir qaşqabağını turşudub, yavaşcadan, amma tərs bir cavab verdi:

– Cəmil, sən Allah məndən əl çək!..

Cəmil ondan aralanıb, yoldaşlarının yanına qayıtdıqdan sonra Tahir yenə dərin düşüncələrə daldı: “Usta müxbirə hamını tərifləyir, mənə gələndə...” Birdən onun başına tamam ayrı fikir gəldi: “Montyor gözləyirik. İş dayanır. Nə üçün? Montyorsuz keçinmək olmazmı?..” – Tahir o dəqiqə öz-özünü istehzaya qoydu: “Bu rüsvayçılıqdan sonra hələ bir ustaya məsləhət də verirsən? Hələ sabah iclasa çağırıblar. Özü də sənin məsələndir, tükünü didib yola salacaqlar. Niyə bunun dərdini çəkmirsən?”

Gəmi yaxınlaşırdı.

Tahir bir də ona baxanda, bu gün səhər qəzetdə oxuduğu bir qeydi xatırladı: “Dənizçilərin iş üsulu... Aha, bəs onlar niyə gəminin sürətini çoxaldırlar? Deməli, hər şey bacarıqdan asılıdır. Gərək baş işlədəsən...” Tahir günahını unudub, yalnız bu xüsusda düşünürdü: “Mənim borcum ustaya deməkdir. Bəyənər də yaxşı, bəyənməz də yaxşı. Yox, bəyənər, mən deyənin xeyri olar ki, zərəri olmaz”.

Tahir quyuya tərəf getdi. Yanaşı oturub söhbət edən ustalar onu gördülər, amma yenə özlərini görməməzliyə vurdular. “İkisinin də

mənim ilə arası dəyib. Fikrimi onlara desəm necə olar, hə? – Yox, gülərlər, daha da biabır olaram. Bəs boş keçən saatlar?.. Axı nə üçün boş keçsin?”

Tahir yenə tərəddüd göstərib geri qayıtdı. Gəmi iki-üç yüz addımlığa gələndə, bir az əvvəl xəyalından keçən fikri, indi ona rahatlıq vermirdi: “Cavan olanda nə olar?” Bu barədə o çox düşünüb-daşındı. Ən axırda qəti fikrə gəldi: “Ustaya ayrılıqda deyəcəyəm. Mənə gülsə də, qoy tək özü gülsün...”

Onlar gecə növbəsini çox səmərəsiz keçirib, yalnız iyirmi metr qazıdıqdan sonra Ramazanla bərabər sahilə qayıdırdılar. Tahir hamıdan beş-altı addım geridə yeriyir, ustanın fəhlələrdən ayrılmağını gözləyirdi. Ramazan briqada üzvləri ilə vidalaşıb, izdihamlı küçədən keçərək tində gözdən itincəyə qədər Tahir onu izlədi. Daldan gələ-gələ:

– Usta, – dedi, – zəhmət olmasa bir ayaq saxlayın.

Şagirdinin səsini eşidən usta dayanıb geriyə sarı boylandı.

– Hə, nə var, oğul? – deyə soruşdu.

– Yarımca saatlığa sizə gəlmək istəyirəm. Olarmı?

– Hə, nə sözün var? – deyə Ramazan qaşqabaqlı halda yenə soruşdu və Tahirin üzünə diqqətlə baxdıqda onun nə isə mühüm bir iş haqqında danışmaq istədiyini hiss elədi. – Burada deyə bilməzsən?

– Yox, usta... Ayaq üstündə deyiləsi söz deyil.

Ramazan Tahirin ağzını yoxlamaq üçün, səsinin ahəngini dəyişmədən xəbər aldı:

– Yoxsa yenə kəndə qayıtmaq fikrindəsən?

– Xeyr, tamam ayrı məsələdir. Mən istəyirəm sizə ayrılıqda, xəlvətdə deyim. İzin verin sizə gəlim, usta. Buruq barədə sözüm var.

– ”Buruq barədə... sözü var” – deyə düşünən usta, təəccüblə qaşlarını yuxarı qaldırıb, güclə sezilən xəfif bir təbəssümlə gülümsədi. Tahir onun üzündəki istehza ifadəsini dərhal görüb, udquna-udquna başını sinəsinə endirdi.

– Onda get dincəl, üç-dörd saatdan sonra gələrsən. Evdə olacağam.

– Baş üstə!

Usta yoluna düzəldi.

Tahir ümumi yaşayış evinə gələndə, Cəmil artıq çoxdan yatmışdı. O, nəfəs aldıqca adyalının üstündə örtülü halda duran kitab enib-

qalxırdı. Yarımaçıq gözləri azacıq qızarmışdı. Sağ əli kitabdan üzülüşüb yanına düşmüşdü.

Tahir də paltarını soyunub yerinə girdi, ancaq onun yuxusu göyə çəkilmişdi. Xəyalında Ramazanla söhbətə hazırlaşırdı. Əvvəlcə öz düşündüyünü deyir, sonra ustanın etirazlarını səbirlə dinləyir, yenə öz fikrini müdafiə edir, başqa dəlillər gətirirdi.

İki saatdan çox sağına-soluna buruldusa da, yata bilməyib ayağa qalxdı, paltarını geyindi. Cəmili oyatmamaq üçün səssizcə eşiyə çıxdı. Qonşuluqdakı bağa getdi. Tək-tənha gəzinərək, dünəndən bəri onu bu qədər həyəcanlandıran fikri hərtərəfli götür-qoy elədi.

...Usta Ramazan onu mehriban qarşıladı:

– Hə, buyur oğul, – dedi və Tahirin üzündəki ciddiyyəti yalnız indi görmüş kimi təəccüblə baxdı. – Niyə belə qəmginsən?

– Günah məndədir, usta... – deyə Tahir elə bil Ramazanın nüfuzedici baxışlarına dözməyib gözlərini yerə dikdi. – Amma söz verirəm ki, bundan sonra bir də elə səhv buraxmayacağam.

Qoca, şagirdinin səmimiyyətlə titrəyən səsindən, təcrübəli və yaşlı adamlara məxsus ciddiyyətindən, bu sözləri elə-belə, gözə kül üfürmək üçün yox, dərin bir etiqadla, iztirablı və uzun daxili çarpışmadan sonra dediyini hiss edib sevindi, ancaq bu sevincini büruzə vermədi:

– Baxarıq, – dedi, – gərək bunusöznən yox, işnən sübut eləyəsən.

– Elərəm, usta, elərəm. İndi mən çox şey başa düşmüşəm. Necə deyərlər, Allah qoysa siz də görərsiniz ki, mən söz verdim, eləyəcəyəm.

Tahir susdu. Müqəddiməsindən razı qalıb başını yuxarı qaldırdı, daha da inamla qocanın gözlərinin içinə baxdı.

– Başıma bir fikir gəlib, usta... – dedi – elə onu sizə deməyə gəlmişdim.

Usta Ramazan adəti xilafına səbirsizlik göstərdi.

– Hə, de görüm, de görüm...

– Dünən hesab elədim, düz dörd saat işi dayandırıb montyor gözlədik.

– Elədir, elədir, – deyə qoca daha da tələsməyə başladı.

– Çilingər lazım olanda, xarrat lazım olanda da bu cür gözləyirik. Əgər sabah boran qopsa, dörd saat yox, dörd gün, beş gün gözləyəcəyik. Mən görürəm, qızıl kimi saatlar boş keçir, bundan həm hökumətə ziyan dəyir, həm də bizə.

Ramazanın gözləri sevinclə parıldadı.

– Biz nə üçün bu qədər gözləyək, usta?

– Bəs neyləyək?

Bu işləri özümüz görə bilmərik? – deyə Tahir soruşdu, ancaq o bu sözləri sualdan çox, qəti bir hökm tərzində söylədi.

– Axı hərənin bir sənəti var. Nə sən, nə Cəmil, nə də Qrişa montyorluq bacarmır.

– Doğrudur, nə onlar bacarır, nə də mən. Ancaq öyrənə bilərik, ya yox?

– Əlbəttə, əlbəttə!

– Buruğa kənardan adam çağırıb əlimiz qoynumuzda gözləməkdənsə, hərəmiz bir sənət öyrənsək, lazım olanda da bu işləri özümüz görsək olmaz?

Ramazan sevinirdi. Ona xoş gələn, Tahirin bu təklifindən ümumi işə dəyəcək böyük xeyir deyildi, onu ən çox sevindirən, belə xeyirli təklifi lap əvvəldən, ilk görüşdən doğru tanıya bildiyi Tahir kimi bir şagirdindən eşitməyi idi.

– Bundan hökumətə xeyir gələcək, ziyan? – deyə Tahir izah etməyə başladı: – Əlbəttə xeyir... Ona görə ki, iki adam əvəzinə bir adam işləyəcək, deməli, iki maaş əvəzinə bir maaş veriləcək. Bundan başqa, o qədər boş saat havayı getməyəcək.

Usta Ramazan onun sözünü kəsdi:

– Yaxşı, bəs bu sənəti harada, kimdən öyrənəcəksiniz?

– Kimdən? Onu da fikirləşmişəm, usta. Klubda dərnək düzəldərik.

Ramazan indi daha çox tələsirdi:

– Yaxşı, deyək ki, sən montyorluq öyrəndin, bəs çilingərliyi kim öyrənəcək?

– Kim? O biri yoldaşlar... Axı, bir də mən tək öz buruğumuzu demirəm. O birisilər də bizim yolumuzla getsinlər də...

Tahir susdu. Onun ürəyində indi tamam ayrı bir narahatlıq baş qaldırdı: “Mənim səsimə səs verən olacaqmı?”

– Sağ ol, bala!.. – deyə qoca usta ayağa qalxdı, – sağ ol! Deməli, mən sənin barəndə yanılmamışam. Xeyirli sözə nə deyim?

Usta şagirdini qucaqlayıb öpmədisə də, bu onun az mehriban olmağından deyildi, usta Ramazan artıq inanırdı ki, bundan sonra Tahirdən belə-belə ağıllı sözləri çox eşidəcək və bu sözlər daxili bir

ehtiyacdan, nə isə yaratmaq, ümumi işə ürəklə yapışmaq ehtiyacından doğduğu üçün, bu gün də olmasa sabah onun kəşfiyyat buruğunda öz səmərəsini verəcək.

Tahir də ayağa qalxdı.

– İndi iclas var, usta. Mənim məsələmi qoyublar. Nə desələr haqları var. İzin verin gedim.

– Get, oğlum, get. Amma sözümüz sözdür.

– Əlbəttə, usta, əlbəttə!

**8**

Tahirin məsələsini müzakirə eləyən iclas çoxdan qurtarmışdı. O, pəncərənin qabağında oturub, boz və yovşanlı təpələrin arxasında batan günəşə baxırdısa da, fikri tamam başqa yerdə idi. Hamı çıxıb getmişdi. O isə hələ yerindən qalxmaq istəmirdi: "Məni yaman əzişdirdilər. Mənə hələ bu da azdır. Günah özümdədir. Usta mənə etibar eləyib iş tapşırdı, amma mən..." Tahir bunufikirləşə – fikirləşə özündən narazı halda başını buladı. Onu yandıran yoldaşlarının haqlı tənqidi deyildi. Tahirə yalnız Lətifənin sözləri ağır gəlirdi. Görünür, qızın son təklifini bütün ömür boyu unuda bilməyəcək idi: "Tahir heç vaxt düzəlməz," – Nə üçün düzəlməz? Kimin səhvi olmur ki? Ax, Lətifə! Sənə güvəndiyim dağlar, sənə də qar yağarmış!.."

Tahir Dadaşlını insafsız və daş ürəkli bir oğlan hesab edirdi. Amma hamıdan insaflı o danışdı: "Biz hər bir yoldaşımıza kömək etməyi bacarmalıyıq. Tahirin səhvi böyükdür, gərək bundan nəticə çıxarsın!"

– Düz deyir! Bax, mən də kişi kimi söz verirəm ki, bu mənim axırıncı səhvim olacaq!..

Tahirin dediyi bu sözlər, indi özünə də xoş gəlirdi. İclasdakılara da bu vəd səmimi bir təsir bağışlamışdı. Yalnız Lətifə gözlərini yerə dikib yenə də istehzalı bir tərzdə gülümsəyirdi. Deyəsən yalnız o Tahirə inanmırdı. "Axı niyə inanmasın?" Tahir yerindən qalxdı, qapıya tərəf addımladı. Eşiyə çıxdı. İxtiyarsız olaraq Lətifəgilin evinə doğru getməyə başladı: "Yox, gərək onu görüb ürəyimi boşaldam. O nə üçün mənə inanmır?"

Fəhlə qəsəbəsi üzərinə axşam qaranlığı çökürdü. Hələ də fənərləri yandırmamışdılar. Asfalt yolla şütüyüb keçən minik və yük maşınları da Tahiri öz düşüncələrindən ayıra bilmirdi. Kim isə onun qulağının dibində qışqırdı:

– Kar deyilsən ki?

Yalnız indicə başını yuxarı qaldıran Tahir, yolun ortasında, düz çənəsinin dibində dayanmış ZİS maşınını görüb, bu sözlərin özünə aid olduğunu anladı və cəld kənara sıçradı.

"Lətifəni görüm, görməyim?" deyə bir müddət səkidə dayanıb tərəddüd göstərdi. Yanındakı dirəkdə fənərlər yandı: "Tahir heç vaxt düzəlməz!" sözləri yenə onun qulağında səslənir, Lətifə isə ilk günlərdə gördüyü kimi istehza ilə gülümsəyirdi: "Görəcəyəm!" deyə Tahir təpənin döşünə qalxan daş pilləkənlə yuxarı dırmanmağa başladı: "Niyə hamı mənə inanır, amma o?.."

– Hara belə, Tahir? – deyən bir qız onun arxasından səslənəndə, Tahir tez dönüb baxdı: Lətifə idi. Tahir gözlərinə inanmadı. O bu zaman haradan gəlirdi?

– Hara gedirdin?

Artıq utanmaq yeri deyildi:

– Sizə! – dedi və dik-dik qıza baxdı.

– Bizdə nə var?

– Anana, atana şikayət edəcəyəm.

Lətifə güldü:

– Nədən?

– Qız olasan, belə daş ürəyin ola?

Tahirin qaşqabağı yerlə gedirdi. Amma Lətifə isə elə bil onu daha da cırnatmaq üçün qayğısız bir təbəssümlə gülürdü.

– Sözün doğrusunu dediyim üçünmü?

– Sözün doğrusu... – Tahirin üz-gözü əyildi. O daha qızın gözlərinə güz baxa bilməyib, başını aşağı saldı. – Axı sən nə haqla mənə inanmırsan?

– Onu özündən soruş.

– Mənim günahım nədir ki?

Hər ikisi susdu. Lətifə düşünürdü: "Aha, görünür sözlərimin təsiri olub..."

– Bura bax, Tahir, atama şikayət eləsən, bundan təkcə sənə ziyan dəyər. Əgər o bilsə ki, sən buruğu korlamısan, elə orada tutub, qulağını dibindən qoparar.

– Buruq niyə korlanır? Axı bilmirəm sizə nə düşüb ey? Usta Ramazan yalan olub, siz gerçək. O kişi bir söz deməyə-deməyə, bunlar ona vəkillik eləyirlər.

– Bax, sən hələ də səhvini başa düşməmisən.

– İclasda yadımdan çıxdı deyim: “Yalnız ölülər səhv etmirlər...”

– Hikmətli sözləri əzbərləmək azdır, başa düşmək lazımdır! – deyə Lətifə soyuqqanlı halda Tahirin üstünə ayaq aldı. – Doğrusu, mənim sənə yazığım gəlir.

– Özünə yazığın gəlsin! Tahir dabanı üstə geriyə fırlanıb uzaqlaşdı. Lətifə onun dalınca bir neçə dəqiqə baxıb yerindən tərpənmədi: “Tərs!” deyə ucadan səslənib, daş pillələri dırmaşdı.

Tahir isə düz evə gəldi. Otaqlarında heç kim yox idi. Çarpayıda uzanıb əlfəcinli kitabı əlinə aldı. Oxumaq istədi, amma fikrini toplaya bilmədi: “Bu qız niyə mənə düşmən olsun?” deyə öz-özündən soruşdu. Bu suala cavab tapa bilməyib, yerində qurcalanmağa başladı.

Bu halda Səməndər içəri girdi.

– Tahir, kefini pozma, – dedi. – Belə şeylər çox olar.

– Eşitmədin zalım qızı nə deyirdi?

– Pişik balasını istədiyindən yeyər.

– Nə o pişikdir, nə də mən balası.

– El məsəlidir də... Bir de görüm, nə əcəb işə getməsisən?

Tahir cavab vermədi. Bu sirri hamıdan gizli saxlamaq istəyirdi. Ancaq Səməndərin səmimi qıyıq gözlərinə baxanda, “sənə inanıram, açıb söyləyəcəm” deyə düşünüb, əvvəlcədən şərt kəsdi.

– Əgər öz aramızda qalsa, deyərəm. Kişi kimi söz ver.

– Verirəm.

– De sən öl, daşdan səs çıxar, məndən yox.

Tahir yenə imtahanedici bir nəzərlə dostuna baxdı: bir sən, bir də Allah... yox ey, elə ikimiz bilirik.

Səməndər pərt olub udqundu.

– Qayıtmayacaqsan?

– Yox, qayıdacağam. Ustaya söz vermişəm. Qayıtmasam, kişilikdən olmaz. Sən elə bilirsən ki, trestimizin geri qalmağı mənim qeyrətimə toxunmur? Nə təhər olsa qayıdacağam.

– Gedirsən, izin al get.

– Ustadan izin istəyəcəyəm. Əlbəttə ki, izinsiz getmək yaxşı olmaz.

Səməndər bu səfərin məqsədini bilmək üçün:

– Nə olub ki? – deyə soruşdu. – Olmaya yenə anandan kağız gəlib?

– Yox. Kağız üçün yox. Ayrı fikrim var.

– Nədi axı?
– Bax, bunusənə deməyəcəyəm. Bu sirri tək özüm bilirəm.
Səməndər nə qədər təkid etdisə də, Tahirdən səs çıxmadı.
– Mən gələndə biləcəksən. Tələsmə!
O, yeni aldığı balaca çamadanını götürüb, vağzala hazırlaşanda, Səməndərin ürəyində nə üçünsə yenə şübhə oyandı:
– Ayə, birdən qayıtmazsan ha?
– Yox, sən öl qayıdacağam!
O, Səməndəri qucaqladı:
– Bakıya elə öyrəşmişəm ki, dünya da dağılsa qayıdacağam, – deyib otaqdan çıxdı.
Səməndər yalnız indi başa düşürdü ki, Tahirdən ayrı onun ürəyi bərk darıxacaq.

## ALTINCI FƏSİL

### 1

Qüdrəti şəhər partiya komitəsinə çağırmışdılar. O, başqa trest müdirlərinin də burada olacağını bilirdi. Lalə ilə öz arasında baş vermiş o nazik ixtilafın da, bütün müşkülləri həll edən bu yerdə, hamının ümid mənbəyi və nüfuzlu söz mövqeyi saydığı bu binada öz xeyrinə, yəni onun düşündüyü kimi həll ediləcəyinə inanmasaydı, payız gününün bürkülü havasında tərləyə-tərləyə bu hündür binanın dik pillələrini belə həvəslə qalxmazdı, bir bəhanə ilə özünü xəstəliyə vurar, ömründə yalan demədiyi halda belə bir yalanı söyləməkdə zərrə qədər də tərəddüd göstərməzdi. Onu hər yerdə həmişə haqlı saymışdılar. Onun iş təcrübəsi çoxlarına, hətta istəkli arvadı Laləyə belə nümunə göstərilmişdi. Qüdrətə elə gəlirdi ki, bu yüksək mövqeyi itirmək yalnız onun şəxsi duyğularını deyil, bir də, çoxdan bəri vərdiş halına gəlmiş iş üsullarını təhqir edir. Əgər burada inadlı mübarizə zərurəti hiss olunsaydı, o, heç bir vuruşmadan geri durmayacaqdı. Qüdrət özünü haqlı saydığı vaxt, ixtiyarca ondan yuxarıda duran adamlarla da vuruşmağı bacarır, müvəqqəti məğlub olsa da ruhdan düşmür, hər zaman, hər yerdə inadla, mərdlik və cəsarətlə fikrini müdafiə edirdi.

O, tavana qədər uzanan divar şkafları ilə örtülmüş və kabinetdən ziyada kitabxanaya bənzəyən geniş bir otağa girib, göy mahudlu uzun stol ətrafındakı ağ parusin örtüklü kürsülərdə əyləşmiş dostlarını, tanışlarını və onların arasında başını aşağı dikib oturmuş Laləni görərkən, təxminində yanılmadığına sevinmiş kimi, tez gəlib yer tutdu. Usta Ramazan da burada idi. Lalənin sağ tərəfində əyləşmişdi.

Otağın baş tərəfindəki dəyirmi stol üstündə düzülmüş bir biçimli telefon aparatlarından azacıq aralı duran enli yazı stolu arxasında şəhər partiya komitəsi katibi Aslanov oturub, diqqətini bir yerə cəmləyərək, qabağındakı vərəqləri oxuyur və əlindəki qırmızı karandaşla arabir nə isə qeydlər edirdi. Onun yanında ayaq üstündə durmuş qadının da bu mühüm vəsiqəni gözlədiyi aydın idi.

Katib iş və mübarizədə saç ağartmış adamlardan biri idi. O, gənc yaşlarında Bakı fəhlələrinin mübarizəsində yaxından iştirak etmiş, gizli inqilabi fəaliyyətinə görə dəfələrlə həbs olunub, sürgünə göndərilmişdi. Onun həyatında baş verən hadisələri doğma partiyasının tarixindən ayırmaq çətin idi. O, cəbhədəki vuruşmalardan sonra, bunlardan heç də asan olmayan bir mübarizəyə atılmışdı. Onu dəfələrlə öldürmək istəmişdilər. Lakin xalq onu gözü üstündə saxladığından, ona atılan güllələrdən heç biri hədəfə dəyməmişdi.

Aslanov bəzən ciddi müvəffəqiyyətsizliyə uğrasa da ruhdan düşməmiş, xalqının düşmənləri ilə mübarizədən bir an belə geri durmamışdı. O, saysız-hesabsız dostlarının gücünə arxalandığından, ən axırda qalib gələcəyinə heç bir zaman şübhə etmirdi. O müxtəlif sahələrdə işləmiş, xalqının maarifini, təsərrüfatını yüksəltmək üçün yorulmaq bilmədən çalışmışdı. O, özünü sıravi bir əsgər saymaqla həmişə fəxr edirdi. Azərbaycanın ən uzaq guşələrində belə onun ağır döyüşlərdə sınanmış saysız-hesabsız dostları vardı. Bu dostlar kənd yerində, rayon mərkəzində gözlərinə dəyən böyük qüsurları başqalarına deməkdən çəkinsələr də, Aslanova həmişə deyə bilərdilər. O, hansı vəzifədə işləsə, xalqının arzu və xəyallarını inadla həqiqətə çevirirdi. O, xeyli qocalsa da, hərəkətində, danışığında yenə eyni qüvvət və iradə hiss olunmaqda idi. O, yalnız bir neçə ay əvvəl nəhəng vuruşmalardan çıxmış ölkəmizin yeni daxil olduğu quruculuq cəbhəsinə də eyni qüvvət və iradə ilə atılmışdı. İstirahət vəd edən bu dövrdə, onun gündəlik yuxusu indi bir saat da azalmışdı: "Müharibə qurtardı, lakin vuruş davam edir" – bu fikri o təkcə özünə deyil, bütün yoldaşlarına da təlqin edirdi.

O, axşamlar yeni kəşfiyyat buruqlarında, quruda və suda gedən bu qansız vuruşmalarda sıravi bir əsgər kimi iştirak edir, lakin çoxları ondan məsləhət və kömək alırdı. O, pambıq tarlalarında, səs-küy salmadan kolxozçu kəndlinin işinə göz qoyur, ona aqronomdan da yaxşı məsləhətlər verirdi. Aslanovun ən çox inandığı bir həqiqət vardı: partiya xalqın həyat və səadətindən ayrı yaşaya bilməz. O, azı on saatdan bəri işləsə də, özünü son dərəcə gümrah hiss edirdi. Müşavirəyə toplaşanların gözü onda idi. Aslanovun neçə gündən bəri mədənləri dolaşdığını, fəhlələrlə söhbət etdiyini və işin sürətini ləngidən səbəbləri yerindəcə öyrəndiyini, burada oturanların hər biri öz-özlüyündə bilirdi. Hamı ondan bu müşahidələrin yekununu öyrənməyə tələsirdi. Onun tənqidindən qorxanlar olduğu kimi, məsləhət gördüyü tədbirlərdən böyük ümid gözləyənlər də vardı. Bu sonuncuların sayı hər zaman çoxalır, qorxu hissi öz-özünə ürəklərdən yavaş-yavaş silinirdi. Bacardığını əsirgəməyənlər üçün katib həmişə yaxın dost və məsləhətçi idi. Beləliklə onu, o da belələrini sevirdi. Aslanovun tənqidi sərt olsa da, aradakı çətinlik bu tənqiddən sanki o dəqiqə azalırdı.

Elə bunun üçün də hamı onun dillənməsini səbirsizliklə gözləyirdi.

Nəhayət, Aslanov qabağındakı vəsiqənin son sətirlərini oxuyub, üzünü qadına tutdu:

– Yoldaşlara mənim adımdan tapşırın ki, yazı üslubunun anlaşıqlı olmasına diqqət yetirsinlər, – dedi. – Buradakı sözlərin doxsan faizi artıqdır. Bizim hər bir vəsiqəmizdə partiyanın üslubu görünməlidir: az söz, çox məna! – Bunların yazdığından isə tamamilə yanlış bir məna çıxır. Guya yeni neft yataqlarının varlığı təxmin olunur. Halbuki bu belə deyildir. İndi artıq sübut olunmuşdur ki, bütün Azərbaycan torpağında yeni və zəngin neft mənbələri vardır.

Aslanov iclasdakılara baxdı.

– Əgər, – dedi, – bu yalnız fərziyyə olsaydı, Mərkəzə bunuyazmağın nə mənası vardı?

Qüdrət: “Aha, məktubdur!” – deyə xəyalından keçirdi. Aslanov isə artıq izaha ehtiyac görməyib, bir neçə yerini cızıb qaraladığı kağızı yanındakı qadına verdi. Qadın çıxıb getdikdən sonra katib, müşavirənin üzürlü səbəbə görə gec başladığını söyləyərək: – Hamı gəlmişdirmi? – deyə soruşub, müşavirəyə toplaşmış adamları tələsmədən, iri, ala gözlərinin sakit baxışları ilə süzdü.

Onu çoxdan tanıyan Qüdrət bu sakit, lakin nüfuzedici baxışlardan müşavirəyə nə üçün çağrıldıqlarını bilməyə tələsdi. Ancaq Aslanovun fikri, bircə dəqiqə əvvəl oxuyub qadına verdiyi məktubda idi. Qüdrət onun neft məhsuluna nə qədər diqqət yetirdiyini, bəzən bu işin hər bir təfərrüatına necə fikir verdiyini yaxşı bilirdi. Qüdrət, neft istehsalına dair qəzet səhifələrində gündəlik məlumatı oxuyanda, katibin üzünü görməsə də sevindiyini və ya kədərləndiyini dərhal təyin edə bilərdi. Çünki neft, respublikada görülən bütün işlərin barometri sayılırdı. Katib neft istehsalının hətta bir faiz azaldığından xəbər tutduqda, yalnız pambığın, təzə salınmaqda olan asfalt yolların və payız əkininə hazırlaşan traktorların deyil, uzaq kəndlərdəki onillik məktəblərin və qiraət komalarının da taleyi üçün həyəcan keçirməyə başlardı. O:

– Bakı ölkənin damarlarına təzə qan dağıdan bir ürəkdir. Bu ürəyin döyüntüsünü dinləyən hər kəs, bütün ölkənin səhhətini öyrənə bilər! – deyəndə, qanadlı sözlərə həvəs göstərmir, uzun illərdən bəri möhkəmləşmiş əqidəsini ifadə edirdi.

– Bir məsələ üçün sizə zəhmət vermişəm, – deyə katib danışığına sadə, lakin qəti bir tərzdə başladı. – Yeni il yaxınlaşır. Bir azdan sonra, görülmüş işlərə yekun vurub, təzə il üçün də plan düzəldəcəyik. Müxtəlif sahələrdə çalışan yoldaşlar həmişə orta rəqəm götürürlər. Əlbəttə, onlar geridə qalanların səviyyəsinə enməməkdə, haqlı, lakin qabaqda gedənlərin səviyyəsini əsas meyar saymamaqda isə haqsızdırlar. Artıq biz elə bir dövrdə yaşayırıq ki, xalqımızın kütləvi qəhrəmanlıq göstərməsi üçün hər növ imkan yaranmışdır. Dövlətimizi indi orta rəqəm qətiyyən kifayətləndirə bilməz.

Qüdrət yerində qurcalandı: “Mən haqlıyam” deyə fikirləşdi və trestdə çağırdığı müşavirə zamanı, usta Ramazanın briqadasını meyar götürüb, planı yüz iyirmi faizə qaldırmağı təklif etməkdə haqlı iş gördüyünü düşünəndə, mühəndis Fikrətin çıxışını xatırladı. Bundan başqa, indidən Aslanovun yeni ildən danışması da ona heç təəccüblü görünmədi. Katibin iş üsulu belə idi. Xırmanda yabalaşmamaq üçün şərti şumda kəsməyi sevirdi.

– Məsələn, – deyə o, yavaş-yavaş Ramazana yaxınlaşdı, – bizim bu köhnə dostumuz o qədər cavan olmasa da, yüz iyirmidən aşağı enmir. Dünən onun kəşfiyyat buruğunda idim. Briqada üzvlərinin çoxusu cavan uşaqlardır. Halbuki təcrübəli fəhlələrin işlədikləri buruqlarda imkan daha çoxdur. Amma bu nə təhər olur ki, Ramazan ava-

riyalarla vuruşa-vuruşa yenə də hamınızdan irəlidədir? Məncə bunun yeganə bir səbəbi vardır: çünki o, irəli getməyi vərdiş və ənənə halına gətirmişdir. Bəziləri isə əksinə, ən böyük mənanı geriləməkdə görür. Onu trestə inanıb göndərmişik. Bəs nə üçün o öz ənənəsinə xəyanət edir?

Çox soyuqqanlı deyilən bu sözlər Qüdrəti ildırım kimi vurdu.

– 86 faiz azdır, yoldaş İsmayılzadə. İki ayda 15 faiz çox azdır. Lalə İsmayılzadəni götürün!

Qüdrət qulağının dibinəcən qızardı, yanaqları xal-xal oldu. Az qala bütün ümidləri alt-üst olub getdi.

– Azdır, yoldaş Lalə, azdır! – deyə katib sözünə davam etdi. – Srağagün bir ayda əlli metr qazan ustanıza rast gəldim. Bu nədir?

Qüdrət dərindən nəfəs aldı: “Hələ mənə briqada göndərməyindən xəbəri yoxdur” deyə fikirləşdi.

– Bilirəm, başqa trestlərə də kömək edirsiniz, – deyə katib Lalənin utandığını duyub gülümsədi. – Əlbəttə, mən sizi başa düşürəm. Ancaq belə köməklər, bəzən ziyan da verə bilər.

– Düzdür, – deyə Qüdrət yerindən söz atdı. – Bu, avral əhval-ruhiyyəsi yaradır.

– Ramazan buna razı ola bilməzdi. Briqadanı geri yollamaqda mən ona haqq verirəm. Əlbəttə, qazıma planını hər gün yüz iyirmi faiz ödəyən bir usta bu köməyi təhqir hesab etməkdə haqlıdır. Məgər trestin geriliyi yalnız fəhlə qüvvəsinin azlığındandır? Əlbəttə, yox! Fəhlə qüvvəsindən səmərəli istifadə edilmir!

Adi bir qəzet üslubunda, ancaq dərin bir atəşlə deyilən bu son cümlə Qüdrətin qulağında yeni bir ahənglə səsləndi. Ona elə gəldi ki, çoxdan bildiyi bu adi və sadə həqiqəti, əsil mənasında yalnız indi başa düşür.

– Yoldaş İsmayılzadə, – deyə Aslanov Qüdrətə üz tutdu, – söyləyin görüm, nə üçün üç yüz beşinci buruqdan yalnız əlli ton neft alınır? Görünür, yoldaşlar nəyi isə korlayıblar. Mən o buruğa çoxdan bələdəm.

Qüdrət ayağa qalxdı. Trestindəki bütün köhnə quyularla yaxşı tanış olduğu üçün, katibin nəyə işarə etdiyini bilirdi.

– Belədir, – deyə bir an duruxdu və sonra həyəcanını boğmağa çalışaraq, sakit və təmkinli bir tərzdə izaha başladı: – Həmin buruq doğrudan da trestin gözü hesab olunur. Ancaq məsələ burasındadır ki,

yeni tədqiqat nəticəsində min səkkiz metr dərinlikdə əlavə bir təbəqənin olduğunu aydınlaşdırmışıq. Əlbəttə, mən ondan yuxarıkı qatı işə sala bilərdim və oradan gündə əlli ton deyil, yüz əlli ton ala bilərdim. Mən bu yolla getmək istəmədim. Çünki...

– Aydındır, aydındır, – deyə katib onun mühafizəsi ilə razılaşdı. – Mən sizi əyri yola çəkmək fikrində deyiləm. Belə təsadüflərdə mühəndislərimizin saf vicdanına etimadla yanaşmaq lazımdır. – Katib İsmayılzadənin bu hərəkətini tərifləməyə başladı. – Siz haqlısınız, yoldaş İsmayılzadə. Bəziləri müvəqqəti şöhrət üçün, əlbəttə, aşağıdakı qatı buraxıb yuxarı təbəqəyə qalxardı, amma bu cür üsul dövlətə xəyanətdən başqa bir şey deyil!

Neftçilər arasında belə söhbətlərin mənasını aydınlaşdırmağa ehtiyac yox idi. Katib "müvəqqəti şöhrət" deyərkən, faizi tez yuxarı qaldırmaq üçün minlərcə ton nefti itirən adamları nəzərdə tuturdu. Belə hallarda dövlətə xeyir deyil, ziyan dəyirdi. Yaxşı neftçi isə ölkənin gələcəyini düşündüyündən söyülməyə razı olur, amma bir damcı nefti itirməyi, katibin dediyi kimi, xəyanət sayırdı. Qüdrətin hesabına görə üç yüz beşinci buruq hələ yarım il bu qayda ilə işləməli, sonra isə yuxarı təbəqə "güllələnməli" və Aslanovun nəzərdə tutduğu bol məhsul alınmalı idi.

– Ancaq mən bilirəm ki, həmin təbəqədən gündə əlli tondan çox alına bilər. Bir də yoxlayın! – Katib artıq, tərifdən məsləhətə keçdi: – İmkanlarınızı diqqətləmi yoxlamısınız? Bir də baxın! Məncə, əlli ton, buruğun imkanından azdır.

Qüdrət istər-istəməz razılaşdı:

– Ola bilər, – dedi, – mən sabahdan özüm gedib oranı bir də yoxlaram.

– Çox gözəl. Əyləşin.

**2**

Dmitri Minayev yeni ixtirasını müvəffəqiyyətlə tamamladı, bir neçə dəfə diqqətlə yoxladıqdan sonra bütün çertyoj və izahlarını aparıb, "Azərneft" birliyi nəzdindəki ixtira bürosunun müzakirəsinə verdi. Çox keçmədən onun özünü də çağırdılar. Müzakirə vaxtı fikirlər haçalandı. Onu müdafiə edənlərlə yanaşı, ixtiranın əhəmiyyətsizliyini söyləyənlər də az olmadı. Qəti rəyə gələ bilmədilər. Ancaq Dmitri Semyonoviç aydın hiss edirdi ki, burada danışanlar nə üçünsə öz fikir-

lərini açıq deməkdən çəkinir, kimdən və nədənsə qorxurlar. Layihə bu müzakirədən sonra "Azərneft" birliyi rəisinin bütün mühəndis-texniki işlər üzrə müavininə veriləcəkdi. Minayev haqq-hesabında yanılmadığına, layihəsinin gec-tez müsbət qiymət alacağına əmin idi.

O, bu ümidlə də müşavirədən çıxıb getmək istəyəndə, müzakirə zamanı ağzına su alıb oturmuş bir mühəndis dəhlizdə onu saxlayıb kənara çəkdi və tez-tez yan yörəsinə baxaraq, ucadan danışmamağa səy edərək dedi:

– Dmitri Semyonoviç, bəlkə elə layihənizə zidd gedənlər də ürəklərində sizə tərəfdardırlar. Amma onlar Mirzəyevdən çəkinirlər. Onun razılığını almaq, necə deyərlər, qıl körpüdən keçmək kimi bir şeydir.

Mirzəyev "Azərneft" rəisinin müavini idi. Onun haqqında çox adam bu fikirdə idi. Mühəndis, Minayevə dediyi sözlərin qarşısında təşəkkür əvəzinə etiraz eşitdi.

– Əzizim, nə üçün bunumüşavirədə demirdiniz? Qorxurdunuz?

Mühəndis boynunu yana sarı əyib çiyinlərini çəkdi, uzun kirpiklərini aşağı saldı.

– Doğrusu, hə, – deyə etiraf etdi. – Məsələ belədir ki, bir kəlmə Mirzəyevin əleyhinə danışdın ömürlük düşmənin olacaq. Yaxşı deyirlər ki, onu tənqid edəndə gərək əlində çamadan, cibində dəmiryol bileti, kabinetin qapısı ağzında dayanasan, sözünü deyib qurtarandan sonra, oradan bir baş vağzala gedib, naməlum istiqamətdə yola düşəsən. Buna da ki, çox adam razı olmaz. Çünki vətənindən didərgin düşmək heç kəsin ürəyindən deyil.

Dmitrinin qanı başına vurdu:

– Ax, siz!.. Hələ bir mühəndis adını da daşıyırsınız!

Mühəndis narazılığını gizlədə bilmədi.

– Məni niyə təqsirləndirirsiniz? Mənim günahım nədir?

Minayev əsəbi bir tərzdə qolunu qaldırıb saldı, dişini qıcadı və mühəndisə baxa-baxa başını buladı:

– Günahınız çoxdur, – dedi, – əvvəla odur ki, siz orada fikrinizi deməkdən qorxursunuz, ikincisi də, dalda danışırsınız. Doğrusu belə şeylərdən mənim xoşum gəlmir.

– Axı... Dmitri Semyonoviç... mən...

Minayev artıq onu dinləməyib, Mirzəyevin qəbul otağına tərəf yönəldi və onun qapısına əl atanda, stolun dalında oturub telefonda kimi isə acılayan katibənin cır səsini eşitdi.

– Yoldaş Mirzəyev bu gün heç kəsi qəbul etmir!

Lakin Dmitri onun sözünə əhəmiyyət vermədən özünü içəri saldı. Saysız-hesabsız portretlərlə bəzənmiş uzun otağın qurtaracağında, pəncərə qabağındakı enli yazı stolunun dalında böyük bir iştah ilə səhər naharı yeyən yoğun, gödək adam Minayevi gülər üzlə qarşıladı və əlilə qabağında ona yer göstərdi.

– Əyləşin, Dmitri Semyonoviç, – dedi, – sizdən nə əcəb?

Mirzəyevin bu nəzakəti də Dmitrinin qəzəbini soyutmadı.

– Sizə nə olub? Nə üçün kefiniz yoxdur? – deyə Mirzəyev yeməklə dolu ağzını əlilə örtdü və nəhayət yeməyi uddu...

Minayev oturmadı:

– Mən bir sualıma cavab almaq üçün buraya gəldim. Naharınızı qurtarın, mən gözlərəm.

– Eybi yoxdur, eybi yoxdur, mənə mane olmursunuz, buyurun.

Dmitri Semyonoviçin ilk sualı bu oldu:

– İnsanlarda ikiüzlülük nədən əmələ gəlir, yoldaş Mirzəyev?

Mirzəyevin qalın və əyri qaşları dartıldı.

– Mən mühəndisəm, psixologiyadan başım çıxmır, – dedi.

– Amma siz rəhbər işsiniz!

Mirzəyev Dmitrinin bu sözlərində nə isə bir istehza nidası duydu, nə qədər özünü saxlayıb ona cavab verməmək istədisə də, bacarmadı.

– Necə məgər, bəlkə sizin buna şübhəniz var?

– Bəlkə görünür ki, var, – deyə Minayev kirpiklərini qırpmadan müsahibinin gözlərinin içinə baxdı. – İkiüzlülük qorxudan əmələ gələn bir xəstəlikdir, yoldaş Mirzəyev.

– Bu məlumatınız üçün sizə yalnız təşəkkür edə bilərəm, – deyə Mirzəyev kinayəli bir əda ilə başını qaldırıb saldı. – Ancaq mən bilmək istərdim: bu sözləri deməkdə məqsədiniz nədir?

– Məqsədim odur ki, bəlkə də sizə məlum olan bir həqiqəti təkrar edim. Siz ixtira büronuzda bəzi yoldaşların gözünü necə qorxutmuşsunuzsa, öz fikirlərini deməyə ehtiyat edirlər, daha doğrusu qorxurlar.

Mirzəyev yerində gərnəşdi:

– Qorxmamaq üçün gərək fikir, fikir olsun. Aydındırmı?

– Aydındır. Lakin o qədər də düz deyil. Əgər onların rəyi sizin üçün bu qədər əhəmiyyətsizsə, nə üçün büroda işlədirsiniz?

Mirzəyev rəsmiyyətə keçdi:

– Bilirsinizmi, bu yalnız mənə aid məsələdir. Bu işə mən cavabdehəm. Mən də adamları seçməkdə müstəqiləm. Ancaq bilmək olmazmı, nə məsələdir?

– Mənim ixtiram...

– Aha, sizi danışdıran yalnız şəxsi mənfəət duyğularıdır!

– Mən bu dildə danışmağa adət eləməmişəm, yoldaş Mirzəyev.

– Mən də. Baxarıq. Yoxlarıq. Yaxşı ixtira bizi hər zaman sevindirir.

– Büronuzda bununə üçünsə görmürəm.

– Görərsiniz, görərsiniz!

Mirzəyev gözlərini yerə dikdi. Danışığın bitdiyini Minayevə hiss etdirdi. Minayev sürətlə çıxdı və bir baş Lalənin yanına gəldi. Əhvalatı ona danışdı.

Lalə telefonun dəstəyini götürdü:

– Qüdrət, – dedi, – sən Dmitrinin ixtirası ilə tanış ol. Mirzəyev bilmirəm nə vaxta qədər bizə mane olacaq? Hər halda belə şeylərə soyuqqanlı baxmaq yaramaz. Müşavirə? Mən tanışam. Sən də tanış olandan sonra çağıraq. Ümumi fikrimiz olsun. Belə yaxşı deyilmi? Aha, göndərərəm. – Lalə dəstəyi yerindən asdı.

– Çertyojları göndər Qüdrətə. Birgə müşavirədə özümüz müzakirə edərik!

Dmitri, üzərindən ağır yük götürülmüş kimi, dərindən nəfəsini dərdi.

**3**

Qüdrət hər iki trestin mühəndisləri ilə bərabər Lalənin kabinetində oturub Minayevin yeni ixtirası ilə tanış olurdu. Hamı böyük bir diqqət və maraqla Minayevin izahatını dinləyirdi. O, qısa və aydın danışmağa səy edərək deyirdi:

– Məlum olduğu üzrə, on il bundan əvvəl, quyunun diametrini ölçmək üçün kvadriller aləti ixtira olunmuşdu. Nə üçünsə indiyə qədər bu mühüm alət istehsalatda tətbiq edilməmişdir. Mən öz ixtiram üzərində işlərkən, bu ixtiranın gözəl məziyyətlərini nəzərə almışam. Kvadrillerin xüsusiyyəti nədən ibarətdir? Biz bu alət vasitəsilə quyuların divarlarını bərkitmək üçün lazım olan sementin qədərini təyin edə bilərik. Bu sahədə elmi fikrimizin bir sıra müvəffəqiyyətləri hələ də təcrübədə imtahandan keçirilməmişdir. Lakin neft sənayesinin bu günkü inkişaf mərhələsində səmərələşdirici üsulların olduqca böyük əhəmiyyəti vardır. Mənim ixtiramın xüsusiyyəti nədədir? Mən həmin aləti daha da mükəmməlləşdirib, istehsalata tətbiqini asanlaşdırmışam. Məşhur konstruktorlardan bir neçəsi mənim ixtiramın layihəsilə tanış-

dır. Onların fikrincə bu kvadrilleri kütləvi surətdə istehsal etmək də o qədər çətin deyildir. İndi siz də bu barədə öz mülahizənizi söyləyin. Xahişim budur ki, həmin ixtiranın nə dərəcədə yararlı olub-olmadığını təcrübədən keçirmək üçün mənə imkan verilsin.

Minayev sözünü qurtarandan sonra uzun bir mübahisə başlandı. Rəylər müxtəlif idi. Bəziləri Minayevin üsulunu büsbütün rədd edir və öz fikirlərinin doğruluğunu sübut üçün, indiyə qədər ixtira olunmuş alətlərin çox az xeyir verdiyini söyləyirdilər. Bəziləri isə Minayevi qızğın müdafiə edir və quyuları sürətlə istismara buraxmaqda bu üsulun böyük bir yenilik yaradacağını iddia edirdilər. Bu iki cəbhə arasında tərəddüd göstərən və qəti bir fikrə gəlməyən adamlar isə həmin ixtiranı təcrübədən keçirməyi elmi idarələrin boynuna atmağı və istehsalata mane olmamağı məsləhət görürdülər.

Nəhayət Qüdrət söz aldı və ümumən trestlərdə ixtiralara qarşı yanlış bir münasibət hökm sürdüyündən danışdı.

O göstərdi ki:

– Neft sahəsində elmi idarələrin gördüyü iş həqiqətən az deyildir. Bakı mühəndislərinin ən gözəl cəhətlərindən biri də budur ki, onlar işə rəsmiyyətçi yanaşmırlar, hər zaman istehsalatın taleyini düşünürlər. Onlar boş vaxtlarında yeni ixtiralar üzərində çalışırlar. Cəsarətlə demək olar ki, ixtira onların əsas işilə üzvü vəhdətdədir. Ancaq nə edəsən ki, yeni ixtiraların imtahandan keçirilməsi, bəzən bu və ya başqa bir çinovnikin səhlənkarlığı üzündən illər boyu süründürülür... – Qüdrət özünün də bəzi ixtiralarını xatırlayıb, onların istehsalatda tətbiqinə əngəl törədənləri gözü önünə gətirəndə əsəbiləşdi: – Şəxsən mən də ixtiralara etinasız yanaşmağın nə qədər böyük bir xəstəlik olduğunu görmüşəm. Bu etinasızlıq mühəndisin bütün həvəsini öldürə bilər. Bu zərərli vərdişlə amansız vuruşmaq bizim müqəddəs borcumuzdur. Biz neftçilər elmi işçilərimizə kömək əlimizi uzatmalı və onların ixtiralarını təcrübədən keçirməyə imkan yaratmalıyıq...

O, Minayevin üsulunu müdafiəyə başlarkən, kabinetin qapısı açıldı və təkdənbir mədənlərə yolu düşəndə olduğu kimi, indi də uzunboğaz çəkmə və qalife şalvar geyinmiş Mirzəyev göründü. O salam verdi və keçib oturmamış bu iclasın nə üçün çağırıldığını öyrənəndən sonra Qüdrətə tərs-tərs baxaraq onun sözünü kəsdi:

– Məncə, – dedi, – Qüdrət yoldaş məhz nə üçün bu trestə göndərildiyini məndən də yaxşı bilir. O, buradan neft çıxarmaq üçün təyin

olunmuşdur. Ancaq belə görünür ki, o, elmi-tədqiqatla məşğul olub, öz vəzifəsini unutmuşdur.

Elə bil hamının başına qaynar su tökdülər. “Azərneft” birliyində böyük vəzifə sahibi olan bu adamın qabalığı, hətta Minayevin ixtirasını ciddi tənqid edənlərin də əsəbinə toxunurdu. O, yenə eyni sərt və amiranə bir tövrlə vəzifəsinin böyüklüyünü hamıya göstərmək üçün qalın qaşlarının arasını düyünləyib, heç kimin üzünə baxmadan gözlərini yerə zillədi: – Məncə belə iclasları ixtisar edib buruqlara getsəniz, heç də pis olmazdı. Yoldaş İsmayılzadə, siz trestinizin kəsir içində olduğunu nahaq unudursunuz. Mən indi başa düşürəm ki, geriliyin səbəbi bu cür “elmi” müşavirələrdir.

O, “elmi” sözünü ağzını-burnunu əyə-əyə, istehzalı bir təbəssümlə deyərkən, Qüdrət buna dözmədi və uca səslə etiraz etdi:

– Xeyr, bu deyildir, yoldaş Mirzəyev! Geriliyin səbəbi belə xeyirli müşavirələrin az çağırılmasındadır.

Mirzəyev Qüdrətin cəsarətini ədəbsizlik hesab edib, başını dik tutaraq, yuxarıdan aşağı onun üzünə baxa-baxa tutqunlaşmış səsilə bağırdı:

– Kiminlə danışdığınızı nə üçün unudursunuz?

– Xeyr, unutmuram, amma təəccüb edirəm ki, necə olur ki, sizin kimi adamlar belə mühüm bir ixtiranı lağa qoyub gülürlər? Məncə belə hallarda bir qədər diqqətli və ciddi olmaq daha faydalıdır.

Qüdrətin bu nəsihəti onu daha da özündən çıxardı:

– Nə ixtiyarla və nəyə əsasən bu müşavirələri çağırırsınız?

– Yuxarının göstərişinə əsasən! – deyə Qüdrət çox soyuqqanlı, lakin qəti və inamlı bir səslə cavab verdi. – Mən şəxsən kamilləşmiş texnika olmadan neft istehsalının sürətini artırmağı təsəvvürümə gətirə bilmirəm.

Mirzəyev artıq quru bir rəsmiyyətə keçdi.

– Müşavirəni bağlı elan edirəm! – dedi və nifrət dolu küt bir nəzərlə iclasdakılara baxaraq, elə bil hamını qorxutmaq üçün, gəldiyi kimi də, məğrur və geniş addımlarla kabinetdən çıxdı.

Qüdrət narazı halda, ağır-ağır başını buladı.

– Siz də şahid olun, yoldaşlar, – dedi, – özünüz görürsünüz ki, mühafizəkar adamlardan danışmaqda mən nə qədər haqlıyam.

Əgər Mirzəyev belə tələsik və gözlənilmədən getməmiş olsaydı, Qüdrət onun gözlərinin içinə baxar, daha kəskin bir ifadə işlədərdi: “Bizim geriliyimizə səbəb sənin kimi çinovniklərdir!”

Lakin Qüdrət adamların dalınca danışmağı sevmədiyindən, içində qırıla-qırıla qalıb, heç bir söz demədi.

Hamı onun üzündəki tutqun rəngi, xəfif bir tərzdə səyriyən dodaqlarını görür və qəzəblənirdi. Məsələnin nə yerdə olduğunu bilmək istəmədən Qüdrətin üstünə xoruzlanan Mirzəyevi buradakılardan heç birinin görən gözü yox idi. Onun bu qaba hərəkəti, İsmayılzadəni Mirzəyevdən qat-qat bacarıqlı bir mühəndis və fədakar bir neftçi sayan, hər zaman, hər yerdə onun hörmətini saxlayan adamlara da eyni təsiri buraxmışdı. Belə qan qaralıqdan sonra danışmağın faydasız olduğunu görən Qüdrət:

– Necə bilirsən, Lalə? – deyə arvadına müraciət etdi. – Mən bu cihazın müvəffəqiyyət qazanacağına zərrə qədər də şübhə eləmirəm.

– Mən buna lap çoxdan əminəm! – deyə Lalə də qəti bir inamla cavab verdi. – Mən də günü bu gün onu imtahandan keçirmək üçün imkan yaradacağam.

Qüdrət öz qərarını bildirdi:

– Elə isə günü sabah başlayaq!

Hamıdan çox həyəcan keçirən Minayev əvvəlcə elə güman edirdi ki, Qüdrət bu sözləri Mirzəyevin acığına deyir, amma sonra onun üzündəki qətiyyət Minayevi sevindirdi. O aydın gördü ki, tutduğu vəzifə ilə çoxlarına qorxu təlqin edən Mirzəyev, Qüdrəti zərrə qədər də fikrindən daşındıra bilməmişdir. Minayevə elə gəldi ki, Qüdrət bu ixtiraya adi bir hadisə kimi baxmır, nə isə, geniş vüsətli, böyük bir işin taleyini bu ixtiraya bağlayır. Minayev yanındakı adamlara göz gəzdirib hamının da sifətində eyni inamı oxuduqda, Qüdrət haqqındakı fikrində yanılmadığını hiss edir, sevincindən quş kimi qanadlanıb uçmaq, birbaş evinə, arvadının yanına qayıtmaq, bu şad xəbəri ona da söyləmək istəyirdi.

Müşavirəyə yığılanların hamısı çıxıb gedəndən sonra, Qüdrət Lalə ilə bərabər ikinci mərtəbədən aşağı enirdi ki, birdən usta Ramazanla qarşılaşdı. Qüdrət qocanın tutqun qaşqabağından, nə isə çox ciddi bir fəlakət üz verdiyini güman edib dayandı və sükut içində onun gətirdiyi acı xəbəri gözləməyə başladı. Lakin usta qəddi bükülmüş halda gözlərini yerə dikib, dinmir, elə bil söyləyəcəyi əhvalatın təsirini əvvəlcədən qüvvətləndirmək istəyirdi. Ortalığı bürüyən sükut elə dərin idi ki, Lalənin trestindən xeyli aralı görünən mədənlərdən kaçalkaların səsi də aydın eşidilirdi. Ramazanın nadir hallarda kömək istədiyini bilən Qüdrət, nəhayət səbri tükənmiş halda ondan soruşdu:

– Xeyir ola, usta, nə var belə, nə üçün qəmginsən?

– Nə olacaq? Qayıtmayıb.

– Kim?

– Tahir. Səndən icazəsiz buraxdım. İndi tamam peşmanam.

Lalə belə şeylərdən ötrü qanını nahaq yerə qaraltdığını ona hiss etdirmək üçün əlini qaldırıb saldı:

– Qayıtmır, qayıtmasın? Mən də dedim görəsən nə olub? O nə böyük itkidir ki?

Qoca, gözləmədiyi bu cavabdan səksənmiş kimi, başını yana tərəf çevirdi. Laləyə tərs-tərs baxdı:

– Axı mən otuz ildir elə şagird yetirirəm. Mən görürəm, qızım, mən adamımı tanıyıram, – dedi, – on şagirdə bərabər oğlandı. Bircə il vaxt istəyirəm, o, lap qəhrəmanlığa namizəddir.

Qüdrət də yandan söz atdı:

– Axı onun qəhrəmanlığı nədə idi? Hələ ki, avariyadan başqa əlindən bir iş gəlmirdi.

Usta Ramazan Qüdrətdən lap incidi. Ancaq ona ağır cavab vermədi, çünki hər zaman hörmətini gözləməyə adət eləmişdi.

O yalnız:

– Qardaşoğlu, – dedi, – axı yaxşı baytar olmaq istəyən gərək hər dərədə yeddi at öldürə...

Lalə gülümsündü:

– O köhnə sözdür, usta. İstehsalat riyazi haqq-hesab sevir.

– Nə?!

– Deyirəm ki, indi buruqda elə məsuliyyətsizliyə yol vermək olmaz.

Ramazan az qaldı özündən çıxsın:

– Cavanların qədrini bilmək gərək, qızım... Mən istəmirəm belə sözləri səndən eşidim. Öyrənməyə can atan uşağın günahı da olsa, biz gərək onun qədrini bilək. Heç bilirsən Tahirdən nə usta yetişərdi?

Ramazan köksünü ötürdü. Qüdrətlə Lalə yalnız bundan sonra ustanın Tahirə nə qədər böyük ümidlər bəslədiyini başa düşüb, bir də onun könlünə toxunmadılar.

Qüdrət:

– Gedək bizə, usta, – dedi, – qəm yemə. Bu saat Bakının sənət məktəblərində minlərcə ixtisaslı fəhlə yetişdiririk. Tahirdən yüz qat artıq bacarıqlı oğlanlarımız var.

– Mən demirəm yoxdur. Ancaq, onun üstündə çox əmək çəkmişəm. Hökumətə zərər olub. Gərək onu öyrədib əvəzini çıxarım, ya yox? Vallah, izin versən, özüm gedib onu kənddən qaytararam.

Qüdrət ustanın qoluna girdi:

– Gedək, usta. Anam bizi gözləyir.

Onlar pilləkənlə həyətə enib M-1 maşınına yan aldılar və minib yola düşdülər.

Usta Ramazanın kədərini artırmamaq üçün, zahirdə bu xəbəri əhəmiyyətsiz bir hadisə kimi qarşılayan Qüdrət, əslində ondan heç də az həyəcanlanmırdı. İstehsalata yeni gəlmiş cavanları narazı salan ən adi uyğunsuzluğun belə, trestdəki ümumi vəziyyətdən əmələ gəldiyini düşündükcə, onun da ürəyində dərin bir təşviş baş qaldırırdı. Bir nəfər oğlanın işi buraxıb qaçması istehsalata çox cüzi bir təsir göstərsə də, bunun daha geniş miqyasda zərəri ola bilərdi. Tahirin qaçdığını görən cavanlara bu xəstəlik sirayət edərsə, yeni fəhlələr hazırlamaq kimi böyük dövlət tədbirinə zərbə dəyə bilərdi.

Qüdrət Lalədən soruşdu:

– Sizdə də belə hadisələr olurmu?

– Əvvəllər təkdənbir olurdu. Amma son zamanlarda əksinə, könüllü gələnlərin sayı artır.

Maşın Qüdrətin evinə yetişəndə, usta üzrxahlıq edib onlardan ayrılmaq istədi:

– Qanım qaradır, sabahda-birigündə gələrəm. Nisa məni gözləyir.

Lalə bir qoluna, Qüdrət də o biri qoluna girib onu buraxmadılar.

– Zəng edib Nisa xalaya deyərik ki, bizdəsən, o da gələr.

Qapıda onları Tükəzban qarşıladı:

– Allah sənə şükür, – dedi, – sizdən nə əcəb bu gün tez gəlibsiniz?

Qüdrət anasını qucaqladı:

– Ay ana, ay ana işimiz çoxdur. Bizdən nahaq inciyirsən, geri qalanları əzişdirirlər axı... İndi mənim dilim lap gödəkdir. Hər yoldan ötən üstümə ayaq alır. Mən buna öyrəşməmişəm.

Tükəzban qarı oğlu ilə həmişə fəxr edirdi:

– Lap yaxşı eləyirsən, oğul. Namərdə baş əymək sənə yaraşmaz. Axı sənin atan Salman...

Onun sözü yarımçıq qaldı. Gözləri Qüdrətin dalınca içəri girən Ramazana sataşanda, demək istədiyi sözləri tamam unudub oğlundan aralandı.

– Səndən nə əcəb? – deyə Ramazana yanaşdı. – Bu gün Nisanın yanındaydım. O da sənin əlindən şikayət eləyirdi. Yazıq evdə təkdir, lap bağrı çatlayır, – Tükəzban qarı duruxdu, nə isə yadına düşdü. – Hələ bir de görüm, sənə nə tapşırmışdım?

– Unutmuşam... Hə, hə yadıma düşdü. Qab-qacağı sürtməyə qum istəmişdin. Elə bunun üçün deyiblər ki, keçi can hayındadır, qəssab piy... – Ramazan könülsüz bir tərzdə gülümsündü. – Bu gün axşam nə təhər olsa yollaram. Lap dənizin dibindən, iki min yüz metrlikdən... – Usta, bununla quyunun dərinliyini bildirmək istəyirdi. – Ancaq sap gətir, barmağıma bağla, yoxsa yadımdan çıxacaq. Allahdan gizlin deyil, səndən nə gizlədim, heç nə yadımda qalmır.

Qüdrətlə Lalə qocaların söhbətini dinlədikcə, bir-birinə göz vurub oğrun-oğrun gülürdülər.

Onlar yemək stolunun dövrəsində oturub, Tükəzbanın xörəyini gözlədikləri zaman, qonşu otaqdan Şirmayı ilə musiqi müəllimısi çıxdı. Sədəf hamını salamlayıb, axırda Qüdrətə müraciət elədi:

– Yoldaş Qüdrət, Şirmayıya Şopenin bir neçə əsəri lazımdır. Mən özüm nə qədər axtardımsa tapa bilmədim. Əgər mümkün olsaydı Moskvaya sifariş edərdiniz.

– Baş üstə! – deyə Qüdrət əlini gözünün üstünə qoydu. – Bu günlərdə yoldaşlardan Moskvaya gedənlər olacaq. Onlardan xahiş edərəm gətirərlər. Siz hara? Əyləşin bizimlə nahar edin!

– Çox sağ olun. Bu gün işim çoxdur. Hələlik... – Sədəf cəld qapıya yanaşdı və Lalənin də ərinə qoşulub nahara qalmağı xahiş etməsini gözləmədi.

O gedəndən sonra, ailədə başlanan söhbətin mövzusu çox müxtəlif idi. Tükəzban, rəfiqəsi Nisanın tərəfini saxlayır, onun yalqızlığından doğan kədərinə şərik olur, Ramazanın oğlanlarını xatırlayır, öz sadə, aydın və səmimi ifadələrilə ana məhəbbətinin böyüklüyündən danışırdı. Ramazan isə oğlanlarının dərdini yalnız ürəyinə salır, bu xüsusda deyilən hər sözə başının ahəstə hərəkətilə cavab verir, çox vaxt ağır fikrə gedir və zahirdə Tükəzbana haqq verirdi. Lakin onun nəzərincə ata da, ana da öz övladlarını yalnız bir ailənin səadəti üçün böyüdüb tərbiyə etmədiyindən, hər iki oğlu doğrudan da məhv olsaydı belə, bu dərdi hər yerdə danışıb sızlamaq və başqalarının da ürəyini köyrəltmək faydasızdı. Qocanın fikrincə, həyatın sərt və amansız qanunlarını təkcə öz mənfəətinə görə qiymətləndirənlər, xudpəsənd və dargöz

adamlardı. Elə buna görə də Ramazan, qoca arvadının aramsız iniltilərinə və gizlində axıtdığı göz yaşlarına qadın acizliyinin sadəcə bir təzahürü kimi baxırdı. Onun qənaəti belə idi ki, insan dünyaya yüngül zövqlər və maraqlı əyləncələr üçün gəlmir. Belələri mənasız ömür sürənlərdir.

"–Qüdrət sənin oğlundur, amma təkcə sənin üçün yaşamağa haqlı deyil. Düz demirəmmi, Tükəzban?"

"–Yaxşı tutaq ki, Paşa qayıtmadı. Mən nə haqla deyə bilərəm ki, oğlumu əlimdən aldılar?"

"–Əgər mən təkcə özümü fikirləşsəydim, gərək bir də mədənə qayıtmayaydım".

Ramazan bu sözləri ucadan söyləmirdisə də, amma ürəyindən keçirirdi və başını ahəstə-ahəstə tərpədib, Tükəzbana sükutla cavab verəndə də bu xüsusda fikirləşirdi. Lakin Tahir hər dəqiqə onun yadına düşür, söhbət tez-tez hədəfini dəyişsə də, qoca ustanın qüssəsi zərrə qədər də azalmırda.

Nahar zamanı Qüdrət Tükəzbanla Ramazanı dinləyib, anasının dediklərini təsdiqləyirdisə də, fikrini ən çox məşğul edən bu günkü müşavirə idi. O, əvvəldən yaxşı tanıdığı Mirzəyevin odlanıb getdiyini, özünü haqlı çıxarmaq üçün Qüdrətlə Lalənin fikrinə və sözlərinə min cür şey artırıb, daha nüfuzlu yoldaşlara xəbər verəcəyini və onlardan intiqam almaq üçün ən adi hiylələrə belə əl atacağını düşünürdü.

Lalə isə Qüdrətin trestindəki geriliyi və Mirzəyevin bu zəif nöqtədən bərk yapışıb ixtiranı da, müşavirəni də gözdən sala biləcəyini fikirləşdikcə həyəcanlanırdı.

O:

– Qüdrət, – deyirdi, – əlbəttə ki, Mirzəyev kobudluq elədi. Mən əminəm ki, rəhbər yoldaşlar iclasda onun dediklərini eşitsəydilər, onu kabinetdən qovardılar. Ancaq məsələ burasındadır ki, trestin geriliyini bəhanə eləyib, səndən hayıf almağa çalışacaq.

– Məni heç bir şey qorxutmur, – deyə Qüdrət dodaqları səyriyə-səyriyə ayağa qalxdı. – Cücəni payızda sayarlar. Qoy Mirzəyev əlindən gələni iki qaba çəksin!

Usta Ramazan bu söhbətdən heç nə başa düşmədiyi üçün, yenə Tahirin üstünə qayıtdı.

– İndi mən neyləyim? Nə məsləhət görürsünüz?

## 4

Usta Ramazan şər qarışanda Qüdrətin evindən birbaş gənc fəhlələrin ümumi yaşayış evinə getdi. İçəridə Cəmil əllərini belinə qoyub ayaq üstündə durmuş, pəncərədən eşiyə boylanır və dodağının altında Tahir oxuyan mahnılardan birini zümzümə edirdi. Ayaq səsi eşidəndə dönüb usta Ramazana baxdı. Onun tutqun qaşqabağını görüb, kədərinin səbəbini o dəqiqə başa düşdü və Ramazanı əvvəlcə o salamladı.

– Xoş gəlmisən, usta!

Usta Ramazan cavab verməyib, Tahirin yatdığı çarpayıya yanaşdı, bir söz demək istədi, ancaq nədənsə dinmədi. Tahir iş paltarını qatlayıb səliqə ilə, çarpayısının başından asmışdı. Ona verilmiş başqa dövlət şeylərinin də heç birini aparmamışdı.

Usta, Tahirin heyfini Cəmildən alacaqmış kimi, dinməz-söyləməz ona qəzəbli bir nəzər saldı, sonra ağır-ağır dilləndi:

– Allah ona lənət eləsin! Gör bir neylədi... Günah səndədir. Niyə mənə demədin ki, o kəndə gedib qayıtmaq fikrində deyil?

– Mən neyləyim, ay usta? Mən onun getdiyini sonradan bildim. Mənim günahım yoxdur, usta, – deyə Cəmil uzun bir nağıl başladı: – O günləri iclas çağırmışdılar. Tahir də orada idi. Bərk vurhavur başlandı. Avariyada müqəssir olduğu üçün üstünə düşdülər. Hamı danışdı. Düz üç saat müzakirə elədik. Başa saldıq ki, belə olmaz, fəhləsən, gərək fikrin işdə olsun.

– Çıxardınız? – deyə usta səbirsizcə soruşdu.

– Çıxaraq deyənlər az olmadı. Elə biri Lətifə. Dedi ki, biz gərək o biri uşaqlara nümunə olaq, amma Tahir təşkilatın adını batırır.

– Lətifə nə dedi, "çıxaraq?"

– Bəli, o təklif elədi ki, o birilərinə ibrət dərsi olmaq üçün birdəfəlik çıxaraq getsin. Amma Dadaşlı razı olmadı. Dedi ki, çıxarmaq asandır, tərbiyə eləmək lazımdır. Bərk töhmət verdik.

Usta Ramazan otaqda var-gəl etdi, sonra yenə Cəmilə üz tutdu:

– Əvvəlcə bizə də məsləhət eləyəydin də... Hamıya bir ölçü ilə yanaşmaq olmaz axı... Yəqin o qədər danlamısınız ki, axırda baş götürüb qaçıb...

– Bəs özünütənqid nədən ötrüdür? Hamımız onun xeyrini fikirləşirik də... Bu dəfə bərk vurmazsan, axırda elə iş açar ki, buruğu da korlayar, özü də bədbəxt olub gedər.

– Mən deyəni başa düş. Tənqid elə, səhvini göstər, amma həvəsdən salma!.. – deyə usta, cavanların həddi-hüdudu keçdiklərini dü-

şünüb, bütün günahları Cəmilin üstünə yıxdı: – Əgər yaxşı yoldaşdın, niyə əvvəlcədən onu başa salmırdın?

– Axı o məni saymır, usta... Elə bilir ki, onunla qərəzliyim var. Guya ki, mən onun ayağından çəkirəm.

– Niyə ayağından çəkirsən?

– Guya mən Lətifəni istəyirəm.

Usta, cavanlar arasındakı bu macəradan yalnız indi xəbər tuturdu:

– Yəni elə bir şey var?

– Yox, canım, sözdür!

Bu halda Səməndər içəri girdi. Ustaya salam verib, əlindəki bağlamanı tumboçkaya qoydu (deyəsən o yemək alıb gətirmişdi).

– İclasda sən də vardın? – deyə Ramazan Səməndərdən soruşdu.

– Bəli, vardım.

Sən də Tahirin pisliyinə danışdın?

– Xeyr. Mən heç danışmadım. Doğrusu, uşaqlar qarışqanı böyüdüb dəvə elədilər. Adam başına iş gələr. Elə hər şeydən ötrü adamın abrını tökməzlər ki? Amma bunlar ağına-bozuna baxmadılar. Döşə ki, döşəyəsən... Öz aramızdır, son vaxtlar çox həvəslə oxuyurdu. Deyirdi bir də kənd adını dilimə gətirməyəcəyəm. – Səməndər Bədirlinin təzə aldırdığı etajerkanın gözlərində cərgə ilə düzülmüş kitabları göstərdi. – Bunların hamısını təzəcə almışdı. Öz aramızdır, bərk çalışırdı, balam... – O Cəmilə baxıb ondan bu fikrini təsdiq işarəsi gözlədi, amma Cəmil gözlərini yerə dikib cavab vermirdi. – Nə qədər deyirdin saz çal, oxu, deyirdi yox, mane olmayın, vaxtım yoxdur.

Səməndər ürəyində Cəmili yamanlayırdı:

“Kənddən həvəsləndirib gətirib, indi də sözü düz gəlmir” deyə düşünürdü, ancaq heç kəsi özündən incitməmək üçün özünü də ona qatdı: – Əlbəttə ki, təqsir bizdədir, – dedi, – istəsəydik, yaxşı dostluq eləyərdik, o da bizdən inciməzdi...

– Belə görünür ki, özünütənqid düşmənçilikdir? – deyə Cəmil ona tərs-tərs baxıb etiraz etdi. – Yaxşı dost dostunu tənqid eləyər də...

– Tənqid eləyər, daha deməyiblər ki, baltalı da, baltasız da...

Usta əlilə havanı yardı və qapıya yönəldi:

– Allah onun bəlasını versin! – deyib getdi.

Ramazan axşama qədər evindən eşiyə çıxmadı. Kefsizliyinin səbəbini dönə-dönə soruşan Nisa qarıya da cavab vermirdi. Uşaqların axşam dərsi başlananda, o mühəndis Fikrətin dərs verdiyi sinif otağında göründü.

– Ay yoldaş müəllim, – dedi və birdən salam vermədiyini xatırlayıb tutuldu. – Axşamınız xeyir, uşaqlar!

– Axşamınız xeyir, usta, – deyə cavan fəhlələr hər tərəfdən səs-küy qaldırdılar.

Qoca buraya ilk dəfə gəlirdi. Onu yaxından tanıyan uşaqlar bu gəlişin səbəbi ilə maraqlanıb, gözlərini ona dikmişdilər.

– Yoldaş müəllim, – deyə o, Fikrətin qabağında dayandı, – axı mən bilmirəm, buradakı altmış-yetmiş uşağın niyə biri fərsiz çıxdı?

Mühəndis Fikrət ustanın kimi nəzərdə tutduğunu bilirdi. Ancaq yəqinlik hasil etmək üçün soruşdu:

– Siz Tahiri deyirsiniz?

– Bəs kimi? Yoxsa özgəsi də var?

– Xeyr, usta, Tahirdən heç gözlənilməyən işdir. İzin alıb ustasını aldatmağı heç ona yaraşan hərəkət deyil. Son günlərdə çox həvəslə oxuyurdu. Deyirəm bəlkə xəstələnib, usta?

– Yox, elə olsaydı, mənə tel vurardı, xəbər verərdi. Qaçıb, bir də qayıtmaz. Yaxşı, heç insafdırmı, onun bu qədər yoldaşı ola, biri də onu başa salmaya? – Ramazan yenə başını buladı. – Özünüz təşkilatlar uzun, hamınız da yekə oğlan... Niyə onun başına ağıl qoymamısınız?

Qabaq cərgədə oturan gənclərdən biri, üzr istəyirmiş kimi, cavab verdi:

– Biclik eləyib, aldadıb...

Ramazan, dərsə mane olduğunu birdən xatırlayıb, Fikrətin qolundan tutdu:

– Məni bağışla, yoldaş incinar, Tahir sinəmə dağ çəkib, mənə yalan satıb, – deyə gəldiyi kimi də qaşqabaqlı sinif otağını tərk etdi.

O evə qayıdanda, Nisa qarı oturub, əlində boz ipdən corab toxuya-toxuya radioya qulaq asırdı. Neftçilərdən danışırdılar. Ramazan, fikri dağınıq halda bir az dinlədi. Diktor onun yaxşı tanıdığı buruq ustası Volkovu tərifləyirdi:

“Onun rəhbərliyi ilə cavan fəhlə İman Səfdər oğlu yeni sənətini mükəmməl öyrənmişdir!..”

Ramazan radio aparatının işığını söndürəndə, Nisa qarı ona acıqlı bir nəzər saldı:

– A kişi, niyə söndürürsən? Qoysana qulaq asaq!..

– Qanım qaradır, ay arvad. Görmürsən nə deyir?

## 5

Bu hadisədən iki gün sonra Qüdrət öz kabinetində oturub radio ilə yeni xəbərləri dinlərkən, qapı açıldı və onun yaxşı xatırladığı bir gənc içəri girməyə izin istədi.

Qüdrət gözlərinə inanmadı: qarşısında Tahir Bayramlı dayanmışdı.

– Hə, sənsən?

– Bəli, mənəm, yoldaş İsmayılzadə, ancaq tək deyiləm, icazə verin yoldaşlarımı da çağırım...

Qüdrətin qaşları təəccüblə çatıldı:

– Onlar kimdir? Gəlsinlər.

Tahir geriyə dönüb əlilə eşikdəki adamlara gəlmək işarəsi verdi. Beş nəfər boylu-buxunlu, Tahir kimi qarayanız və sağlam gənc bir-birinin dalınca kabinetə girdi. Onlar hərbi qayda ilə sıraya düzülüb, dartınmış halda dayandılar və salam verdilər. Qüdrət bu gəlişin mənasını heç anlaya bilmirdi. Cavanlar dinməz-söyləməz ona baxır, Tahir isə Qüdrətə yanaşıb deyirdi:

– Ustaya söz vermişdim ki, səngərdən qaçmayacağam. Mən sözümün üstündə möhkəm durmuşam. Bu uşaqların hamısını da mən gətirmişəm. Dəniz buruğunda işləmək istəyirlər.

Qüdrət öz adi təbəssümü ilə güldü:

– Demək istəyirsən ki, gec qayıtmağın üzürlü səbəbdən olub?

Tahir:

– Xeyr, – dedi, – bu günahımı nəyin hesabına yazırsınız, yazın.

Qüdrət, komandir kimi, əli belində cərgənin qabağına yeridi. Baş tərəfdə dayanmış birinci oğlana yanaşıb soruşdu:

– Adın nədir?

Oğlan, əsgəri qayda ilə dartınaraq cavab verdi:

– Əhməd Bayramlı.

Qüdrət ikinci oğlana yanaşdı:

– Sənin adın nədir?

Bu oğlan da geniş sinəsini irəliyə verib gur səsilə dilləndi:

– Səməd Bayramlı.

Qüdrət bir neçə an duruxdu və üzündə təəccüblə qarışıq bir təbəssüm gəzindi. Sonra üçüncü oğlanın adını soruşdu. Boyca o birilərindən bir daban gödək olan bu oğlanın döşündə iki-üç hərbi medal parıldayırdı (Avropa şəhərlərini vurub keçdiyi aydın oldu), onun duruşu da

hərbi qaydaya tamam müvafiq idi. Əllərini yanını qısmış, döşünü irəli verib başını dik tutmuşdu. Qüdrətə cavab verəndə, onun azacıq pəltək olduğu aydınlaşdı:

– Mə-mm-məd Bayramlı.

Qüdrət özünü saxlaya bilməyib qaqqıltı ilə güldü. Oğlan, məhz pəltəkliyinin gülüşə səbəb olduğunu düşünüb, qulağının dibinəcən qızardı. Amma Qüdrəti güldürən, əlbəttə, onun fiziki qüsuru deyildi. Onun nəzərində cavanların bu gəlişi qəribə və gülməli idi. Pəltək oğlanın utandığını hiss edən Qüdrət, səsinə mehriban bir ifadə verdi:

– Neçə yaşın var?

– İyirmi bir.

– Əhsən! – deyə Qüdrət əlilə onun çiyninə vurdu, – Berlinə çata bildin, ya yox?

– Çatdım, yoldaş İsmayılzadə. Amma hayıf ki, bərk yaralandım (oğlan sağ qıçını göstərdi), məni hərbi qulluqdan azad elədilər.

– Eybi yoxdur. Qəhrəmanlıq üçün Bakıda da fürsət tapacaqsan. Oğlan şirmayı kimi ağ dişlərini göstərdi:

– Bi-bi-bilirəm, yoldaş İsmayılzadə, Ta-ta-ta-hir bizə hər şeyi danışıb.

Qüdrət dördüncü oğlana yanaşdı:

– Bəs sənin adın?

Bu oğlandan nazik qız səsi çıxdı:

– Əhəd Bayramlı.

Onun cavabına təkcə Qüdrət deyil, hamı güldü. Bu cavanların hamısından yoğun olan Əhəd, deyəsən, xasiyyətcə məzəli bir oğlandı. Hələ yalnız adını söyləyəndə belə gülüş doğururdusa, demək, o, yol uzunu bütün bayramlıları doyunca güldürmüşdü.

İsmayılzadə beşinci oğlanın adını soruşmadı:

– Yəqin, – dedi, – sənin də familiyan Bayramlıdır, hə?

Oğlan Qüdrətin sözünü yarıda kəsdi:

– Düzdür, mən də Bayramlıyam, elə adım da Bayramdır.

Bu anda telefon zənginin səsi eşidildi. İsmayılzadə tez yazı stolunun dalına keçib dəstəyi götürdü. Azərneft birliyindən danışırdılar. Qüdrətin üzündəki xəfif təbəssüm tədricən silinib, dodaqları səyriməyə başladı:

– Bəli, dedi, – əgər o öz hörmətini gözləmirsə, mən müqəssir deyiləm. Mirzəyevin hərəkəti yalnız məni deyil, hamını qəzəblən-

dirmişdi. Xeyr, burada şəxsiyyət məsələsi yoxdur. Mirzəyev məni fokstrot oynarkən görsəydi və ya təhqir etsəydi, bu doğrudan da şəxsi məsələ olardı. Minayevin ixtirası nəticə verərsə, o zaman mən Mirzəyevdən yox, o məndən də, iclasdakı yoldaşların hamısından da üzr istəməli olacaq. Mən sizin yanınıza gəlməyə hazıram, lakin ondan üzr istəməyəcəyəm. Xeyr, – Qüdrət səsini ucaltdı. – O, qaçmamışdır.

Tahir, səksənmiş kimi başını dik qaldırıb gözlərini Qüdrətə zillədi: söhbətin özünə aid olduğunu düşünməkdə o yanılmırdı.

– O nəinki qaçmamışdır, hətta beş nəfəri də özü ilə bərabər gətirmişdir. Mirzəyev yoldaşın verdiyi məlumat həqiqətə yalnız bu dərəcədə uyğun gəlirsə, onun dediklərinə bir qədər tənqidi yanaşmalı olacaqsınız!

Qüdrət dəstəyi yerinə qoydu. Papiros götürüb yandırdı və dərindən qullab vurub Tahirə baxarkən gülümsədisə də, bütün bayramlılar onun əsəbiləşdiyini, əlinin xəfif titrəyişindən aydın hiss edirdilər.

– Yaxşı, qoçaq, – deyə Qüdrət Tahirdən soruşdu: – Bu oğlanlar bir kənddəndir, yoxsa bir familyadan?

– Hamısı mənim əmim uşaqlarıdır. Ancaq, yoldaş İsmayılzadə, sizdən xahişim budur ki, usta Ramazana zəng edib deyəsiniz. Qorxuram gecikməyim onu həyəcanlandırsın. Təqsir məndə olmadı. Anam fermadan gec gəldi. Onu görməmiş qayıtsaydım, elə siz də razı olmazdınız.

Qüdrət qəsdən qaşqabağını turşutdu.

– Hər halda xəbər verməli idin, – dedi.

Tahir dinmədi. Haqlı sözə nə deyə bilərdi?

– Gedin, hamınıza iş veriləcək. Tahir buranın qaydasını bilir, o sizi aparar...

– Bəli, apararam.

Bayramlılar kabinetdən çıxdılar.

Bir neçə dəqiqə əvvəl cavanların gəlişindən hədsiz dərəcədə sevinmiş Qüdrət, indi artıq pərt olmuşdu. Telefonla danışan adamın sözlərini eşidəndən sonra əsil vuruşmaların hələ yenicə başlandığını duyurdu. Lakin ümidsizlik onun ürəyinə yol tapa bilmirdi. Ağır mübarizə onun mənəvi qüdrətini artırır, o, xəyalən gələcək döyüşlərə hazırlaşır və öz-özünə deyirdi: “Axı bunsuz, həyat cansıxıcı olmazdımı?”

## YEDDİNCİ FƏSİL

### 1

Nisa gözlərinə inanmırdı. Ona elə gəlirdi ki, həmişəki kimi yenə də oğlunu röyada görür, onun əynindəki zabit libası da hər gün çörək almaq üçün dükana gedəndə rast gəldiyi hərbi adamların paltarına bənzəyir. Bəs nə üçün Paşa özgə vaxt yuxusuna girəndə elə müharibədən əvvəlki sadə kostyumunda, əlində qovluq gəlirdi?

– Ana, xoş gördük, ana! Deyəsən məni tanımadın?

Yox, Nisa tanıdı. Başqası Paşaya bu qədər oxşaya bilməzdi ki? Saçlarının ağlığı, alnındakı qırışların çoxluğu ana gözlərini aldatmayacaqdı ki?

Paşa anasına yaxınlaşmaq istərkən, Nisa özünü onun üstünə atdı:

– Oğul!.. – deyə necə qışqırdısa böyründə, çarpayıda uzanmış Ramazan da hövlnak oyanıb, yuxulu – yuxulu Nisaya tərəf baxdı.

– Nə olub, ay arvad, bu nə şivəndi salmısan? – deyə azacıq tutqunlaşmış səsilə, soruşanda, gördüyü mənzərəni o da röya hesab etdi. – Ə, ay uşaq mən yuxu-zad görmürəm ki? (o, Paşanı da, Əhmədi də hər zaman “uşaq” – deyə çağırardı).

Paşadan səs çıxmadı. Nisa onu elə qucaqlamışdı ki, oğlu cınqırını belə çəkə bilmirdi. Ananın arıq qolları onun boynuna dolanmış, dodaqları isə yanağının bir yerinə yapışıb qalmışdı.

Yox, Nisa dörd il müddətində heç belə yuxu gördüyünü xatırlamırdı. Əhməd də, Paşa da içəri girəndə Nisa qürurla onların üzünə baxar, amma heç birini qucaqlayıb öpməzdi. İndi isə Paşanın isti nəfəsini duyurdu.

Deməli, Paşa cəbhədən qayıtmışdı. Buna səbəb kim idi? İllərdən bəri əl boyda kağız da yazmamış bir oğul haradan və necə gəlmişdi?

Ah, ana! Sən nə qədər böyük məxluqsanmış!.. İndi sən Allaha dua edir, “kəraminə qurban” deyirsən, bütün möcüzələri onun adına yazırsan. Sən öz yenilməz qüdrətini hiss etmir, gözlərində illər boyu yanan o həsrətin qədr-qiymətini bilmirsən. Halbuki Paşanı sağ-salamat qaytaran sən özünsən.

– Yaxşı, arvad, ağlama görək!.. Ay rəhmətliyin qızı, uşaq gəlib çıxanda da ağlayırsan?

Nisa ərinin sözlərini eşitmədi. Hıçqırığının səsi bütün otağı bürümüşdü.

– Yaxşı, biz də burada bir kişiyik, ya yox?

Qoca Ramazan, deyəsən birdən-birə müharibədən əvvəlki məzəli xasiyyətlərini yadına salıb, oğlunu şad ürəklə qarşılayırdı.

– Bu oğulu əkəndə biz də zəhmət çəkmişik, ya yox?

Amma bu zarafatları dinləməyə Nisanın həvəsi yox idi. Onun göz yaşları Paşanın sinəsindən axıb gedirdi.

– Yaxşı, ana can, yaxşı, mənəm, gəlmişəm. Daha göz yaşı nə üçündür?

Bu anda qarının əlləri Paşanın çiynində, sonra da yan-yörəsində gəzməyə başladı. Əlbəttə, onun heç bir qəsdi yox idi. Hələ də gözlərinə inanmadığı üçün oğlunun bədənini əlləşdirir, yəqinlik hasil etmək istəyirdi. Ancaq birdən elə bil onu ildırım vurdu. Əli toxunan yerləri görmədiyi halda, Paşada nəyin isə yoxluğunu hiss edib duruxdu. Əlini bir də o yerə vurdu. Ürəyinə daman o uğursuz şübhə bütün varlığını sarsıtdı.

Paşanın sağ qolu yox idi.

O, anasını nəzakətlə özündən aralayıb atasına doğru gedəndə arxadan geniş açılmış gözlərilə baxan Nisa yanılmadığını görüb yerində dondu. Amma bir söz demədi. Bəlkə də deməyə dili gəlmədi. Əslinə baxsan, o buna inanmaq istəmirdi. Sevincini gizlədə bilməyib, göz yaşı axıtdığı halda, indi artıq dərdini ürəyinə saldı: “Allah Hitlerə min təsbih lənət eləsin!..” deyə fikrindən keçirib, ah çəkirmiş kimi, dərindən köksünü ötürdü.

Qoca usta yerindəcə doğrulub Paşanı qucaqlayanda Nisa kimi ağlamadı. Onun gözlərində nə isə alışıb yanırdı.

– Elə mən bilirdim gələcəksən, oğul, – dedi və bir qolunun yoxluğunu dərhal görüb, həm özünə, həm də arvadına təsəlli vermək üçün əlavə etdi: – Canın sağ olsun, igidin başı qalda gərək!.. – O cəld geyindi, hələ də gözləri Paşaya zillənmiş qarının nələr çəkdiyini duyub sözünə ara vermədi: – Sən ki o odun – alovun içində dörd il vuruşubsan, elə igidsənmiş. Deməli, papağımı yerə vurmamısan. Döşündəki o nişanları görəndə başa düşdüm ki, elə qolsuz ola-ola da yeyib-yatmamısan.

– Əlbəttə, ata, əlbəttə! – deyə Paşa atasını inkisar xəyala uğratmamaq üçün onun sözlərini ucadan təsdiqlədi. – Yeri gələndə bir qol da azlıq eləmirdi.

Qoca, oğluna yer göstərdi.

– Bir otur görək, otur! Gəlini görübsən, yoxsa elə birbaş buraya gəldin?

– Yox, hələ görməmişəm, ata. Cəbhəyə də buradan yola düşmüşdüm, dedim ki, buraya qayıtsam yaxşı olar. Bəlkə o məni bir qolla görüb üz döndərəcək?

Paşa qəmgin bir tərzdə gülümsədi.

– Elə demə, ağrın ürəyimə. Halal süd əmib, – deyə Nisa qarı gəlinini təriflədi. – Dünən axşam burada idi. Yazığın gözü yoldadır.

Paşanın nə qədər sevindiyini deməyə ehtiyac varmı? O, qəlbinin nə qədər bərk döyündüyünü özü də hiss edə-edə atası ilə bərabər yemək otağına keçdi.

– Ay arvad, uşaq yoldan gəlib, dur bir çaydan-çörəkdən gətir!

Nisa qarı əl-ayağa düşəndə dərdini unudan kimi oldu. Mətbəxin balaca pəncərəsindən qonşu həyətə baxaraq, uşaqlardan birini səslədi:

– Yaşar, Yaşar, qadan ürəyimə, yüyür Nailəni çağır. Əgər dərsdədirsə, de ki, izin alıb gəlsin!

Nisa uşağın qaçaraq getdiyini görüb, tez-tez əlindən qab-qacağı sala-sala yeməyə nə isə hazırlayır, oğlunun yanına tez qayıtmağa çalışırdı.

Ramazan isə əl-üzünü yuyub, baş tərəfdə, yemək stolunun dalında, həmişəki yerində oturmuş, oğlunun başına gələnləri birdən, həm də tez öyrənməyə tələsirdi. Paşa:

– Uzun əhvalatdır, ata, – deyirdi, – gedən gündən başım qeyl-qalda idi.

– Bəs bir əl boyda kağıza nə deyirdin?

– Kağızı haradan, kimdən yollayaydım, ata? Düz üç il onların arxasında olmuşam. Qolumu da partizan həkimləri kəsib sağaltdılar.

– Sən də fransızlara qoşulmuşdun? – Ramazan Qüdrətin şoferindən eşitdiyi əhvalatı xatırladı. – Axı çoxları belə olub.

– Yox, ata, mən həmişə Ukraynada idim. Bizimkilər qayıdandan sonra da dəstəmiz almanların arxasına keçdi. Bu barədə baş komandanın əmri vardı.

Arada sükut oldu. Qoca düşünürdü: “Deyirəm axı, niyə uşağı əsgərlikdən buraxmayıblar...”

– Bakıdan tez-tez xəbər tuturduq. On gündə, beş gündə bir təyyarə uçub gəlirdi.

– Bakıdan?

– Yox, Moskvadan. Təyyarə yerə düşəndə mən həmişə pilotdan soruşurdum: “Bakıda nə var, nə yox?” – O deyirdi ki, “Bakı benzinilə uçuram...”

Qocanın gözlərində qürur ifadəsi canlandı: “Bəlkə mənim qazdığım buruqdandır?”

– Mən də hamısına deyirdim ki, benzini sizə atam yollayır.

– Eləmi deyirdin?..

– Bəs necə?

– Yaxşı demisən. İldə beş təzə buruq qazmışam. Hayıf ki, tez-tez prostoy olurdu.

– Niyə ki?

– Təzə boru, təzə balta yox, köhnə də remont istəyirdi. Çatışdırmaq olmurdu. Gözlə ki, gözləyəsən. Əşi, bunlar düzələr, Əhməddən xəbər-ətər yoxdur ki?

– Əvvəllər mənə yazırdı.

– Elə bizə də yazırdı, sonradan arası kəsildi.

Paşa, qardaşının ölümünü birdən açıb söylədi:

– Hissələrinə yazıb soruşdum. Yoldaşlarından biri cavab verdi ki, kəşfiyyata gedəndə mühasirəyə düşüb, axırıncı qumbara ilə həm düşməni, həm də özünü məhv eləyib.

Qocanın rəngi kətan kimi ağardı. Yalnız indi səhvini başa düşən oğlu, cəbhədə əsgər üçün adi bir şey olan bu ölüm-dirim hadisəsinin arxada necə ağır təsir etdiyini ilk dəfə indi görürdü.

– Ancaq bunuanama deməyəsən, ata. Bilirəm, onun üz-gözündə salamat yer qalmayacaq.

Ramazanın başı sinəsinə enmişdi. O susur, boğazında nə isə ilişib qalmış kimi, tez-tez udqunurdu.

Nisa yemək düzəldib gətirəndə, aralıqdakı gərgin sükutun fərqinə vardısa də, bunun səbəbini başa düşməyib yenə mətbəxə keçdi. “Eh, görünür alnımıza belə yazılıbmış”, deyə düşünüb yenə köksünü ötürdü:” Bu Nailə harada qaldı? Yazıq uşaq elə sevinəcək ki...”

Paşa isə atasına baxdıqca, onun qəhər boğduğunu aydın hiss edirdi.

– Sən özün başa düşürsən, ata, – deyirdi. – Bu dava bizə çox baha tamam oldu.

– Bilirəm, oğul, bilirəm. Sən elə fikir eləmə ki, mən təkcə öz balalarımın dərdini çəkirəm. Qızıldan qiymətli oğlanlarımız getdi. Özü də beşi yox, onu yox. Necə eləyəsən, olan-olub, keçən-keçib.

Bu anda qapı ağzında bir qadın göründü. O, tünd rəngli parçadan don geyinmiş, başına kəlağayı örtmüş, qara saçlarını ortadan ayırmışdı. Ayaqlarında gödək dabanlı, sadəcə qara tufli vardı.

Paşa dalı qapıya sarı oturduğu üçün onu görmürdü. Ayaq səslərini eşidəndə dönüb geriyə baxdı. İxtiyarsız olaraq yerindən qalxdı və qadına tərəf getmək istədi, amma kəsik qolu yadına düşəndə ayaq saxladı.

– Sabahınız xeyir, deyə qadın Ramazandan yaşınaraq gözlərini yerə dikdi.

– Yaxın gəl, qızım Nailə, utanma! – deyə qoca ayağa qalxıb gəlininə yanaşdı, onun boynunu qucaqladı, bu dəfə özünü saxlaya bilmədi, uşaq kimi hönkürdü, lakin öz-özündən utanıb ağlamağına tezcə də ara verdi. – Ananın südü sənə halal olsun, bala! – dedi.

Paşanın səbri tükənirdi. O, arvadının hər şeydən tez xəbər tutmasının, tez də ürəyini açıb söyləməsini arzu eləyirdi. Əgər Nailənin üzündən narazı göründüyünü azacıq olsa da hiss etsəydi, bu qədər yolunu gözlədiyi üçün ona təşəkkürünü bildirər: – "sən məni şikəst ikən sevməmişdin, indi ixtiyar sənindir" deyərdi.

Ramazan ürəyində qövr edən dərdi elə bil göz yaşının köməyilə azaldıb bir qədər yüngülləşdi, yavaş və ağır addımlarla eşiyə çıxdı.

Nailə ərinin üzünə baxdı. Onların gözü bir-birinə sataşdı. Sanki heç birinin tərpənməyə taqəti yox idi. yenə də həmişəki kimi məsum bir qız utancaqlığı ilə durmuş Nailə, ilk hərəkəti ərindən gözləyirdi. Paşanın dərdi isə get-gedə dağ kimi ağırlaşırdı. Elə bil ayaqları yerə mıxlanmışdı. O da ilk sözü Nailədən gözləyirdi.

İçəridəki sükut elə gərgin, elə həyəcanlı idi ki, onların hər biri ayrı-ayrılıqda öz ürəyinin döyüntüsünü belə eşidirdi.

İnsan nə qədər səbir edə bilərdi? Cəbhədə hər şeydən çox təmkinli və səbirli olmağa öyrənmiş Paşa üçün bu o qədər də çətin deyildi. Ancaq Nailə? Yox, o, dörd illik intizardan sonra daha dözə bilməzdi.

– Paşa, – dedi, – mən səni öz evimizdə gözləyirdim.

– Mən buna həmişə arxayın idim.

– Görünür, arxayın deyilsənmiş...

– Yox, yanılırsan... – Paşanın kirpikləri titrədi. O, gözlərini yerə dikdi. – Arxayın olmasaydım, sən məni bir də görə bilməzdin. Ancaq mən...

Nailənin qolları onun boynuna dolandı. Heç birindən səs çıxmadı.

## 2

Qüdrət İsmayılzadə cavan fəhlələrin ümumi yaşayış evi yanında yeməkxana açdırmışdı. İndi, əvvəlki kimi, tramvayla üç kilometrlik yol getməyə ehtiyac yox idi. Yeməkxana ümumi yaşayış evinin alt mərtəbəsində yerləşirdi. Həftədə bir dəfə axşamlar burada siyasi məşğələlər keçirilir, sonra də özfəaliyyət dərnəyinin müsamirəsi olurdu.

Bir gün Dadaşlı özü ilə bərabər yeni bir mühazirəçi gətirib gəlib. Bu adamı cavanlar ilk dəfə görürdülər. Çünki onlar Bakıya, mədənlərə gələndə, həmin mühazirəçi cəbhəyə getmişdi. Tahir, Səməndər, Cəmil, Biləndər və bütün bayramlılar yeməkxananın ensiz uzun salonunda, lap qabaq cərgədə oturub onu gözləyirdilər. Görünür, Dadaşlı təzə mühazirəçi haqqında bərk təbliğat aparmışdı. Mühazirəçi təşkilat katibi ilə bərabər içəri girəndə, hamının gözü ona zilləndi. Doğrudan da təzə mühazirəçi o birilərinə bənzəmirdi. Bunun döşləri hərbi ordenlərlə dolu idi. Paqonları olmasa da, libasına baxanda hərbi vəzifədən yenicə qayıtdığı dərhal bilinirdi. Dadaşlı onu cavanlara təqdim edəndə, onların təzə mühazirəçiyə marağı daha da artdı.

– Gəlməyənlər sonra peşman olacaqlar ha!.. – deyə o, salondakılara göz gəzdirdi, mühazirəyə toplaşmış cavanların sayından razı qaldığı halda, yenə də başını buladı. – Gəlməyənlər öz bəxtindən küssünlər. Rayon partiya komitəsinin xahişinə görə bu gün sizə Paşa İsgəndərzadə yoldaş “müasir gənclərin əxlaqi məziyyətləri haqqında” mühazirə oxuyacaq. Yəqin ki, siz Paşa yoldaşı tanıyırsınız.

Heç kimdən səs çıxmadı. Deyəsən onu tanıyan yox idi. Dadaşlı bunuhiss edib, bir neçə kəlmə onun bərəsində məlumat verdi:

– Usta Ramazanı necə, tanıyırsınızmı?

Cavanlar hər tərəfdən səs-küy qaldırdılar:

– Tanıyırıq, tanıyırıq!

– Bax, Paşa yoldaş Ramazan dayının oğludur.

Cavanlar əl çaldılar.

– Cəbhədən yenicə qayıtmışdır. İndi sakitcə oturun, diqqətlə qulaq asın, sualınız olsa, bir yerə qeyd eləyin, mühazirə qurtarandan sonra xəbər alarsınız. Yaxşı?

Dadaşlı Paşanı hələ müharibədən əvvəl tanıyırdı. Vaxtilə özü mədəniyyət sarayında onun bir neçə mühazirəsinə qulaq asmışdı. O zaman Paşa beynəlxalq vəziyyətdən və xüsusilə alman faşizmindən çox danışırdı. Onun mühazirələri zahirən o qədər parlaq olmasa da, cavanları

həmişə razı salardı. Çünki Paşa ümumi siyasi mülahizələrlə yanaşı, qəribə dəlillər gətirər, mühazirəsini maraqlı bir nağıl şəklinə salar və qulaq asanların qəlbində düşmənlərə qarşı dərin bir nifrət oyatmağı bacarardı.

O vaxtlar Dadaşlı sıravi təşkilatçı idi. Onu mühazirəyə çağırardı. İndi isə bu vəzifə onun öz öhdəsinə düşürdü.

Paşanın hərbi qulluqdan azad olunub qayıtmağından xəbər tutanda, o çox sevinmiş və evinə zəng eləyib, görüşməyə icazə istəmişdi. Paşa ilk günlərdə heç bir vəzifəyə təyin olunmadığından, evdə oturub, müharibə dövründə Bakıda çıxmış kitablarla tanış olurdu. O, xüsusilə bədii əsərləri daha diqqətlə oxuyur, arxa cəbhədə baş vermiş hadisələri bu vasitə ilə daha dərindən öyrənmək istəyirdi.

Dadaşlı qapını döyəndə, onu Paşa özü qarşıladı, içəri gətirib oturmağa yer göstərdi, kim və nəçi olduğunu xəbər aldı. Dadaşlı ona cavab verib əlavə, nə məqsədlə gəldiyini də söylədi:

– Yoldaş İsgəndərzadə, gənclər təşkilatının ən mühüm vəzifəsi siyasi təhsillə məşğul olmaqdır.

– Yaxşı, sizdə təhsil işləri necə qurulub? – deyə Paşa onun sözünü kəsdi.

– Pis deyil. Ancaq mən vəziyyətimdən o qədər də razılıq eləyə bilmərəm.

– Niyə ki?

– Bilirsinizmi, yoldaş İsgəndərzadə, kitabları oxuyub məzmununu təkrar eləmək azdır. Hər bir məşğələ gərək cavanların ürəyinə od salsın, onların entuziazmını birə yüz artırsın, yəni mühazirə yuxu gətirməsin.

– Düzdür, düzdür, – deyə – Paşa onun fikrini təsdiqlədi.

– Dediyim odur ki, əgər biz mədəndə işləyiriksə, gərək hər bir mühazirədən sonra qolumuza qüvvət gəlsin. Biz gördüyümüz işin mənasını daha yaxşı başa düşək. Bilək ki, dünyada nələr olur, niyə olur, bizim öhdəmizə düşən vəzifə nədir. Bir də mühazirəçi gərək uşaqlarda qiymətli kitablara məhəbbət oyatsın. Daha elə danışmasın ki, biz onları əlimizə götürüb oxumaq istəməyək.

Paşa yenə başını tərpədib onunla razılaşdığını bildirdi.

– Doğrudur.

– Bir də, yoldaş İskəndərzadə, mühazirəçi gərək hər gün mədəndəki əhvalatlardan xəbər tutsun. Elə danışsın ki, hər kəs onun dediyindən öz payını götürsün.

– Bəlkə mən bunubacarmadım, hə? Onda necə? – deyə Paşa gülümsədi.

– Yox, yox, bacararsınız. Davadan qabaq oxuduğunuz mühazirələr yadımdadır. Yəqin indi ondan da yaxşı bacararsınız.

Paşa mühazirənin mövzusunu və gününü təyin edib Dadaşlını ötürdü:

– Mən həmişə hazıram, – dedi, – camaatı yığmaq səndən, mühazirə məndən.

– O barədə arxayın olun. Mühazirəçi yaxşı olanda, zalda oturmağa yer tapılmır.

O gündən sonra Dadaşlı təşkilat üzvü olanları da, bitərəf cavanları da bu mühazirəyə yığmaq üçün dəymədiyi buruq qoymadı. İndi isə çox şaddı ki, salonda iynə salmağa yer yox idi.

– Buyurun, söz sizindir, yoldaş İskəndərzadə, – deyə nəzakətlə Paşaya xitabət kürsüsünü göstərdi.

Paşa, cərgələrin qabağında qoyulmuş balaca stoldan bir az aralanıb, düz Tahirin qənşərində dayandı. Onun tək əli bomboş idi. O biri mühazirəçilər kimi notlarını əvvəlcədən yazıb gətirməmişdi.

– Mən bu gün cəbhədə gördüyüm işlərdən danışmayacağam, – deyə Paşa sakit bir səslə sözə başladı. – Lazım olsa, bu barədə sonra sizə söhbət edərəm. Məni ən çox maraqlandıran müasir gənclərimizin əxlaqi məziyyətləridir... Əxlaq özü nədir?

Paşanın gözləri salondakılara deyil, hara isə başqa bir nöqtəyə dikilmişdi. Amma o bütün dinləyənləri birdən-birə ələ aldı:

– Mən Avropa ölkələrini bir dəfə də olsun görməmişdim. Onların mədəniyyətindən danışılanda mən daima heyrətlə dinlərdim. Mənə elə gəlirdi ki, hər bir avropalı, bizdən ən azı iki əsr irəlidədir. Ancaq əsil həqiqətdə nə gördüm? Gördüm ki, bu vaxta qədər bizi ən adi bir əfsanə ilə aldadırlarmış. Mən gördüm ki, ən sadə bir azərbaycanlı da tərifli avropalılardan qat-qat üstündür. Yaxşı avropalının gözü isə bizdə, bizim mədəniyyətimizdədir. Mən qərb ölkələrində yaşayan xalqlara baxanda, bizim gənclərə məhəbbətim birə yüz artdı. İndi mən hər dəfə küçə ilə gedəndə, iclasa gələndə, buruqlara yolum düşəndə, hər bir cavan oğlana, hər bir cavan qıza ürək döyüntüsü ilə baxıram. Vaxtilə onların əxlaqında qüsurlu saydığım cəhət də indi mənə xoş gəlir. Biz çox vaxt onların zahirən qaba görünən hərəkətlərinə baxıb deyirik: “Bu cavan nə pozğundur!” Amma biz yanılırıq! Biz çox tələsik

nəticə çıxarırıq. Bax, sizin trestdən bir nəfər oğlan işini buraxıb kəndə qaçmışdı. Siz onu üzvlükdən çıxarmaq istəyirsinizmiş. Nə üçün? Sizin yerinizə mən olsaydım, tələsməzdim.

Tahir qıpqırmızı olmuşdu. Bu sözlərin özünə aid olduğunu yaxşı bilirdi. Yəqin "ustadan eşidib" deyə düşünürdü. O, gözlərini geniş açıb, Paşanın dodaqlarına zilləmişdi. Adını da çəkəcəyindən qorxurdu.

– Mən tələsməzdim ona görə ki, həmin oğlan burada, bu qızıl sovet torpaqda anadan olmuşdur. Mən əvvəlcə onun xasiyyətlərini yaxşıca öyrənərdim, niyə qaçdığını aydınlaşdırardım. Bu səbəbi tapandan sonra tədbir görmək asandır. Onun səhvi nədədir? O oğlan vətənini sevir, işini sevir. Ancaq onun fikrincə ən böyük vətən, dağ döşündəki İrəmə kəndi, ən böyük ana da Fatmanisə xaladır.

Cavanlar gülüşdülər.

– Onun qaçmağına səbəb budur, yoldaşlar. Onun vətəni balaca, məhəbbəti balacadır. Günah kimdədir? Əlbəttə bizdə. Biz ona deməli idik ki, doğrudur, səni doğan ana Fatmanisa xaladır, amma əsil böyük anan bu ucsuz-bucaqsız vətənindir. Kəndini də sev, köhlən atını da sev, amma unutma ki, bunları ayrıca təsəvvür etsən, ürəyin balacalaşar. İrəmə kəndi vətənimizin ən dilbər guşələrindən biridir ("Mən özüm də orada olmuşam" deyə Paşa daha da səsini yavaşıdıb əlavə etdi). Ancaq böyük vətən olmasa, bu gözəllikdən nə fayda? Gərək siz təzə quyuları bircə metr qazanda biləsiniz ki, Bakının qüdrətini yalnız tonların sayı ilə ölçmək olmaz. Bu qüdrəti yaxşı təyin eləmək üçün gərək saysız-hesabsız fabriklərimizi, zavodlarımızı, uzaq-uzaq ölkələrə uçan təyyarələrimizi gözünüzün qabağına gətirəsiniz. Biləsiniz ki, hər bir buruğu həmin ucsuz-bucaqsız ölkəmizin qan damarı saymasanız, gördüyünüz işin qiymətini başa düşə bilməzsiniz.

Paşa bir qədər duruxdu. O indi uzaqlara yox, salondakılara baxırdı. Onun əsil məqsədi, xəyalən qət etdiyi bu məsafələri qarşısında oturmuş cavanların da təsəvvürünə gətirmək idi. Paşa özü Ukrayna, Moldaviya, Macarıstan çöllərində vuruşan zaman, yalnız İrəmə kəndinin deyil, yalnız Bakının və Azərbaycanın deyil, böyük bir diyarın taleyi həll edildiyini öz qanında, canında, əsəblərində hiss etmişdi.

– Bax, bizim cavanlar bunubildiyi üçün də, mən onlara baxanda ürəyimdə sonsuz bir iftixar hissi duyuram. Bu şüur, öz gözümlə gördüyüm Avropa cavanlarında yoxdur və ola da bilməz. Siz Krasnodon qəhrəmanlarını xatırlayırsınızmı? "Gənc qvardiya" əsərini oxumusunuzmu?

– Hələ də gözləyirik ki, Azərbaycan dilində çıxsın! – deyə Cəmil yerindən söz atdı.

Paşa narazı halda başını buladı:

– Çox təəssüf, çox təəssüf... – dedi. – Siz onları tanımırsınız, mütləq tanımalısınız! Donbas ilə Bakının dostluğu həmişə möhkəm olmuşdur. Siz Krasnodon qəhrəmanlarının hər birini tanımalısınız!

Paşa "Gənc qvardiya" romanından bir xeyli danışdı. Bəzən o özü də hiss etmədən cuşə gəlir, mühazirə dönüb maraqlı bir hekayətə çevrilirdi. Dinləyənlər o qədər sükuta dalmışdılar ki, salonda uçan payız milçəyinin vızıltısı belə aydın eşidilirdi. Dadaşlı özü romanı yaxşıca xatırladığı halda, Paşanın təhlili zamanı heyrət içində donub qalmışdı. Çoxları Krasnodon fədailərindən Sergey Tülenini xoşlayırdı. Hamıda da onun arzuları oyanırdı.

– Bax, sizin də aranızda bu cavanlardan geri qalmayan yoldaşlar çoxdur. Mən buna inanıram. – Krasnodon qəhrəmanlarının öz analarına çox böyük məhəbbəti vardır, çünki onlar vətəni sevməyi bacarırdılar. İndi fikrim aydındır, deyilmi?

Hamı Paşanın mühazirəsini alqışladı.

– Bax, bu cür lektora varam! – deyə Biləndər Dadaşlıya baxıb, baş barmağını dimdik tutdu və bir-iki dəfə qaldırıb saldı. Tahir, məftuniyyətlə parıldayan gözlərini elə bil, mühazirəçidən ayıra bilmirdi. Onun təsəvvürünü yalnız Krasnodon fədailəri çulğalamışdı. O, azacıq yan tərəfə baxanda, iki cərgə geridə oturmuş Lətifəni görə bildiyi halda, onu da büsbütün unutmuşdu.

Tənəffüs verdilər. Bir azdan müsamirə başlanacaqdı. Yalnız sonradan-sonraya dərin xəyallarından ayrılan Tahir, yoldaşları ilə bərabər eşiyə çıxanda Zivərlə yanaşı gələn Lətifə, Tahirə baxmadan ötüb keçdi: "Yeri deyil, yoxsa ona bir-iki söz deyərdim. Sonra ayırd edərik..."

– Bura bax, Səməndər, bu gün usta gələcəkmi? – deyə soruşdu.

– Çağırmışıq. Yəqin ki, gələr.

– Bir onun forsuna bax, – deyə Tahir oğrun-oğrun Lətifəyə sarı baxıb dodağının altında mızıldandı. – Əgər Ulya elədiyinin mində birini eləsəydi, dünyanı dağıdardı...

– Kim, kim?

Tahir söhbətlərinin Cəmillə Biləndərin də eşitdiyini görüb, bir daha dinmədi.

– Balam, günah səndədir. Xətrinə dəymisən. Yaman dikbaş qızdır. Nə bilirsən, “Gənc qvardiya”nın düşdüyü vəziyyətdə olsaydı, bəlkə heç Ulyadan geri qalmayacaqdı?

– Eh!.. – deyə Tahir əlilə havanı yardı.

**3**

Bu zaman Qüdrət Azərneft rəisinin kabinetində ayaq üstündə durub, alnının tərini tez-tez silərək, iki saatdan bəri üzərinə atılan ağır ittihamları bir-bir rədd edirdi. Amma görünür, yazı stolunun dalında oturmuş rəis də, onun qarşısında əyləşmiş o biri adamlar da Qüdrətin dediyi sözlərə deyil, Mirzəyevə daha çox inanırdılar. Çünki onun haqlı olduğu nöqtələr də vardır. O, Qüdrətin trestində hələ də möhkəm dönüş yaranmadığını deyərkən, kim ona etiraz edə bilərdi? Bütün Abşeron yarımadasındakı trestlər müharibədən sonrakı aylar içində iş sürətini artırıb ölkəyə borcundan da artıq neft verdiyi halda, Qüdrət plan səviyyəsindən hələ də aşağıda idi. Əlbəttə, bunuəlində əsas tutmuş Mirzəyevi məğlub eləmək o qədər də asan deyildi.

– Məni qəzəbləndirən başqa şeydir, – deyə Qüdrət səsini ucaltmadan və əsəbiləşdiyini gizlətməyə səy edərək, Azərneft rəisinə baxdı. – İxtira ilə məşğul olmaq haqqını kim bizdən almışdır?

Rəis onun sözünü kəsərək:

– Yoldaş Qüdrət, – dedi, – buradakı anlaşılmazlıq ayrı şeydən irəli gəlir.

– Nədən? – deyə İsmayılzadə duruxub, rəisin izahını gözlədi.

– Ondan irəli gəlir ki, siz şəhər partiya komitəsinin göstərişindən sonra gedib buruqlara baş çəkməkdənsə, işə operativ rəhbərlik etməkdənsə, bizim ixtira bürosunun vəzifəsini əlindən alırsınız.

– Qətiyyən! – deyə Qüdrət etiraz səsini ucaltdı. – Məlumdur ki, həmin büro Mirzəyevə tabedir, mən də onun xasiyyətini yaxşı bildiyim üçün, hər növ yenilikdən ürkdüyüm özüm şahid olduğum üçün, Minayevin ixtirası ilə maraqlanmalı idim.

– Sən nə haqla belə ittihamlara əl atırsan?

Mirzəyev kükrəyib coşmaq istədisə də, Qüdrət buna əhəmiyyət verməyib fikrini tamamladı:

– Onu yalnız gündəlik plan maraqlandırır, amma mən indidən əllinci ilin perspektivini nəzərdə tuturam. Demək, bizim aramızda anlaşılmazlıq deyil, dərin bir uçurum var. Onun dediyi yolla getsək,

əlbəttə, iki-üç ay plan dolacaq, amma sonra on il kəsirdən çıxa bilməyəcəyik. Mən isə bu rüsvayçılığa üç ay dözürəm, amma on il dözmək istəmirəm.

– Bu necə məntiqdir? – deyə Mirzəyev yenə təkəbbürlə soruşdu.

– Belə məntiq məndə artıq vərdiş halına gəlmişdir. Mən idarə etdiyim trestləri həmişə bu yolla aparmışam.

– Keçmiş xidmətiniz sizi xilas etməyəcək!

– Mən dünənki işimlə öyünməyə ehtiyac görmürəm! – deyə Qüdrət yenə atmacaladı: – Öz xasiyyətinizi məndə nə üçün axtarırsınız?

– Görünür, sülh baş tutmayacaq, yoldaş Qüdrət, – deyə rəis də Mirzəyevin tərəfini saxladı.

– Elə görünür... – deyə İsmayılzadə təsdiqlədi.

– Bilmirəm, siz nə üçün Minayevin ixtirasına bu qədər ümid bəsləyirsiniz? Doğrudanmı o, trestinizi rüsvayçılıqdan qurtara bilər?

Rəisin sualında artıq istehza oxunurdu.

– Məncə bu münaqişəni şəhər komitəsi katibi həll edəcək. Çünki siz hamınız onun adından məni töhmətləndirirsiniz. Mirzəyev də öz haqsızlığını rütbəsinin gücü ilə ört-basdır eləməyə çalışır. İzin verin hökumət telefonu ilə katibə zəng edim.

– Bizi nahaq qorxudursuz, yoldaş İsmayılzadə, mən yalnız partiyanın dediyini həyata keçirirəm.

– Daha yaxşı. Demək, mən onda haqsızlığımı görüb, birdəfəlik susmağa məğbur olaram.

– Olacaqsınız, mən buna əminəm!

Qüdrət telefon aparatları qoyulmuş balaca, dəyirmi stola yanaşdı:

– İzin verin, sizin yanınızdan ona zəng edim.

– Buyurun, buyurun!

Qüdrət dəstəyi götürüb nömrəni yığdı:

– Axşamınız xeyir, yoldaş Aslanov, – dedi. – Bilirəm çox məşğulsunuz. Lakin mən işin xatiri üçün beş-on dəqiqə vaxtınızı almaq istəyirəm... Bəli, yaxındayam. Çox gözəl, sağ olun! – Qüdrət dərindən nəfəs aldı və yenə rəisə baxdı:

– Bir saatdan sonra görüşərik. İcazə verin mən gedim hazırlaşım.

Mirzəyev qıpqırmızı olmuşdu: “Katib bizi çağırmasa, bu özünü təmizliyə çıxarıb, hamımızın kölgəmizi qılınclayacaq” deyə düşündü.

Rəis Qüdrətin xasiyyətinə yaxşı bələd olduğu üçün, yalnız bu sözləri dedi:

– Təbii ki, şəxsi məsələləri yadınızdan çıxaracaqsınız.

– Ona şübhə etməyə bilərsiniz! – deyə Qüdrət qapıya yönəldi.

Mirzəyev şəhadət barmağı ilə Qüdrəti hədələdi:

– Bax, namərdlik eləmə ha!

– Tərcümeyi-halınızı danışmayın, mən ona yaxşı bələdəm, – deyə İsmayılzadə rəisin kabinetindən çıxıb, maşınını Lalənin trestinə sürdürdü. Minayevi tapdı, tez çertyojlarını və ixtirasının maketini istədi. Dmitri maşınla evinə yola düşəndən sonra, Qüdrət arvadı ilə üzbəüz oturdu.

Lalə dünən baş mühəndisin texniki imtahandan keçirdiyi adamlara dair yazıb verdiyi xasiyyətnamələrlə tanış olurdu. O, Qüdrətin həyəcanlı gəldiyini görən kimi ayağa qalxdı, nə üçün belə əsəbiləşdiyini soruşdu.

– Bu trest səni qocaltmasa yaxşıdır, – dedi. – 155 nə haldadır?

– Vaxtından bir ay əvvəl qurtaracaq. Məni düşündürən o deyil. Adamların təşəbbüsünü boğurlar. Görünür bu gün qəti hücum başlanacaq.

– Necə məgər?

– İşə mane olan Mirzəyevdir. Mən onun haqqında nədənsə həmişə yaxşı fikirdə olmaq istəyirdim. Ancaq indi görürəm ki, bu fikrimi dəyişməyə məcburam. Deyəsən onu maraqlandıran iş deyil, öz hakimiyyətini mənə, sənə hiss etdirməkdir. Doğrusu, qət eləmişəm, bu gün üstüörtülü nə varsa açıb deyəcəyəm.

– Ona haqq versələr?

– Nə olar, olar! Bundan qorxsam, hər gün başıma qapaz dəyəcək. O namərd adamdır. Düzəlməz. Yaxşı, bunlar bir yana dursun, sən nə üçün qəmginsən?

– Dünən üç yerdə avariya olmuşdur. Səhərdən bəri adamları danlayırdım. Bəziləri elə güman eləyirlər ki, müharibə qurtardı, demək istirahət başlandı. Bax, Allah eləməsin, bu xəstə əhval-ruhiyyə başqalarına da sirayət eləsin...

– Düz deyirsən. Köhnə quyularda işləyən adamlar bu mərəzə daha tez tutulurlar. Bərk dayanmaq lazımdır... Bu gün qəzet oxumusanmı?

– Oxudum. Trumen korlayır. Hitler də belə başlamışdı...

Qüdrət əsnədi.

– Yorğunsan, Qüdrət. Get dincəl!

Qüdrət ayağa durub gəzinməyə başladı. Lalə qayıdıb yerində oturdu. O da yorğun idi. İki gündən bəri gecə saat dörddən tez evə gedə bilmirdi.

– Bu Dmitri harada qaldı? Mən gecikirəm.

– Zəng eləyim? – Lalə ərinin cavabını gözləmədən Minayevin ev nömrəsini yığdı. – Vera, hanı Dmitri? Çıxdı? Yaxşı, lazımdır. Gözləyirik.

Bu zaman doğrudan da Minayevin ayaq səsləri eşidildi. O içəri girəndə Qüdrət dedi:

– Əgər Aslanov razı olsa, özünü çağıraram, gəlib izah elərsən. Hər halda müəllifin özü əsərini daha yaxşı başa düşər... Konstruktor Talıbzadənin resenziyası hanı? Ona Aslanov çox inanır.

Minayev, layihəsini çəkdiyi qalın kağızlar arasında bircə səhifəsi yazılmış vərəqəni tapıb çıxardı. Burada qoca mühəndis Talıbzadə öz rəyini iki cümlə ilə ifadə eləmişdi "Dmitri Minayev yoldaşın ixtirası ilə tanış oldum. Məncə, bu konstruksiyanın böyük təcrübi əhəmiyyəti vardır".

– Qoca çox sevindi. Hər dəfə ona rast gələndə məni elə həvəsləndirir ki... Köhnə zamanda oxuyasan, yeniliyi bu qədər sevəsən? Çox nadir keyfiyyətdir! Xülasə, qoca məni ürəkdən təbrik elədi. – Dmitri qalın kağızları açıb bir-bir Qüdrətə göstərdi. – Mən əminəm ki, nəticəsi məni utandırmayacaq.

Qüdrət saata baxdı. Qəbul vaxtına cəmisi on dəqiqə qalırdı:

– Mən getdim, – deyə o, tez kağızları səliqə ilə yığışdırıb çıxdı və maşına minib şəhər partiya komitəsinə yola düşdü.

**4**

Gənclərin müsamirəsi qurtarmaq üzrə idi. Lətifə, mühazirə söylənən zaman tutduğu yerdə Zivərlə yanaşı oturmuşdu. Qabaqdakı yemək stollarını eşiyə çıxarıb, səhnə əvəzinə açıq bir yer düzəltmişdilər. Lətifənin yaxşı tanıdığı konferansye cavan fəhlələrin özlərindən deyildi. O, həmişə rəngbərəng qalstuklar taxan, qara şalvarları çox ütüləməkdən işıldayan, uzunsov başının yan tərəfində qalmış seyrək saçlarını uzadıb, kəlləsinin ortasındakı dazın örtməyə çalışan, amma yenə də başının tüksüz yeri açıqda qalan gödək və şişman bir oğlandı. O, tamaşaçıları güldürmək üçün dediyi sözlərə hamıdan çox özü gülürdü.

O son nömrələrdən birini elan edib deyirdi:

– İndi də göydən toz, yerdən duman qaldıran bir oyun havası! – Cavan fəhlələrdən düzəlmiş sazəndələr dəstəsinə işarə vurdu.- Qaytağı!

Bu dəfə heç kəs onun sözlərinə gülmədi.

– Söz verilir Səməndərin qılçalarına!

Salondan gurultulu alqışlar qopdu. Konferansye özünə əl vurduqlarını düşünərək, dediyi sözlərin təsirindən razı qalıb güldü. Bu zaman Səməndər də səhnədə göründü. Salonda doğrudan da qəhqəhə səsləri ucaldı. Cavanlar konferansyenin gülməyinə gülürdülər.

Əvvəlcə yavaş çalınan hava get-gedə qızışdıqca, Səməndər, hamının xoşuna gələn bir məharətlə oynayıb səhnədən çəkiləndə, tamaşaçılar “bis, bis!..” deyə qışqırdılar. Konferansye yenə ortada göründü.

– Sakit olun, yoldaşlar, – dedi, – proqramımız çox duzludur. Var olsun aşpaz!

O, əlbəttə, özünün məharətini nəzərdə tuturdu. Lətifə, yarım saatdan bəri eşitdiyi bu çeynənmiş sözlərdən lap təngə gəlib Zivərə dedi:

– Bu əti tökülmüş haradan gəlib bura çıxıb.

– Oynayanlar, çalanlar yaxşıdır, amma konferansyenin talantı yadından çıxıb evlərində qalıb.

Bu anda Lətifənin heç gözləmədiyi bir nömrə elan olundu:

– Aşiqlər aşiqi Tahir Bayramlı oxuyacaq... – Konferansye duruxdu. – Özü deyər, nə oxuyacaq.

Tahiri yaxşı tanıyan dostları əl vurdular. Ancaq çoxları onu birinci dəfə dinlədikləri üçün sükut içində irəliyə, yan otaqdan bəriyə açılan qapıya sarı baxdılar. Tahir kənddən ilk dəfə gələrkən geyindiyi mixəyi paltarında idi. Saçlarını geriyə daramış, sazını yanından aşağı sallamışdı. Ortalığa gələndə məğrur bir görkəm aldı, müvəffəqiyyət qazanacağına əvvəldən möhkəm inanan artistlər kimi, əl vuranların azlığından narazı qalmadı.

Lətifə ixtiyarsız olaraq qaşlarını çatdı, tərifini eşitdiyi Tahirin mahnısını səbirsizliklə gözlədi. Müsamirənin son nömrəsində çıxan cavan aşığı tanımayanlardan bir neçəsi yerlərindən qalxıb qapıya sarı yönələndə, salondakı sükut pozuldu. Tahir bundan da tutulmadı. Elə bil onun qulaqları heç bir səs eşitmirdi.

Tahir sazını sinəsinə basdı. Onun barmaqları simlər üzərində oynarkən, Lətifənin gözləri yavaş-yavaş böyüməyə başladı, qaşlarının düyünü açıldı, dodaqları bir-birindən azacıq aralandı, Tahir, çaldığı

havanın ahənginə uyaraq, yerindən ahəstə-ahəstə tərpənir, salondakıların başı üzərindən hara isə uzaqlara baxırdı. Birdən onun səsi də eşidirdi. Tahir ucadan oxuyurdu. Səsində təbii və ahəngdar bir titrəyiş vardı. Görünür salonda oturanların çoxluğu onu həyəcana gətirmişdi. Mahnının sözlərini aydın tələffüz edir, oxuyarkən də çalmağına ara vermirdi. Onun söylədiyi qoşmanı da, çaldığı havanı da Lətifə ilk dəfə eşidirdi.

– Bu sözlər kimindir? – deyə pıçıltı ilə Zivərdən soruşdu.

– Bilmirəm. Yəqin axırıncı bənddə müəllifin adı olar.

Tahir zildən vəsətə keçəndə bütün salon heyrət içində susmuşdu. Yalnız onu ilk dəfə eşidənlər deyil, Cəmil də, Biləndər də, gəlib qapı ağzında oturmuş Səməndər də bu mahnıya valeh olmuşdular. İndiyə kimi Tahirin belə gözəl oxuduğu onların yadına gəlmirdi. Səməndər bunun səbəbini yaxşı bilirdi. O, dodağını Biləndərin qulağına yaxınlaşdırdı:

– Bilirsən niyə belə qiyamət eləyir?

– Niyə?

– Lətifə buradadır axı...

Səməndər haqlı idi. Tahir Lətifənin əlindən yanıqlı olduğu üçün, dinləyənlər arasında gözlərilə onu axtarmadan bütün həyəcanını mahnı ilə ifadə edirdi.

– Axı bu sözlər kimindir? – deyə Lətifə bir də Zivərdən soruşdu.

– Bu saat deyər. Aha, özünündür!

Doğrudan da Tahir dostluqdan, vəfadan, məhəbbətdən bəhs edən bu gözəl qoşmanı özü söyləmişdi. Paşanın mühazirəsində eşitdiyi hekayələrdən, xüsusilə gənc qvardiyaçıların fədakar dostluğundan nə qədər mütəəssir olduğu bu qoşmadan aydın görünürdü. Şerin məzmunu çox sadə idi: tufanlı dənizdə qərq olmaq təhlükəsi də üz versə, dost yolunda canını əsirgəmə, çünki bizim həyatımız bu dostluq üzərində yüksəlir!

Tahir qoşmanın son bəndini zilə çəkib oxumağına ara verəndə, salonda elə bil tufan qopdu. Hamı ondan bir də oxumağı xahiş elədi. Konferansye ortaya çıxıb mahnıya “duz” qatmağa belə ehtiyac görmədi.

Tahir yenə oxudu. Lətifə isə gözlərini ondan ayıra bilmirdi. Bəlkə qız, indiyə qədər hərdəmxəyal, mütərəddid və qeyri-ciddi bir uşaq hesab elədiyi Tahirin məharətinə vurulduğu üçün dünyada hər şeyi

unutmuşdu? Bəlkə onun könlündə özü də hiss etmədən Tahirə qarşı dərin bir məhəbbət oyanmışdı? Lətifə, oxuduğu roman və dastanlardan bu məhəbbətin təxminən necə bir şey olduğunu bilirdi. O bilirdi ki, insanlar bu yolda hədsiz iztirablara məruz qalır, çox zaman ölüm qorxusunu belə unudub, hər növ çətinliyə sinə gərir, ən axırda isə həlak olub dünyadan gedirlər. Əvvəllər Lətifə bu cür hadisələrin yalnız köhnə zamanlarda baş verdiyini xəyal edirdi. Ona elə gəlirdi ki, indi belə iztirablara düçar olan yoxdur və ola da bilməz. Bəs öz ürəyində baş qaldıran bu hiss nə idi? Nə üçün indiyə kimi Tahirə qarşı bu qədər biganə olduğu halda, indi onun geriyə daranmış sərt saçları, geniş alnı, ilhamla dolmuş gözləri, azca qalın görünən dodaqları, titrəyən səsi, saz çalması, oxuması da onun varlığını ehtizaza gətirirdi? Bəlkə o, Tahiri yalnız indicə, mahnı oxuyan zaman tanımışdı?

Lətifə birdən anladı ki, yox, bu saat onda Tahirə qarşı oyanan bu meyl çoxdan, özü də ilk dəfə onu gördüyü dəqiqələrdən başlanmışdır. Görünür indiyə qədər özü bunuduymamış, bunun fərqinə varmamışdır.

Yenə alqış səsləri gurlayıb salonu titrətdi. Konferansye müsamirənin qurtardığını söylərkən, cavanlar elə bil onun acığına daha da bərkdən əl vurdular. Lakin Tahir bir daha səhnədə görünmədi. Alqışlar getdikcə azalıb, ən axırda kəsildi.

Lətifə yerindən qalxa bilmirdi. Salonun yarısı boşaldığı halda, onun gözləri yenə də səhnədə idi. Elə bil Tahir onun gözlədiyini duyub, bir də oxuyacaqdı.

Bu anda o, Zivərin səsini eşitdi:

– Kimi gözləyirsən?

Lətifə fikirdən ayrıldı. Tez ayağa qalxdı. Onlar qol-qola girib eşiyə çıxdılar və bu zaman uzun dəhlizdə qəribə bir hadisənin şahidi oldular: usta Ramazan Tahirə yaxın gəlib onun qabağını kəsdi. Tahir əlini irəli uzadıb, usta ilə görüşmək istərkən, qoca sevincini gizlədə bilməyərək, əli ilə onun böyrünə vurdu:

– Allah sənin bəlanı versin! – dedi, – istəyirdin mənim briqadam belə oxuyanını itirsin.

Sən demə qoca qapının dalında ayaq üstündə durub Tahirin qoşmasını dinləyir və onun eşiyə çıxmasını səbirsizliklə gözləyirmiş... Tahir qızları görmürdü. Kim bilir, bəlkə də görür, amma özünü görməməzliyə vururdu? Lətifə gülümsəyirdi. Tahirin, usta ilə görüşündən

sonra mütləq bəriyə tərəf baxacağını və onu görəndə salam verəcəyini düşünürdü. Amma usta Ramazan şagirdilə bərabər çıxıb yola düzəldi. Tahir gözünün ucu ilə də olsa Lətifəyə baxmadı. "Demək, bundan sonra qaçmayacaq".

Birdən Zivər onu özünə tərəf çəkdi. Qızlar qaranlıqda gözdən itdilər.

Cəmil isə qızların bir hərəkətini belə gözdən qoymurdu. Konsert salonunu tərk etdikləri dəqiqədən başlayaraq, onları addım-addım izləyirdi. Əlbəttə, onu maraqlandıran yalnız Lətifə idi. Özünü qızlara göstərmədən, səssizcə addımlarla yeriyir, Zivərin Lətifədən ayrılmağını gözləyirdi. Bu dəfə o nə üçünsə Zivərin Lətifəgilə getməyəcəyinə tamamilə əmin idi.

Qızlar qol-qola tutuşub, asfaltın düz ortasilə yeriyirdilər. Amma nə Lətifə dinib-danışır, nə də Zivər ondan bir söz xəbər alırdı.

Onlar nəhayət daş pilləkənə çatanda Cəmil, yolu işıqlandıran böyük fənərin altında özünü göstərməmək üçün kənar yol tutdu və qaranlıq yerlə, uzaqdan-uzağa onlara baxa-baxa yeriməyə başladı.

Qızlar daş pillələri dırmandılar, sona çatanda ayaq saxladılar. Bu zaman Bayıl üzərini çuğlamış ağ buludlar arasından siyrilib çıxan ay, onların üstünə süd kimi ağ bir işıq saldı.

Birdən Cəmil Zivərin səsini eşitdi:

– Nə olub sənə, ay qız? Niyə qanın qaradır?

Lətifə dinmədi. Başını Zivərin çiyninə söykədi.

– Bayaqdan fikir verirəm. Demə ki, Zivərin gönü qalındır. Axı o səni görmədi. Usta onun başını qatmışdı. Mən bilirəm ki, o səni çox istəyir. Günah özündədir. Xətrinə dəymisən.

Lətifə yenə dinmədi.

– Yaxşı oğlandır. Səməndər mənə deyib. Ürəyi təmiz, yoldaşlıqda vəfalıdır. Amma gözəl oxudu. Deyəsən hava da özünündür. Sözləri necə idi?.. Hayıf yadımda qalmayıb.

Səbirsizlikdən az qala Cəmilin ürəyi yerindən qopurdu: "Gör qızı nə tovlayır! Görək Lətifə özü nə deyəcək?" deyə nifrətlə Zivərə baxırdı.

Yenə Zivərin səsi eşidildi:

– Bu nədir, sən ağlayırsan?

Qaranlıq bucaqda durub, onlara qeyri-adi bir intizarla baxan Cəmil, Lətifənin hıçqırıqlarını aydın eşidirdi.

“Aha, Tahiri sevirmiş...” Cəmil, elə bil gicgahlarında vuran damarların zərbindən bir az geriyə çəkildi və burada gizlənib oğrun-oğrun baxdığını kiminsə görəcəyindən qorxurmuş kimi, tez uzaqlaşdı.

Ümumi yaşayış evinə gələndə, yoldaşları hələ yatmamışdı. Səməndərlə Biləndər bir-birinin sözünü kəsərək Tahiri tərifləyir, konsertdə hamıdan çox onun müvəffəqiyyət qazandığını söyləyirdilər.

– Doğru deyirsiniz, bu gün Tahirin gəlhagəli başlanıb, – deyə Cəmil adəti üzrə ciddi və sakit bir tərzdə əlavə etdi.

Səməndər bir Tahirə, bir də Cəmilə diqqətlə nəzər salıb, zarafat tərzində, bic-bic gülərək dedi:

– Aşna, elə bilmə ki, görmədim ha!

Cəmil diksinərək gözlərini Səməndərə zillədi:

– Nəyi?

– Lətifənin dalınca getməyini...

Cəmil dinmədi. Yalnız gözlərini aşağı salıb, xəfif bir halda köksünü ötürdü. Amma Səməndəri işin nəticəsi maraqlandırırdı:

– Olmaya atqaz elədi?

Hamı sükut içində Cəmildən cavab gözləyirdi. Tahir həyəcanını üzə vurmurdusa da, ürəyindən qara qanlar gedirdi: “Deyirəm axı, niyə Cəmil birdən yox oldu. Deməli, Lətifəni ötürürmüş”.

Yerində mıxlanmış kimi duran Cəmil, nəhayət Tahirə yanaşdı:

– Sən xoşbəxtsən, əzizim, – dedi, – mən yoldaşlıqda sədaqəti hər şeydən uca tuturam. O səni istəyirmiş. Aranıza girmək namərdlik olar!

– Axı nədən bilirsən? – deyə Səməndər qalxıb çarpayıda dik oturdu.

Cəmil ürəyində baş qaldırmaq istəyən həsəd hissini boğa-boğa dedi:

– Öz gözümnən gördüm, öz qulağımnan eşitdim.

Onun səsindəki titrəyişi cavan fəhlələr deyil, özü də duyub, sükuta qərq oldu. Tahir bu etirafı eşidəndə qulaqlarına inanmadı. Cəmildən yenə nə isə soruşmaq istədi. Ancaq onun könlünə toxunacağından qorxub dinmədi...

## 5

Aslanov, Qüdrətin nə məsələ üçün gəldiyini öyrənəndən sonra, Azərneft rəisi ilə Mirzəyevi də yanına çağırtdırdı. Onlar gəlincəyə qədər Minayevin layihəsi ilə tanış olub, qoca mühəndis Talıbzadənin

rəyini gözdən keçirdi. Qüdrət, belə hallarda katibə izahat verməyi artıq bilirdi. O, uzun illərin təcrübəsi sayəsində neft sənayesinin bütün təfərrüatına bələd olduğundan, ən yaxşı mütəxəssislər belə onun məsləhəti ilə hesablaşırdılar. Qüdrət, bu ixtiranın xüsusən dərin quyular qazımaq üçün nə qədər əhəmiyyətli bir hadisə olduğuna əmin idisə də, lakin yenə də katibin rəyini: bilməyə tələsirdi. Yalnız bir alətin taleyini deyil, onunla Mirzəyev arasındakı ixtilafı bu rəy həll edəcəkdi. Amma katib bu xüsusda heç bir söz demədi. Görünür, fikrini söylərkən hər iki tərəfin iştirakını lazım bilirdi. O indi tamam başqa bir məsələdən söz saldı:

– Dünən rayonlardan birində idim. Kəndlərimizdə kütləvi bir hərəkat başlanmışdır: hamı elektrik işığında oturmaq istəyir. Bəzi kolxoz sədrləri heç kəsdən kömək almayıb, özləri stansiya tikdiriblər. Həmin rayon mərkəzinə bitişik yüz əlli təsərrüfatı olan bir kənd var... (Katib qəsəbənin də, kəndin də adını söylədi) Qəsəbədə elektrostansiya xarab olduğundan, kənd onlara işıq verir. Qəribədir ki, sadəcə bir təsadüf nəticəsində bu fikir başlarına gəlib. Qəsəbədəki teatrda yeni bir tamaşa göstərirlərmiş, həmin kolxozun üzvləri də salonda oturub, pərdənin qalxmasını gözləyirlərmiş. Birdən işıqlar sönür. Məlum olur ki, elektrostansiya sabaha qədər işıq verə bilməyəcək. Biletləri qaytarmalı olurlar. Kolxoz sədri deyir ki: "camaat, bir az gözləyin, mən işığı düzəltdirərəm..." Elə oradaca kolxozun üzvlərindən birinə əmr verir ki, tez kənd elektrostansiyasını şəhərlə calaşdırsınlar. Bir saat belə keçməmiş teatr onlardan işıq alır, tamaşanı göstərir. Ondan sonra kolxoz bütün qəsəbəyə elektrik xətti çəkdirməyi boynuna götürür. İndi nə vaxt qaranlıq olsa, kənd onları işıqla təmin edir.

Qüdrət, Aslanovun bu əhvalatı nə üçün söylədiyini bir dürlü başa düşmürdü. Deyəsən katib onun təəccüblə baxdığını duyub, yenə sözünə davam etdi:

– Bu il, başqa bir sıra kolxozlar da öz planlarında elektrik stansiyaları qurmaq məsələsini nəzərdə tutublar. Ancaq kolxozların bir neçəsində hələ bu təşəbbüsü həyata keçirə bilmirlər, çünki onlara vaxtında mühəndis-texniki yardım göstərmək mümkün olmur. Bakı müəssisələri bu hərəkata kömək eləsələr necə olar? Olmazmı ki, ayrı-ayrı kolxozları şefliyə götürüb, bütün kəndlərimizdə balaca elektrostansiyalar düzəldək? Məsələn, sən ilk dəfə bu təşəbbüsü boynuna götürsən necə olar? – Katib Qüdrətə yanakı baxıb gülümsündü: – Elə düşünə

bilərsən ki, öz trestin geridədir, partiya sənə aid olmayan bir işi də boynuna yükləyir... Məsəl var: "Çobanın könlü olsa, təkədən pendir tutar". Bir qədər düşünsən, görərsən ki, belə lazımdır.

Katib susdu. Ayağa qalxıb ağır-ağır gəzinməyə başladı.

Katib:

– Dünən cavan fəhlələrin yeməkxanalarına baxırdım, – dedi, – çoxdandır onlar göyərti, alma-armud üzü görməyiblər. Bakının meyvəsi ilə onları doydurmaq çətindir. Yaxşı olmazmı ki, belə şeylərlə də kolxoz sizə kömək eləsin? Lap sizin rayonda dükan açıb meyvəcat satsın?

Qüdrət də istər-istəməz qımışdı: "Aha, indi bildim bu müqəddimə nə üçündür".

– Hə, necə fikirdir? – deyə Aslanov soruşdu.

Qüdrət bir qədər düşündü. Zehnində haqq-hesab elədikdən sonra cavab verdi:

– Mümkündür. Geridə qalmış olsam da, bir-iki kəndi boynuma götürərəm.

Bu anda qapı açıldı... Katibin köməkçisi içəri girib, çağırılmış adamların gəldiklərini xəbər verdi. Katib:

– Çağırın, çağırın! – deyə yenə gəzindi.

Bir an sonra Azərneft rəisi ilə Mirzəyev daxil olub salam verdilər. Aslanov onlarla əl tutuşdu. İri və sərt gözlərini bir xeyli onların üzündə gəzdirdi və əllərini dalında çarpazlayıb yenə kabinetdə var – gəl etdi.

Rəislə Mirzəyev yanaşı oturdu.

– Hə, bu proektlə tanışsınızmı? – deyə katib birdən duruxub Azərneft rəisinə baxdı, əlilə layihə kağızlarını göstərdi.

Mirzəyev ayağa qalxdı:

– Məsələ burasındadır ki, Qüdrət İsmayılzadə yoldaş...

– Mən Qüdrəti soruşmuram. Minayevin proektini soruşuram.

– Xeyr, tanış deyilik.

– Nə üçün, görünür belə xırda işlərlə məşğul olmağa vaxt tapmırsınız, hə? – Katib "xırda" sözünü deyəndə, səsinin ahəngində istehza nidası vardı. – Mən hələ istehsalat nöqteyi-nəzərindən demirəm, sırf elmi cəhətdən götürsəniz də olduqca mühüm ixtiradır. Gələn il üçün mükafata namizəd axtarırsınız, bundan yaxşı namizəd?

Mirzəyevin üstünə elə bil qaynar su calandı.

– Aparın, tanış olun. Mümkün qədər tez təcrübədən keçirin! – Katib heç bir etiraza yol verməyən qəti bir tərzdə əlavə etdi: Özü də lap bu il kütləvi surətdə istehsal olunsun!

Qüdrət işin sonunu belə gözləmirdi. Aslanov nə qədər səbirli adammış, bu xüsusda o nə üçün əvvəldən kiçik bir işarə belə vurmurdu?

– Məncə, – deyə katib rəisin başı üzərində dayandı, – Mirzəyevi Minayevlə əvəz etsəniz pis olmazdı. Mərkəzdən xahiş elərik, razı olarlar.

Bu zərbə Qüdrətin özünü də səksəndirdi.

– Nahaq təəccüb eləyirsiniz. Bizə beyinlə işləyən adamlar lazımdır. Amma siz... – Mirzəyevin boğazı qurumuşdu.-Onu sıravi mühəndis kimi qəbul eləməyə razısanmı? – deyə katib Qüdrətdən soruşdu.

Ortalığa ağır bir sükut çökdü.

Katib stolunun dalına keçdi:

– Aşağıda çalışan adamlar rəhbəri vurub keçəndə, həmişə belə təbəddülata ehtiyac duyulur. Amma sən, yoldaş Qüdrət, bu liberallığı burax! Nə üçün indiyə qədər Mirzəyevin hərəkətini bizə xəbər verməmisən?

– Hansı hərəkətini?

– Necə hansı hərəkətini? Müşavirə aparırsınız, ixtiranın layihəsini müzakirə edirsiniz, bu isə gəlib ağzına gələni deyir. Sizcə bundan bizim xəbərimiz olmalı idi, ya yox?

**6**

Onlar şəhər komitəsindən çıxanda Mirzəyevi tər basmışdı. Azərneft rəisi dinmir, başını aşağı salıb onlardan qabaqda yeriyir, Qüdrət isə lap geridən gəlirdi.

– Namərd tərpəndin, Qüdrət! – Mirzəyev geriyə tərəf boylandı. – Mən səni heç belə bilməzdim...

– Orada deyilən sözlər, orada da qalır! – deyə Azərneft rəisi onun sözünü kəsdi. – Günah, əlbəttə, bizdədir. Sən o ixtira bürosunu yoxlasan pis olmaz. Göydə axtardığımız yerdə əlimizə düşür, amma biz istifadə eləməyi bacarmırıq.

Qüdrət yenə də bir söz demədi. Onu indi başqa məsələlər düşündürürdü: “Yarış nəticələrini yoxlamaq gərək! İndi iş sürəti birə üç artmasa, bu zərbədən biri də mənim üçün var. Yoxlamaq gərək!”

Eşikdə külək qalxmışdı. Çoxdan bəri dəniz havasını öz sümüklərində hiss edən Qüdrət, buradan birbaş trestə getməyi qərara aldı: "Tufan qalxacaq. Trestdə gecələmək lazımdır!"

Onlar ayrılanda yalnız Qüdrətdən səs çıxdı:

– Hələlik...

**7**

Qəsəbənin bağında yarpaqlar çoxdan xəzəl olmuşdu. Külək əsdikcə havalar soyuyur, xəzəllər kəpənək sürüsü kimi göydə uçuşur, yerə tökülüşürdü. Yarpaqların pıçıltısını, qızla oğlanın pıçıltısından ayırmaq çətin idi.

Bu zaman bağda gəzinən kim ola bilərdi? Söhbət üçün yermi, vaxtmı qəhət idi? Oğlan qızın qoluna girmişdi, heç yana tələsmədən ağır-ağır yeriyir, amma ürəyini açıb söyləməyə yalnız indi fürsət tapmış kimi, sözlərini birnəfəsə, tez-tez deməyə çalışırdı:

– Çoxdanmı sevirdin? Bəs nə üçün bunumtəndən gizlədirdin? Gərək elə həmişə oğlan qıza yalvarsın? Deyirsən ki, oxuyanda bir dəfə də sənin üzünə baxmadım. Əlbəttə baxmazdım. Bəs mənim heysiyyətim yoxdur?

Əziz oxucu! Mən o qızla oğlanın toy büsatını təsvir etmirəm. Çünki onların heç biri bu xüsusda düşünmürdü. Oğlanın da, qızın da arzusu daha böyük idi. Onların gözü uzaqlara, gələcəyə zillənmişdi. Oğlan deyirdi:

– Lətifə! Gələn il bu zaman mən özüm, bax, orada, sahildən on kilometr uzaqda beş min metr dərinliyində bir quyu qazacağam. Dənizdə ən dərin quyu mənim olacaq. Onu qurtaran günü hər yerdən adamlar gələcək, müxbirlərin, fotoqrafların əlindən tərpənmək mümkün olmayacaq!

Qız deyirdi:

– Tələsmə, Tahir, hələ tezdir. Sən yenicə həyata qədəm basırsan. Dərəcəni artırmaq üçün imtahan vermisənmi?

Xəzəllər yenə pıçıldaşdı. Onlar sükut edib ətrafa baxırdılar. Hər ikisi, onlardan başqa kimlərinsə bir bucağa çəkilib pıçıldaşdığını düşünürdü. Lakin ətraf bomboşdu. Yoğun ağacların qaralışan gövdələrindən başqa heçnə gözə dəymirdi.

– Tələsmə, – deyə Lətifə nəsihətə keçdi, – hələ sən bu sənəti yenicə öyrənirsən. Mənim atam iyirmi il fəhlə işləyəndən sonra buruq ustası olub...

Tahir qızın könlünə toxunmaq istəmədi: “O başqa, o savadsızdı” deyə düşündü.

– Bir il bir igidin ömrüdür, – dedi. – On səkkiz yaşında o qədər qəhrəman var ki... Mən o vaxtacan çox şey öyrənəcəyəm. Bir ildən sonra gedib anamı da gətirəcəyəm.

– O necə arvaddır, hə? Mehribandır?

Lətifənin gözlərində sualdan çox, Tahirin anasını görmək arzusu oxunurdu. Tahir də bunuduymuş kimi, ona cavab vermədi:

– Paho, mən gecikirəm, – dedi və tez-tez yeriməyə başladı.

– Hara, hara gecikirsən?

– Bu saat dərsimiz başlanır. Montyorlar dərnəyinin məşğələsi saat yeddidədir, – o, Lətifənin qolundan ayrılmadı. – O vaxt sən deyirdin ki, neftçiyə üç şey lazımdır, onların heç biri məndə yoxdur. Yadına gəlirmi?

– Aha, yadımdadır. Cəsarət, diqqət, iradə...

– Amma birini yadından çıxarmısan.

– Nəyi?

– Biliyi... Bunsuz cəsarət fayda verməz.

– O heç. O hamıya lazımdır.

– Amma neftçiyə hamıdan çox lazımdır. Yox? – Tahir duruxdu. – İki saatdan sonra mən boşam. Kinoya gedəkmi?

Lətifə başını ahəstə tərpədib razılıq verdi.

Onlar daş pilləkənin başlanğıcında ayrıldılar. Amma gedə-gedə iki-üç dəfə dönüb bir-birlərinə baxdılar.

Tahir dəftər-kağızını götürüb dərs otağına gələndə, dərnək üzvlərinin hamısı toplaşıb rəhbəri gözləyirdi.

Məşğələ bir saat çəkirdi, amma Tahirin sualları dərsdən də çox çəkirdi. Onlara rəhbərlik edən adam hər şeydən artıq Tahirin bu suallarından qorxurdu. O, çoxdan bəri öz sənətinə dair kitab oxumadığı halda, Tahir elektrikə dair balaca bir kitabxana düzəltmişdi. O, gecə yarıdan sonra həmin kitabları oxuyur, nazik, uzun dəftərinə qeydlər yazır, başa düşmədiyi yerləri (bəzən yalnız müəllimin özünü imtahan etmək üçün) soruşurdu. Amma dərnək rəhbəri, ən çox, mədənlərdə baş verən hadisələrdən danışır, dərsdən sonra cavanları buruğa aparıb, əyani surətdə göstərirdi.

Bu dəfə içəri girəndə, Tahirin nazik, uzun dəftərini görüb qımışdı:

– Durun gedək, – dedi, – dünən bizim mədəndə yanğın olub, onu sizə göstərmək istəyirəm. Bu barədə hələ heç bir kitab yazılmayıb...

...Onlar yanğının səbəbini öyrəndikdə, təəccübdən Tahirin qolları yanına düşdü. Yoğun elektrik kabelinin mis qabığında, çeçələ barmağının ucu enində bir yer sürtülüb açılmış və iki xətt bir-birinə toxunub qığılcım vermiş, bundan da havaya hopan qaz od tutmuşdu. Dərnək rəhbəri:

– Əlbəttə, – deyirdi, – belə təsadüflərin çox faciəli nəticələri olur. Yaxşı ki, yanğın komandası dünən çox məharət göstərdi, fəlakətin qabağını tez aldı. Ancaq təsəvvür edin ki, belə hallar ya çox uzaqda, ya da dənizdə baş versə, böyük insan tələfatı ola bilər. Çünki komanda özünü yetirənə qədər yanğın qüvvətlənib adamları məhv eləyər, bütün buruğu da korlayar. Bunun üçün də elektrik xətlərini çox diqqətlə yoxlamaq, vaxtlı-vaxtında təmir etmək və əmniyyət cihazlarının sayını artırmaq lazımdır. Diqqət etsəniz, görərsiniz ki, buruqlarda bu cihazların sayı çoxdur.

Amma Tahir yenə də sual verdi:

– O nə üçündür axı?

– Yanğın olsa, gərək dərhal tok kəsilsin! – deyə müəllim əmniyyət cihazının dəstəyini aşağı basdı – bax belə...

Dərnək rəhbəri onları buruğun dövrəsində çox gəzdirdi. Sonra pilləkənlə qülləyə dırmaşdılar. Tahir buradan Lətifəgilin evlərini aydın görürdü və gördüyü üçün də saat doqquzu yadından çıxarmırdı...

**8**

Lətifə Tahirdən ayrılandan sonra evə gəlib, bu iki saatı çox səbirsizliklə gözlədi. Hansı işdən yapışmaq istədisə də bacarmadı. Bu gün səhərdən bəri Tahirlə elədiyi şirin söhbətdən doymamışdı. İndi də yalnız onu düşünür və gələcək münasibətlərini götür-qoy eləyirdi. Ata-anası evdə olmadığından, onun düşüncələrinə heç kəs mane olmurdu. Görüş vaxtına yalnız on-on beş dəqiqə qalmış atası işdən qayıtdı. Lətifə onun bədənnüma güzgüyə düşən əksini görüb, hər iki əlilə saçlarını hörə-hörə geriyə çevrildi.

– Atacan, gəldin? Lap yaxşı oldu. Anam qonşudadır. İndi də gəl, sən evdə növbə çək.

Qocanın uzun bığları altından gülümsəyən bozumtul dodaqları onun nə üçünsə çox sevindiyini göstərirdi. Lətifə bunun səbəbini təxminən bilsə də, yenə soruşmalı oldu. Qoca iri əllərini bir-birinə sürtərək, qürurla başını qaldırıb-saldı:

– Sağlığına, bu gün buruğu təhvil verdim, qızım. Yaman vurhavurdu. Səhərdən trest müdiri, baş incinar da oradaydı. Demə ki, qabaqda gedən elə təkcə sənin ustan Ramazandır. Keçici bayrağı qonşumdan alıb mənə verdilər.

– Doğrudan? – deyə Lətifə, sevincindən parıldayan gözlərini atasından ayırmadı. – Bəs sən deyirdin sabah yox, birisi gün qurtarırsan?

– Yox, qızım, mən dünən qurtarmışam, bu gün özüm gedib neftçıxarma briqadasını başa salırdım. Səhər tezdən güllələmişdilər. Neftin çıxmağını gözləyirdim.

– Hə, nə oldu, neft gəldi?

Qoca bu sualdan inciyən kimi duruxdu:

– Ay hay, bəs nəmənə? Amma rəngindən özümün də xoşum gəldi. Elə bil yenicə süzülmüş beçə balıdır. Qüdrət çox razılıq elədi. Zarafat deyil, vaxtından düz iyirmi gün qabaq qurtarmışam.

Lətifə tələsik şlyapasının rezinini boğazına keçirib güzgüdən aralananda atası soruşdu:

– Hara gedirsən? İşə? Ay qız, gəl sən bu daşı ətəyindən tök. Çox əziyyət çəkirsən. Sabah mənə o qədər mükafat verəcəklər ki, pulumuzu yığıb-yığışdıra bilməyəcəyik. Həm oxumaq, həm də işləmək səndə can qoymur axı.

Evdə dəfələrlə təkrar olunmuş bu söhbətin təzələnməyi Lətifənin ürəyindən deyildi. O da köhnə cavabını təkrar eləməyə məcbur oldu:

– Yox, ata, mən buruqdan ayrılmayacağam. Bilirəm, mənim aldığım maaş sənə lazım deyil, amma mən buruqda çox şey öyrənirəm. Mühəndis olandan sonra (bu sözləri deyəndə Lətifənin xəyalından ayrı fikirlər keçdi: “Tahirlə bərabər ali məktəbi bitirəndən sonra”), daha o birilər kimi illərlə təcrübəyə getməyəcəyəm.

– Yaxşı, indi hara?

– Kinoya.

– Kiminlə gedirsən, qızım?

Söhbət uzanırdı. Görüş vaxtının keçməyi Lətifəni həyəcanlandırmağa başlayırdı. O, bu dəfə bərk tutulub, rənginə çökən utancaqlıq qızartısını atası görməsin deyə yönünü kölgə düşən tərəfə çevirdi.

– Zivərlə gedirsən, qızım? Bəs o hanı?

– Yox, ata can, bu gün başqa adamla gedirəm.

O kimdir? Mən sənin bütün yoldaşlarını tanıyıram.

– Yox, ata can, bunu tanımırsan.

Valideynindən bu vaxta qədər heç nəyi gizlətməyən Lətifə, yalan deməmək üçün, cəld addımlarda qapıya yanaşdı.

– Olmaz ki, bilək, görək kimdir?

– Gecikirəm, ata can, sonra bilərsən! – deyə Lətifə yüyürüb, eşiyə çıxdı. Asfalt yolun səkisində, əli belində gəzinən və tez-tez bəriyə sarı boylanan Tahiri lap uzaqdan gördü və az qala yüyürməyə başladı. Küçə işığında qol saatına baxdı. Atası onu xeyli gecikdirmişdi. "Gözləyir" deyə xəyalından keçirdi. Tahirin yanına yenicə çatmışdı ki, onun çoxdan tanıdığı antennalı maşın, sürətlə böyründən ötdü:

– Bilirsən bu kimdi? – deyə soruşdu.

Tahir maraqla maşının dalınca baxdı:

– Kim idi?

– Aslanov yoldaş. Yəqin mədənləri gəzir.

– Bəlkə bizim buruğa gedir? Hayıf ki, mən orada olmayacağam. Onun barəsində çox eşitmişəm, amma hələ də üzünü görməmişəm.

Onlar tramvayın duracağına tərəf yeridilər.

– Kinoya?

– Hara istəsən.

– Atam dedi: "Kiminlə gedirsən?" mən utandığımdan kişiyə cavab da vermədim.

– Nahaq. Əvvəl-axır biləcək ya yox?

Onlar susdular. "Mən ata-anamdan heç bir sirrimi gizlətmirəm. Amma bununecə deyim? Çətindir." deyə düşünən Lətifə Tahirə üz tutdu:

– Fikir verirsən, külək bərkiyir?

– Elədir, tufan qalxacaq, hə?

– Belə getsə, hə.

Aralıqda yenə sükut oldu. Hər ikisi danışmağa çətin söz tapırdı. (Bizim hansımız gənc yaşlarımızda bu çətinliyə rast gəlməmişik?)

– Qorxurdum ki, gəlməyəcəksən. Dərnək rəhbəri az qaldı məni gecikdirsin. Elə gözüm siz tərəfdə idi.

Lətifə onun üzünə baxmır, dodaqaltı gülümsəyirdi.

Tramvay gəldi. Şəhərə getdilər. Lakin kinoya bilet tapa bilmədilər. Saat on birdə başlanan seansa qalmaq olmazdı. Lətifə evə, Tahir işə tələsirdi: səhər tezdən qalxmalı idi.

Deyəsən bu hadisə ürəklərindən oldu. Küçə ilə yuxarı qalxmağa başladılar. Tahir də, Lətifə də özünü xoşbəxt hiss edirdi, hər ikisinin

qəlbi qeyri-adi bir sevinclə döyünürdü. Lakin bu xüsusda danışmaq nə qədər çətin idi! Lətifə gur işıqda aydın görünən Nizami muzeyini göstərdi:

– Heç buralara gəlmisənmi? – deyə soruşdu. – Şairlərin heykəlinə bax!

Tahir muzeyin ikinci mərtəbəsində, Azərbaycan şairlərinin cərgə ilə qoyulmuş heykəllərini bircə dəfə görmüşdü:

– Hayıf ki, Sabirinkini qoymayıblar, – deyə Tahir düşüncəli bir görkəm aldı.

– Çünki onun xüsusi meydançası var, orada da heykəli qoyulub.

– Doğrudur, ancaq dostu dostdan ayırmaq yaxşı deyil.

– Sən Sabiri çoxmu sevirsən, Tahir?

– Onu sevməyən oxucu varmı? Mənim anam savadsızdır, amma Sabirin çox sözünü əzbər bilir.

Onlar yenə yola düzəldilər. Küçə uzunu aşağı-yuxarı axınan adamların sayı-hesabı yox idi. Lətifə bir-bir uca binaları göstərir, Tahiri başa salırdı:

– Bura Elmlər Akademiyasının binasıdır. Vaxtilə məşhur milyoner Musa Nağıyev tikdirib. Görmüsən, yox?

– Görmüşəm, amma kim tikdirdiyini bilmirdim. Onun barəsində atam çox danışır. Bax, bu uca binanı başa çatdırana qədər mühəndis lap cana doyub.

– Niyə?

– Nağıyev çox xəsismiş. Dostları sözü bir yerə qoyublar ki, gəlin onu tovlaşdıraq mərhum oğlu İsmayılın adına bir saray tikdirsin. Amma görürlər ki, sarayın əsil xərcini ona desələr, heç razı olmayacaq. Dostlarından biri deyir ki, smeta tutduraq, pulunu lap az göstərək, qoy birinci mərtəbə tikilib qurtarsın, sonra deyək ki, pul çatmadı. O vaxt məcbur olub yenə pul verəcək. Yazıq mühəndis kələyə düşür. Hər dəfə ondan pul istəyəndə üzü danlanır. Nağıyevdən pul çıxanda elə bil canı çıxır. Bu bina tikilib hazır olandan sonra, xeyriyyə cəmiyyətlərindən biri yetim uşaqlar üçün konsert düzəldibmiş. Şəhərin dövlətlilərini çağırıblarmış. Nağıyev özü də buradaymış. Qonaqların döşünə nişan taxıb pul yığırlarmış. Axırda gəlib Nağıyevin qabağında dayanırlar. O, əlini cibinə atır, bir abbası çıxardır. Pul yığan oğlana verir. Nağıyevin dostlarından biri deyir ki: “A kişi, sən neyləyirsən, bu nədir? Oğlun beş yüz

manat verdi”. Onun cavabı bu olur ki, “mənim oğlumun atası milyonerdir, o istədiyi qədər verə bilər, amma mənim atam samançı olub”.

Tahiri təəccüb götürmüşdü. O:

– Bu əhvalat olub, yoxsa elə-belə uydurublar? – deyə maraqlandı.

– Yox, yox, olub. Atam danışır. Nağıyevin xəsisliyi bütün Bakıda məşhurmuş.

– Gör bir Bakı neftinin qazancı kimlərin cibinə axırmış!..

Tahirlə Lətifə yenə tramvaya minib evə qayıtdılar. Lakin onlar bir-birlərindən ayrıla bilmirdilər. Tez-tez xudahafizləşir, amma yenə də dönüb gəzişə-gəzişə söhbət edirdilər. Beləliklə saat on bir oldu.

– Yox, gedək Tahir. Anam nigaran qalar.

Ancaq yenə də onların əli bir-birindən üzülüşmədi.

Bu anda Aslanovun tanış maşını sürətlə yanlarından ötdü. Onlar sükuta qərq olub, maşının dalınca baxdılar.

– Hayıf ki, mən orada olmadım. Bəlkə bizim buruqda imiş?

– Darıxma, Tahir, görəcəksən!

## 9

Lalənin trestində bəzi işçilər qeyri-rəsmi də olsa Volkova dördüncü buruğu tərk edib, başqa, təzə bir buruq qazmağı məsləhət görür, burada bir şey çıxmayacağını söyləyirdilər, amma o isə əzmindən dönmür, bütün günahları öz boynuna götürüb, avariya ilə nəticələnmiş ağır səhvini düzəltmək üçün, neçə gündən bəri idi ki, yuxu və istirahət bilmədən əlləşirdi. O, nəhayət, məqsədinə çatıb, sürətli qazıma işini yenidən başladı və hədər getmiş vaxtın əvəzini tezliklə çıxdı.

Bu gün proyekt dərinliyinə çatmağa cəmisi onca metr qalmışdı. Birdən Aslanovun maşını buruğa yan aldı. O, Volkovun təcrübəli və mahir bir buruq ustası olduğunu çoxdan bilirdi.

Aslanov, adəti üzrə ustanı ucadan salamladı və briqadasının üzvlərilə əl verib görüşdü. Volkov utandığından, onun üzünə şax baxa bilmirdi. Aslanov bunun səbəbini anlayırdısa da, dördüncü buruqda baş vermiş qəzanı bir də ustanın yadına salmamağı qərara aldığından, sual-cavabını sadə bir tərzdə başladı:

– Kefin, halın, Semyon Vladimiroviç?

Volkov günahının böyüklüyündən danışmaq istəyəndə Aslanov onun sözünü kəsdi:

– Mən o barədə soruşmuram, – dedi, – istintaqa ara verməyi çoxdan əmr eləyiblər, deyilmi?

– Bəli, Aslan Teymuroviç, elədir. Çox sağ olun!

– Biz səhlənkarlıqla səhvi bir-birindən fərqləndiririk. Ancaq yoldaşları başa salın ki, dövlətimizi həyəcanlandıran birinci növbədə fəhlənin həyatıdır.

– Elədir, Aslan Teymuroviç, lakin biz də hər bir manat üçün məsul olduğumuzu unutmuruq.

Aslanov səmimi bir əda ilə deyilən bu sözlərin ürəkdən gəldiyinə şübhə eləmirdi. O, bütün briqadanın hər zaman necə gərgin bir diqqətlə işlədiyindən xəbərdardı.

– Amma şəxsən sizin bir günahınızı bağışlamayacağam, – deyə Aslanov eyni ciddiyyətdə sözünə davam etdi, – gərək ki, sizin buruqda telefon var, hə?

– Bəli, var.

– Telefonun yanında asılmış siyahıda mənim də nömrəm yazılmışdır eləmi?

– Elədir.

– Bəs nə üçün mənə zəng eləməmisiniz? Yoxsa o nömrə elə-belə, forma üçündür?

Volkovun dodaqlarında acı təbəssüm titrədi.

– Doğrusu, mən qara xəbərləri deməkdən xoşlanmıram.

– Nahaq, nahaq! – Aslanov fırlanan rotora yaxın gəldi. – Bəs gil məhlulu zavodu sizə necə kömək eləyir?

– Onlardan şikayət eləyə bilmərəm, – deyə Volkov ağır-ağır dilləndi.

– Yox, gil məhlulu zavodunun günahını yumaq lazım deyil. Oradakılar ümumən pis işləyirlər. Məhlulun keyfiyyətini yüksəltməyə az fikir verirlər. Yoxsa düz demirəm?

Aslanov sıravi fəhlələrlə söhbət eləməyə ehtiyac duyurdu. İki-üç gün idi ki, neftçilərin ümumi Bakı müşavirəsində çıxışa hazırlaşırdı. O, belə hallarda mədənləri daha çox gəzir, ayrı-ayrı briqadaların səsini eşitmək istəyirdi. İndi isə uzun söhbətə imkan yox idi. Hamı bərk məşğul idi. Bir də mexanizmlərin gurultusu onların danışığını aydın

eşitməyə mane olurdu. Xüsusən Volkovun hər şeyi öz günahı kimi qələmə verdiyini görüb, ondan xeyirli bir məlumat ala bilməyəcəyini yəqin eləyəndən sonra hamı ilə salamatlaşdı, maşına minib o biri buruqlara sürdürdü və yalnız axşam saat on birdə evinə qayıtdı.

Küçə qapısından içəri girər-girməz, maşının qudok səsini tanıyıb qabağına yüyürən kiçik oğlu pilləkəndə onun dizlərinə sarıldı.

– Ata, – dedi, – axşamdan bəri fotoqraf səni gözləyir.

– Nə fotoqraf, oğlum?

– Özün deməmisən gəlsin.

Aslanov oğlu ilə bərabər qonaq otağına girdi. Bura çox sadəcə bəzənmiş bir salon idi. Baş tərəfdə yazı stolu vardı. Ortada böyük bir xalı salınmışdı. Aslanov içəri girəndə, kino çəkən aparatı döşəməyə qoyub, şabalıdı rəngli kürsüdə oturan qarayanız, saçlarını ortadan ayırmış, yoğun, gödək oğlan hörmətlə ayağa qalxaraq onu salamladı.

– Hə, bu nə aparatdır? – deyə Aslanov qonağa əl verib zarafatla soruşdu: – yoxsa mənim şəklimi tarix üçün yadigar qoymaq istəyirsən? Mən belə bilsəydim, “gəl” deməzdim. Axı sən kimdənsə mənə məktub gətirmişdin.

Kino operatoru gülümsədi:

– Məktub var. Burası doğrudur. Ancaq xasiyyətinizi bildiyim üçün ömrümdə birinci dəfə doğruya yalan qatdım.

– Məktub kimdəndir?

– Moskvadan. Mərkəzi kino-xronika studiyasından. Ümum İttifaq ekranı üçün bəzi adlı-sanlı yoldaşları çəkməliyik. – O, paketi Aslanova verdi. – Sizdən xahişləri budur ki, çəkilməyə razılıq verəsiniz.

Aslanov məktubu açıb oxudu və yenə paketə qoyub yazı stolunun üstünə atdı.-Mən sizə mövzu verirəm, – dedi. – Neftçilərimiz arasında çəkiləsi adamların sayı az deyil.

Operatorun qanı qaraldı:

– Hələlik icazə verin, sizi iş stolunuz arxasında heç olmasa bir-iki metr çəkim.

Aslanov əl hərəkətilə etiraz edib, yarı ciddi, yarı zarafat dedi:

– Yox, əzizim, mənim sifətim o qədər də fotogenik deyil.

Kiçik oğlu onun fikrini anlayıb, dodaqlarını büzdü. O özü foto şəkil çəkməyi sevdiyi kimi, çəkilməkdən də zövq alırdı.

– Ata, axı mən istəyirəm!

Aslanov oğlunun “əmrindən” boyun qaçıra bilmədi:

– Elə isə buyurun, yoldaş operator. Ümid edirəm ki, ikimiz bir yerdə çəkilsək, bizi ekranda göstərməzsiniz.

Operator hazırlıq görənə qədər, Aslanov yan otağa adlayıb, yorğunluğunu almaq üçün yuyundu, uzun ağ saçlarına daraq çəkdi və əllərində iki stəkan limonlu çay, geri qayıtdı.

– Buyurun, çay için, – deyə güclü işıq vermək üçün dəhlizdəki projektoru içəri sürüyüb gətirən kino operatorunu stola dəvət elədi.

Ata ilə oğul stolun dalında, söhbət əsnasında çəkildilər. Ancaq operator bununla kifayətlənmədi.

– Çox xahiş eləyirəm, təklikdə telefonla danışasınız.

Aslanov istər-istəməz dəstəyi götürdü:

– Poza üçün yox, doğrudan danışacağam, – deyə o, Azərneft birliyi rəisinin nömrəsini yığdı. – Danışan Aslanovdur. Müharibə çoxdan qurtarıb. Daha bəzi qaydaları dəyişmək pis olmaz. Məsələn, müharibə vaxtı məlum səbəbə görə dənizdəki qazıma briqadalarının toxunulmaz yemək ehtiyatını ləğv eləmişdik. Hər vaxtın öz qanunu var. Məncə, daha bu fondu bərpa eləyə bilərik. Bu barədə layihə düzəldin. Büroda baxıb qərar çıxaraq. Hə, bir də, Ramazanla bərabər qoca neft ustası Şapoşnikovu Sosialist Əməyi Qəhrəmanlığına namizəd vermək lazımdır. İnternasionalizmdən danışmaq azdır. O da sənin böyük ailənin yaxşı bir üzvüdür. Ögey-doğmalıq salmayın. Siyahınızda onun niyə adı yoxdur? Bu ay planı dolmayıb? Ay qurtarmamış hökm verməyə tələsməyin. Bir də, siz yəqin ki, onun əllinci il hesabına işlədiyini yaddan çıxarmısınız. Hələlik.

Aslanov kino operatorunun nəyi isə qurdalayıb düzəltməklə məşğul olduğunu və heç nə çəkə bilmədiyini görəndə elə bil sevindi:

– Gəlin, gəlin, çayınız soyuyur. Mənim əvəzimə Şapoşnikovu çəksəniz daha yaxşıdır.

Operator onun daha zarafat eləmədiyini anlayıb fikrindən daşındı, stola yanaşdı və Aslanovun göstərdiyi kürsüdə oturdu.

İstirahət saatlarında, başına gələn hadisələrdən danışmağı sevən Aslanov, bu dəfə bərk yorulduğu üçün yalnız çay içir və arabir operatora deyirdi:

– Şapoşnikovu indiyə qədər niyə çəkməmisiniz? Əlli illik neftçi stajı var. Məncə ona həm qəhrəman adı verilməli, həm də yubileyi keçirilməlidir.

Operator pərt idi. Aslanovu ayrılıqda çəkə bilmədiyindən, çay da boğazından ötmürdü. Vidalaşıb getməyə hazırlaşanda, katib onu başa saldı.

– Bilirsinizmi, əzizim, sizin sənətiniz gərək xalqı səfərbərliyə almaqda kömək eləsin. Xüsusilə indiki dövrdə. Məni ruhlandırmağa ehtiyac yoxdur. Lenti korlamaq nəyə lazım?

**10**

Bütün trest müdirləri kimi, Qüdrət də neftçilərin ümumi Bakı müşavirəsinə üç-dörd gündən çox hazırlaşmışdı. Onun tresti kəsirdən çıxdığı üçün, indi nisbətən az həyəcan keçirirdi: “Bu gün hər halda tərif edilənlərdən biri mən olacağam” deyə düşünürdü. Lakin fikri bu idi ki, o, ən çox, trestindəki nöqsanlardan danışsın.

Müşavirə, Bakının ən böyük tamaşa salonlarından birində – Mirzə Fətəli Axundov adına Dövlət Opera Teatrında çağırılmışdı. Buraya neft trestlərinin müdirləri, baş mühəndislər, baş geoloqlar, şöbə müdirləri, mədən müdirləri, əsaslı təmir idarələrinin kompressor təsərrüfatı şöbələri, neftayıran və maşınqayıran zavodların direktorları, neftçıxarma və buruq ustaları, Azərneft, Azərbaycan neft zavodları kəşfiyyat birliklərinin, Azərneftmaş trestinin, tikinti təşkilatlarının rəhbərləri gəldiklərindən, teatr yerləşən Nizami küçəsi növbənöv avtomaşınlarla dolmuşdu. Qüdrət mədənlərdən birində yeni istismara buraxılan təzə buruğa baş çəkməyə getdiyi üçün, demək olar ki, hamıdan sonra gəlmişdi. O, maşınını kənarda saxlayıb teatr binasına doğru yönələndə, yaxşı tanıdığı raykom katiblərinə, ilk partiya təşkilatlarının katiblərinə rast gəldi və onlarla salamlaşıb, yenə çevik addımlarla yeriyərək içəri girdi. O, müşavirədə nədən danışacağını bir daha xəyalından keçirir və yadından çıxan nöqtələri xatırlamağa çalışırdı. Bütün trest illik planı doldursa da, o, öz işində əmələ gəlmiş bu dönüşü yalnız fərəhli bir başlanğıc adlandırırdı. Lakin Qüdrət heç bir şübhə etmirdi ki, Aslanov yoldaş onun adını daha, geridə qalanlar sırasında deyil, qabaqcıllar sırasında çəkəcək, həmişəki kimi, indi də onu başqalarına nümunə göstərəcək, bəlkə qüsurlarına toxunmayacaq: “Baxın, onun tresti iki-üç ay əvvəl hamıdan geri qaldığı halda, indi ən yaxşı trestlər sırasına keçmişdir” deyəcək. Amma Qüdrət foyeyə daxil olub, ətrafa göz gəzdirəndə, müşavirənin o qədər də təntənəli keçməyəcəyini dərhal hiss elədi. Belə hallarda Bakı neftçilərinin

nailiyyətlərinə dair iri və zərli hərflərlə yazılmış şüarlar divarları bəzərdi. Bu gün isə tamaşa zalının girəcəyində, bütün divar boyu yalnız bircə şüar vardı: “Ölkəyə daha bol neft verək!”

Qüdrət içəri girdi. Yerlər çoxdan tutulmuşdu. O, son cərgələrin birində oturmuş Laləni görüb ona yanaşdı:

– Deyəsən sən də gecikmisən, arvad! – dedi, biz hamıdan dala qalmışıq.

Lalə ərinin üzünə zənlə baxdı:

– Bura yaxşıdır. Mən belə görürəm ki, bu zalda hər şey bir məqsəd üçün düzəlib.

– Nə məqsəd?

– Tənqid və özünütənqid! Bax, nə orkestr var, nə şüar var, nə də ki, prizidium stolunun qabağında gül-çiçək. Amma bir şeyi yaddan çıxarmayıblar. Salonu bərk radiolaşdırıblar. Harada otursaq, yaxşı eşidəcəyik.

Lalə haqlı idi. Aslanov səhnə arxasından öz yoldaşlarilə bərabər içəri girib, səhnədəki uzun prezidium stoluna yanaşanda, bütün salondan gurultulu alqışlar qopdusa da, şəhər komitəsi katibi narazı halda başını buladı, toplaşanları sakitliyə çağırdı və müşavirəni özü açıb, səbir və təmkinlə dedi:

– Mənə elə gəlir ki, vaxta qənaət etmək üçün, yığıncağımızı işgüzar bir tərzdə keçirsək yaxşıdır.

Lalə yenə də Qüdrətə baxdı:

– Gördün mən deyən oldu?

Doğrudan da Aslanov nitqini hamıya, o cümlədən Qüdrətlə Laləyə də təəccüblü görünən sərt bir üslubda başladı:

– Azərbaycan neft sənayesi bu ilin planını yarım ay vaxtından əvvəl yüz iki faiz doldurmuşdur. Bəzi yoldaşlara belə görünə bilər ki, həyəcan keçirməyə heç bir əsasımız yoxdur. Ancaq mən indidən xəbərdarlıq edirəm: bu müşavirəmizdə mənim dediyim “yüz iki faiz” sözlərdən başqa qeyri müvəffəqiyyət haqqında danışılmayacaq.

Aslanov qabağındakı mikrafonu ikiəlli tutub yerindən oynatdı və özünə yaxınlaşdırdı:

– Mənim dediklərimi yaxşı eşidirsinizmi, yoldaşlar?

Salondakılar “bəli, bəli!” deyə səsləndilər. Katib yenə eyni təmkinlə sözünə davam etdi:

– Neft qəhrəmanlarına həmişə vaxtlı-vaxtında fəxri adlar və ordenlər verildiyinə görə, onları əlavə tərifləməyə ehtiyac görmürəm.

Qəzetlərimiz bu barədə az yazmamışlar və mənə elə gəlir ki, redaksiyalarımızın tənqiddən çox tərifə meyli var. Bu isə bizim ən böyük qüsurumuzdur.

Bu sözlərdən Qüdrət də, Lalə də öz payını aldı. Dünən qəzetlərin hamısı onların trestlərini tərifləmişdi.

– Biz özümüzü haqlı olaraq qabaqcıl adlandırırıq. Lakin unuduruq ki, bu şərəfli ad bizim boynumuza əlavə vəzifələr qoyur. Nə üçün neft planı az dolmuşdur?

– Az? – deyə Qüdrət qeyri-ixtiyari səsləndi.

– Ona görə ki, biz hələ də pis işləyirik. Bəli, bəli, pis. Bütün plan üç-dörd trestin hesabına dolmuşdur. Bəs qalanları? Planları dolduran trestlərin müdirləri bundan belə bir nəticə çıxarmamalıdırlar ki, guya onların fəaliyyəti tərifə layiqdir. Xeyr! Onlar planı bir-iki mədənin hesabına doldururlar. Bu nə deməkdir? Bu yol artıq köhnəlmişdir!

Salon elə səssizdi ki, Aslanov bir an susanda, adamların qulağı cingildəyirdi.

– Plan nədir? Plan qanundur. Ona əməl etməyənlər dövlət qarşısında məsuldurlar.

Burada oturanların hamısı, demək olar ki, Aslanovun xasiyyətinə bələddi. O, yalnız ümumi həqiqətləri deməklə kifayətlənməyəcəkdi. Bu, Qüdrətə də, Laləyə də gün kimi aydındı. Doğrudan da katib bir-iki cümlədən sonra heç bir kağıza baxmadan trest rəislərinin, raykom katiblərinin, mədən müdirlərinin, buruq ustalarının, mühəndislərin hətta ayrı-ayrı briqada üzvlərinin adını çəkə-çəkə, mahir bir tənqid ustası kimi, onların işinə mane olan səbəbləri sadə və aydın bir dillə açıb söylədi:

Belə geniş və məsul bir müşavirəyə ilk dəfə gəlmiş tək-tək adamlar Aslanovun bu qədər faktı yadında saxladığına bir növ inana bilmirdilər. Hətta Qüdrət özü onun qüvvətli hafizəsinə indi də təəccüb edirdi: “Mən öz trestimdə işləyənlərin adını onun qədər bilmirəm”.

Lalə Qüdrətə sarı əyildi:

– Bax, bax, indi bizim trestlərdən elə bir əhvalat danışacaq ki, hələ nə sənin, nə də mənim xəbərim var.

Qüdrət təsdiq işarəsi olaraq kirpiklərini qırpdı:

– Buna mənim zərrə qədər də şübhəm yoxdur! – dedi.

Şəhər komitəsi katibi, bütün Bakı neft trestlərinin vəziyyətini müfəssəl təsvir etdikdən sonra, Qüdrətin buraxdığı səhvləri də bir-bir göstərdi:

– Fəhlələrin kütləvi qəhrəmanlığından danışmaq azdır, yoldaş İsmayılzadə. Hətta bütün briqadaları qabaqcıllara çatdırmağa təşəbbüs eləmək də kafi deyil. Nə üçün sizin dördüncü mədən quyruqda sürünür? Bunun səbəbi odur ki, hər bir quyu üzərində, onun iş qaydasını müəyyən etmək üzərində müntəzəm surətdə, mütəşəkkil və planlı qaydada, ətraflı, ciddi, möhkəm və gündəlik iş aparılmır. Hər bir quyuya diqqətlə xidmət edilmir, öhdəçiliklərini yerinə yetirilməsi uğrunda əzmlə mübarizə aparılmır. Çünki siz, danışdığınız qəşəng sözlərin, bəslədiyiniz gözəl arzuların real nəticəsini yoxlamırsınız. Siz unudursunuz ki, sözlə iş arasındakı dəmir vəhdət pozulanda ümumən iş üslubu da korlanır. Siz, yəqin, dördüncü mədəndə usta Qurbanəlini yaxşı tanıyırsınız. O “təzə” bir “nəzəriyyə” icad etmişdir. Onun fikrincə ölü quyuları diriltmək iynə ilə gor qazımaqdır. Bu nədir? Yəqin ki, bu “nəzəriyyə”nin başqa tərəfdarları da yox deyil. O özü buradadırma?

Aslanov gözlərini salonda gəzdirdi:

– Odur, bax, camaatdan üzünü gizlədir!

– Mən buradayam, yoldaş Aslanov, – deyə orta cərgələrin birindən ucaboy, qırmızıyanaq, başını ülküclə təzəcə qırxdırmış bir kişi ayağa qalxdı.

Ön sıralardan geriyə dönüb baxanlar, onu utandırdılar. Qurbanəli başını aşağı dikdi:

– O mənə nə desə yaxşıdır? – deyə Aslanov sözünə davam etdi. – Guya plan verənlərin məqsədi bu imiş ki, hamının yanında onun başını aşağı eləsinlər. Amma bu heç də belə deyil. Onun “ölü” adlandırdığı 804-cü quyunu ikinci mədəndə Dadaşlının komsomol briqadası könüllü olaraq boynuna götürəndən sonra quyu dirildi. İndi hər gün otuz ton neft verir. Halbuki, Qurbanəlinin ümidinə qalsaydı, quyu sıradan çıxıb getmişdi.

Lalə ərindən soruşdu:

– Qüdrət, bu əhvalatdan sənin xəbərin var?

– Doğrusu, yox, – deyə Qüdrət etiraf elədi. – Bəlkə məndən qabaq olub?

Aslanovun nitqi iki saatdan çox çəkdi. Ancaq dinləməyənlərin heç biri vaxtın necə tez gəlib-getdiyini duymadı. Tənəffüs verildi.

Qüdrətlə Lalə foyeyə çıxdı. Burada onlar uzun müddətdən bəri görmədikləri məktəb yoldaşlarına, vaxtilə birgə çalışdıqları köhnə

dostlarına rast gəldikcə salamlaşır, hal-əhval bilirdilər. Ərlə arvad bu insan kütləsi içərisinə düşəndə, elə bil daha geniş nəfəs alırdılar. Onlar Aslanovun tənqidindən incimir, “sevdiyi adamları daha çox tənqid eləyir” deyə düşünür, bilmədikləri hadisələrdən xəbər tutduqca, ona xəyalən təşəkkür belə edirdilər. Öz trestində baş verən bir hadisəni yalnız indi öyrəndiyini görən Qüdrət, öz-özünə deyirdi: “Bax, o, tamamilə haqlıdır. Hələ də mən adamları layiqincə tanımamışam. Yoxsa trest plandan əlavə yüzlərcə ton neft verə bilərdi”.

Tənəffüsdən sonra başlanan qızğın mübahisələr gecə saat birin yarısına qədər uzandı. Aslanov, giriş nitqində deməyə imkan tapmadığı kəsirləri tez-tez natiqlərin yadına salır, mübahisənin odunu bir an belə soyumağa qoymurdu. O, sanki, böyük bir gəminin mahir kapitanı kimi, hara hansı yolla və nə zaman gedəcəyini əvvəldən açıq-aydın görürdü.

Müşavirənin sonunda xitabət kürsüsündə usta Ramazan göründü. O, çox danışmadı. O, yalnız bu sözləri dedi:

– Bəzi yoldaşlara qəribə görünür ki, bizi niyə danlayırlar? Amma mən deyirəm, yox, yoldaş Aslanov haqlıdır. Mən özümdən başlayım. İşimi düz qursam, iki yüz faizə qalxaram, ya yox? Əlbəttə ki. Üzümüzə gələn il gərək belə olsun. Bizim yolumuz birinci növbədə zəhmət, alın təri deməkdir. Kim ki, bu yolu asan getmək istəyir, qorxuram o yarı yolda qala. Ancaq düzü, mənciyəz qalmaq istəmirəm. Fəhlə sinfi bu yolda can qoyub. Mən də elə bu yolda saç ağartmışam. Mən istəyirəm bu böyük imarəti tikib başa çatdıraq. Yaxşı, bizim nöyütümüz olmasa, xoşbəxt gələcəyə çatarıq ya yox? Yox! Çünki... Daha mən nə deyim? Özünüz uşaq deyilsiniz məndən də yaxşı bilirsiniz. Deməli, qeyrət, namus dəmidir!

Ramazan nitqinin sonunda nə isə təsirli bir söz demək istədi. Amma nə qədər fikirləşdisə, belə bir sözü tapa bilmədi və xitabət kürsüsündən aralandı.

Bütün salonu alqış səsləri titrətdi.

Aslanov müşavirəni bağlayanda, səsini bir qədər də ucaltdı:

– Bakıda tufan başlanır. Biz bu gündən daha ciddi imtahan qarşısındayıq. Biz təbiətə, stixiyaya müharibə elan etməliyik və bu müharibədən qalib çıxmalıyıq. Məncə, aydındır, yoldaşlar. Hamınıza müvəffəqiyyətlər diləyirəm!..

# SƏKKİZİNCİ FƏSİL

## 1

Dənizdə tufan başlanırdı. Külək getdikcə şiddətlənirdi. Səhər çoxdan açılmışdısa da, göy üzü hələ də aydın görünmürdü. Mavi dənizin suları tutqun bir rəngə çalırdı. Dalğalar üzərində ağ köpüklər görünməsəydi, sulara mazut qarışdığını güman etmək olardı. Qaralmış buludlar cənuba doğru axışır, elə bil küləyin təqibindən baş götürüb hara isə qaçışırdı.

Bu gün səhər növbəsinə düşmüş Tahir, ilk dəfə buruğa gələrkən, dənizdəki tufanlı günlərə dair Cəmildən eşitdiyi xəbərdarlığı unutduğu üçün, küləyin bu cür şiddətlə bərkiyəcəyini heç gözləmirdi. O elə bilirdi ki, belə qorxulu günlərdə buruqda iş dayandırılacaq, "Çapayev" qayığı gəlib, hamını sahilə aparacaq. O, rotorun eyni qayda ilə fırlandığını və burada köhnədən işləyən adamların azca da olsa əl-ayağa düşmədiklərini görəndə xeyli təəccüb elədi, böyründə oturub sakit-sakit baxan Vasilyevə bu barədə sual vermək istədi, ancaq, onun da gülümsər üzündə heç bir həyəcan əlaməti olmadığını sezib dinmədi. Usta müavini də Tahirin gizli bir həyəcanla parıldayan gözlərindən onun nə isə bir şey xəbər almaq istədiyini duyub, sual dolu bir nəzərlə ona baxdı. Tahir ürəyindəkini açmadığı üçün, Vasilyev də təxminində yanılmadığını güman edib, başını ahəstəcə bir tərzdə yırğaladı:

– Bakının qışı başlanır, – dedi.

Tahir onun fikrini başa düşmədi: "Hələ nə qış?" deyə öz-özündən soruşdu və tezcə də usta müavinin sözlərindəki əsil mətləblə marağlandı:

– Hələ qışa çox var, usta, – dedi.

Vasilyev:

– Kalendarda çox var, amma havadan qış iyi gəlir, – deyib ayağa qalxdı.

Bu anda özünü buruğa çırpan külək bərkdən vıyıldadı. Bütün qurğu sarsılan kimi oldu. Amma Vasilyev yenə aldırmadı.

– Bakıda qış xəzri il gəlir,-deyə əlavə edərkən, elə bil usta Ramazanın bu gün nə üçünsə buruğa gəlmədiyini birdən xatırlayıb, əli ilə şapkasından möhkəm yapışaraq, buruğu yavaş-yavaş dolanmağa başladı. Material ehtiyatlarını yoxladı, dörd-beş günlük tufan müddətində

qazıma borularının çatıb-çatmayacağını ürəyində hesablayaraq, yan tərəfdə uzadılmış təzə boruları gözəyarı saydı. Sonra adamların öz yerlərində olub-olmadıqlarına fikir verdi. O, briqada üzvlərinin şüurca özündən geri qalmadıqlarını yaxşı bilsə də belə hallarda hücuma hazırlaşan hissənin komandiri kimi, əvvəlcədən əgər-əskiyi nəzərə almağa vərdiş eləmişdi. Adamların hamısı öz yerində idi. Onlar üzdən sakit görünsələr də, necə diqqətli və hazır dayandıqları o dəqiqə hiss olunurdu. Belə günlərdə usta Ramazanın briqadasından bir nəfər də işi dayandırmağı xəyalına gətirməzdi. Qoca usta həmişə deyərdi: “Birdən beş gün yox, on gün tufan oldu, vaxt ömürdən gedir, axı”.

Vasilyev bu fikri öz sözü ilə ifadə edərdi: “Bizim lövbərimiz həmişə bir yerə atılıb...”

O addım-addım gəzindikcə, söhbətindən qalmayan briqada üzvlərinə baxır, inam dolu baxışları ilə sanki onlara deyirdi: “Ay uşaqlar, sizə, bizə nə tufan? Belə şeyləri çox görmüşük!”.

Cəmil əlində mazut kimi qaralmış brezent əlcək, iki nəfər yoldaşı ilə gil məhlulu hazırlayırdı. Ancaq onun fikirli olduğunu Vasilyev dərhal hiss elədi. Cəmil Tahirin özfəaliyyət dərnəyindəki çıxışından sonra ona dair hamıdan tərif eşitdiyi üçün, Lətifədə əmələ gəlmiş dəyişikliyi də bununla izah edirdi. İndi Cəmil aydın duyurdu ki, Tahirlə Lətifə arasında dəruni bir əlaqə başlanmış, qız hər dəfə Cəmili görəndə elə bil məcburən salam verib keçir. Cəmilin fikrincə buna səbəb Tahir idi: “Yəqin o, Lətifənin mənimlə salamlaşmağına razı deyil”.

Vasilyev cavanların əhvalatını bilmədiyindən, həmişə intizamlı dolanan, hər addımını ölçüb-biçən Cəmilin könülsüz və ağır hərəkətlərini havanın xarab olmasından görürdü.

– Suyu çoxaldın, uşaqlar, – deyə məhlula baxa-baxa Cəmilə yanaşdı, dünəndən bəri balta çox yavaş gedir. Bir sutkada on iki metr azdır. Çox azdır. Axı biz yarışırıq!

– Bəlkə daşa, qayaya rast gəlib, usta? – deyə Cəmil yenə də fikirli-fikirli soruşdu.

Vasilyev onun sualını eşitsə də, cavab verə bilmədi: külək ağzına tıxanır, danışmağa qoymurdu. O bir neçə an dayanıb məhluldan gözlərini çəkmədi, yalnız başının hərəkətilə razılığını bildirib, mədəni budkaya doğru getdi. Ayağının altındakı taxta körpü yalnız Vasilyevin addımlarından deyil, həm də küləkdən titrəyir, az qala yerindən qopurdu. O, müvazinətini saxlamaq üçün taxtadan ikiəlli yapışdı, bir an

dayanıb ətrafına göz gəzdirdi. Dalğalar bir-birinin ardınca hücum edər kimi, cərgələnərək şütüyür, gah enir, gah qalxır, sahilə doğru yüyürüşürdü: "Fırtına getdikcə qüvvətlənəcək" deyə fikirləşən Vasilyev, yenə yoluna davam etdi: "Ramazan İsgəndəroviç nə təhər olsa gələr". Lətifə budkada, balaca stolun dalında oturub, kitab oxumaq əvəzinə, telefonla trestə məlumat verir, küləyin vıyıltısını ötməyə çalışaraq, uca səslə qışqırırdı:

– Yox, yox dayandırmayıblar.Yox, işləyir! – Boynunu uzadıb qapıdan buruğa tərəf boylananda Vasilyev gözünə sataşdı. – Bax, budur, yoldaş Vasilyev özü desin.

– Kimdir? Baş mühəndis? De ki, bu sual artıqdır. Dayandırmaq barədə fikirləşən yoxdur.

– Dayandırmayacaqlar!.. – Lətifənin səsindən tutqun bir nida qopdu. – Eşidirsinizmi, hə dayandırmırlar. Yaxşı, bu saat deyərəm.

Lətifə dəstəyi yerinə qoydu:

– Kimdir, qızım? – deyə usta müavini soruşdu.

– Qazıma kontorundandır. Onların da işinə məəttəl qalmışam. Özgə vaxtı axtarmaqdan yoruluruq. İndi başlayıblar ki, işi dayandırıblar, ya yox?

Vasilyev Lətifənin qabağındakı kürsüdə oturdu. Emalı getmiş nazik, uzun tütün qabını açdı, döş cibindən qəzet kağızı çıxartdı. Bir parça cırıb, yanlarını hamarladı, yenə də səbirli-səbirli uzun bir papiros eşdi. Lətifə isə gözlərini ona dikib bir neçə an dinmədi. Sonra qabağına sərilmiş ağ vərəqəni götürüb, qalın kitabın arasına qoydu. Vərəqədə bir kəlmə də yazılmadığını əvvəlcədən görmüş Vasilyev qızın bu tələsik hərəkətinə heç bir məna vermədisə də, üzündə əmələ gələn xəfifcə qızartı gözündən qaçmadı. Lətifə üç-dörd dəfə nə isə yazmaq istəmiş, lakin tez-tez cingildəyən telefon zəngi ona mane olmuşdu. Trestdən danışan adamların səsini yaxşı eşidə bilmədiyindən, cavablarını də təxmini vermişdi. O bilirdi ki, belə tufanlı günlərdə öz kabinetlərində oturan müdirlər və mühəndislər qazımaçılardan azı on qat artıq həyəcan keçirirlər. Əlbəttə, onları, hər şeydən əvvəl iş maraqlandırır: "Dayanıb, dayanmayıb? deyə soruşmasalar da, Lətifə bütün sualların yalnız bunun üçün verildiyini bilirdi. Lakin onun qabağındakı ağ vərəqə nə üçün idi? Səhərdən bəri Lətifə onu azı beş dəfə çıxarıb stolun üstünə qoymuş, yenə də götürüb kitabın arasında gizlətmişdi. O, Tahirə məktub yazmaq istəyirdi. Dilinə gətirmədiyi sözləri, qələmlə ifadə

etmək də o qədər asan deyilmiş. Bəlkə buna tufan mane olurdu? Yalnız buruğun kiçik kollektivini tanımayanlar belə düşünə bilərdilər. Lətifə də burada çoxdan işləyən fəhlələr kimi, belə günlərdə daha sakit, daha soyuqqanlı olurdu. Təsadüfən dəniz kənarında durub dağ boyda dalğaları seyrə dalmış nərmənazik adamları fəlakət və ölüm kimi yüksək məfhumlar düşündürdüyü halda, buradakıları sadəcə bir şey, verdikləri vəd həyəcana gətirirdi: “Buruq beş gündən sonra qurtarıb istismara buraxılmalıdır!” Bax, odur, Cəmil Tahiri təqsirləndirir, ürəyində özünü yox, onu vəfasız sayır, məlahətli səsi, könülə yatan mahnıları ilə qızın qəlbini ovladığını güman edir, Lətifəni çoxdan sevdiyinə dair əvvəlcədən nahaq yerə ona bir söz demədiyinə təəssüflənir, amma axırda yenə də: “beş gün qalır!” deyə başqa fikirləri özündən inadla rədd edirdi. Tahir isə usta Ramazanın buruğa gəlmədiyini görüb: “yəqin borandan qorxur” deyə düşünür, vahiməyə bənzəyən bir hisslə tükləri ürpərmiş halda yoldaşlarına baxdıqca, özü də fərqinə varmadan həm küləyin səsinə, həm də qurğunun tez-tez sarsılmasına vərdiş eləməyə başlayırdı. Onun da, yoldaşlarının da zehnini məşğul edən yalnız bu idi: “Beş gün qalır!” deyə. Lətifə isə xəyalında məktubu azı on cürə başlamış, lakin bir kəlmə də yaza bilməmişdi: “Buruq təhvil veriləndən sonra yazsam daha yaxşı olmazmı? Axı cəmisi beşcə gün qalır!”

Nəhayət Vasilyev papirosunu tüsdülədərək Lətifə ilə yox, özü ilə danışırmış kimi dedi:

– Az qalır, qızım, beş gün qalır! Sağ olsun uşaqlar. Mən onlara inanıram. Bilirsənmi nə çatışmır?

– Nə? – deyə Lətifə nə qədər fikirləşdisə də, məhz nəyin çatışmadığını tapa bilmədi.

– Müharibədən danışmaq istəmirəm, ancaq o bizə hələ də mane olur. Yemək ehtiyatımız yoxdur.

– Aha, – deyə Lətifə qaşlarını azacıq yuxarı qaldırdı. – Gətirərlər, Sergey Timofeyeviç.

Vasilyev yemək şeylərinin olmadığını deyil, gətirməyin çətinliyini bildiyi üçün ixtiyarsız halda səsini ucaltdı:

– Gətirərlər?!

– Əlbəttə, usta, bu qədər adamı ac qoymayacaqlar ki?

– Yox, bizim uşaqlardan heç biri öz qarnı üçün başqasının dənizdə batmasına razı olmaz. Mən ki, heç... Yox, yox, lazım deyil. – Vasilyev küncdə qoyulmuş radio aparatını göstərdi: – O necədir? Sazdırmı?

“Aha, radionu yoxlamağa gəlibmiş” deyə Lətifə sürətlə düşünüb, cavab verdi:

– Yoxlamışam. Sizdən bir az qabaq yoxladım. Yaxşıdır. Telefon korlansa, o dəqiqə işə salarıq.

– Əlbəttə, əlbəttə! Sən bizim qoçaq qızımızsan.

– Hayıf biletimdən... Bu gün “Oneginə” gedəcəkdim.

– Onun ömrü uzundur, çox görəcəksən.

– Neçə gün tufan olar, usta? Dörd, ya beş?

– Bəlkə daha çox...

Sükut oldu. Lakin budkanın dirəklərini döyəcləyən dalğaların şırıltısından başqa bir səs eşidilmədi.

– Ramazan İsgəndəroviç zəng eləmişdimi?

**2**

Bu zaman qoca usta telefonda Aslanovla danışırdı. Paşa ilə Nailə də evdə idi. Nisa qarı əl-ayağa düşüb dərdini ürəyinə salıb kədərlənsə də, ailənin bu cür bir yerə toplanmasını o çoxdan gözləyirdi. Sevinc kədərlə qarışmışdı.

– Axı-danışan kimdir, ata?

Telefonun dəstəyini ikiəlli tutmuş qoca, bu sualı eşitmədi. Aslanovun təklifi qəribə, qocanın fikri isə qəti idi. Katib onu mərkəzi muzeyin Bakı filiallına çağırır, gündə bir-iki saat muzeyə gələn uşaqlara öz xatirələrini danışmağı məsləhət görür; “daha bəsdir, yorulmusan, buruqdan çəkil” deyirdi. Usta Ramazan isə:

– Yox, – deyib dururdu. – Nə vaxt, harda istəyirlər, gəlim danışım, amma məni buruqdan ayırmayın. Əgər tez ölməyimi istəmirsinizsə, elə onu da bacararam, bunuda.

Qocanın inadı katibə xoş gəlirdi. O, nəhayət razılaşıb dəstəyi asdı. Bu anda telefon zəngi yenə səsləndi. Ramazan yerinə qayıtmamış dəstəyi götürdü.

– Hə, hə, mənəm, qızım... Vasilyevə de ki, bu saat gələcəyəm. Elə hazırlaşırdım gəlim.

– A kişi yenə hara? – deyə Nisa qarı qapı ağzından soruşdu. – Sən getməsən dünya dağılar? – Qarı oğluna üz tutub şikayətləndi: – Sən bunun başına bir ağıl qoysana, qocaldıqca xərifləyir. Bu çovğunda dənizə ayaq basmaq olar?

Paşa dinmədi. O hər şeyin faydasız olduğunu bilirdi. Bundan sonra atasını ağıllandırmağa onun gücü çatmazdı.

– O nədir orada cızıldadırsan? Bəri gətir, yeyək! – deyə usta düz oğlunun qabağında oturdu. – O biri gəlin haradadır?

– Dərsdədir. Bura gəlib səndən nə ləzzət aparacaq? – Nisa artıq dodağının altında mızıldanmağa başlayırdı. – Elə bil bundan başqa buruq qazan yoxdur.

Paşa ilə Nailə bir-birlərinə baxıb gülümsəyirdilər:" Bunlar köhnə söhbətdir".

– Hə, danışan kim idi?

– Yoldaş Aslanov...

– Nə deyirdi?

– Deyir ki, gəl muzeydə otur, uşaqlar sənə tamaşa eləsinlər. Bilmirəm məndə nə görüb? Əvvəllər çox istədi məni böyük eləsin, razı olmadım. Dedim ki, elə bu saat da padşah kimi dolanıram.

Ailə üzvlərinin sevinci artıq başqa dərdləri unutdururdu.

Nisanın buğlanan xörəyi balaca otağı öz ətrilə doldurdu. Amma onlar söhbətə yenə də ara vermədilər. Paşa Aslanovun tərəfini saxladı:

– Kişi düz deyir, ata. Daha bəsdir! Axı sən yorulmusan. Mən gələndən sonra sən niyə işləyəsən?

Bu sözlər qocanın fərəhini artırırdı. Onun gözlərində qürurla bərabər, güclə sezilən bir təbəssüm vardı. Ancaq o Paşanın dediklərinə bir cəhətdən haqq vermirdi.:"Axı mən pul qazanmaqdan ötrü işləmirəm ki? Bir mənəm, bir də qarım. Artıq pul nəyimə gərək?"

– Yox, oğul, – dedi, – bu baş tutmayacaq. Ürəyimdə çox arzum var.

– Nədir axı?

– Hım... Nədir? Guya bilmirsən? Arzum odur ki, dənizdə təzə bir Abşeron olsun. Öləndə arxayın ölüm. Bilim ki, Bakı yenə nöyütün padşahıdır.

– O uzun məsələdir, ata. Ona bir insan ömrü kifayət eləməz.

– Elər, elər... – qoca, Nisanın boşqaba çəkdiyi göyərti çığırtmasını qabağına qoydu və onun içərisindəki bütöv yumurta sarısını əzdi. – Mən dənizdə ilk buruğu qoyanda qulağıma səs dəyirdi ki, "səksənində öyrənən gorunda çalar". Amma indi onuncunu təhvil verirəm. Cəmisi beş gün qalıb... Deməli, qəbirdə çalmadım.

– Mən onu demirəm, təzə Abşeronu deyirəm.

– Olsun da... Mən əlimdən gələni eləyəcəyəm. Demirsən beş illik plan? Allah qoysa üç aydan sonra mən əllinci ilin planını dolduracağam.

Qoca yeməyə cumdu. İşləyəndə də, yeyəndə də əjdaha idi. İki şapalaqda payının yarısını ötürdü.

Muzey yaxşı şeydir. Gedib baxmışam. Onu mənsiz düzəldiblər. Amma burada mənsiz bir iş olsa, bağrım çatlar.

– Elə bu nefti də sənsiz bacararlar.

Bax, Ramazan bunuheç təsəvvürünə gətirə bilmirdi:

– Mənsiz?! – deyə o, əsəbi bir tərzdə yerində qurcalandı və tezcə də yumşaldı. – Mən demirəm ki, bacarmazlar. Mənim dediyim odur ki, arzum ürəyimdə qalmasın.

Telefonun zəngi cingildədi. Dəstəyi Nailə götürdü.

– Bəli, evdədir. Bu saat?

Ramazanı çağırdılar. O, ütü altından yenicə çıxmış ağ salfetlə dodağını silib ayağa qalxdı. Dəstəyi qulağına tutan kimi gözləri böyüdü:

– Gəlməyim? Bu nə sözdür?

Danışan Vasilyev idi. Lətifədən qocanın buruğa gəlməyə hazırlaşdığını biləndə narazı qalmışdı: “Bu saat linkora də minsən, batarsan” deyirdi.

– Bah, batarsan!.. Həştərxana benzin aparanda dəniznən buludu bir-birindən seçmək olmurdu, bəs onda niyə batmırdım?.. İndi qocayam? – Ramazan əlini havada tovladı: – Heç uşaqlara demisənmi beş gün qalır? Bir də de!.. Baxım, görüm... Hə, sağ ol!..

O yenə öz yerində oturdu. Paşa onu fikrindən daşındırmaq xəyalına düşmədi. Atasını inadından döndərməyin nə qədər çətin olduğunu yaxşı bilirdi.

– Ata, – dedi, getməyinə sözüm yox, amma qayıq olmayacaq.

– Onun dərdini çəkmə, taparam.

Qoca, boşqabda qalmış payını yeyib-qurtaran kimi ayağa qalxdı, iş paltarını geyindi və cəld qapıya yanaşdı:

– Arvad, – dedi, – o biri gəlinin könlü qırıqdır, bir onun yanına dəysənə!

Bu halda külək pəncərəni vurub taybatay açdı.

– A kişi, heç olmasa uşaqlardan utan, sənsiz dünya dağılmayacaq ki? – deyə Nisa pəncərəni örtüb bərk-bərk bağladı.

Ramazan otaqdan çıxıb, gözdən itdi.

## 3

Qüdrət yan divardan asılmış barometrə tez-tez baxırdı. Əqrəb "fırtına" sözü üzərində möhkəm dayanmışdı. Pəncərə şüşələrinin cingiltisindən aydın hiss olunurdu ki, külək get-gedə şiddətlənir. Qüdrətin üzünü isə donuq bir ifadə bürüyürdü. O əsəbiləşirdi. O, hər günkü adi tədbirlərindən əlavə, yeni bir tədbir də düşünməyin zərurətini hiss edirdi. Nə üçünsə Qüdrətə elə gəlirdi ki, trestin taleyi yalnız bu tufanlı günlərdə həll olunacaqdır. O, birdən mühəndis Fikrəti xatırladı və onu tez yanına çağırtdırdı:

– Əzizim, – dedi, – mən istəyirəm ki, hər birimiz özümüzü bir buruğa təhkim edək.

– Bu tufanda?

– Bəli, bu tufanda!

– Nə üçün?

– Mən hiss edirəm ki, burada oturduqca, adam həddindən çox həyəcanlanır. Axı durduğumuz yerdə nə üçün əsəbiləşək? Hər şey adam üçün qeyri-müəyyən olanda, daha çox həyəcanlanırsan.

Fikrət əlilə saçını sığallayıb Qüdrətin üzünə baxanda, onun nə üçün bu fikrə gəldiyini başqa bir səbəblə izah elədi: "Mənim etirazlarıma cavab verir. Demək istəyir ki, stixiya ilə mübarizə eləmək mümkündür. Nə olar ki? Mən heç nədən qorxmuram".

– Elnən gələn qara gün toy – bayramdır, – yoldaş Qüdrət, – dedi, – əgər məni imtahana çəkirsinizsə, mən hazır!

– İmtahan? Nə imtahan? Mühəndislər işin üstündə olsalar yaxşıdır. Bəlkə təzə buruqlarda bizim köməyimizə ehtiyac var?

– Sözüm yox. Gedək!

Doğrudan da Fikrət getməyə hazırdı. Onun heç bir tərəddüd göstərmədən verdiyi cavab da Qüdrəti təəccübləndirmədi. O vaxt müşavirədə ürəyindəkiləri gizlətmədən açıb söylərkən də, Qüdrət onu qorxaqlıqda təqsirləndirməmişdi.

– Ancaq mən yalnız bir saatdan sonra dənizə çıxa bilərəm, – deyə Fikrət xəbərdarlıq elədi.

– Niyə ki?

– İkinci mədəndə 814 nömrəli buruq deşiləcək. Söz verdim ki, gələcəyəm. Onu qurtaran kimi mən hazır!

– Olsun. Oradan bir şey çıxar?

– Gündə minimum yüz əlli ton. Hələ bəlkə daha da artıq. 402-dən gözüm su içmir. İki təbqəni güllələdik, su verdi. Sabahdan yarış nəticələri yoxlanır. Komissiya düzəldiblər.

Qüdrət azca səksənən kimi oldu. Gözlərini Fikrətə dikib qaldı. Ona elə gəldi ki, gənc mühəndis müşavirə zamanı özünün nə qədər haqlı olduğunu xatırlatmaq məqsədilə bu sözləri deyir. Qüdrət ayağa durub fikirli-fikirli otaqda var-gəl etməyə başladı, sonra yenə müsahibinə zənnlə baxdı. Ancaq Fikrətin üz-gözündən heç bir istehza oxunmurdu.

Yoldaş Qüdrət, – deyə yenə Fikrət dilləndi, – elə düşünməyin ki, trestin geriliyi mənim qeyrətimə toxunmur. Köhnə quyuların təmirini əvvəlkindən iki dəfə yox, üç dəfə sürətlə aparırıq. Məncə, başqa trestlərdə köhnə quyuların hesabına bu qədər neft alan yoxdur. Dünən planımız üç faiz artmışdır. Bu da həmin quyuların hesabınadır. Mən o zaman dənizdəki quyuların çətinliyini nəzərdə tuturdum. Bu tufandan sağ-salamat çıxsaq, yüz əlli dördüncü, yüz əlli beşinci quyunu istismara buraxsaq, Lalə bacı bayrağı əldən verməli olacaq.

– Məsələ yalnız bayraqda deyil, yoldaş Fikrət, məsələ orasındadır ki, stixiya qorxusunu camaatın ürəyindən silib atmaq lazımdır. Elə mən də ona görə deyirəm ki, hamımız işin üstündə olsaq yaxşıdır. Qonaqov buradadırmı?

Bəli, buradadır.

Qüdrət zəngi basdı. Paltosunu çiyninə salmış katibə içəri girdi.

– Soyuqdur? – deyə trest müdiri xəbər aldı.

Üşüyürəm, Qüdrət Salmanoviç, – deyə qız baxışlarını yerə dikdi.

– Soyuqdan, yoxsa qorxudan?

– Soyuqdan... Çox dəhşətli bir xəbər söylədilər, Qüdrət Salmanoviç. Dənizdə bir qayıq batmışdır.

– Qayıq, yoxsa adamlar?

– Adamlar... Deyilənə görə ysta Ramazan da onların arasında imiş...

Qüdrəti elə bil ildırım vurdu:

– Kim dedi? Qonaqovu buraya çağırın!

Katibə dabanı üstə dönüb, sürətlə çıxdı. Qüdrətlə Fikrət tutqun halda bir-birinin üzünə baxıb dinmədilər.

Hökumət telefonunun zəngi ötkün bir səslə cingildədi. Qüdrət dəstəyi götürdü. Danışan şəhər partiya komitəsinin katibi idi.

– Salam! Sabahınız xeyir! Elə deyirlər, ancaq mən buna inanmıram... – Qüdrət susdu. Dinləməyə başladı. Onun sir-sifətində tədricən əmələ gələn qırışlardan, Aslanovun nə dərəcədə ağır sözlər dediyini dərhal hiss eləmək mümkün idi. O, Qüdrəti adamların həyatına məsuliyyətsiz yanaşmaqda təqsirləndirdi. O deyirdi ki: ”Əgər insan tələfatı olarsa, məhkəmə qarşısında dayanacaqsan!”.

Qüdrət yenə susurdu. Tez-tez udqunur, cavab verməyə söz tapmırdı. Nə deyə bilərdi? Dənizdəki əhvalatdan ilk dəfə özü xəbər tutmalı ikən, ona başqaları bunuxəbər verirdi.

– Bu dəqiqə yoxlayaram, sizə zəng elərəm! – deyə Qüdrət hərbi adam kimi dartındı və dəstəyi yerinə qoydu.

– Əlbəttə, bu rüsvayçılıqdır! Bizdən başqa hamı bilirmiş.

Qonaqov içəri girdi. Qüdrət ona qəzəblə baxdı:

– Batan hansı qayıqdır?

– ”Bahar”. Əşi, bilmirəm bu qalmağalı kim qaldırıb? Adamın başına iş gələr. Doğrudur, qayıq çevrilib, ancaq batan olmayıb. Hamısı sağ-salamatdır. Üzüb çıxıblar. Qayığı da bu saat gətirdilər.

Qüdrətin üstündən elə bil dağ götürüldü.

– Usta Ramazan necə?

– Yalan sözdür. O, “Çapayev”lə gedib, buruğa çatıb. Bu saat telefonla mənimlə danışırdı.

– Doğrudanmı? – Qüdrətin ürəyi sanki sinəsini yarıb çıxmaq istədi. – Bəs bu nə şayiədir? Mənim adımdan əmr ver ki, bundan sonra bir qayıq da dənizə çıxmasın. Aydındır. Yoxsa bir də izah edim?

– Aydındır, – deyə Qonaqov trest müdirinin heç olmasa bir dəfə razı saldığına hədsiz dərəcədə sevinib cəld addımlarla kabinetdən çıxdı.

Qüdrət telefonla zəng edib, Aslanova əsil həqiqəti bildirdi və sonra Fikrətə üz tutdu:

– Dənizlə rabitəni möhkəmlədin – dedi. – Telefonları, radionu işə salsınlar!

Fikrət sürətlə qapını açıb getmək istəyəndə, qabağına çıxan bir dəstə adam qəbul otağına daxil oldu. Onlardan biri İsmayılzadədən içəri girməyə izin istədi.

Qüdrət:

– Buyurun, buyurun! – deyə hamısını kabinetə çağırdı.

Gələnlər, trest müdirinin göstərdiyi kreslolarda əyləşdilər və yaylıqlarını çıxarıb, üz-gözlərinin tozunu silməyə başladılar. Qüdrətə yaxın oturmuş bir gənc mühəndis havadan narazılıq edərək söylənirdi:

– Mən heç ömrümdə belə xəzri əsdiyini görməmişdim. Bütün aləmin toz-torpağını süpürüb şəhərə gətirir. Dənizə baxanda adamın gözü qaralır. Elə bil yerlə göy qovuşacaq.

Qüdrət öz trestində işləyən bu mütəxəssislərlə uzun söhbət eləməyə imkanı olmadığını söyləyib, üzr istədi:

– Bu saat hər dəqiqənin bir hökmü var, yoldaşlar. Ona görə də ehtiyatlı olmalıyıq. Məsələ belədir. Hökumətin göstərişilə uzaq kəndlərin bir neçəsində elektrik stansiyaları qurulur. Bizim trest iki kəndi hamiliyə götürür.

– Hamımız bilirik, – deyə bayaq danışan gənc mühəndis həm özünün, həm də yoldaşlarının adından briqadalar düzəldiyini və artıq izahata ehtiyac olmadığını bildirdi. Biz bu gün yola düşə bilərik. Necə buyurursunuz?

İsmayılzadə əvvəlcədən xəbərdarlıq elədi:

– Nəzərdə tutun ki, buradakı işlərimizin heç birinə ziyan toxunmamalıdır. Adamlarınızı başa salın. Onlara lazımi göstərişlər verin.

– Siz o barədə də arxayın olun, yoldaş müdir. Hamı bu məsələnin əhəmiyyətini yaxşı başa düşür. Bəziləri hətta işdən kənar vaxtda elektrik stansiyası üçün müəyyən avadanlıqda qayırıblar. İməcilik düzəldib, köhnə-köşkülləri təmir eləyiblər.

– Çox gözəl, çox gözəl, – deyə Qüdrət razı halda başını tərpətdi.

– Unutmayın ki, hamımız burada da lazımsınız. Kənddə bir aydan artıq qalmayın.

– Doğrudur, – deyə hamı onun fikrilə razılaşdı.

İsmayılzadə, dirsəyini stola söykəyib oturmuş digər mühəndisə üz tutdu:

– Siz hansı kəndə gedirsiniz?

– Kəndin adını unutmuşam, yoldaş müdir, amma orasını bilirəm ki, Nizami kolxozudur. Lap dağın kəlləsindədir. Şamaxıya qədər maşınla, sonra da araba ilə gedəcəyəm. Kolxoz sədri ilə məktublaşmışam. Bir aydır bərk hazırlıq aparır. Tikinti və torpaq işlərini görüb qurtarıblar.

– Deməli, Sarban kəndinə gedirsiniz? Çox gözəl! – Qüdrət birdən Tahiri xatırladı. – Bilirsinizmi, kolxozun cavanlarından bir neçəsi bizdə işləyir?

– Bilirəm, bilirəm. Bayramlılar o kənddəndir. Mən Tahiri də briqadaya yazmışdım. Ancaq fikrimdən daşındım. Çünki indi o nə iş görəcək? Stansiya qurtarandan sonra gedər, elektrik xətti çəkər.

– Aha, düz deyirsiniz. Geyiminizə fikir verin. İndi oralarda bərk soyuq düşüb. Daha mən sizi saxlamayım. Gedin, hazırlıq görün! – İsmayılzadə mühəndislərə, texniklərə əl verdi. – Bizdən kolxozçulara salam aparın, deyin ki, trest heç bir köməyini əsirgəməyəcək.

Onlar çıxıb gedəndən sonra, Qüdrət yenə barometrə baxdı. Tufan get-gedə şiddətlənirdi.

**4**

Mirzəyevin trestə sıravi bir mühəndis göndərilməyi yəqinləşəndə, o əvvəlcə evində oturub, havanın sakitləşməsini gözlədi. O, vəzifədən çıxarılmağını ilk zamanlar arvad-uşağından gizlətmək istəyir, “nə üçün qanlarını qaraldım?” deyə fikirləşirdi. Onun işə getmədiyini görən arvadı, Mirzəyevin əhvali-ruhiyyəsində əmələ gəlmiş dəyişikliyi aydın hiss edib, bunun səbəbilə maraqlanmağa başladı. Nəhayət Mirzəyev məsələni açıb ona söylədi:

– Paxıllar mənim ayağımdan çəkib, irəli getməyə qoymadılar, Dilara. Guya mən başqalarına mane olurammış. Axırı, srağa gün əmrimi verdilər. İndi məni düşmənimin ixtiyarına sıravi mühəndis göndərdilər, – Mirzəyev dərindən ah çəkib susdu. – Məndən yaman intiqam aldılar, Dilara. Sinəmə dağ çəkdilər. Sən özün bilirsən ki, mən başqalarının kölgəsində yox öz istedadım sayəsində bu mərtəbəyə qalxmışdım. Gözləri götürmədi. Nə var, nə var, mən onların hamısından tez ad çıxarmışdım. Bir vaxt vardı ki, mənim həyatım həmişə ehtiyac içində keçirdi. Sənə nişanlananda üzük almağa da gücüm çatmadı. Oxudum, çalışdım, özümü göstərdim. Axırda gördülər ki, yox, mən daha böyük rütbələrə layiqəm. Odur ki, irəli çəkdilər, orden verdilər, bunlar hamısı müvəqqəti imiş. Aslanov mənə olmazın sözlər dedi. Yəqin məndən yuxarıya çox şey qandırıblar. Yoxsa birdən-birə nüfuzdan niyə düşdüm? Eh görünür taleyim belə imiş.

Dilara onun qulluq işlərinə qarışmağı sevmirdi. O, yalnız uşaqlarının həyatı ilə maraqlanır, onların yaxşı oxumağına fikir verir, ən çox da evinin səliqəsilə məşğul olurdu. Amma bu dəfə ərinin təsəlliyə möhtac olduğunu görüb, məyus bir tövrlə dedi:

– Qəm yemə, Saleh. Adam həmişə böyük vəzifədə olmaz ki?

– Yox, mən demirəm ki, gərək mən elə ömrümün axırınacan orada oturam? Mən mühəndisəm, dövlət məni hara yollarsa, orada da işləyəcəyəm. Amma burası var ki, günahım olmaya-olmaya nə üçün məni aşağı endirsinlər?

Dilara təbiətcə mülayim və nəvazişkar bir qadındı. O, ərinin qəlbinə dəyməmək üçün, onun qüsurlarını də həmişə sakit və mülayim bir tərzdə deməyə çalışırdı. Bu gün isə onun əsəbi halda otaqda var-gəl etdiyini görüb, xəyalından keçən sözləri demək fikrindən də daşındı. O yenə təsəlliyə güc verdi:

– Saleh, – dedi, – Aslanovun xasiyyətini özün məndən yaxşı bilirsən. Bu gün tənqid eləyir, vəzifəni azaldır, amma görəndə ki, düzəlirsən, işə can yandırırsan, daha kin saxlamır, qolundan tutub qaldırır.

– Eh, daha mənimki getdi. O gün müşavirədə hamını tənqid elədi, amma mənə gələndə əlini tovladı, yəni ki, məndən bir adam olmaz... Mən onun xasiyyətinə bələdəm. Kimi bərk tənqid eləyirsə, bil ki, o adamı çox istəyir. Amma məni... Yox, gözündən bərk düşmüşəm, Dilara. O İsmayılzadə nə kələk qurdusa, mənim evimi yıxdı.

Bu söhbətdən üç gün keçdi. Amma dənizdə tufan yenə də kəsilmədi. Külək arada bir zəiflədisə də, üçüncü günü axşamı yenidən şiddətlənməyə başladı. Mirzəyev iki dəfə Qüdrətin trestinə zəng elədi. Müdirin gecəli-gündüzlü oradan heç yana tərpənmədiyini öyrənəndə, evdə bu qədər boş oturmaq onun arına gəldi. Səhərdən işə çıxmağı qərara aldı: “Belə getsə, bir həftə gözləməli olaram” deyə fikirləşdi və arvadından hələ adi mühəndis ikən geydiyi paltarı istədi. Bu hadisə ailədəki pərtliyi daha da artırdı. Onun pərişanlığı arvad-uşağına daha da çox təsir elədi. O həm özünə, həm də ailəsinə təsəlli verib:

– Nə olar ki? Adam böyüyər də, kiçilər də, məni hökumət hara göndərsə, orada işləyəcəyəm, – deyirdisə də, özü də, ailə üzvləri də bu sözlərin ürəkdən gəlmədiyini aydın başa düşürdü.

Mirzəyev səhər saat ona yaxın evdən çıxanda, adəti üzrə maşın dayanan yerə addımladı. Ancaq, böyründən antennası havaya ucalan maşınını görməyəndə düşdüyü vəziyyəti bir də xatırlayıb, qanı qaralmış halda piyada getdi. Çoxdan bəri özünü və ailə üzvlərini təzə maşında gəzməyə öyrətdiyindən, bu saat ona ən çox təsir edən vəzifəsinin kiçilməsi deyil, məhz bu maşından məhrum olması idi: “İndi hamı deyəcək ki, aşna, necəsən? Çox özünə qürrələnirdin. Buna hökumət deyərlər. Qaldırar və endirər də...”

O, bu fikirlə ətrafına baxdısa da, tanıdığı adamların üzündə gözlədiyi istehzadan cüzi bir əlamət belə görmədiyinə təəccüb elədi. Hamı, ehtiramla salam verib keçirdi. Mirzəyev tramvaya minib trestə gələndə, ilk dəfə, mədəndən qayıdan Qüdrətlə rastlaşdığı üçün daha da pərt oldu. Qüdrət onu görüb dayandı, özü salam verdi:

– Xoş gördük, yoldaş Mirzəyev, – dedi. – Nə üçün piyada gəlirsiniz? Zəng eləsəydiniz, maşını yollardım...

Bu sözlər iti xəncər kimi Mirzəyevin qəlbinə işlədi: “İstehza eləyir!” deyə xəyalından keçirib qaş-qabağını turşutdu. Qüdrət isə cəld ona yaxınlaşıb, nəzakətlə əl verdi:

– Buyurun! – deyib, kabinetini göstərdi.

Onlar içəri girəndə Mirzəyevin başı sinəsinə enmiş, gözləri yerə dikilmişdi. Bunun səbəbini hiss edən Qüdrət, Mirzəyevin heysiyyətinə toxuna biləcək hərəkət və sözlərə yol verməməyə çalışır, tamam ayrı məsələdən danışırdı:

– Bu gün kefim çox yuxarıdır, elə bil tufan işin sürətini daha artırıb. Plan yüz beşdən yüz səkkizə qalxıb. Təzə buruqlarda gündəlik qazıma planını yüz iyirmidən aşağı ödəyən yoxdur. Bilirsinizmi bu nə deməkdir?

O, sevinclə parıldayan gözlərini Mirzəyevə dikib cavab gözlədi. Ancaq müsahibinin fikri tamam başqa bir istiqamətdə işləyirdi: “İndi mən bunun ixtiyarındayam. Bu gündən sonra başımda qoz sındırıb, intiqam alacaq” deyə həyəcanla düşünüb, ixtiyarsız olaraq başını yuxarı qaldıranda, Qüdrətin uşaq kimi səmimi, sadə bir tərzdə gülümsədiyini görüb, onun sifətində axtardığı istehzanı tapmadı: “Bəlkə məndən bu yolla intiqam alır?” fikrilə, bir xeyli ondan gözlərini çəkə bilmədi.

– Necədir, hə yoldaş Mirzəyev! Bu niyə belə oldu?

– Siz nəyi deyirsiniz?

– Onu deyirəm ki, bizim bu fəhlələrin gücünə özüm də heyran qalmışam. Uzun illərin təcrübəsindən bilirdim ki, tufan vaxtı hər yerdən qara xəbərlər gəlir. Amma bu gün...

Telefon zəngi uzun bir cingilti ilə səsləndi. Qüdrət tez Mirzəyevdən aralanıb stol arxasına keçdi, dəstəyi götürdü.

– Hə, hə, mənim qızım... Trest adından ustaya de ki, mən ona təşəkkür elan edirəm. Mükafat də öz qaydasilə. Bütün briqadaya! Briqada acdır. Mən bunu bilirəm. Qorxmasınlar. Mən onları unutmamışam. Əgər bunun üçün təyyarə də lazım olsa, düzəldib yemək göndərəcəyəm. Elə belə də deyərsən!

Qüdrət dəstəyi yerindən asanda şadlığından bir yerdə qərar tuta bilmir, gəzinir, yenə də Mirzəyevə müraciət edib deyirdi:

– Varam belə adamlara! Bu günə qədər yemək göndərməyimizə razı deyildilər. Qoca Ramazan deyirdi ki: “Lazım deyil, ölüm-itim olar”.

– Bəs indi necə, istəyirlər?

– Yox, yenə də razı deyillər? Amma, doğrusu, zarafat deyil. Üç gündür dənizdə bütün nəqliyyatın hərəkəti dayanıb. Camaat bir saat belə istirahət eləməyib. Yorğunluq, aclıq yəqin onları əldən salıb. Nə təhər olsa yemək göndərəcəyəm!

– Gedənlər dənizdə qərq olsalar, kim cavab verəcək?

– Özləri!

– Necə yəni özləri?

Mirzəyev heç özü də fərqinə varmadan sualını amiranə bir tövrlə verirdi. Lakin Qüdrət üçün bunun heç bir əhəmiyyəti yox idi. O, yenə otaqda var-gəl edərək, birdən dayandı:

– Özləri cavab verəcəklər. Mən bu işə könüllüləri göndərəcəyəm! – dedi:

– Bunun məhkəməsi var, prokuroru var!

Qüdrət bu dəfə gərgin bir fikrə getdi. Lakin onu həyəcanlandıran Mirzəyevin dediyi sözlər deyildi. O indi yalnız Mirzəyevin xasiyyəti haqqında düşünürdü: “Axı bu neft sahəsinə haradan gəlib düşmüşdür? Məhkəmə, prokuror... Onlardan mən nə üçün qorxmalıyam? Mirzəyev, sən bilirsənmi ki, məhkəmə ilə prokuror yalnız caniləri qorxuda bilər? Yox, aşna sən belə sözlərlə mənim inadımı zəiflədə bilməzsən! Yaxşı olar ki, gedib başqa bir işlə məşğul olasan” – Qüdrət bir xeyli kiriyib yenə fikirləşdi və sonra:

– Yoldaş Mirzəyev! – dedi, – sizdən yalnız bir xahişim olacaq.

– Buyurun! İndi mən sizə tabeyəm (Mirzəyevin səsindən xətrinə dəyilmiş bir adam incikliyi duyulurdu.)

Qüdrət dedi:

– Məsələ onda deyil. Xahişim budur ki, 107-ci buruqda Minayevin ixtirasını imtahandan keçirirlər. Mənim maşınımla ora gedin, göz yetirin!

“Başlandı!” deyə Mirzəyev Qüdrətin qəsdən ixtiradan söz saldığını, çoxdan hazırladığı intiqamın başlanacağını bilib, ona qarşı ürəyində baş qaldıran kin və qəzəbini boğmağa çalışdı:

– Rica edirəm, – deyə Qüdrət ona mehriban bir nəzərlə baxdı, – axı siz hər halda texnika sahəsində hazırlıqlı adamsınız. Əgər o ixtiranın kiçik bir qüsurunu də göstərsəniz, böyük köməkdir.

Mirzəyev bu sözlərdə və onların ahəngində nə qədər intiqam nidaları axtardısa da, heç bir şey tapa bilmədi. Qüdrətin yalnız səmimi

bir yoldaşlıq xahişi elədiyini başa düşdü. Qüdrət barədə tamam yanıldığını görüb, belə adamlara qarşı münasibətində nahaq yerə qabalıq göstərdiyini birdən-birə etiraf etməyə məcbur oldu.

– Gedərəm, mütləq gedərəm! – dedi.

– Çox sağ olun, yoldaş Mirzəyev. Bir dost kimi əl ələ verib işləyəcəyik, deyilmi?

– Əlbəttə!

Bu artıq səmimi bir vəd idi. O, kabinetdən çıxandan sonra Qüdrət öz-özünə deyirdi: "Axı nə üçün o belədir?"

Bu anda içəri girən Bədirli onun fikir sapını qırdı:

– Yemək düzəlib. Aparan lazımdır.

– Bu saat gedərik, – deyə Qüdrət şəhər telefonu ilə evinə zəng elədi: – Ana, Şirmayı hanı? Gələndə deyərsən ki mənə zəng eləsin. Xeyirdir, ay ana, xeyirdir. Vallah ac deyiləm. Bilmirəm onun konserti bu gündür, ya sabah? Yadımdan çıxıb. Nə təhər olsa, zəng eləsin!

O, dəstəyi yerindən asdı. Bədirlinin gözlərinin içinə baxdı:

– Bir şey var, yoxsa adi yeməkdir?

– Çörəkdən tutmuş selyotkayacan hər nə desən var.

– Bəs haradadır?

– Yeşiyə doldurublar. Yük maşını ilə körpüyə yola saldım...

– Gedək, yoldaş Bədirli, mən özüm gəmini və ekipajı yoxlamasam, ürəyim rahat olmaz.

Onlar eşiyə çıxdıqları zaman, Qüdrət Mirzəyevin maşınla getdiyini xatırlayıb, balkonda ayaq saxladı:

– Gözləyək, maşın qayıtsın, – dedi və birdən M-1-in həyətdə durduğunu gördü: Mirzəyevin mədənə piyada yola düşdüyünü anlayıb, ixtiyarsız olaraq güldü. İndi o, istər-istəməz Mirzəyevə istehza edirdi. Bir an belə keçməmiş bu hərəkətini zəiflik əlaməti kimi heç özü də bəyənmədi: "Atalar düz deyib ki, igid basar, boğazlamaz". Bu zərb-məsəl köhnəlmiş olsa da Qüdrətin xasiyyətinə uyğun gəlirdi.

– Yoldaş Bədirli, deyəsən külək yavaşıyır, hə? İndi Bədirli, müdirinə xoş gəlsin deyə, onun sözlərini təsdiq elədi, bir havaya, bir də Qüdrətə baxdı:

– Yox, dedi, – daha da bərkiyir. Əslinə baxsan, yoldaş Qüdrət, siz əmr elədiniz, mən də hər şey düzəltdim, elə elədim ki, daha deməyəsiniz əlimdən bir iş gəlmir. Amma, öz aramızdır...

Bədirlinin də, Mirzəyev kimi, nə isə deyib, onu fikrindən daşındırmaq istədiyini hiss edən Qüdrət, əlini havada tovlayıb, Bədirlinin sözünü kəsdi:

– Yaxşı, yaxşı! Tələsmək lazımdır. Camaatı acından qırmayacağıq ki?

– Şər deməsən, xeyir gəlməz, yoldaş Qüdrət, düzü, bu havadan heç gözüm su içmir.

– İndi neyləyək deyirsən? – Qüdrət etiraz eşitmək istəmədiyini bildirən qəti bir ifadə ilə Bədirliyə baxdı. – Göndərmək, vəssalam!

– Siz deyən olsun. Ancaq... Üç-dörd saat gözləyək, bəlkə Allah elədi, tufan yavaşıdı...

Qüdrət maşına mindi, əli ilə Bədirliyə arxada yer göstərdi:

– Məndən sənə nəsihət, yoldaş Bədirli, bir iş görəndə qəti ol. Tərəddüd adamı qorxaq eləyir.

Maşın daş yola çatanda, havanı qara bir bulud kimi tutmuş toz, bir addım qabağı belə görməyə qoymurdu. Maşının örtülü pəncərələrinə xırdaca daş parçaları dolu sayağı dəyib şüşələri şaqqıldadırdı. Şofer fənərləri yandırdısa da, yol bir qarış belə işıqlanmadı.

– Bu nədir, deyəsən Nuhun tufanı təzədən başlanır! – deyə Qüdrət qaşqabağına sallayıb irəliyə baxa-baxa udqundu. – Ayrı yoldan sürəydin də...

– Hər yer belədir, yoldaş Qüdrət, bir az gözləsək yaxşıdır.

Onlar iyirmi dəqiqədən çox dayanıb dinməz-söyləməz gözlədilərsə də, havanı çulğamış toz buludu seyrəlmədi:

– Yavaş-yavaş sür gedək.

M-1 hərəkətə gəldi. Qüdrət yana tərəf baxa-baxa şoferə komanda verməyə başladı: – Bir az sağa, bir az sola, dayan, gözüm yolu seçmir, hə, sür, aha, hava açılır. Yol görünəndə sürətini artır. Bax, belə, aha...

Onlar asfalt yola çıxdılar. Burada toz seyrək idi. Ətraf görünməsə də, yolu seçmək olurdu. Nəhayət gəlib sahilə çıxdılar. Həmişə adamların daldalandıqları balaca otağa girdilər.

Qüdrətin əmrilə buraya toplaşmış kapitanlar öz aralarında ucadan danışır, mübahisə edirdilər. Qüdrət, yalnız bəzi sözləri aydın eşidir, söhbətin dəniz səfərinə aid olduğunu başa düşürdü. Mübahisə edənlər hələ də onu görmədikləri üçün bir-birlərinin sözünü kəsir, bütün günahları fırtına zamanı buruğu tərk etməyən ustaların boynuna atırdılar. Pəncərə qabağında ayaq üstündə durmuş gödək və şişman kapitan əli

ilə qapı ağzında dayanmış Qüdrəti göstərəndə, elə bil qurbağa gölünə daş atıldı. Bəziləri ayağa qalxıb, skamyada trest müdirinə yer göstərdilər.

– Əyləşin, əyləşin! – deyə Qüdrət papirosunu çıxarıb, avtomatik alışqanla yandırdı və bir-iki qullab vurandan sonra imtahanedici nəzərlərini kapitanların üzündə gəzdirdi. Onların hamısı cavandı.

– Görürəm, işsizlikdən darıxırsınız, deyə Qüdrət zarafat tərzində sözə başladı. – Dənizə heç kimi məcburi göndərməyəcəyəm. Kim istəsə, o gedəcək. Xəbərdarlıq edirəm: ehtiyat və iradə lazımdır!

Hamı hipnoz olmuş kimi, Qüdrətin gözlərinə baxırdı. Birdən yan tərəfdən “Çapayev” qayığının kapitanı dilləndi:

– Bunların arasında yenə də mənim az-çox təcrübəm var. İzin verin aparım.

– İzin verin... – deyə Qüdrət onu yamsıladı. – Məndən niyə izin istəyirsən? – Əlini ürəyinin üstünə vura-vura əlavə etdi: – Hər şey bundan asılıdır.

– Çətindir, yoldaş İsmayılzadə. Mən usta Ramazanı aparanda az qala batmışdıq. Lodka elə qalxıb-düşürdü ki, başımız buluda dəyirdi.

– Bilirəm, bilirəm, – deyə Qüdrət yenə papirosunu tüstülətdi.

“Çapayev”in kapitanı iri, qonur gözlərilə necə baxdısa da, Qüdrət onun baxışlarında: “bilirsənsə, daha niyə göndərirsən?” sualını oxudu.

– Bu gün dördüncü sutkadır yoldaşlarımız ac-susuz işləyirlər. İndiyə kimi özləri də razı olmurdular. Amma görünür daha tab gətirmirlər. Bircə hovurluğa özünüzü onların yerində təsəvvür edin. Ac ola-ola, bir dəqiqə də işi dayandırmayıblar. Kim könüllü getmək istəyir?

– Hamımız! – deyə pəncərə qabağında durmuş gödək və şişman oğlan cavab verdi:

– Hamımız, – deyə hər tərəfdən səslər ucaldı.

– Mən hazır!

Bunu eşidəndə Qüdrət öz adi təbəssümü ilə gülümsədi. yenə “Çapayev” deyə xəyalından keçirdi: – Elə isə de görüm necə hazırlaşmısan?

– Necə?.. Uzun bir kəndir hazırlamışam.

– O nə üçündür?

Kapitan da gülümsədi.

– Ya gərək usta Ramazana yemək aparam, ya da özümü kəndirdən asam.

Qüdrət sir-sifətini turşutdu:

– Bu zarafatın heç yeri deyil!

– Mən zarafat eləmirəm, yoldaş İsmayılzadə. Kəndiri ondan ötrü aparıram ki, lodkanı buruqdan uzaqda saxlayıb, şeyləri bir-bir onun ucuna bağlayım, buruğa atım, suya düşəndə də batıb hayıf olmasın. Uşaqlıqda sapand atardıq ha... bax, o cür atmaq istəyirəm. Bir uzun kəndir də aparacağam ki, lodkanı buruğa bənd eləyim, hər dəfə dalğa vuranda yarım verst uzaqlaşmayım.

Qüdrət sevindi: "Bax, bu gedəcək!"

– Siz necə, hazırsınızmı? – deyə İsmayılzadə o biri kapitanlara müraciət elədi. – Kim öz bacarığına inanmırsa, indidən desin.

Bu dəfə onların heç birindən səs çıxmadı.

– Ən çətini, əlbəttə ki yüz əlli beşinci buruqdur. Açıq dənizdə ən azı iki kilometr yol gedilməlidir. O biriləri asandır. Bir fəlakət üz verərsə də üzüb çıxmaq olar. İki nəfəriniz lodkanı hazır saxlayıb gözdə-qulaqda olsun, qalan üç qayığın hərəsi bir buruğa yola düşsün.

Beş dəqiqə belə çəkməmişdi ki, Qüdrətin dediyi kimi də oldu. Yük maşınından yeməyi düşürdüb Bədirlinin göstərişi ilə qayıqlar arasında bölüşdürdülər və bir-birinin dalınca üç qayıq dənizə çıxdı.

Hamıdan qabaqda "Çapayev" gedirdi.

Qüdrət körpüdə dayanıb həyəcan içində baxır, küləyin şiddətli zərbələrdən yıxılmamaq üçün ayaqlarını yerə möhkəm dayayıb, gözlərini "Çapayev"dən bir an çəkmirdi.

– Yoldaş Qüdrət, – deyə Bədirli şapkasından ikiəlli yapışıb kəsik-kəsik dilləndi. – Bunların çoxusu front görmüş oğlanlardır, bərkə-boşa düşüblər, intahası qorxurlar yeməyi aparıb çatdıra bilməyələr.

Qüdrətdən səs çıxmadı. Onun iki-üç addımlığında uğuldayan dəniz, körpünü az qala yerindən qoparır, hər dalğa sahili döydükcə, elə bil, yer, göy zəlzələyə düşüb titrəyirdi.

"Çapayev" isə dalğalar arasında gah batır, gah çıxır, amma yenə inadla vuruşaraq özünə yol açırdı.

– O gedəcək! – deyə Qüdrət artıq bir inamla Bədirliyə baxdı və onun gözlərində doğrudan da qəribə bir sevinc alışıb yandı...

## 5

Usta Ramazanın buruğunda isə qayıq haqqında düşünən yox idi. Briqada üzvləri yalnız tufanın qurtarmasına ümid bağlayırdılar. Hamının fikri-zikri işdə idi. Tufan günlərində balta dörd yüz iyirmi metr məsafə qət eləmişdi. Deməli, buruq bu gün də olmasa, sabah üç min metr dərinliyə çatıb, istifadəyə veriləcəkdi. Əslinə baxsan bu sürət Ramazanın özü üçün də gözlənilməzdi. Aclıq onu da, yoldaşlarını da əldən salırdı. Hamının rəngi-ruhu qaçmışdı. Briqada üzvləri arasında buraya gəlib düşdüyü günə lənət oxuyanlar da vardı. Amma bunuheç kim üzə vurmurdu. Çünki nə qədər əsəbiləşsələr də, ən axırda bircə şey onlara təsəlli verirdi: – Buruq vaxtından yalnız bir ay əvvəl yox, hələ bundan da iki gün tez qurtarırdı. Briqada bu dəhşətli tufandan üzü ağ çıxardı... – Bu sözləri də heç kəs demirdi. Amma hamının aclığa, susuzluğa dözməsi də; "get yat, yorğunsan" deyə təklif edən Ramazana "yox" cavabı verməsi də bu hissin, bu duyğunun səbəbinə idi. Ramazan, oğlunun düşmən mühasirəsində bundan da üçqat artıq ac qaldığını briqadasının üzvlərinə danışmağa ehtiyac duymurdu. O bilirdi ki, cəbhədə vuruşmuş oğullarını da, burada saatla yox, vicdanla işləyən dostlarını da bir torpaqda yaşayan, bir göyün altında bir havadan nəfəs alan analar doğmuşdur. Ramazan onların arasında təbliğat aparmalı deyildi ki? O, Vasilyevə, Cəmilə, Heydərə, Qrişaya, Tahirə və Lətifəyə nə deyə bilərdi? Hamısı kimin üçün, harada işlədiyini Ramazandan da yaxşı bilmirdi?

Qəribədir: Tahir, tufan zamanı qocanı bir dəfə də qaşqabaqlı görmədi. Bu qədər qan qaraltısı olan yerdə qoca usta qırğı kimi cəld, uşaq kimi sadə, Tahirin doğma atası kimi zarafatcıl olmuşdu. Əvvəlcə ona elə gəlirdi ki, usta yalnız görk üçün belə hərəkət edir. Amma tədricən başa düşdü ki, qocanın xasiyyəti belədir, gərgin anlarda özünü daha gümrah, daha şad hiss edirdi. Bundan sonra Tahir təəccüblə Ramazana baxmır, hamı ilə bərabər o da ustanın məzəli sözlərinə gülür, onun zarafatlarından xoşhal olur, işləyəndə yorğunluğunu adi, əhəmiyyətsiz bir hal sayırdı.

Qüdrətlə danışandan sonra mədəni budkadan buruğa gələn Lətifə, usta Ramazanı bir tərəfə çağırıb, qanı qaçmış dodaqlarını yalaya-yalaya trest rəisinin tapşırığını ona yetirdi və axırda güc-bəla ilə (qız, acından ayaq üstündə dura bilmirdi) bu sözləri deyə bildi:

– Qüdrət yoldaş bu gün nə təhər olsa yemək göndərəcək.

Ramazanın qaşqabağına qəm kölgəsi qondu.

– Olmaya sən istədin?

– Yox, usta, özü yollayır.

Bu neçə gündən bəri hamının aclıqdan və susuzluqdan çəkdiyi iztirabı gördükcə ürəyi sızıldayan qoca, bu xəbərdən sonra narazı halda başını buladı:

– Nahaq, qızım, nahaq, – dedi, – axı niyə ölüm-itim olsun?

Usta özü Qüdrətə zəng eləyib, onu bu fikrindən daşındırmaq istədi. Ancaq birdən ona elə gəldi, briqada üzvlərindən kim isə öz yanında şikayətlənib narazılığını bildirdiyi üçün, Qüdrət bu tədbiri görməyə məcbur olmuş, kimin isə həyatını təhlükəyə atmağa hazırlaşır.

– Qızım, deyə Ramazan Lətifəyə diqqətlə nəzər saldı, – bəlkə uşaqlardan ona zəng eləyən olub?

– İnanmıram, usta. Mən ki görməmişəm, – deyə Lətifə, müqəssir adamlar kimi, gözlərini yerə dikdi.

Qoca usta, dörd gündən bəri aramsız işləyən dostlarına nə isə deməyə hazırlaşaraq, mexanizmləri dayandırmaq əmri verdi. Buruğa sükut çökəndə, hamını yanına çağırdı, oturmalarını xahiş elədi.

– Görünür usta iclas çağırır, – deyə Tahir də Cəmillə bərabər gəlib Ramazanın böyründə oturdu.

Boran başlanan gündən bəri bir dəfə də ustanı qaşqabaqlı görməmiş fəhlələr, onun pərt olduğunu dərhal hiss edib, təəccübdən böyümüş gözlərini ona dikərək, bu pərtliyin səbəbini öyrənməyə tələsdilər. Amma o, gah yerə, gah da briqada üzvlərinə baxır, dinmirdi: "Yəqin zəng eləyən olub, yəqin şikayətlənən olub" deyə düşünürdü: "Çətindir, əlbəttə çətindir. Ancaq bu çovğunda kim dənizə çıxsa, qərq olacaq. Dözmək yaxşı deyilmi?"

– Ay uşaqlar, – deyə nəhayət Ramazan dilləndi, – mənim sözüm yoxdur, siz deyin, mən qulaq asım: – Yemək gətirilsin, ya yox?

Bu süal hamıya qəribə göründü: imkan varsa, nə üçün gətirilməsin? Dörd günlük ağır işdən sonra hamını gücdən salmış bu aclığı dözmək bəs deyilmi?

Vasilyev dostunun fikrini hamıdan əvvəl başa düşdü:

– Gətirilsin, Ramazan İsgəndəroviç, əlbəttə gətirilsin! Uşaqların rənginə bax. Heydərlə Qrişanın bir boruya gücü çatmır. Taxta qırıntıları Cəmilin gözünə çörək qırıntıları kimi görünür. Tahir dənizi buluddan seçə bilmir.

Əvvəlcə bu sözlərin çox ciddi bir məqsədlə deyildiyini güman edənlər, axırda gülüşdülər. Gülməyən təkcə Ramazan, bir də Vasilyev özü oldu.

– Mən zarafat eləmirəm, uşaqlar, tufan elə dörd gün bundan qabaqkı kimidir, hələ bəlkə bir az da gücləndi. Qoy gətirsinlər. Bundan sonrası da var.

– İşi dayandırsaq necə olar?

Usta başının yuxarı qaldırmadı. Sual verən Heydəri səsindən tanıdı. Qocanın nəzərində yemək istəmək – belə məğlub olmaqdan min qat yaxşı idi. Amma o, yenə dinmədi. Öz könlü ilə danışmaq istəyən olmadığı üçün adamları ucadan adbaad çağırdı:

– Heydər, de görüm, gətirsinlər, ya yox?

Əvvəldən də arıq və cansız olan bu fəhlənin ovurdları tamam batmışdı. O, bir xeyli sükut edib, tərəddüd içində qalmışdı. Ramazana elə gəldi ki, işi dayandırmağı məsləhət görən adam, yemək istəməyə çoxdan razıdır, amma bunudililə deməyə utanır.

– Deməli, razısan, hə?

– Yox, usta, izin ver, fikirləşim, – deyə Heydər üzünü bir qədər yana çevirdi.

Hamının gözü onda idi.

– Hə, yaxşı fikirləş! – Usta Qrişaya müraciətlə soruşdu: – Sən necə, razısan?

Dünəndən bəri kəmərində bir neçə təzə deşik açan bu şişman oğlan:

– Gətirsələr... – deyə sözünün axırını uzatdı və birdən, tələsmiş kimi əlavə etdi: – Axı, usta, işi dayandırdın, qarnımın qurultusu artdı, olmaz başlayaq?

Aclar gülüşdülər.

– Vallah, düz deyirəm. Axı söz vermişik, usta.

Vaxt gedir. Yox, mən razı deyiləm. Hansı kapitan gəlsə, mənim dostumdur. Niyə batsın axı? Razı deyiləm!

Bu anda Heydər də dilləndi:

– Mənim də dostumdur, elə mən də razı deyiləm.

Ramazan, bir neçə dəqiqə bundan əvvəl başı hərlənib, ürəyi xarab olaraq yıxılmış sarı saçlı rus balasına döndü:

– Andryuşa, sən necə? Bir saat ac qalsan, təcili yardım çağırmalı olacağıq. O da bu tufanda gəlib çıxa bilməyəcək.

Andrey əlini qaldırıb-saldı:

A nu eqo... – deyə o, bu sözlərdən qabaq yalnız cavanlar arasında işlətdiyi yağlı söyüşü udub cavab verdi...

– Deməli razı deyilsən?

– Yox, Ramazan İsgəndəroviç. Axı o da adamdır. Necə olar? Lazım deyil. Mən aclığı unutmuşam.

"Bəs bu şikayəti eləyən kimdir?" – deyə usta zahirən çox biganə bir halda, amma diqqətlə yoldaşlarına göz gəzdirdi.

– Tahir, yemək göndərsinlər, ya yox?

– Yox, usta, – deyə Tahir az qala Ramazanın sözünü kəsərək dilləndi.

– Niyə ki? Ac deyilsən?

– Doğrusu... – Tahir duruxdu, – usta düz deyir. Gözümə qaranlıq çökür... tək mənim yox, hamının... amma lazım deyil...

– Niyə ki?

– Yox usta, lazım deyil. Çünki bizə yemək gətirməyi hər halda igid oğlana tapşırarlar. Axı bilə-bilə onu niyə həlak eləyək? Dözmək yaxşıdır. Dözərik, usta!

Kim isə yan tərəfdə dodağının altında deyindi:

– Bəlkə dözməyənlər var?

– Mən öz adımdan deyirəm, – Tahir, gil məhluluna bulaşmış əllərini ovxaladı, – yox, elə hamının adından deyirəm. Kim gəlsə, o da bizim adamdır. Mən razı deyiləm!

Ramazan Tahirə etiraz edən oğlan haqqında düşünürdü. "o zəng eləməz. Bir həftə ac qaldığı vaxtlar olub, dinməyib..."

– Deməli, heç birinə razı deyilsiniz, hə? Bəs Qüdrətə kim zəng eləyib?

Təəccüb dolu gözlər Ramazana zilləndi.

Onlar birdən küləyin vıyıltısı ilə qarışıq bir səs eşitdilər. Əvvəlcə buna fikir verən olmadı. Belə vaxtda kim cəsarət eləyib buruğa gələ bilərdi? Bu səs bir də, bir də eşidildi. Tahirin qulağı hamıdan iti idi. O, səs gələn tərəfə diqqətlə baxdı və buruqdan xeyli aralı çılğın dalğalarla vuruşa-vuruşa gələn, bəzən aşağı enib görünməz olan, bəzən də suyun üzündə odun parçası kimi atılıb-düşən qayığı tanıdı və gördüyünə inanmadığı halda ayağa sıçradı, gözlərini Ramazana zilləyib ucadan səsləndi:

– Usta, "Çapayev" gəlir!..

Bu sözü eşidənlər əvvəlcə istehza ilə gülümsədirlər. Birdən başlarını qaldırıb o tərəfə baxanda, onların dodaqlarını bürümüş təbəssüm dərhal silinib getdi. Elə bil hamı bir vaxtda eyni röyanı görürdü.

– "Çapayev", "Çapayev!" – deyə briqada üzvləri birdən qışğırdılar.

Doğrusu, heç kim öz gözlərinə inanmırdı. Böyük gəmilər limanda lövbər saldıqları halda, "Çapayev" ölümlə vuruşa-vuruşa gəlirdi. Onun nə üçün, nə məqsədlə belə təhlükəyə baş vurduğunu fikirləşəndə, hamının ürəyini vahimə basdı: "Yəqin bir bədbəxtlik üz verib..."

Qayıq buruğun əlli-altımış addımlığına yaxınlaşanda, dalğalar onu vurub gözdən itirdi. Lakin "Çapayev" dənizdə qərq olmaq fikrində deyildi. O yenə göründü və yenə irəliyə doğru şütüdü. Əgər kapitan buraya qədər necə gəlib çıxdığını bilsəydi, bəlkə çaşıb özünü itirər, doğrudan da batıb qayıqdan ayrı düşər, bir daha suyun üzündə görünə bilməzdi. O bunudüşünmürdü. Onun bütün əsəblərini və beynini məşğul edən yalnız bir məqsəddi: "Öldü var, döndü yoxdur"! Ancaq indi bunun heç birinə ehtiyac qalmırdı: o, buruğa yetişir, məqsədinə çatırdı.

– Usta hey... – deyə kapitan Ramazanı səslədi.

Cəmillə Tahir əllərini havada yelləməyə başladılar.

"Çapayev" bir də geriyə atıldı. Lakin bu anda kapitanın ayaq üstündə durub əlində kəndir tutduğunu hamı aydın görürdü. Onun qarabuğdayı köməkçisi sükanı idarə edir, kapitan isə qışqırırdı:

– Ehey! Tutun kəndiri!.. Tutun kəndiri!..

Qayıq lap yaxına cələndə, bu möcüzəyə yalnız fəhlələr deyil, kapitan özü də məəttəl qalmışdı. O kəndiri necə məharətlə atdısa, ucu düz gəlib Tahirlə Cəmilin ayaqları altına düşdü. Cavanlar tez əyilib kəndiri tutdular və çəkməyə başladılar.

– Cəmil! Tahir! Çox dartmayın! Aralı saxlayacağam!

Cavanlar kapitanın fikrini o dəqiqə anlayıb, kəndiri iki-üç dəfə dirəyə doladıqdan sonra geri çəkildilər. Dalğalar qayığı nə qədər sağa-sola çırpdısa da, kapitanın halına təfavüt eləmədi. O suya batmış iri çörəkləri və konserv qutularını bir yerə topladı, hazırladığı xüsusi kəndiri tapıb gətirdi və əvvəlcə çörəklərin birini onun ucuna bağlayıb havada cavanlara göstərdi:

– Ey, ac həriflər! – deyə yenə qışqırdı, – atıram ha, tutun!

Buruqda iş-güc yaddan çıxmışdı. Yalnız usta quyunun yanından uzaqlaşmır, kapitana baxa-baxa dodaqaltı deyirdi:

– Vay sənin, igid oğlanmışsan!.. Görürsən, görürrsən?

Çörək havada oynaya-oynaya gəlib suya düşdü. Tahirlə Cəmildən ufultu qopdu.

– Keşkə Səməndər burada olaydı. Bir dəqiqədə suyun dibindən tapıb çıxarardı, – deyə Tahir təəsüfünü gizlədə bilmədi.

– Eybi yoxdur, eybi yoxdur, çörək çoxdur, – deyə kapitan kəndiri geriyə çəkdi, amma onsuz da möhkəm islanmış çörək suyun içində dilik-dilik olub tökülmüş, kəndirin ucu boşalmışdı.

– Atdım ha, bərk durun!

Kapitan sapandla daş atan kimi kəndiri buruğa tərəf atdı. Cəmil çörəyi havada qapdı. Kapitan döşünə döyə-döyə özünü təriflədi:

– Malades mənə!..

Cəmil yorğun kəndirin ucundakı nazik işlərlə möhkəm bağlanmış çörəyi açıb Tahirə verdi:

– Dirildik!..

Kəndir yenə geri çəkildi. Bu dəfə konserv qutusunu bağlayan kapitan, əvvəlkindən də tuşqul atdı:

– Ey-y-y, az yeyin ha, bir də gəlməyəcəm, onsuz da mənim var-yoxum qarnıma gedib...

İndi bütün briqada üzvləri Tahirlə Cəmilin dövrəsini bürümüşdülər.

Bu dəfə kəndirin ucuna uzun bir kolbasa bağlanmışdı. Kapitan kəndiri yenə atanda, Tahir onu yerə düşhadüşdə tuta bildi. Uşaqlar qaqqıltı ilə gülüşdülər.

– Ey-y-y bircə arağı çatmır, özüm gətirmədim. Yoxsa yolda içib balıqlara yem olardım.

Arada bir ət konservi də gəldi.

– Eh, bu olmadı, – deyə Tahir Qaşqabağını salladı və ucadan kapitanı səslədi: – Bura bax, Abasqulu, əvvəlcə o qara çörəkdən ver gəlsin, bu amerikan zir-zibilini sonraya saxla!

Kapitan, mahnılarını ürəkdən bəyəndiyi "aşıq Tahir"in könlünü xoş eləmək üçün:

– Ala!.. – deyib, iri qara çörəkdən birini də tulladı.

Usta Ramazan uzaqdan-uzağa kəndirin atılmasına tamaşa edir, işindən, hərəkətindən daima narazı olduğu kapitanın hünərini ürəyində tərifləyirdi: "Əl boyda lodkanı bura sağ-salamat gətiribsə, deməli, qoçaq oğlandır!"

Kapitan, elə bil bundan xəbər tutub şəstlə döşünü qabartdı, Ramazanı çağırdı:

– Ay usta ey, ömrümdə səndən bir yaxşı söz eşidəcəyəm, ya yox?

Ramazan onun nəyə işarə elədiyini bilirdi. Doğrudan da qoca onu bir dəfə də tərifləməmişdi. Amma indi gülə-gülə dedi:

– Daha sənlə barışacağam. Sağ ol!

Kapitanın atdığı uzun konserv qutusu buruğa çatmamış suya düşdü. Kəndiri geri çəkəndə qutunun üstündəki kağız havada qanad çalırdı.

Vasilyev kapitanın yorulduğunu hiss edib:

– Abasqulu! – dedi, bir az dincəl! Qolun yorulub, dincəl, hayıf eləmə yeməyi!..

Bu halda mədəni budkadan Lətifəni çığırtısı eşidildi. Hamı dönüb o tərəfə baxdı.

– Yanğın! Yanğın! – deyə qışqıran qız, körpü ili bəriyə tərəf yüyürdü.

Yenə aclıq, susuzluq hamının yadından çıxdı. Cavanlar budkaya doğru yüyürüşdülər. Lətifə onları görüb dayandı və əlilə budkanı göstərdi.

Bir an belə keçməmiş onlar yanğın yerinə çatdılar.

– Nədən olub? – deyə Vasilyev Lətifədən soruşdu.

– Bilmirəm. Elektrik məftili yandı. Mən radionu qururdum, bir də onu gördüm ki, budkanı alov bürüdü.

– Uşaqlar, qalmaqalsız, tez su gətirin!.. – deyə Vasilyev ora-bura vurnuxan Cəmillə Tahiri sakitliyə çağırdı. Tahir, Vasilyevi belə təəccübə gətirən bir cəldlik və məharətlə divardakı əmniyyət cihazını burub elektrik qüvvəsini kəsdi. Montyorluq dərsi ilk dəfə onun üzünü belə ağartdı! Sonra o, ildırım sürətilə vedrəni götürüb özünü içəri saldı. Alovun dilləri ona tərəf uzanır, yaxın düşməyə qoymurdu. O, suyu qaldırıb yanan yerə səpələdi. Bir neçə an budkanı tüstü bürüdüsə də, alov yenə də kəsilmədi. Tahir eşiyə yüyürdü və vedrəni kəndirə bağlayıb dənizə saldı. O qayıdana kimi Cəmil divardan asılmış yanğın qutusunu götürüb açdı, onun içindəki torpağı alovun üstünə atdı. Tahir əlindəki vedrəni boşaldıb yenə qayıtmaq istərkən Vasilyevin qışğırığını eşitdi:

– Qız, getmə!

Lətifə özünü alova vurub radio cihazını çıxarmaq istəyir, lakin Vasilyev onun ətəyindən yapışıb buraxmırdı. Bunu görən Tahir, bir də

geri qayıdanda, suyu boşaldıb vedrəni kənara tulladı və özünü alovun içinə atdı.

– Tahir, qayıt!.. – deyə Vasilyev onu da geri çağırdı.

Lakin Tahir onun sözünə baxmayıb, odun, tüstünün içində radio cihazını axtarmağa başladı. Birdən o, üstünə su calandığını hiss edib, diksinən kimi oldu, amma yenə də axtarıb nəhayət cihazı tapdı.

Bu dəmdə yüyürə-yüyürə su daşıyan Lətifənin nələr düşündüyünü təsvir etmək çətindir. Yalnız bunudemək mümkündür ki, o, Tahirin alov içərisinə şığıdığını görəndə, ürəyinin yerindən qopduğunu hiss edir, vedrə ilə qayıdanda qorxu və həyəcandan böyümüş gözlərini bir an belə Tahirin atıldığı nöqtədən çəkmir, özü irəliyə sıçrayıb onu qurtarmaq istəyir: "Yandı, yandı!" deyib ah-uf edirdi.

Birdən hamı əlində radio cihazı tutmuş, üz-gözü pörtmüş Tahiri gördü. Onun paltarı tüstülənirdi. Alnından, yanaqlarından tər damcıları axır, tüstüdən yaşarmış gözləri parıldayırdı. Cəmil vedrə dolu suyu onun üstünə töküb, paltarının yanan yerlərini söndürdü.

Nəhayət cavanlar cərgəyə düzülüb vedrəni əldən-ələ verir, elə sürətlə işləyirdilər ki, yanan yerə yaxın durmuş Vasilyev, get-gedə alovun azaldığını görür, cavanları yenə tələsdirir, özü isə suyu hər dəfə lap dibə atırdı.

On dəqiqə belə keçməmiş alov kəsildi. Qapqara və acı bir tüstü budkanı bürüdü.

– Yenə su!.. – deyə Vasilyev dolu gələn vedrəni götürüb özünü içəri saldı və hələ də işıldayan nöqtələrə su səpməyə başladı.

İndi hamı tərini silir, yenə də bütün gücü ilə vıyıldayan küləyin qarşısında üşüdüklərini hiss edir, elə bil nədənsə çəkinib dinmirdilər.

Vasilyev Lətifəyə üz tutdu:

– Qız, sən bu budkanı kağız-kuğuzla nahaq bəzəmisən, – dedi, – bir az da gec gəlsəydik, anan bizi Bakıdan sürgün elətdirərdi.

Lətifə dinmədi: alovun belə tez qalxmağı təkcə küləkdən deyil, həm də divarlara yapışdırılmış qəzet və portretlərdəndi.

– Hə indi yemək bizə halaldır! – deyə Vasilyev gülümsədi, – gedək, uşaqlar.

Budkadan hələ də arxayın olmayan Lətifə, diqqətlə içəri boylandı. Tahir ona:

– Daha qorxma, – dedi, – hər yer sönüb.

Doğrudan da bir azdan tüstü seyrəkləşdi və yanıb qaralmış döşəmə göründü. Hamı içəri girdi. Tahir radio cihazını gətirib yerinə qoydu. Sonra mənalı bir tərzdə Lətifənin üzünə baxdı:

– Bu saat məftili də düzəldərik, şəhərdən bizə şad xəbərlər tutarsan!

Onlar Lətifəni də aparıb buruğa sarı getdilər. Usta uzaqdan-uzağa yanğınla vuruşanlara baxır, yenə də quyudan ayrılmırdı: “Vasilyev oradadır, nə lazımsa eləyər” deyə düşünürdü.

– Nədən olub?

– Məftilllərin hamısı köhnədir, – deyə Vasilyev cavab verdi və ustadan aralanıb “Çapayev”in kapitanını səslədi: – Abasqulu, qayıtma, bir az gözlə, bəlkə dəniz sakitləşdi. Ona etibar yoxdur.

Bu barədə kapitan çoxdan fikirləşmişdi. O, möhkəm dincəlib, sonra geri qayıdacaqdı. Köməkçisi ilə yanaşı oturub, qara çörəklə ət konservi yeyirdi. Bu qədər yorğunluqdan və aclıqdan sonra, yeyilən hər bir loxmanın özgə dadı vardı. Bir az bundan əvvəl qaş-qabağı yer süpürən adamları indi tanımaq çətin idi. Ramazan, öz istəkli balalarını süfrə başına yığıb yemləyən mehriban bir ana kimi, qayğıkeş və səmimi idi. O da yeyirdi, amma özündən çox balalarını yedirirdi.

**6**

Atasının dəniz buruğuna sağ-salamat gedib-çıxmağından xəbər tutan Paşa, sevincək halda Nailə ilə anasına cəbhədə gördüyü maraqlı hadisələrdən danışan zaman, onu telefonla şəhər partiya komitəsinə çağırdılar. O özü də, ailə üzvləri də bunun səbəbini bilirdi: Paşa, işsiz gəzməkdən artıq yorulub on-on beş günlük istirahətdən sonra yenə köhnə vəzifəsinə qayıtmaq haqqında ərizə vermişdi.

Onu şəhər komitəsinin ikinci katibi qəbul elədi və Aslanovun təklifini ona çatdırdı:

– Məsləhətimiz belə oldu ki, siz burada, aparatda çalışın.

Paşa hansı sahədə işləyəcəyi ilə maraqlandı:

– Mənim vəzifəm nədən ibarət olacaq?

– Sizi hələlik şəhər komitəsinin şöbə müdiri təyin eləmək fikrindəyik. Müharibədən əvvəl, gərək ki, raykomda propaqandist işləyirdiniz, deyilmi?

– Bəli. Elə indi də bu sahədə işləmək arzusundayam. Doğrusu, mədənlərdə fəhlələr arasında çalışmağa əvvəldən həvəsim var. Bir-birimizi tez başa düşürük.

– Bu daha gözəl. Bizə də belə yoldaşlar lazımdır. O gün neftçilərin müşavirəsinə gəlmişdinizmi?

– Xeyr, məni çağırmamışdılar. Ancaq atamdan soruşdum, o mənə hər şeyi ətraflı danışdı.

– Deməli, siz Bakı partiya təşkilatının yaxın vəzifələrindən xəbərdarsınız. Aslan Teymuroviçin fikri budur ki, aparata, müharibə alovlarında bərkimiş yoldaşlardan mümkün qədər çox cəlb olunsun. Çünki, təsərrüfatın hər sahəsində olduğu kimi, neft cəbhəsində və səfərbərlik əhvali-ruhiyyəsini birə on yüksəltmək lazım gələcək.

Lakin Paşa yenə də köhnə işinə qayıtmaq fikrindən əl çəkə bilmirdi. Onun rəyincə, öz səviyyəsinə nisbətən yüksək vəzifə tutmaqdansa, yaxşı bacardığı işə getmək hər halda daha faydalı idi.

– Bilirsinizmi, – dedi, – əlbəttə, mən Aslanov yoldaşın da, sizin də etimadınıza qarşı təşəkkür edirəm. Ancaq... – Paşa tərəddüd içində bir neçə an duruxdu. – Ancaq, doğrusu, mən bu vəzifəyə özümü layiq görmürəm. Axı mən...

– Siz təvazökarlıq edirsiniz, – deyə katib ciddiyyətini pozmadan onun sözünü kəsdi. – Heç bir kəs anasının qarnında öyrənmir. Gələrsiniz, işin səciyyəsilə yaxından tanış olarsınız. Biz hər zaman sizə kömək edəcəyik.

Paşa yenə qərarından dönmədi:

– Hər halda sizdən xahişim budur ki, Aslanov yoldaşa mənim arzumu söyləyəsiniz.

Katib, Paşanın bu hərəkətindən narazı qalsa da, onun xahişini Aslanova yetirmək üçün, hökumət telefonunun dəstəyini götürüb, nömrəni yığdı:

– Yoldaş Aslanov, dedi, – Paşa İsgəndərzadə ilə danışdım. Bəli, yanımdadır. Xeyr. yenə köhnə işində çalışmaq fikrindədir. Baş üstə! – Katib dəstəyi yerindən asdı. Stolun üstündəki iş qovluğunu götürüb ayağa qalxdı: – Bizi yanına çağırır, gedək.

Paşa həyəcanlanmağa başladı.

– Yaxşı, mən ona nə deyim?

– Burada nə dedinizsə onu.

Paşa yavaşca addımlarla yuxarıkı mərtəbəyə qalxana qədər, Aslanovun yanında əlavə nə kimi dəlilər gətirəcəyini düşündü: “Aşağı partiya aparatında da bacarıqlı işçilər lazımdır. Orada özümü göstərə

bilsəm, sonra yenə irəli çəkərsiniz. Çoxdandır partiya işindən ayrılmışam. Qorxuram sizə az xeyrim dəysin"

Paşa ikinci katiblə bərabər Aslanovun kabinetinə girəndə, əvvəlki dəlilləri də, pilləkəndə düşündükləri də tamam yadından çıxdı. Aslanov onun yeganə, sağ əlini bərk-bərk sıxıb, gülə-gülə dedi:

– Hə, cəbhə səni bərk yorub? Rahat bucaq axtarırsan? Otur, otur!

– Xeyr, yoldaş Aslanov. İş az olanda ürəyim darıxır.

– Bəs niyə məsləhətimiz xoşuna gəlmir?

Paşa yalnız indi, aşağıdakı mərtəbədə düşündüklərini xatırlaya bildisə də Aslanovun qüvvət təlqin edən aydın baxışlarından, nə isə, qorxmuş kimi, bu xüsusda bir kəlmə belə danışmaq istəmədi.

– İşin asanından yapışmaq hünər deyil, – deyə Aslanov bu anda yan qapıdan içəri girən ağ önlüklü bir qızın padnosda gətirdiyi və stol üstündə qoyduğu limonlu çaya qənd saldı, stəkanı cingildədə-cingildədə qaşıqla qəndi qarışdırdı və qıza tapşırdı: – Yoldaşlara da çay ver – O, nəyi isə xatırladı və qızın üzünə baxdı. – Yoxsa dərsə gecikirsən?

– Xeyr, hələ on beş dəqiqə var, – deyə Aslanovun belə qayğıkeşliyindən razı qalıb gülümsəyən al yanaqlı, qara saçlı, utancaq qız yenə qapı dalında görünməz oldu.

– Bütün dərslərdən əla oxuyur. Özüm təkdənbir onu imtahan eləyirəm. Axı mən vaxtilə maarifçi olmuşam! (Aslanov, həmişə bu barədə söhbət düşəndə öz gənclik illərini xatırlardı). Hesabla gərək məndə partiyadan xahiş eləyim ki, məni köhnə sənətimə qaytarsın, hə? Bəs yaxşı, bu necə olur ki, cəbhədən qayıdan bəzi yoldaşlar bir balaca aşağı vəzifəyə göndəriləndə bunuözləri üçün təhqir bilirlər, amma sən...

Paşa katibin danışığındakı aydın istehza nidalarını duyub, utana-utana cavab verdi:

– Görünür onlar daha çox qəhrəmanlıq göstəriblər, yoldaş Aslanov. Yaxud da əvvəldən böyük vəzifədə olublar.

Bayaqkı qız yenə çay gətirib, ikinci katibin və Paşanın qabağına qoydu.

– Ümumiyyətlə, İsgəndərzadələr mənim təklifimdən boyun qaçırmağa öyrəniblər, – deyə Aslanov zarafat tərzində usta Ramazana işarə ilə gülümsədi. – Sizi istəmədiyiniz işə məcburi təyin eləmək fikrində deyilik. Gedin, bir gün də düşünün!

Paşa o günün axşamı qəti qərara gəldi:

– Razıyam.

Şəhər komitəsinin bir sıra işçiləri kimi, o da tufan günlərini mədənlərdə keçirməli oldu. Əgər Paşa çovğun zamanı trestlərdə baş vermiş hadisələrə dair mühazirə söyləsəydi, mütləq bəzəkli bir cümlə işlətməyə məcbur olardı: “Bu günlərdə Bakının qəhrəman neftçilər ordusu, dənizdə və quruda gedən amansız vuruşmalarda təbiətin kor qüvvələrinə poladdan da möhkəm bir iradə ilə sinə gərdilər!”

Mütəmadi əsən külək ən qüvvətli insanı belə asanlıqla yıxırdı. Açıq havada, heç bir sığınacağı olmayan buruqlarda isə yıxılan və təbiətdən imdad istəyən bir fəhlə yox idi. Kaçalkalardan birinin də hərəkəti dayanmamışdı. Əsaslı təmirat işləri adi sürətlə davam edirdi. İstismara buraxılmış dəniz buruqlarından ehtiyat anbarlarına axan neftin miqdarı azalmırdı və Paşaya elə gəlirdi ki, təbiət quduzlaşdıqca, insanların iradə və mətanəti hər an möhkəmlənir. Bu, doğrudan belə idi.

Paşa ilk dəfə maşından düşüb mədənə ayaq basanda sadə, lakin mənalı bir hadisənin şahidi oldu. Lalə İsmayılzadənin trestindəki buruqlardan birində külək köhnə vışkanı uçurmuş və buruğun təmirat işini dayandırmışdı. Paşa briqadaya yan alanda, gödək, yoğun bir oğlanın, ruhdan düşmüş dostlarına üz tutaraq dediyi bu sözləri eşitdi:

– Ay uşaqlar, biabır olduq. Daha deməyəcəklər ki, gülək vışkanı uçurdu, deyəcəklər bizi uçurdu. İki saatdan sonra onu dikəltməsək, bütün ömrümüz boyu bu ləkə bizim üstümüzdə qalacaq.

Paşa tək əlilə papağından yapışıb, yıxılmamaq üçün küləyə arxasını çevirdi və dalı-dalı addımlayaraq gödək, yoğun oğlanın sözünə qüvvət verdi:

– Düz deyir, uşaqlar, beş-on gündən sonra bu tufan hamının yadından çıxacaq, amma vışka əhvalatını unutmayacaqlar.

Hamı Paşanın üzünə ümidsiz bir nəzərlə baxırdı. Yoğun oğlan yoldaşlarına müraciətlə, döyüşçüləri hücuma aparmaq istəyən komandir kimi, əlini yuxarı qaldırdı:

– Gəlin! – deyə bağırdı. – Namus, qeyrət dəmidir, uşaqlar!

Briqada hərəkətə gəldi. Traktorun motoru guruldadı. Paşa özü də onların vışkanı dikəldə biləcəklərinə inanmırdı. Adamlar yıxılmayıb ayaq üstündə durmağı bacarsaydılar, bu özü balaca hünər deyildi.

Paşa gödək oğlanın hamıdan çox əl-ayağa düşdüyünü, quyudan altı-yeddi addım uzağa yıxılmış vışkaya cəld bir hərəkətlə dəmir kən-

dir bağladığını və həmin kəndirin o biri ucunu traktorun dalına calaşdırdığını görəndə, böyründəki fəhlədən soruşdu:

– Bu qoçağın adı nədir?

Uğuldayan külək fəhlənin səsini eşitməyə qoymadı.

– Nə, nə? – deyə Paşa əlini qulağının dalına tutaraq bir də soruşdu:

– Səməndər, Səməndər!

Paşa buruqların arasilə yeriyərək, səldirləyə-səldirləyə asfalt yolun aşağı tərəfinə keçib, əlli-altmış addım gedəndən sonra, ağ rənglə suvanmış bir mərtəbəli uzun binanın qarşısında dayandı. Burada, Qüdrətin trestinə baxan ikinci mədənin idarəsi yerləşirdi. Paşa içəri girib, çoxdan tanıdığı müdirlə salamlaşdı, gördüyü əhvalatı ona danışıb, yeraltı təmir briqadasına kömək yollamağı xahiş elədi. Müdir ümidsiz halda əlini tovladı:

– O buruğu diriltmək, ölü adamı diriltməkdən çətindir, – dedi.

– Hər halda kömək yollasanız pis olmaz, – deyə Paşa israr elədi.

– Kimi yollayım, yoldaş İsgəndərzadə? Bu saat hamı məşğuldur. Bir də, axı o buruq bizim trestə baxmır. Bu saat hər kəs öz hayındadır. – Mədən müdiri dəmir kassanın qulpundan asdığı əzik-üzük şapkasını götürdü və Paşadan üzr istəyib sürətlə çıxdı. Qapı dalından onun acıqlı səsi eşidildi:

– Bu saat qayıt uçastokuna. Belə sözləri dinləməyə vaxtım yoxdur!

Paşa onun kimlə danışdığını bilmək üçün, qapını azacıq aralayıb baxdı. Dəhlizdə, çiynini çəkən Dadaşlını gördü. Mədən müdiri onun böyründən güllə kimi sürətlə eşiyə atıldı.

– Canım, bizim bu müdirə nə olub, başını nə yaman itirib? – deyə Dadaşlı öz-özünə deyinərkən, gözü Paşaya sataşdı. – Yoldaş İsgəndərzadə, xoş gəlmisiniz, izin verin, sizi təbrik edim. Deməli, bundan sonra daha bizə mühazirə oxumayacaqsınız?

Paşa Dadaşlıya əl verdi:

– Niyə oxumuram? Mən yenə təbliğat işlərilə məşğul olacağam, – dedi. – Bəs sən niyə öz uçastokunda deyilsən?

– Çünki belə tufanlar mənim halıma təfavüt eləmir. Bütün buruqlarım normal qaydada işləyir. Hələ külək başlayalı planı on faiz də artıq ödəyirəm. Yoxsa müdir mənim atamı dalıma sarımamış əl çəkməzdi... Doğrusu, başıma bir fikir gəlib, dünəndən bəri mənə rahatlıq vermir. İstəyirdim onu müdirə deyəm.

– Nə fikir?

– Ayaqüstü danışmaq istəmirəm. Əgər vaxtınız varsa, on-on beş dəqiqə ömrünüzdən mənə bağışlayın.

– Buyurun.

Onlar müdirin kabinetinə girdilər. Paşa dalınca qapını bərk örtdü.

– Yoxsa şikayətdir?

– Xeyr, xeyr. Mənim şikayətlə aram yoxdur. Sözüm olanda hamısını iclasda deyib ürəyimi boşaldıram. Xeyirli bir təklifim var. Onu deməyə gəlmişdim.

– Gəl otur görüm. Axı bu işlərdən mənim də bir az başım çıxır.

– Bu daha yaxşı. Təklifim xoşunuza gəlsə, mənə kömək edərsiniz.

– Buyur, buyur.

Paşa müdirin yerində oturdu. Dadaşlı yaylıqla üz-gözünün tozunu silib, Paşanın yanında divara söykəndi.

– Hə, yaxşı yadıma düşdü. Bir qədər səbir elə, – deyə Paşa Laləyə zəng elədi: – Əvvəla salam, Lalə xanım. Çox sağ olun, çox razıyam. Yeni vəzifəm mənə düşmədi. Buralara ayaq basanda, sizin trestdə yıxılan bir vışkaya rast gəldim. Xəbəriniz var? O briqadaya kömək eləmək olmaz? Hımm... Siz eləmi güman edirsiniz? Amma mən orada Səməndər adlı bir oğlan gördüm, hamısı elə olsa, siz deyəndir, doğrudan da dikəldəcəklər. Yaxşı, gözləyək, – Paşa dəstəyi yerinə qoyub Dadaşlıdan soruşdu: – Onları tanıyırsan?

– Bəli, hamısı bizim komsomolçulardır. Amma çətin ağlım kəsir o buruqdan bir şey çıxa. Bütün avadanlığı korlanıb

Aralığa sükut çökdü. Eşikdən küləyin yalquzaq kimi ulayan səsi gəldi.

– Hə, indi danış görüm, – deyə Paşa, müsahibini oturmağa dəvət elədi.

– Belədir, yoldaş İsgəndərzadə, – deyə Dadaşlı düz onun qabağında oturdu. – Özünüz bilirsiniz ki, mən neftçıxarma ustasıyam. Briqadamda iyirmi bir nəfər adam işləyir. Hamımız otuz quyuya cavabdehik. Bu yaxınlarda mənim briqadama iki buruq da verilib. Onları də əsaslı təmir eləyib işə salmışıq. Amma bu buruqlar təmirdən qabaq nə qədər neft verirdirsə, indi də bir o qədər verir. Deməli, bu təmiratın nə xeyri oldu?

Paşa Dadaşlının sözünü kəsdi:

– Necə məgər? Xeyri o oldu ki, quyular uzun müddət normal işləyəcək, sıradan çıxmayacaq.

– Xeyr, bu azdır. Təmirat gərək məhsulun qədərini də artırsın.

– Məsələn, necə?

– Mən bizə yeni verilən bu iki buruğun tərcümeyi-halını ətraflı öyrənmişəm və bu qərara gəlmişəm ki, onların hərəsi yeddi ton yox, bəlkə on, on beş ton verə bilər. Bəs niyə az verir? Çünki təmirat yaxşı aparılmayıb. Əsaslı təmir briqadası işini başdansovma görüb, məsuliyyətsizliyə yol verib. Belə getsə, həmişə də belə olacaq, çünki o, məhsulun qədərinə də, keyfiyyətinə də cavab vermir.

Paşa, Dadaşlının dərin bir inamla dediyi bu sözlərdən sonra daha çox maraqlanmağa başladı və tələsik xəbər aldı:

– Yaxşı, bəs sən nə təklif edirsən?

– Mən? Təklif edirəm ki, hər iki briqada, həm təmir, həmdə neftçıxarma briqadası əvvəldən-axıra kimi hər bir quyunun vəziyyətinə cavabdeh olsun. Bunun üçün nə lazımdır? Mən bu qərara gəlmişəm ki, gərək kompleks briqada düzəlsin.

Paşa onun fikrini aydın başa düşmədi:

– Bu nə deməkdir?

– Yəni təmir briqadası ilə neftçıxarma briqadası birləşdirilsin, bir adamın ixtiyarına verilsin. Daha onda təmiratçılar işlərini qurtarıb, məsuliyyətdən yaxalarını kənara çəkə bilməzlər. Onlar da mənimlə bərabər hər şeyə can yandırarlar. – Dadaşlı, təklifinin Paşaya müsbət bir təsir bağışladığını hiss edib, yenə eyni hərarətlə sözünü tamamladı: – Elə düşünməyin ki, mən burada ixtiyar sahibi olmağa can atıram. Xeyr. Mən görürəm ki, dövlətimizə külli miqdarda ziyan dəyir. Fəhlələrin qiymətli əməyi lazım olan səmərəni vermir.

– Yaxşı, belə çıxır ki, təmirçilər vicdansızlıq eləyirlər?

– Xeyr, mən elə demirəm. Mən deyirəm ki, harada məsuliyyət hissi olmasa, orada işin keyfiyyəti həmişə pis olacaq. İnsanların hamısı qanunun tələbinə uyğun hərəkət eləsəydi, onda biz məhkəməni də, cəza məcəlləsini də çoxdan ləğv eləməli idik. Ruslar demişkən, belələrini manatla döymək lazımdır. Yəni onlar gördükləri işin keyfiyyətinə görə də pul almalıdırlar. İndiki halda onların cibinə zərər dəymir. Amma kompleks briqada olsa, zərər dəyəcək və bu da məsuliyyət hissini artıracaq. Bundan başqa, neft ustası istədiyi vaxt quyunu təmir etdirəcək. Daha əli qoynunda dayanıb yeraltı təmirçiləri gözləməyəcək. Deməli, mənim fikrimcə külli miqdarda vaxt qazanılacaq.

Dadaşlı ağıla batan sözlər deyirdi.

– Yəni bu cür olsa, məhsulun qədəri artar, hə?

– Bəs necə, yoldaş İsgəndərzadə?! Ona mənim heç şübhəm yoxdur. Qoyun nümunə üçün əvvəlcə mənim briqadamdan başlasınlar. Nəticəsini yoxlasınlar. Mən inanıram ki, bu yolla bir çox "ölü" quyuları da dirildib işə salacağıq. Deyirlər ki, ölməsinə səbəb guya neftin yoxluğudur. Xeyr, bu doğru fikir deyil. Çox vaxt diqqətsiz təmirat nəticəsində yaxşı quyular da korlanıb gedir. Axı doktor var ki, naxoşu diqqətlə müalicə eləyir, doktor var ki, heç nəyi vecinə almır, xəstə öləndə də min dənə bəhanə gətirir. Biz nə üçün pis doktorların yolu ilə gedək? Nə üçün həm dövlətə, həm də bizə ziyan dəysin?

Paşa bu gənc ustaya artıq fəxrlə baxırdı. O, açıq-aydın hiss edirdi ki, Dadaşlının hər bir sözü, dəfələrlə yoxlanılmış, uzun haqq-hesabdan sonra əldə olunmuş bir fikrin nəticəsidir.

– Çox gözəl, yoldaş Dadaşlı, mən bu məsələni trestdə qaldıraram. Gəlib orada da danışarsan. Əgər mənim rəyimi bilmək istəyirsənsə, mən bu barədə sənin dediklərinə tamamilə şərikəm. Ümidvaram ki, sənin ideyan tez bir zamanda bütün neftçilər arasında yayılacaq.

Sevincindən Dadaşlının gözləri par-par parıldayırdı:

– Çox sağ olun, yoldaş İsgəndərzadə – deyə o, ayağa qalxdı. – Mən daha ürəyimi boşaltdım. İndi gedim quyulara baş çəkim. Hələlik! – O, Paşaya əl verdi. – Əgər mənim təklifim keçsə, birinci sizə təşəkkür eləyəcəyəm.

Paşa ayağa qalxdı. Dadaşlını gözlərilə ötürüb, Qüdrətə zəng elədi. "Bu saat gəlirəm" deyib eşiyə çıxdı. yenə də eyni qüvvətlə külək əsir, onu yeriməyə qoymurdu. Mədənlərin üzərini qatı toz dumanları bürümüşdü. Qaralan buludlar havanı çulğalamışdı. Hər tərəfdə qışın soyuq nəfəsi duyulurdu.

Paşa güc-bəla ilə yeriyib maşınına mindi və Qüdrətin trestinə yola düşdü.

Bu zaman o, qayıqları dənizə yola salıb qayıtmışdı. Paşanı gülər üzlə qarşıladı:

– Yeni vəzifəni təbrik edirəm, – dedi.

Yol uzunu Dadaşlının təklifi haqqında düşünmüş Paşa, indi divanda oturub papiros çəkə-çəkə Qüdrətlə söhbət edir, amma yenə də cavan ustanın dediklərini unuda bilmirdi: "O danışdıqca, elə bil gözlərindən od tökülürdü. Ona mütləq kömək eləmək lazımdır!" deyə düşünürdü.

– Qüdrət, sənin trestində Dadaşlı adlı cavan bir neft ustası var.

– Hə, hə, komsomol təşkilatçısıdır. Tanıyıram. Yaxşı oğlandır. Necə məgər? İkinci mədən hələlik onun hesabına yaşayır. Nə olub ki?

Paşa, Dadaşlının dediklərini qısaca təkrar edib, öz tərəfindən də onun təklifini bir xeyli təriflədi:

– Məncə, çox ağıllı, çox səmərəli təklifdir, – dedi, – sən onu mütləq müdafiə eləməlisən.

Qüdrət yazı cihazının böyründəki kalendara nə isə yazdı.

– Doğrudan da çox ağıllı fikirdir. Ondan belə şeyləri gözləmək olar, – dedi. – Sən bilirsənmi, ümumiyyətlə bizim bu fəhlə sinfində nə qədər zəngin bir fikir xəzinəsi var! – Qüdrət qürurunu gizlətməyib, mənalı-mənalı Paşanın üzünə baxdı. – Ən sadə bir fəhləni də yoxlasan, görərsən ki, hər şeyə bizdən dərin baxmağı bacarır. Mən özüm Dadaşlını yanıma çağırıb ətraflı danışaram. – Qüdrət ayağa qalxdı, bir az əvvəl yola saldığı qayıqları xatırlayıb, düşüncəli bir görkəm aldı. – Hamısı belədir. Əgər pisi varsa, bil ki, buraya təsadüfi gəlib düşüb.

Paşa yarı ciddi, yarı zarafat dedi:

– Amma, Qüdrət, bir fikrinə şərik deyiləm ha...

– Hansı fikrimə?

– Sən deyirsən ki, fəhlə sinfi bizdən dərin düşünməyi bacarır. Məgər fəhlə ayrı, biz ayrıyıq? Bəs biz özümüz kimik? Şəxsən mən fəhlə balası olmağımla fəxr edirəm. Hara getsəm, nə vəzifədə olsam, mənən ondan heç zaman ayrılmayacağam. Əlbəttə biz bütün xalqımızın oğluyuq. Xalqımız doğrudan da böyük və nəcib xalqdır. Amma mən fəhlə sinfini ölkəmizin fəxri sayıram. Bu sinif inqilabın da, quruculuğun da, müharibənin də ən böyük ağırlığını öz qadir çiyinlərində daşıdı. Nə üçün mən bunlarla fəxr etməyim hə?

Qüdrət sadə və səmimi bir təbəssümlə güldü:

– Bəs mən kiməm? Yoxsa mən bu sinifdən deyiləm? Mən o sözləri deyəndə ayrı şeyi nəzərdə tuturdum. Yəqin ki, istehsalatın taleyini bilavasitə həll edən bu adamlar, həyat və təbiətə də, öz işlərinə də çox dürüst baxmağı bacarırlar. Belə insanlara arxalanan bir dövlət hansı çətinliyə duruş gətirə bilməz? Fəhlə sinfinin gücü yalnız qollarında deyil, həm də mənəvi zənginliyindədir.

– Qüdrət, – deyə Paşa telefon aparatını göstərdi: – Laləyə zəng elə görək o vışka əhvalatı nə oldu?

Bu hadisədən Qüdrətin də xəbəri vardı. Lalədən soruşdu. Ərlə arvadın söhbətini dinləyəndə, Paşa nəfəsini belə çəkmirdi. Elə bil onun taleyi cavabın müsbət və ya mənfi olacağından asılı idi.

– Dikəltdilər? Nə danışırsan? Bu tezlikdə?

Paşa kəsik-kəsik gülür, balaca uşaq kimi sevinirdi. O, ayağa qalxaraq:

– Əhsən, əhsən! – deyə sərt bir qol hərəkətilə havanı yardı. – Sən haqlısan, Qüdrət. Doğrusu, mən inanmırdım ki, o vışkanı bu küləkdə, özü də o uşaqlar dikəldə bilsinlər. Deməli, mənimlə fəhlə arasında müəyyən bir fərq varmış. Mən getdim. Burada mənim təbliğatıma ehtiyac yoxdur, hələlik!

O, Qüdrətə əl verib çıxdı. Qapı ağzında trest müdirinin katibəsi göründü:

– Yoldaş İsmayılzadə, – dedi, – qızcığazınız Şirmayı zəng eləmişdi. Yadınızdan çıxmasın, bu gün onun konsertidir.

Qüdrət, hərəkətsiz dayanıb, hara isə, məchul bir nöqtəyə baxırdı:

– Görəsən qayıqlar sağ-salamat gedib çata bildilərmi?

Qayıqların buruqlara sağ-salamat çatdığını biləndən sonra, Qüdrət kefi kökəlmiş halda evinə yola düşdü. Lakin Şirmayı artıq evdə deyildi. Lalə ilə Sədəf onu çoxdan konsertə aparmışdılar.

Vaxta yalnız on dəqiqə qalırdı. Tükəzban qarı oğlunun həyəcanlandığını görüb səbəbini soruşduqda, Qüdrət ata qürurunu gizlətmədi:

– Mən ondan ötrü gəlmişdim. Deyəsən gözləməkdən yorulub axırda gediblər.

– Ay oğul, – Tükəzban da oğlunun sevincinə şərik oldu, – gərək özün burda olaydın, görəydin özünə nə bəzək-düzək verirdi. Elə gözü qapıda idi. “Atam gəlmədi” deyib dururdu. Sən də gedəcəksənmi?

– Gedim, ana can, gedim, axı onlar məni gözləyəcəklər... – Qüdrət xörəyini ayaqüstü yeyib çıxdı. Filarmoniya binasına çatanda, konsertin başlandığını söylədilər. Qapıda durmuş ağ saçlı qadın, nəzakətlə onun qabağını kəsdi:

– Yalnız balkondan baxa bilərsiniz, – dedi.

– Eybi yoxdur, eybi yoxdur, – deyə Qüdrət qadının göstərdiyi pilləkənlə ikinci mərtəbəyə qalxdı.

Konsert başlanmışdı. Səhnədə Şirmayı yaşında bir oğlan uşağı kaman çalırdı. Qüdrət gah ona, gah da salona baxırdı, Laləni axtarırdı. Buraya toplaşanların çoxusu analar və atalardı. Salonda yer tapmayıb ayaq üstündə durmuş adamların sayı-hesabı yox idi. Hamı sükuta dalıb balaca oğlanın çaldığı havanı dinləyirdi.

Qüdrət də ayaq üstündə dinləyirdi. Bəlkə də onu yanındakı boş yerdə oturmağa qoymayan balaca ustanın məharəti idi? Yox, bu Qüdrət üçün gözlənilməz bir şey deyildi. İndi onu həyəcana gətirən və beləcə ayaq üstündə dayanıb dinləməyə məcbur edən daha böyük, daha ülvi bir hiss idi: "Balaca uşaqların taleyini bütün xalq düşünür!" – Qüdrət öz yetimliyini xatırladı, yoxsulluq və ehtiyac içində keçən məşəqqətli həyatını gözləri önündən keçirdi. Atasının, özünün və yoldaşlarının nahaq yerə zəhmət çəkmədiyini indi daha böyük bir qüvvətlə duyub, həyəcanının çoxluğundan qəhərlənən kimi də oldu. Elə bil o buraya Şirmayı üçün yox, məhz bu həqiqəti bir daha duymaq üçün gəlmişdi.

Oğlan uşağı çalıb qurtaranda, salondan qopan alqış səsləri dənizdəki tufanı xatırladırdı. Sonra səhnədə həmin oğlanı bir qız, qızı da başqa bir oğlan əvəz elədi. Onların hansının daha yaxşı çaldığını söyləmək çətin idi: hamısı gözəl çalırdı! Xüsusən qızın ağ dillər üzərində sürətlə gəzən barmaqlarında nə qədər fövqəladə bir güc vardı!

Konferansye yenə səhnədə göründü. Şirmayının adını çəkdi. Qüdrətin ürəyi qeyri-adi bir həyəcanla çırpındı. İxtiyarsız olaraq bir addım irəli gəldi.

– Royalda Şopenin etüdü! – deyə konferansye qadın əlavə edib səhnədən çəkildi.

Bu dəmdə yeni açılmış çəhrayı gülü xatırladan Şirmayı səhnəyə çıxdı. O gələ-gələ gözlərilə kimi isə axtarırdı. Qüdrət də onun baxdığı səmtə gözünü zillədi. Lalə ilk cərgədə Sədəflə yanaşı oturmuşdu. Yanlarında boş kürsü vardı: "Mənim üçün saxlayıblar" – deyə Qüdrət gec gəldiyinə təəssüf elədi. Qızının kimi axtardığını o indi yaxşı bilirdi: "Mən buradayam qızım!" deyə ucadan səslənmək istəyirdi.

Şirmayı royala yanaşdı. Kresloya oturdu. Onun ayaqları yerə çatmırdı. Qüdrətin yeni aldığı qısa dabanlı tuflini geymişdi. Onun barmaqları dillər üzərində gəzməyə başlayanda, salon yenə sükuta daldı.

Şirmayı inam və məhəbbətlə çalırdı. Dinləyənlərin üzündə səmimi və sadə bir təbəssüm vardı. Analar və atalar hər bir uşağın məharətinə sevinirdilər.

Qüdrət özü də heyrət içində donmuşdu. İlk dəfə idi ki, Şirmayının çalmasına belə diqqətlə qulaq asırdı: "Afərin, qızım!" deyə dodaqaltında onu tərifləyirdi.

– Bu qız sizindirmi? – deyə yan tərəfdən bir qadın soruşdu.

Qüdrət dönüb baxdı. Qadını tanımadı. Balkonda da boş yer qalmamışdı.

– Bax, bu qızdan gözəl pianoçu çıxacaq! – deyə həmin qadın, yanında durmuş başqa bir qadına baxdı. – Mən onu məmnuniyyətlə öz sinfimə götürərəm!

Qüdrət qadından soruşdu:

– Yaxşıdır, hə?

– Bəli, bəli, – deyə qadın heyranlıq əlaməti olaraq başını qaldırıb saldı. Qüdrət qadını yalnız indi tanıdı: məşhur musiqi müəlliməsi Şeyda xanım idi.

Şirmayı son akkordları vurub ayağa qalxdı və yüyürə-yüyürə səhnəni tərk elədi. Salondakılardan heç bir səs çıxmadı. Şirmayıya əl çalan yox idi. Qüdrətin alnını soyuq tər basdı. O, dinləyənlərə baxdı. Sükut davam edirdi.

Birdən sürəkli alqışlar qopdu. İndiyə qədər çalan uşaqlardan birini də bu qədər çox alqışlamamışdılar. “Bis, bis!” deyə qışqırırdılar.

Qüdrət yaylığı ilə alnının tərini sildi...

**8**

Bu zaman dənizdə tufan daha da şiddətlənmişdi. Hər tərəf zülmət içində idi. Əgər sahil boyunda Bakının xəfif və bozumtul bir dumana bürünmüş sayrışan işıqları görünməsəydi, Tahir də, briqada üzvləri də dünyanın sonu yaxınlaşdığını güman edərdilər. Bütün qurğu yerindən sarsılıb uçmaq dərəcəsinə gəlir, mexanizmlərin səsi tufanın qorxunc uğultusuna qarışırdı. Lakin qazıma işi eyni sürətlə davam edir, proyekt dərinliyinə yetişmələrinə çox az qalırdı.

Usta Ramazanın bütün varlığı elə bil diqqətdən yoğrulmuşdu. Fəhlələr də bunugörüb, bir dəqiqə belə öz postlarından ayrılmır, hər bir anın əhəmiyyətini hiss edirdilər. Gözlər bir nöqtəyə dikilmiş, əsəblər isə bərk köklənən sim kimi gərginləşmişdi.

Rotorun hərəkətini, dirillometrin əqrəbini Ramazan özü izləyir, boş təbəqələrə rast gəldikcə, balta üzərinə düşən təzyiqi çoxaldıb, qazıma sürətini artırırdı. O, yoldaşlarını nahaq yerə həyəcanlandırmamaq üçün zahiri təmkinini hifz edərək, eyni sakit və arxayın ədasilə əmrlər verir, yaxşı cərəyan edən gil məhlulundan ovcuna götürüb baxır, qoxulayırdı.

– Çox gözəl, çox gözəl, – deyə sanki yoldaşlarına deyil, hamıdan çox özünə təsəlli verirdi.

Birdən ildırım qüvvətilə buruğa çarpılaraq uğuldayan küləklə qarışıq hamıdan ah-uf səsləri ucaldı. Buruğun işıqları sönmüş, hər tərəf qaranlığa batmışdı.

– Bu nə qalmaqaldır, uşaq deyilsiniz ki? – deyə Ramazan səsləndi.

Rotorun hərəkəti yenə kəsilməmişdi, adətən işıq verən elektrik xətti ilə, mexanizmlərə enerji verən xətlərin ayrı olduğunu çoxdan öyrənmiş Tahir, bir anlığa özünü itirdi və bildiyi bu sadə şeyi unudub, qaranlıqda, gözlərilə usta Ramazanı axtardı.

Qoca usta dinmirdi. O, yalnız bir neçə anlıq sükutdan sonra:

– Bala, Qrişa, – deyə çağırdı: – tez mənim əl fənərimi gətir!

Həyəcandan ürəyi bərk-bərk döyünən Tahir isə qocanın sifətini görmür, hələ də özünə gələ bilmirdi.

– Bu da korlanmağa vaxt tapdı. Belə çovğunda briqada gələsi, bunudüzəldəsi...

Tahir Heydərdən eşitdiyi bu sözlərdən sonra fikrini topladı. “Mən niyə durmuşam?” deyə öz-özündən soruşdu. Axşamlar Lətifəni evlərinə ötürəndə, ehtiyac hiss edib aldığı cib fənəri yadına düşdü. O, əllərini qabağa sarı uzadaraq, yavaş və ehtiyatlı addımlarla, həmişə sazını asdığı dirəyə yanaşdı, brezent plaşının cibindən fənəri çıxarıb yandırdı.

– Usta, – dedi, – izin ver axtarım, xarab olmuş yeri tapım.

O, “tapım və düzəldim” demək istəyirdi, ancaq bu kəlmələri dilinə gətirməkdən qorxdu. Çünki bir həftə bundan əvvəl elektromontyorlar dərnəyinin məşğələsindən ümumi yaşayış evinə gələndə, öz biliyini təcrübədə sınamaq üçün dəhlizə qoyulmuş hesablayıcı maşını qurdalarkən, kontakt eləyib, az qala yanğın törətmişdi. Bunu görən yoldaşları hər yandan qışqıraraq:

– Tahir, dəlləkliyi bizim başımızda öyrənmə, – deyib, ucadan qaqqıltı ilə gülüşmüşdülər.

O, indi də bu vəziyyətə düşməmək üçün əvvəldən ustaya vəd vermədi, fənərinin dairəvi işığını onun üzərində dayandıraraq, cavab gözlədi. Usta Ramazan isə dinmirdi. Onun bütün diqqəti quyuda idi. Qrişa əl fənərini gətirib ona verəndə də, o, Tahirə baxmadı, deyəsən şagirdinin necə səbirsizliklə gözlədiyini hiss etmirdi.

Qoca usta zahirdə çox sakit idisə də, ürəyindən qara qanlar gedirdi. Belə qorxulu anlarda kiçik qəzalardan başlamış, ən böyük fəlakətlərə qədər hər şey ola bilərdi. O, təbiətin kor qüvvələrilə vuruşmada rast gəldiyi çətinlikləri, bəzən də baş verən qəza nəticəsində iki-üç

aylıq əməyinin puça çıxdığını unutmamışdı. İndi də sadəcə bir səhv nəticəsində belə bir hal yenə təkrar oluna bilərdi. Odur ki, qoca hamıdan dəmir bir intizam tələb edir, hər şeyi yüz dəfə ölçəndən sonra bir dəfə biçirdi.

Tahir, səbri tükənmiş kimi, birdən soruşdu.

– Axtarımmı, usta?

– Tək yox, bala, uşaqlarla axtar, – deyə Ramazan gözlərini quyudan çəkməyərək cavab verdi.

Tahir Cəmilin qolundan yapışıb özünə tərəf dartdı.

– Gedək!

Onlar qaranlıqda gözdən itdilər.

Tahir boynuna necə qorxulu vəzifə götürdüyünü çox gözəl anlayırdı. O, dəniz buruğuna işıq verən məftilləri oğrun-oğrun da olsa gözdən keçirmiş, onların haradan başlanıb harada qurtardığını, necə əyri-üyrü yollardan keçib-gəldiyini görmüşdü. Kim bilir, bəlkə də xətt haradansa, suyun içində korlanmış və o xarab olan yeri nəinki onun kimi naşi bir oğlan, hətta avariya briqadalarının ən təcrübəli başçıları da tapıb düzəldə bilməyəcəklər? O:

– Cəmil, – dedi, – sən bilən haradan korlanmış olar?

Cəmil istehza ilə cavab verdi:

– Elektromontyor sənsən, mən deyiləm.

– Mənə lağ eləmə, ən çətini oranı tapmaqdır. Gör düzəldərəm, ya yox. Gərək əvvəlcə yoxlayaq görək mərkəzdən kəsilməyib ki?.. Haradan yoxlamağa başlayaq? – O, Cəmildən cavab almamış, pilləkənlə yuxarı dırmandı. Tahir ilk dəfə buruğa gələndə usta onu imtahan eləmək üçün həmin pilləkənlə buruğun qülləsinə çıxarmışdı. Tahir artıq o günü xatırlamırdı. Belə tufanlara sinə gərmiş bir yerdən keçib-getmək indi onu zərrə qədər də qorxutmurdu.

O, gedə-gedə Cəmilin səsini eşitdi:

– Məftil suyun içində korlanıbsa, heç. Ora düşməyə təhərim yoxdur. Bu soyuqda sətəlcəm olaram.

Külək müdhiş bir səslə vıyıldadı. Tahir şapkasını aşağı basdı, qulağının üstünə endirdi. Fənəri yuxarı qaldırıb havada yellənən məftilləri diqqətlə gözdən keçirdi.

– Buralar sağ-salamatdır, – dedi və yenə yuxarı dırmandı.

Cəmil onun dalınca gəlir, o da Tahirin fənərlə işıqlandırdığı nöqtələrə baxırdı.

– Buralar da salamatdır, – deyə Cəmil Tahirlə nəfəs-nəfəsə dayandı. – Qayıdaq. Bizim əlimizdən gələn iş deyil.

– Qayıdaq, – deyə Tahir geri dönmək istəyirdi ki, zəhmlə əsən külək onu itələyib pilləkənin ağac məhəccərinə çırpdı. – Bu tufandan qan iyi gəlir aşna. Buradan sağ-salamat çıxsaq yüz yaşarıq.

Onlar yenə aşağı endilər. Buruğun yanında fənər işıqları qaranlıq havanın qoynunda səkir, o biri fəhlələr də elektrik xəttinin korlandığı yeri axtarırdılar.

– Buradadır, buradadır! – deyə Qrişa ucadan qışqırdı. – Yoldaş mantyor gəl, öz bacarığına göstər, – deyə o, Tahiri səslədi.

Doğrudan da çətin ağıla gələn bir yerdə, sudan bir metr hündürdə xətt qırılmış, məftilin bir ucu havada yellənirdi. Tahir cəld rubilniki açıb, toku kəsdi, brezent plaşının cibindən bir parça məftil götürdü, yanındakı cavanlara döndü.

– Kəndir gətirin! – dedi və fənərini belindən açdığı nazik kəmərinə bağlayıb boynundan aşağı salladı.

Bu anda Heydər kəndir tapıb gətirdi. Tahir özü onu belinə bağladı.

– İndi, bu kəndirdən bərk yapışın, məni bərk tutun, yıxılıb suya düşsəm boğulmağa qoymayın, yuxarı çəkin. Yaxşımı? – O yenə cavab almamış, ayağını ehtiyatla taxtaların kəsiyinə dayaya-dayaya aşağı endi və məftil qırılan yerə çatanda, bir əlilə taxtadan yapışıb, o biri əli ilə cibindəki məftili çıxardı, fənərlə qırıq məftili tapıb dişinin arasına aldı, cib bıçağı ilə onun bir tərəfini qazıyıb əlindəki məftilə caladı.

– Qrişa, – deyə yoldaşını çağırdı, – izolyator tap gətir, o da olmasa, hələlik bir parça cındır ver.

O ayağının altını bir də yoxlayaraq, xəttin birini calayıb qurtardı. İzolyator əvəzinə bir əli və dişilə yaylığını cırıb məftilin açıq yerini sarıdı. Onun necə sürətlə işlədiyini görmək olmurdu. Fənər işığı tez-tez yerini dəyişir, Tahir isə yalnız sövq təbii gücünə o biri məftili sürtüb calaşdırırdı.

– Tahir, Tahir, – deyə bu anda Qrişa səsləndi. – İzolyator yoxdur, brezent parçası var, ala!

– Ondan özümdə də var. Lazım deyil! – deyə Tahir məftilin o birini də calaşdırdı, və ucadan səsləndi: – Rubilniki basın görüm!..

Bu anda işıqlar elə bil əvvəlkindən on dəfə qüvvətlə yandı. Cavanlar atılıb-düşdülər və təzə montyorun məharətinə əl vurdular.

Tahir quyuya tərəf gələndə, onun alnından axan soyuq tər damcılarını görənlər elektrik xəttini nə qədər gərgin bir vəziyyətdə düzəlt-

diyini anlayıb brezent plaşını çiyninə saldılar. Tahir sustalmış kimi yanı üstə uzanıb dincini almağa başladı.

– Deyirdim axı. Zənnimdə yanılmamışam, – deyə qoca usta Vasilyevə baxıb fəxrlə başını tərpətdi...

**9**

O günün səhərisi külək birdən-birə zəifləməyə başlayıb, günortaya yaxın xırp kəsildi. Lakin dəniz hələ də təlatümdə idi. Axşama yaxın onun da hirsi soyudu.

Usta Ramazanın briqadası proekt dərinliyinə çatıb işi dayandırdı. "Çapayev" qayığı bu günün qəzetlərini gətirdi. Hamını tufan günlərində neft istehsalı və qazıma işlərinin gedişi maraqlandırırdı. Qəzetlərin birinci səhifəsində çap olunmuş və neft sahəsində işləməyənlərin nəzərini o qədər də cəlb eləməyən məlumatı, usta Ramazanla dostları hər bir xəbərdən tez oxudular. İllik planın səviyyəsinə qalxmamış bircə trestdən başqa hamı vuruşdan qalib çıxmışdı.

İndi briqadanı düşündürən bir məsələ idi: yeni buruğu harada qazacaqlar?

Sergey Timofeyeviç Vasilyev əlilə Nargin adasının bərabərini, buruqdan dörd-beş kilometr uzağı göstərdi: – Ramazan İsgəndəroviç, – dedi, – orada bizim ustalardan kim isə buruq qoyur!

Doğrudan da, briqada üzvləri dənizdə ucalan təzə vışkanı görüb təəccüblə baxdılar.

– Olmazmı biz təzə buruğu ondan da bir az irəlidə qoyaq, hə?

Ramazan başını buladı:

– Yox, Sergey Timofeyeviç, neftçinin hünəri təkcə dəniz üstündən getdiyi yolun uzunluğu ilə yox, bir də qazdığı quyunun dərinliyi ilə ölçülür. Mən hələlik buradan başqa yerə köçmək fikrində deyiləm.

Ustanın müavini qoca dostunun fikrini əvvəlcə başa düşmədi.

– Axı biz burada işimizi qurtarmışıq. Yeni buruq qazacağıq, ya yox?

Usta Ramazan bu barədə çoxdan düşünmüşdü:

– Əlbəttə qazacağıq. Amma, bax, burda! – O, şəhadət barmağını aşağıya tərəf şaquli tutaraq, öz quyularının özülünü göstərdi: – Semyorn Vladimiroviç Volkovu tanıyırsanmı?

– Bəli, tanıyıram. Maili qazıma üsulunu icad eləyəni demirsinizmi?

– Bəli, onu deyirəm. Bax, bax, bu günkü qəzetdə yazıblar ki, o buruğunu qurtarıb, işə buraxıb. Deməli, o, evlərin altından neft çıxarır.

Biz də onun üsulilə bax burada bir yox, üç-dörd buruq qazacağıq. Usta Volkov maili qazıma üsulunu tapmışsa, mən də kütdə üsulunu tapmışam. Deməli, biz bu qurğunun üstündə üç-dörd quyu qazacağıq, hərəsi də ayrı-ayrı yerlərdən neft verəcək. Başa düşdün?

Ustaların söhbətini dinləyən Cəmil də sözə qarışdı:

– Elə isə, biz sabahda-biri gündə təzə quyunu başlaya bilərik. Daha ondan ayrı vışka qurulmağını gözləməyə ehtiyac qalmır

– Elədir ki, var oğlum. Volkov dağın kəlləsində oturub şəhərin altından neft çıxaranda, biz də burada oturub Narginin neftini niyə çəkə bilmirik? Bu gün bu mümkün olmasa da, sabah olacaq, ya yox?

Tahir dinmirdisə də, bu söhbəti hədsiz maraq içində, udquna udquna dinləyirdi.

Sergey Timofeyeviç briqada üzvlərinin "Çapayev" qayığına tərəf getdiklərini görüb, brezent plaşını qoltuğuna vurdu və kənarda qurdalanan Heydərə döndü:

– Oğlum, – dedi, – camaata xəbər vermisənmi?

Heydərin başı sinəsinə endi. O, utana-utana dilləndi:

– Xeyr, Sergey Timofeyeviç, özünüz xəbər verin.

– Nəyi? – deyə usta Ramazan təəccüblə soruşdu.

Vasilyev bütün briqadaya üz tutdu:

– Bu gün hamınızı Heydərin toyuna dəvət edirəm! Şərtimiz bu idi ki, quyunu qazıb qurtaran günü olsun. Saat onda buyurun, gəlin.

Lətifə də sözə qarışdı:

– Kimi alır, kimi alır?

– Bilmirsən? – deyə Tahir qıza baxıb hiyləgərcəsinə gülümsədi. – Seygey Timofeyeviçlə qohum olur da.

Hamı yorğunluğunu unudub, sevinclə Heydərə baxırdı.

Ramazan isə mənalı-mənalı dostlarını süzərək deyirdi:

– Seygey Timofeyeviç köhnə dünyadan hayıf alır, uşaqlar. Bizim dostluğumuz qohumluğa keçir.

"Çapayev"in motoru guruldadı.

Hamı sürətlə qayığa doluşdu. O, hərəkətə gələndə Tahir sazını çıxardı və köhnə bir aşıq mahnısı oxudu:

Görüm, ay bəy, toyun mübarək olsun,
Sağdışına, solduşuna borc olsun!

Bütün briqadanın gözü Heydərə zillənmişdi. Yalnız Tahirlə, Lətifə bir-birinə baxırdı...

## 10

On gün sonra, Lalə öz kabinetində oturub dünənki işlərin yekununa dair məlumat cədvəlini gözdən keçirəndə, eşikdə qarmonda çalınan oyun havasını eşidib, ayağa qalxdı və pəncərəyə yanaşdı. Trestin həyətində böyük bir dəstə durub, ortada oynayan adama əl çalırdı.

– Bu nədir, günün günorta çağı nə konsertdir? – deyə Lalə, içəri girən baş mühəndisdən soruşdu.

– Aparmağa gəliblər?

– Nəyi?

– Axı onlar yarışda qalib çıxdılar!

İndi hər şey Laləyə aydın oldu: bu adamlar Dövlət Müdafiə Komitəsinin keçici bayrağını Qüdrətin trestinə aparmağa gəlmişdilər.

– Gərək onlar Ramazanın briqadasına təşəkkür eləsinlər! – deyə Lalə, baş mühəndisin üzünə baxmadı, qaşqabağını salladı.

– Siz Qüdrətə altı ay vaxt vermişdiniz. Ancaq görünür nəyi isə nəzərdən qaçırmısınız.

Lalə həyətdəki dəstənin ikinci mərtəbəyə qalxdığını görüb söhbətə ara verdi. Qapı açıldı. Əlində qarmon tutmuş Mişa, sazını qoltuğuna vurmuş Tahir hamıdan qabaqda gəlirdi. Dəstə nəfərlərinin çoxusu cavanlardı. Bayramlıların da hamısı burda idi.

Cəmil Tahirlə yanaşı durmuşdu.

– Salam, yoldaş İsmayılzadə! – deyə Mişa sözə başladı və Lalənin stolu arxasındakı divardan asılmış bayrağı göstərdi. – Yarışda qalib gəldiyimiz üçün, Mərkəzi Komitənin göstərişi ilə bu bayraq indi bizim trestə verilir!

Məmməd Bayramlı ucadan qışqırdı:

– U-u-u-r-ra!..

Hamı gülüşdü və ura səsləri kabineti titrətdi.

Lalə nə isə bir söz deməli, bu məğlubiyyətdən pərt olmadığını söyləməli idi:

– Biz sevinirik, yoldaşlar!.. – dedi və bir an duruxdu. – Sevinirik ki, bizim dostlarımız çətin vuruşmadan qalib çıxıb, belə bir şərəfə nail oldular. Lakin... – Lalə gülümsündü. – Lakin bu hələ işimizin başlanğıcıdır. Bizim trest də özü üçün nəticə çıxaracaq! – Lalə bayrağa yanaşdı, onu divardan götürüb, döşündə hərbi medallar parıldayan Məmməd Bayramlıya verdi. – İki cəbhənin qəhrəmanına verilsə yaxşıdır, – dedi.

Məmməd Bayramlı daha da ucadan qışqırdı:

– Biz söz veririk ki, bu bayraq həmişəlik bi-bizdə qalacaq!

Bu anda telefon zəngi cingildədi. Lalə dəstəyi götürdü:

– Mənəm!.. – dedi. – Sol əlini yanaqlarına çəkdi. Otaqdakı adamların hamısı kiridi.

Kiminsə, məhz bayraq haqqında danışdığını hamı aydın hiss edirdi. Lalə aralıqdakı həyəcanlı sükutu pozdu:

– Nə olar ki? Dava iki faizin üstündədir. Siz yüz iyirmi iki, bir yüz iyirmi... Bundan sonra canımıza cəfa basarıq, Qüdrət! – Lalə qızardı, – unutma ki, iki il saxlamışıq, bir ay da sizdə olsun görərik!..

Lalə dəstəyi yerindən asanda, qarmon səsləndi. Mişa qaytağı çaldı. Səməndəri xatırladı.

Bütün dəstə hərəkətə gəldi. Məmməd Bayramlı qabağa düşdü və hamı onun dalınca eşiyə çıxdı. Lalə gülə-gülə trestin baş mühəndisinə baxdı.

– Ramazanın buruğu gündə neçə ton verir?

– Beş yüzdən çox...

– Mən çox şadam, – deyə Lalə, narahat halda, qeyri-ixtiyari olaraq, stolun üstündəki kağız-kuğuzları araşdırdı. Ancaq o, birdən baş mühəndisə durğun bir nəzər saldı. – Bəs biz?

Müharibənin ən ağır günlərində neft istehsalını bir faiz də aşağı salmamış bu trest üçün, bayrağın əldən çıxması əlbəttə ağırdı.

– Hamını ayağa qaldırmaq lazımdır! Biz yəqin tuzlara ümid bağlamışıq, – deyə baş mühəndis Aslanovun tənqidini xatırladı, amma lalənin həyəcanını duyub bir daha dinmədi...

## 11

Qüdrətin maşını sahildə dayanmışdı. Özü tanış müxbirlə yanaşı durub, sakit-sakit ləpələnən dənizə baxırdı.

– Mən sizi çox gözlədim, – deyirdi, – indi Ramazan artıq poeziyadan prozaya keçmişdir. Yalnız iki gündən sonra təzə buruğu qazımağa başlayır.

Müxbir, sual verir kimi, Qüdrətin üzünə çəpəki nəzər saldı.

– İstirahət bizim dildə əsil prozadır!.. – deyə Qüdrət əlavə elədi. – Bir də, biz indi köhnə səhvimizi təkrar etməyəcəyik. Adətən trestin müdirlərinin bir çoxu ümidini ayrı-ayrı briqadaların nümunəvi işinə bağlayırdı. Partiya bu səhvi bizə göstərəndən sonra, ən adi quyulara da

ciddi fikir verməyə başlamışıq. Axı dəniz özü ayrı-ayrı damcılardan yaranır! Doğrudur, 155-ci buruğun hər gün verdiyi beş yüz ton neft trestin gündəlik məhsulunda böyük faiz təşkil edir, amma biz qətiyyən onun hesabına yaşaya bilmərik. Biz hər gün yeni-yeni neft mənbələri əldə etməliyik. Çünki neft təkcə bizim çörək ağacımız deyildir. Neft bütün vətənimizin qüdrətini təyin edən dəqiq bir barometrdir. Bunu başa düşən hər bir neftçi, öz işinin sürətini artırmaq üçün yeni-yeni yol tapır, daima irəliyə, gələcəyə baxmağı da bacarır!

Qüdrət, özü də fərqinə varmadan, müxbirin qarşısında dənizdə aparılan işin perspektivini açıb söyləməyə başladı:

– Bax, bu Xəzərdəki tükənməz neft mənbələri gərək yaxın bir zamanda ölkəmizin xidmətinə verilsin!

Müxbir bloknotunu çıxartmamışdı, indi ona hər şey aydın idi.

– İndi məni bir məsələ maraqlandırır, – deyirdi, – Xəzər dənizi içərisində yaranan təzə Abşeronun neft ehtiyatı nə haldadır?

Qüdrət uzaqlara, üfüqlə dənizin birləşdiyi yerə baxdı:

– Abşeronun neft yataqlarını Xəzər dənizinə bənzətmək olar. Onun da suyu get-gedə azalır. Ancaq nə zaman qurtaracağını fikirləşməyə ehtiyac yoxdur. Əslinə baxsanız, bu müqayisəyə də bir qədər tənqidi yanaşmaq lazımdır. Çünki Xəzər dənizinə yeni çay qarışmayacaq, amma Abşeron neft yataqlarına Azərbaycanın bir sıra yeni neft çeşmələri qarışır. Bunların hamısı yeni çeşmələrdir... Belə yaza bilərsiniz ki, "Azərbaycanın neft buruqları daima qaynayacaq!"

– Bəli, bəli, bu daha düz olar, – deyə müxbir Qüdrətin sözlərini təsdiqlədi.

Birdən dənizdə qayıqlar göründü. Onlar beş deyil, on deyil, saysız-hesabsızdı.

– Bunlar hara gedir?

Qüdrət özü onların hara getdiklərini bilmirdi. Ancaq o, dənizdə yaranan yeni Abşeronun haradan başlanıb-harada qurtaracağını müxbirə söyləməli idi.

– Yeni neft adasının sərhəddini təyin etməyə gedirlər!.. – dedi və özü də elə yenicə uydurduğu bu cavabdan xoşlanıb gülümsündü.

Bəzən dalğalar sahili döyəcləyir, ancaq tufan zamanı çatdığı nöqtəyə heç yaxın da gələ bilmirdi. Uzaqlaşan qayıqlardan yalnız bir nəfərin nəğməsi eşidilirdi. Bu nəğmədə neftçilər ordusunun gəncliyi və zəfəri tərənnüm edilirdi.

...Oxuyan Tahir idi. O indi neftçi dostlarına mədhnamə deyir, qarşısında oturmuş Lətifəyə baxa-baxa mahnısını zilə çəkirdi.

Qüdrət isə dinmir, cavan aşığın bağrından qopub gələn bu nəğməni dinlədikcə, ürəyi tel-tel olurdu.

Qayıqlar ayna suları yararaq irəlilədikcə, elə bil dəniz geri çəkilir, bu gün də olmasa, sabah onun qoynunda buruqlar səltənəti yaranacağına heç bir şübhə yeri qalmırdı.

Tahirin nəğməsi isə həyat qədər şirin, məhəbbət qədər güclü idi...

*1947-1948-ci illər, Bakı*

## KİTABDAKILAR

ABŞERON

